# Ümumi məlumat

**Faxralı kəndi**, Gürcüstan respublikasının Bolnisi rayonunda – dağlar ilə əhatə olunmuş füsunkar bir bölgədə yerləşir.

Bu kənd, ulu babaların məskən saldığı, öz gözəl ənənələrinin yaşadıldığı, qorunub saxlanıldığı ***böyük Türk Elidir***.

Müdrik qocalar, el ağsaqqalları və ağbirçəkləri kəndin adını **"Fağır Alı"**, bəzən də **"Fəxr Əli"** (Həzrət Əlinin Fəxri, islamın təbliğatçısı) kimi mənalandırmış, Qazaxın sonralardan Dağ Kəsəmən kəndinə birləşmiş Faxralı kəndi, bəzən də Goranboy rayonunun Faxralı kəndi ilə eyni kökdən olduğunu nəql etmişlər.

## Kəndin adı

1991-ci ildə gürcü millətçilərinin, gürcüləşmiş ermənilərin təklifı və təkidi ilə Gürcüstanda qatı millətçi Qamsaxurdiyanın prezident olduğu dövrdə Hökumət, azərbaycanlıların dədə-baba yurdu olan kəndlərin adlarını dəyişdirərək gürcü mənşəli adlarla əvəzlədi. Faxralının adını **Talaveri** etdilər. Kənd sakinləri kəndin tarixi adının dəyişdirilməsindən çox narazı oldular və dəfələrlə bu barədə əlaqədar təşkilatlara, hətta ölkə Prezidentinə də müraciət etdilər. Lakin bu günkü günədək heç bir nəticə əldə olunmayıb.

Kəndin adının dəyişdirilməsinə baxmayaraq, kənd sakinləri, hətta Bolnisi rayonda yaşayan gürcülər və digər millətlər də bu kəndə Talaveri yox, hələ də **Faxralı deyirlər**.

***İnanırıq ki, Avropaya inteqrasiyaya çan atan Gürcüstanda, demokratik cəmiyyət yaranacaq, respublikada yaşayan bütün xalqların hüquqları tam təmin olunacaq, onların arzu və istəkləri yerinə yetiriləcək və o zaman, kəndin qəlblərdə yaşadılan Faxralı adı da rəsmən bərpa olunacaqdır!***

- Faxralı faxralıların qanındadır…
- Faxralı faxralıların yaşantılarının çığırdaşıdı…
- Faxralı – Faxralı kimi də yaşayacaq!..

Faxralı ulu babalarımızın məskən saldığı, öz gözəl ənənələrinin xatirələrini yaşadan bir kənddir. Müdrik qocalar, el ağsaqqalları və ağbirçəkləri kəndin adını **"Fağır Alı"**, bəzən də **"Fəxr Əli"** (Həzrət Əlinin Fəxri, islamın təbliğatçısı) kimi mənalandırmış, Qazaxın sonralardan Dağ Kəsəmən kəndinə birləşmiş Faxralı kəndi, bəzən də Goranboy rayonunun Faxralı kəndi ilə eyni kökdən olduğunu nəql etmişlər.

Faxralı toponiminin yözumu aşağıdakı ehtimallardan ibarətdir:

**Birinci yozum** Alı adı ilə bağlıdır. Ağsaqqalların, kəndin tarixi ilə maraqlananların dediyinə görə Faxralının ərazisində ilk ocağı XVII əsrin əvvəllərində Qarabağdan gəlmiş Alı və Hüseyn qardaşları çatıb. Bu nəslin ağsaqqalı öz "tükünün üstə dolanan"

fağır bir adam olan Alı imiş. O dövrlərdə bu və ya digər nəsil, sonralar böyüyüb el-elat olanda da nəslin ağsaqqalının adı ilə anılıb. Bu anlamda **Molla Əhmədli** təpəsində məskunlaşmağa başlayan və məskunlaşan nəslin Fağır Alılar – faxralılar kimi anılması, tanınması inandırıcıdır. Qəbir yerləri – qəbristanlıq onların bu ətraflarda uzun müddət yaşadıqlarını təsdiq edir. Bu tarix XVII əsrin əvvəlləri ilə səsləşir…

İstər sonralar Faxralı adı ilə tanınacaq eldə, istərsə də ətraf elatlarda əhalinin artımı bu artımla bağlı mal-qaranın, davarın çoxalması oturacaq yerlərinin darlığına səbəb olur. Belə bir şəraitdə Fağır Alılar nəslinin sözüötgün ağsaqqalının -Alının (o, ulu babasının adını daşıyıb) məsləhəti ilə nəsil **Haça qayanın** ətəklərinə köçüb. Bu yerdəyişmə 1725-1730-cu illərdə olub və elə bu səbəbə görə də Faxralının adı 1728-ci ilə aid “Tiflis əyalətinin müxtəsər dəftəri”nə düşə bilməzdi…

XVII əsrin 40-cı illərində Alı və Hüseyn qardaşları ilə imirhəsənlilər arasında münaqişə düşür. Münaqişə böyüyür və şəri silah kəsir. Bu dava-dalaşda Alı və Hüseyn qardaşlarının qohum-əqrabasından dörd nəfər, imirhəsənlilərdən iki nəfər ölür. Bu qan davası düşmənçiliyə çevrilə bilərdi. Qohum-əqrəbasının taleyinə sayğılarla yanaşan Alı imirhəsənlilərlə yaxın münasibətdə yaşamağın (daha qədim tarixə malik olan imirhəsənlilər say etibarı ilə xeyli çox idilər), bu qanlı olaydan sonra eyni örüşdə mal-qara, davar saxlamağın çətin olacağını anlayır və isinişdikləri, el olduqları yurdlarından – **Haça qayanın** ətəkələrindən bir qədər uzaqlaşmağı məsləhət görür…

Gürcü qaynaqlarına istinad edən Hüseynqulu Məmmədli Səməndər Məmmədovun tərtib etdiyi “Faxralı kimi ağır elim var mənim” kitabına yazdığı ön sözdə xatırladır ki, XV əsrin II yarısında, daha dəqiq olaraq 1474-cü ildə türklər Gürcüstanı işğal etdikdən sonra Mahmud bəyi Faxralı sancaqlığına vali (sahibkar) təyin etdilər. Bu fakt Faxralının tarixinə güman işığı salır: “Əgər söhbət bizim Faxralıdan gedirsə, onda bu elin tarixi 5 əsrdən çoxdur, bu el bir sancaqlıq (el-elat) kimi **1474**-cü ilə qədər hakim idarəçilik tərəfindən rəsmən tanınıb”.

Gürcü tarixçi-alimlərinin hazırladığı bir xəritə diqqəti çəkir. Türkiyənin də ərazisinin bir hissəsini əhatə edən, XVII əsrin siyasi görümünü verən bu xəritədə Türkiyə ərazisində **P a r x a l i** adlı yaşayış məntəqəsi də qeyd olunub. Əvvəla, kənd xəritəyə düşübsə, deməli, xırda deyilmiş. Digər tərəfdən, gürcü dilinə vaqif olanlar bilir ki, bu dildə “f” səsi “p” səsi kimi, “i” səsi “ı” səsi kimi tələffüz olunur və yazılır. P-f, i–ı fonetik hadisəsini nəzərə alsaq, çox da ciddi olmayan Faxralı-Farxalı-Parxali addəyişməsinin səbəbini bilərik. Kəndin mövcudluğu XVII əsrə aid xəritə ilə təsdiqlənirsə, onda onun əzəli tarixi XIV-XVI əsrlərlə səsləşməlidir. ***Deməli, XIV-XVI əsrlərdə Türkiyənin ərazisində Faxralı adlı yaşayış məntəqəsi olub!***

Bu ad oxşarlığı təsadüfidirmi? Belə təsadüfləri qəbul etməyən tarix təsdiqləyir ki, eynilik həddində belə bənzərlik ancaq miqrasiya ilə bağlı olur. Bəs adı gedən eyniliyə səbəb olmuş miqrasiya necə baş verə bilərdi?

**I güman:** Türkiyədən Faxralıya (istər hərbi yürüşlər zamam, istərsə də qan davası zəminində indiki Faxralının həndəvərlərində məskunlaşan nəsillər bu əraziyə öz dədə-baba kəndlərinin adını verib);

**II güman:** Faxralıdan Türkiyəyə (ya qan davası zəminində, ya da yaxşı güzəran axtarışı ilə əlaqədar bu və ya digər nəslin Türkiyəyə köçməsi, birinci gümanda qeyd

edildiyi kimi, məskunlaşdığı əraziyə yeni ad verməsi). Birinci güman daha inandırıcı görünür.

Ağsaqqalların, kəndin tarixi ilə ciddi maraqlananların dediyinə görə, Faxralıya ilk sakinlər Qarabağdan gəlib – **dəryahlılar**. Dəryahlıların Qarabağa Türkiyənin Faxralı kəndindən köçdüklərini gümanlasaq necə? Tarix bu suala cavab verməsə də gümanımda həqiqət çalarları var. Dələver adı da eyni talelidir. Türkiyənin Çıldır mahalında, Zurzunanın yaxınlığında **D ə l ə v e r** kəndi var. Faxralıda suyu qurumuş dərə indinin özündə də **D ə l ə v e r** adlanır. Dələver dərəsinin mənbələrinə yaxın ərazilərdə qədim-ortaçağ yaşayış məskənlərinin xarabalıqları qalmaqdadır. Bu ad oxşarlığının təsadüf olduğuna inanmaq çətindir. Zənnimizcə, bu eynilik də miqrasiyanın nəticəsidir. Güman olunur ki, bu miqrasiya da geniş, bol otlu otlaqlar axtarışı ilə bağlı olub, əhalisi köçən kənd sonralar xarabalığa çevrilib…

Borçalı XVIII əsrin onalarında **Avar xanı Ummanın** (İbrahim xanın qaynıdır, bəzi mənbələrdə Ümmə xan kimi anılır), Dağıstan xanı Çolaq Surxayın nizami ordu hissələrinin hücumlarına da məruz qalıb, XVIII əsrin axırlarında Qaşqa Sərdarın quldur dəstələrinin basqınlarına da. İstər Ummə xanın, istər Qaşqa Sərdarın, istərsə də Çolaq Surxayın Borçalıya basqınları ləzgi talanlan adı ilə tarixləşib.

Ləzgi talanlarına Faxralı da məruz qalıb.

Yaranışından ad-sanına saymazlıq edənlərin “alımını vermiş” faxralılar bu talanı elin adına baş töhməti bilirlər və qisasın zamanını gözləyirlər. “Düşmən düşməndən yüz ildən sonra qisas alır, deyir elə bil bu günkü gündü” – Faxralı deyimidi…

*…Çapar xəbər gətirir ki, Umma xanın silahlı dəstəsi Faxralıya tərəf gəlir. Elin ağsaqqalları talançılan kəndin kənarında qarşılamağı məsləhət bilirlər. Hər nəsildən iki-üç nəfər olmaqla yaradılan silahlı dəstə* ***Bolus gəzdəyı****‘ndə pusqu qurur. Bolus gəzdəyı’nə yaxınlaşan talançılar faxralıların qəfil həmləsi ilə qarşılaşır; talançılar əl-qol açana kimi el təpərli hünərvər oğulların kəsərli qılıncları “öz işini görür”.*

Mənbə : **Rəşid Faxralı** – ***“Oğuz eli Faxralı”*** kitabı

# Tarixi

Ulu babalarımız ilk dəfə **Molla Əhmədli** təpəsi deyilən yerdə yurd salmış, sonra indiki **İmirhəsən** kəndinin ərazisində məskunlaşmış, nəhayət axırıncı dəfə isə suyu, otları bol olan ucsuz-bucaqsız geniş bir ərazidə meşəlik sahələri indi Ermənistan adlanan qədim türk torpaqları ilə sərhədlənən iki dağ arasında, mənzərəli bir yerdə **Faxralı** adlı vətən tutmuş, həmişəlik yurd-yuva qurmuşlar. bu tarixi faktı hər üç qədim yaşayış yerinin ərazisində olan qəbirlər də təsdiqləyir. Yaxınlıqda qədim abidələr, səkkizayaqlı kilsə, qəbirüstü yazılar, XVII əsrin yadigarı məscid diqqəti çəkir.

Söz düşəndə 30-35-ci illərin dünyagörmüş qocaları deyərdilər: “Faxralı yeddi kəndin sonudur”. Məlumdur ki, Faxralı 30-dan çox tayfanı özündə birləşdirib. Hətta bu

tayfaların bir qisminin İranda, Türkiyədə, Azərbaycanda, Türkmənistanda və türklər yaşayan digər ərazilərdə eyni adlı tayfalar, kəndlilərlə soydaşlıqları barədə rəvayətlər, fikirlər söyləmək olar.

Faxralı ulu babalarımızın məskən saldığı, öz gözəl ənənələrinin xatirələrini yaşadan bir kənddir. Müdrik qocalar, el ağsaqqalları və ağbirçəkləri kəndin adını **"Fağır Alı"**, bəzən də **"Fəxr Əli"** (Həzrət Əlinin Fəxri, islamın təbliğatçısı) kimi mənalandırmış, Qazaxın sonralardan Dağ Kəsəmən kəndinə birləşmiş Faxralı kəndi, bəzən də Goranboy rayonunun Faxralı kəndi ilə eyni kökdən olduğunu nəql etmişlər.

Faxralı toponiminin yözumu aşağıdakı ehtimallardan ibarətdir:

**Birinci yozum** Alı adı ilə bağlıdır. Ağsaqqalların, kəndin tarixi ilə maraqlananların dediyinə görə Faxralının ərazisində ilk ocağı XVII əsrin əvvəllərində Qarabağdan gəlmiş Alı və Hüseyn qardaşları çatıb. Bu nəslin ağsaqqalı öz "tükünün üstə dolanan" fağır bir adam olan Alı imiş. O dövrlərdə bu və ya digər nəsil, sonralar böyüyüb el-elat olanda da nəslin ağsaqqalının adı ilə anılıb. Bu anlamda **Molla Əhmədli** təpəsində məskunlaşmağa başlayan və məskunlaşan nəslin Fağır Alılar – faxralılar kimi anılması, tanınması inandırıcıdır. Qəbir yerləri – qəbristanlıq onların bu ətraflarda uzun müddət yaşadıqlarını təsdiq edir. Bu tarix XVII əsrin əvvəlləri ilə səsləşir…

İstər sonralar Faxralı adı ilə tanınacaq eldə, istərsə də ətraf elatlarda əhalinin artımı bu artımla bağlı mal-qaranın, davarın çoxalması oturacaq yerlərinin darlığına səbəb olur. Belə bir şəraitdə Fağır Alılar nəslinin sözüötgün ağsaqqalının -Alının (o, ulu babasının adını daşıyıb) məsləhəti ilə nəsil **Haça qayanın** ətəklərinə köçüb. Bu yerdəyişmə 1725-1730-cu illərdə olub və elə bu səbəbə görə də Faxralının adı 1728-ci ilə aid "Tiflis əyalətinin müxtəsər dəftəri"nə düşə bilməzdi…

XVII əsrin 40-cı illərində Alı və Hüseyn qardaşları ilə imirhəsənlilər arasında münaqişə düşür. Münaqişə böyüyür və şəri silah kəsir. Bu dava-dalaşda Alı və Hüseyn qardaşlarının qohum-əqrabasından dörd nəfər, imirhəsənlilərdən iki nəfər ölür. Bu qan davası düşmənçiliyə çevrilə bilərdi. Qohum-əqrəbasının taleyinə sayğılarla yanaşan Alı imirhəsənlilərlə yaxın münasibətdə yaşamağın (daha qədim tarixə malik olan imirhəsənlilər say etibarı ilə xeyli çox idilər), bu qanlı olaydan sonra eyni örüşdə mal-qara, davar saxlamağın çətin olacağını anlayır və isinişdikləri, el olduqları yurdlarından – **Haça qayanın** ətəkələrindən bir qədər uzaqlaşmağı məsləhət görür…

Gürcü qaynaqlarına istinad edən Hüseynqulu Məmmədli Səməndər Məmmədovun tərtib etdiyi "Faxralı kimi ağır elim var mənim" kitabına yazdığı ön sözdə xatırladır ki, XV əsrin II yarısında, daha dəqiq olaraq 1474-cü ildə türklər Gürcüstanı işğal etdikdən sonra Mahmud bəyi Faxralı sancaqlığına vali (sahibkar) təyin etdilər. Bu fakt Faxralının tarixinə güman işığı salır: "Əgər söhbət bizim Faxralıdan gedirsə, onda bu elin tarixi 5 əsrdən çoxdur, bu el bir sancaqlıq (el-elat) kimi **1474**-cü ilə qədər hakim idarəçilik tərəfindən rəsmən tanınıb".

Gürcü tarixçi-alimlərinin hazırladığı bir xəritə diqqəti çəkir. Türkiyənin də ərazisinin bir hissəsini əhatə edən, XVII əsrin siyasi görümünü verən bu xəritədə Türkiyə ərazisində **P a r x a l i** adlı yaşayış məntəqəsi də qeyd olunub. Əvvəla, kənd xəritəyə

düşübsə, deməli, xırda deyilmiş. Digər tərəfdən, gürcü dilinə vaqif olanlar bilir ki, bu dildə “f” səsi “p” səsi kimi, “i” səsi “ı” səsi kimi tələffüz olunur və yazılır. P-f, i–ı fonetik hadisəsini nəzərə alsaq, çox da ciddi olmayan Faxralı-Farxalı-Parxali addəyişməsinin səbəbini bilərik. Kəndin mövcudluğu XVII əsrə aid xəritə ilə təsdiqlənirsə, onda onun əzəli tarixi XIV-XVI əsrlərlə səsləşməlidir. ***Deməli, XIV-XVI əsrlərdə Türkiyənin ərazisində Faxralı adlı yaşayış məntəqəsi olub!***

Bu ad oxşarlığı təsadüfidirmi? Belə təsadüfləri qəbul etməyən tarix təsdiqləyir ki, eynilik həddində belə bənzərlik ancaq miqrasiya ilə bağlı olur. Bəs adı gedən eyniliyə səbəb olmuş miqrasiya necə baş verə bilərdi?

**I güman:** Türkiyədən Faxralıya (istər hərbi yürüşlər zamam, istərsə də qan davası zəminində indiki Faxralının həndəvərlərində məskunlaşan nəsillər bu əraziyə öz dədə-baba kəndlərinin adını verib);

**II güman:** Faxralıdan Türkiyəyə (ya qan davası zəminində, ya da yaxşı güzəran axtarışı ilə əlaqədar bu və ya digər nəslin Türkiyəyə köçməsi, birinci gümanda qeyd edildiyi kimi, məskunlaşdığı əraziyə yeni ad verməsi). Birinci güman daha inandırıcı görünür.

Ağsaqqalların, kəndin tarixi ilə ciddi maraqlananların dediyinə görə, Faxralıya ilk sakinlər Qarabağdan gəlib – **dəryahlılar**. Dəryahlıların Qarabağa Türkiyənin Faxralı kəndindən köçdüklərini gümanlasaq necə? Tarix bu suala cavab verməsə də gümanımda həqiqət çalarları var. Dələver adı da eyni talelidir. Türkiyənin Çıldır mahalında, Zurzunanın yaxınlığında **D ə l ə v e r** kəndi var. Faxralıda suyu qurumuş dərə indinin özündə də **D ə l ə v e r** adlanır. Dələver dərəsinin mənbələrinə yaxın ərazilərdə qədim-ortaçağ yaşayış məskənlərinin xarabalıqları qalmaqdadır. Bu ad oxşarlığının təsadüf olduğuna inanmaq çətindir. Zənnimizcə, bu eynilik də miqrasiyanın nəticəsidir. Güman olunur ki, bu miqrasiya da geniş, bol otlu otlaqlar axtarışı ilə bağlı olub, əhalisi köçən kənd sonralar xarabalığa çevrilib…

Borçalı XVIII əsrin onalarında **Avar xanı Ummanın** (İbrahim xanın qaynıdır, bəzi mənbələrdə Ümmə xan kimi anılır), Dağıstan xanı Çolaq Surxayın nizami ordu hissələrinin hücumlarına da məruz qalıb, XVIII əsrin axırlarında Qaşqa Sərdarın quldur dəstələrinin basqınlarına da. İstər Ummə xanın, istər Qaşqa Sərdarın, istərsə də Çolaq Surxayın Borçalıya basqınları ləzgi talanlan adı ilə tarixləşib.

Ləzgi talanlarına Faxralı da məruz qalıb.

Yaranışından ad-sanına saymazlıq edənlərin “alımını vermiş” faxralılar bu talanı elin adına baş töhməti bilirlər və qisasın zamanını gözləyirlər. “Düşmən düşməndən yüz ildən sonra qisas alır, deyir elə bil bu günkü gündü” – Faxralı deyimidi…

*…Çapar xəbər gətirir ki, Umma xanın silahlı dəstəsi Faxralıya tərəf gəlir. Elin ağsaqqalları talançılan kəndin kənarında qarşılamağı məsləhət bilirlər. Hər nəsildən iki-üç nəfər olmaqla yaradılan silahlı dəstə* ***Bolus gəzdəyı****‘ndə pusqu qurur. Bolus gəzdəyı’nə yaxınlaşan talançılar faxralıların qəfil həmləsi ilə qarşılaşır; talançılar əl-qol açana kimi el təpərli hünərvər oğulların kəsərli qılıncları “öz işini görür”.*

Mənbə : **Rəşid Faxralı** – ***"Oğuz eli Faxralı"*** kitabı

# Coğrafi mövqeyi

Faxralı kəndi Dələver (Talaveri) çayının sahilində, Gürcüstan Respublikasının paytaxtı Tbilisi şəhərindən 60 km, aşağı Kartli bölgəsinin Bolnisi rayon mərkəzindən 18 km gündoğarda, dəniz səviyyəsindən 560 m hündürlükdə yerləşir. Saat qurşağı UTC+4, ərazisi 17 min hektardır.

Kəndin ərazisi tarixən aşağıdakı kəndlərlə həmsərhəddir:

- şimaldan **Qoçulu**;
- şimali-şərqdən **İmirhəsən, Molla Əhmədli, Qoşakilsə**;
- şərqdən **Saraçlı**;
- cənubdan **Bala Darbaz, Qudru***;*
- cənubi-qərbdən **Hopret** *(yunan kəndi),* **Becanoğuzaran qışlağı** *(sərhədləri Ermənistan ərazisinə dayanır);*
- qərbdən **Kəpənəkçi**;
- şimali-qərbdən **Cəfərli, Mığırlı, Bolus-Xaçın** *(gürcü kəndi).*

## Tarixi abidələri

### Tənəklidə "İmarət" adlı tarixi abidə

**İ m a r ə t** adı ilə tanınan tikili Tənəklinin qayası tərəfdə, meşənin ətəyindədi. Yan-yörəsindəki şirəxanalıqların *(el arasında uçub-dağılmış tikililərin qalaqları – xarabalıq belə adlandırılır)* geniş ərazini əhatə etməsi, yaxınlığında bulaq olması *(sonralar həmin bulağı sel-su batırıb)* yüz–yüz illər əvvəl İmarətin yaşayış məntəqəsi olduğunu təsdiqləyir.
İmarət tarixi abidədir; damı primitiv də olsa xüsusi texnologiya ilə işlənərək bir-birini tamamlayan plitə formalı daşlardan düzəldilib. Pəncərə kimi qəbul edilməsi mümkün olan oytuqları iç tərəfdən geniş, çöl tərəfdən isə nazikdir. Bunların orta əsr qalalarına xas xüsusiyyət olduğunu nəzərə alsaq, onun orta əsrlərdə qala–şəhər kimi tikildiyini, qapısının Qibləyə baxdığını nəzərə alsaq, bu dövrün VIII-X əsrlərlə səsləşdiyini güman edə bilərik.

# Əhalinin məşğuliyyəti

Faxralı Bolnisi rayonunun ən böyük, axar-baxarlı kəndlərindən biridir. Başqa kəndlərdə olduğu kimi, bu kənddə də əhali mal-qara saxlasa da, onların **əsas məşğuliyyəti əkinçilikdir**. Yaylaqlarda xatirə kimi qalan mal-qoyun arxacları, xalxallar, yüksək zirvələrdə düzəldilmiş daş qaravullar (nişangahlar) əsrlərin yadigarıdır.

Vaxtilə kənddə yeddi mindən artıq əhali yaşayıb. Bu kənddə başqa kəndlərdən fərqli olaraq, su məsələsi çətindir. Kəndin əkin sahələrinin çox hissəsi susuz-dəmyə torpaqlardır. Həyətyanı sahələri suvarmaq üçün su yoxdur. Əhali içməli, ümumiyyətlə, hər şey üçün istifadə etdiyi suyu bulaqdan daşıyır. Kənddə 15-dən artıq bulaq var, hər kəs suyu özünə yaxın olan bulaqdan gətirir.

Əsas təsərrüfatçılıq sahəsi kənd təsərrüfatı olan Faxralı kəndinin ümumi ərazisi 17 min hektar təşkil edir. Ərazinin 2,5 min hektaradək sahəsi əkinə yararlı torpaq sahəsi hesab olunur. Bu barədə Gürcüstan Statistika Departamentinin rəsmi internet səhifəsində qeyd edilir.

# “Böyük Vətən Müharibəsi” abidəsi

## 2019-cu ilin may ayında Faxralıda Böyük Vətən Müharibəsi veteranlarının şərəfinə ucaldılmış abidə yenidən restavrasiya olunub.

Faxralı kənd orta məktəbini 1999-cu ildə bitirmiş məzunlar, məktəbi bitirməklərinin 20 illik yubileylərini xeyirxah əməllə tarixə yazmışlar. Onlar 1980-1985-cı ilərdə Faxralının girişində, “Təpələr” deyilən ərazidə Böyük Vətən Müharibəsi (1941-1945-ci illər) iştirakçılarının şərəfinə ucaldılmış abidəni yenidən restavrasiya etmişlər. Qeyd edirik ki, həmin abidə uzun müddət idi ki, baxımsızlıq və diqqətsizlik ucbatından uçub dağılmış, yararsız vəziyyətə düşmüşdü.

1999-cu ilin məzunlarının bu təqdirəlayiq təşəbbüsü, doğulduğu elə-obaya, boya-başa çatdığı kəndə olan sevginin, məhəbbətin ifadəsidir. Bu təşəbbüs bütün Faxralı gəncləri üçün gözəl örnək, nümunə olmalıdır.

Abidəyə müharibədə həlak olan, itkin düşən faxralıların qara mərmər daşında həkk olunmuş siyahısı yapışdırılmışdır. Müharibədən sağ qayıdan veteranlar üçün isə foto-albom hazırlanması nəzərdə tutulmuşdur.

Məlumat üçün qeyd edirik ki, Böyük Vətən Müharibəsi zamanı Faxralı kəndindən 632 nəfər müharibəyə yollanmış və onlardan 248 nəfəri Vətənə qayıtmamışdır.

Abidənin hazırlanmasında əziyyət çəkən hər kəsə minnətdarlıq edirik!

Siyahıda adı olmayanlar barədə məlumat verməyinizi Sizlərdən xahiş edirik:

## Binələr

Qonşu kəndlərə nisbətən Faxralı kəndi maldarlıq, qoyunçuluq, əkinçilik üçün əlverişli olan çox geniş çox geniş coğrafi ərazidə yerləşib.

## Qışlaqlar

Faxralı kəndinin hələ keçmiş zamanlardan geniş əkin və meşə sahəsi olub. Bu ərazilər payız, qış aylarında mal-qara saxlamaq üçün tayfalar arasında bölünmüş, zaman-zaman abadlaşdırılmış, yaşayış məskənlərinə çevrilmişdir.

Tayfaların yurd saldıqları qışlaqlar:

- **Sərginə və Saxundur qışlağı** – *Kələli, Göyüşdər, Baytallı, Hüseynuşağı, Alqazaxlar, Emin öyü*
- **Təhməz** – *Vəlxanlı, Ramazanuşağı, Kaxılar*
- **Miyirdiş** – *Amaşlı, Məsim öyü*
- **Xəmmətli** – *Hasanlı, Babaşlı*
- **Tənəkli** – *Güllər/Hacı öyü/*
- **Qaradağ** – *Yahyalar*
- **Qızılqayanın üstü** – *Balammədli, Alməmmədli/Bədəlli/, Keçili*
- **Becanoğuzaran** – *Nağılar, Dərgahlı*

Bu yerlərdə hər tayfa yeraltı damlar tikmiş, mal-qaranın qışlaması üçün şərait yaratmışlar.

Mart ayından başlayaraq elliklə dağa (yaylağa) hazırlıq görülərdi. Varlı ailələr ehtiyacdan artıq qalan pendir, yağ, yun, taxıl və s. satıb, hər şeydən əvvəl uşaqlar üçün paltar alar, şəkər, düyü, çay, sabun, neft, lampa piltəsi tədarük edərdilər. Köç hazırlığı görən hər ailə ərişdə kəsər, qovut çəkərdilər. Baş keçələri, dəyələrin, alaçıqların yanpalazları, qapılıqlar, nəmi örtükləri nəzərdən keçirilərdi, cırılmış yerləri yamanar, yaramayan nimdaşları isə təzəsilə əvəz edilərdi. Çətən çubuqlrı təmir olunardı. Dağ çiçəkləri, şəfalı dərman otları üçün torbalar tikilərdi. Yağ qarınları qurud, motal, yığıntı üçün xüsusi dəri ehtiyatları görülərdi. Bu zaman uşaqlar da unudulmazdı. Ailənin əziz körpələri, yaxud da aranda qalan qohum – əqrabanın körpələri üçün də dağ sovqatı hazırlanardı. Körpə quzu qarnına və qoyun dərisinin ayaq qunclarına (dərinin bud ilə diz hissəsi) doldurulmuş yağ, pendir körpələr üçün ən qiymətli hədiyyə sayılardı. Yaylaq tədarükü içərisində ayran torbası hazırlamaq, yığıntı dərisi tədarük etmək xüsusi peşəkarlıq tələb edirdi.

Yığıntı dərisini isə əsasən yaşlı və təcrübəli qadınlar hazırlardı. Onlar qoyun dərilərini əvvəlcə duzlu suya qoyar, yundan təmizləyər, qurudar, sonra isə xüsusi boyaq maddəsi və ya palıd qabığının suyu ilə boyayardılar. Dərinin ağzına yumşaq ağacdan yumru ağızlıq (çəmbərə) düzəldər, künclərini və arxa hissəsini möhkəm tikərdilər. Hər ailədə sağılan inək və camışın sayına görə dəri hazırlanardı.

# Yaylaqlar

Faxralının aran torpaqlarından başqa, Dumanisi (keçmiş Başkeçid) rayonunun **Qaraxaç (Qaraqoç)** *(xaç sözü arxac mənasında işlədilir)* ərazisində dəniz səviyyəsindən 1500-2500 metr, Faxralının səviyyəsindən isə 500 – 600 metr yüksəklikdə yerləşən 1200 hektar yaylaq torpaqları vardır.

Cavaxeti yaylasında yerləşən bu torpaq sahəsini 1872-ci ildə Faxralı kənd sakini Allahverdi Aşır oğlu icarəyə götürüb. 1873-cü ildə isə başqa kəndlərin nümayəndələrinin həmin torpaq sahəsini icarəyə götüımək istədiklərini eşidəndə Allahverdi Aşır oğlu gedib, torpaq sahəsinin qiymətini iki qat ödəyərək Başkeçid Tavadından həmişəlik alıb.

Həmin gündən bu torpaq sahəsi Allahverdi Aşır oğlunun şəxsi mülkü olub. Bu torpaq sahəsinin özünə məxsus xüsusiyyətləri var. Belə ki, buranın havası sərin, suyu saf və soyuq, torpağın üst qatı yararlı otlarla örtülü və dumanlı-çiskinli bir ərazidir. Lakin o, öz qohumların və Faxralıda yaşayan bütün nəsillərə bildirir ki, onlar da bu torpaq sahələrindən istifadə edə bilərlər. Sonralal nəsillər arasında eyni qaydada istifadə edilən həmin torpaq  sahələri nəsillərin arxac yeri kimi tanındı. Bu da yaylağın hər yerinin tanınmasına kömək edirdi.

Cavaxeti yaylasının ən hündür zirvəsi **"Dəli dağ"**, aşağı hissəsi isə **Dəvə qoruğudur**. Dəvə qoruğundan baxanda qarşıda **"Qaranlığın qayası"** görünür. Yaylaq torpaqlarımızın bir tərəfdən səhədi buradan başlayır. Buradan başlayan yaylaq torpag1m1z **"Qaranlığın dərəsi"** boyu uzanır və "**Nazar oğunun bulağı"**na kimi davam edir. "Nazar oğlunun ulağı"nın yuxarı hissəsi **"Yastı qar"** adlanır. "Yastı qar"ın davamı **"Bədəllinin arxac1"**, arxacına yuxarısı isə "**Nazik su"** adlanır. Nəzik suyun ətrafıda "Aşırlının arxacı" olub. Sonra isə **"Yolum çınqıl"**, **"Qoşa bulaq"** və **"Xudu öyünün arxacı"** gəlir. Kiçik bir düzənlikdə **"Qazaxlının çeyli"**, üst tərəfində **"Hasanlının çeyli"** və **"Yol arxacı"**, buraya yaxın bir sahədə isə **"Ayvaz öyünün çeyli"** yerləşir.

Cavaxeti yaylasının lap yuxarısında **"Dibsiz"** və **"Keçiqıran"** gölləri yerləşir. Göllərin yuxarı hissəsi **"Qırmızı Gəzdək"** adlanır.

Üzü xrama tərəf Qasımlının arxacı, Aralığın xram tərəfi işə "Hasanlının yurdu"dur. Aralıq ilə Hasanlının yurdu arasındakı kiçik təpə **"Əzən təpəsi"** adlanır.

Yurd yerlərindən **"Qaradaş"**, **"Asırğallı boyun"**u və faylağımızın ən geniş sahələrindən biri olan "Aralığı" göstərmək olar.

Yaylağımızın lap aşağı hissəsi **"Tərəli"** adlanır.Tərəlinin ətəyi ilə axıb gedən dərə isə yaylağımızın o biri sərhədini müəyyən edir. Faxralının yaylaq qəbristanlığı Aralıqla Tərəlinin arasında yerləşir.

Allahverdi Aşır oğlu tərəfindən görülən bu xeyriyyə işinin nəticəsidir ki, 140 il bundan əvvəl öz qızıl pulu hesabına Başkeçid Tavadından həmişəlik aldığı 1200 hektar yaylaq toıpağından Faxralı camaatı indi də istifadə edır.

Gürcüstanda müstəqillik əldə olunduqdan sonra torpaq haqqında 303 N-li qanun qəbul olundu. Müəyyən səbəblərə görə, kəndin rəhbərliyi bu qanunda göstərilən şərtlərlə yaylaq toıpaqlarının özəlləşdirilməsini həll edə bilmədi. Bunun nəticəsində də yaylaq torpaqlarımızın müəyyən hissəsini itirdik. Ona görə də müəyyən tədbirlər görüb geridə qalan torpaq sahəsini özəlləşdirmək lazımdır. Yoxsa keçmişlərimizin ruhu bizi bağışlamaz.

Faxralı yaylaqları barədə məlumatlara *Hüseynqulu Məmmədlinin "Görüm Faxralının biri olsun beş…" əsərindən* daha geniş tanış ola bilərsiniz.

Mənbə: **Allahverdi Kərimov** – ***"Faxralı kəndinin tarixi haqqında yaddaş kitabçası***"

Kəndin ətrafını əhatə edən görkəmli yerlərin hamısı formasına və yerləşdiyi əraziyə uyğun olaraq tarixi adlarla adlandırılımışdır. Molla Əhmədli təpəsindən başlayan tarixi yer adları aşağıda göstərilir:

- Haram təpəsi
- Dumaneşən
- Süpürgəli
- Gözəldağ
- Qarama bulağı
- Əzgilli yal
- Yastana
- Qaşqatala
- Miyirdiş
- Təhməz, Təhməzin qayası, Təhməzin bulağı
- Ağzı gödək
- Babaşlının dam yeri
- Quru dərə
- Qaraqayanın qabağı
- Qoşa bulaq
- Yahaların binəsi
- Qızılqayanın üstü (Almalıq)
- Qızılqaya
- Tənəkli
- Xəmmədli
- Sərginə
- Səngər
- Daşkəsən
- Qarabulaq
- Xurdaçılar
- Haça qaya

# Faxralının yaylaqları

Əvvəllər də Faxralı camaatı elliklə **Qaraxaç (Qaraqoç)** yaylağına çıxardı. Mal – qoyun, köç arabaları mənzil başına üç günə çatardı. Əhali çalışardı ki, Qaraçöp, Qarayazı, Keşəli, Eldar köçlərindən qabağa düşsünlər. Ona görə ki, bu ellər yola çıxanda 10-15 gün yollarda gediş-gəliş kəsilirdi. Sürülərin əvvəli Lüksenburqda olanda sonu aran Borçalıda olurdu.

Köç yola düşməzdən əvvəl tayfa ağsaqqalları kitab açdırar, hansı gün səfərə çıxmağın daha münasib olması barədə məsləhət alardılar. Əvvəl qoyun-quzu, mal-qara sürüləri yola düşərdi. Bəzi ailələrində dədə – babadan qalma sınaqlı günləri vardı. Qoyun sürülərini, mal-qaranı yaylağa salamat və itkisiz aparmaq üçün ayaqdan yüngül, qeyrətli çobanlarla yanaşı, nəslin ağsaqqal və dünya görmüş qocaları da köçü müşaət edərdi. Belə səfərlərdə yaşlılar çox zaman köç yolunda baş verən xoşa gəlməz hadisələrin, dava-dalaşın qarşısını alar, gəncləri təsadüfi hadisələrdən xilas edərdilər.

Mənzil başına çatana kimi köç üç mənzildə gecələyərdi. Adətən birinci düşərgə indiki Kaziret şəhəri ilə üz-üzə dayanan Təktükən deyilən yerdə, ikinci düşərgə Başkeçidin əyrucəsində, yaxud Məmişli kəndinə yaxın (Şüşə zavodu deyilən yerdə), üçüncü düşərgə isə ya Yırğançağın düzündə, ya da Qaranlıq dərənin ayağında olrdı. Köç bəzən Hamamlı kəndindən Boğazkəsən yolu ilə, bəzən də Başkeçidin içindən, Sülüklü gölün yanından keçib gedərdi. 1918-1919-cu illərə qədərmal-qaranı yaylağa aparmaq üçün bir yol da vardı. Bu yol başqa yollardan təxminən 40-50 km yaxın idi. Ancaq Qızılqaya qışlağından başlanan yol, İtkörpüsü, Lök yüksəkliyindən, sonra Sərçəpet, Şahnazar erməni kəndlərinin içindən keçirdi. Əlavə edək ki, ermənilərlə müsəlmanlr arasında olan tarixi ədavət erməni kəndlilərindən keçərkə tez-tez dava-dalaşa səbəb olur, bəzən də ölümlə nəticələnirdi.

1918-ci ildə el köçü Sərçəpet kəndindən keçib yaylağa getmək istərkən köçün qabağını kəsən erməni gəncləri dava-dalaş salmış, nəticədə Faxralıda adlı-sanlı gənc sayılan Qara Namaz adlı bir nəfəri daşla qətlə yetirmişdilər. Təxminən bir il sonra Faxralı köçü həmin yolla arana dönərkən Lök yüksəkliyindən bir qədər aşağı İtkörpüsü deyilən yerdə dar bir dərədə Kaziret erməniləri pusqu quraraq Alməmmədli tayfasının köçünü – qadın, kişi, uşaq və s. fərq qoymadan hamsını dörd tərəfdən atəşə tutmuş və iki nəfər silahlı müqavimət göstərən, qeyrətli cavanı (Qacer Orucu, Bayrış oğlu Eyvazı) qətlə yetirmişlər. Möylə Alməmməd oğlu və anam Yetər Bayram qızını isə yaralamışdılar. Erməni quldurları bununla kifayətlənməmiş köçü qarət etmişdilər.

El arasında o da danışılırdı ki, 1924-cü ildə Ermənistanın Malaqanlar yaşayan məntəqəsinə (Voronsovkaya) bazara gəlmiş Faxralı çobanlarını bir dəstə erməni qulduru münaqişəyə çəkmiş və dava-dalaş salmışlar. Nəticədə bir Azərbaycanlı çoban həlak olmuşdur. Bu yersiz münaqişədən və yoldaşının həlak olmasından qəzəblənən Əhməd Bədəl oğlu (Qara Əhməd) dərhal qarşıdurmaya səbəb olan və qızışdıran iki nəfər ermənini öldürmüşdür. Burada Qara Əhməd həbsə alınaraq Cəlaloğlu (Stepanavan) qəsəbəsinə aparılmış və orada qazamata salınmışdır. Məqsəd ölən ermənilərin qohumlarının əli ilə Qara Əhməddən qisas almaq, onu aradan götürmək olmuşdur.

Cəlaloğlunda qazamat gur axan çayın sahilindəki uçurum qaya üzərində tikilmişdir. Son aqibətinin nə ilə qurtaracağını başa düşən Qara Əhməd zirzəminin dar pəncərəsindən gecəykən özünə çətinliklə yol açmış, bayıra çıxmış, daşlı-sıldırımlı qayadan alpinist hünəri ilə çaya enmiş və bir müddət çayın axarı ilə hərəkət edərək canını erməni qisasından xilas etmişdi. Və bir neçə il qaçaq olmuşdu. Həmişə adı xalq arasında hörmətlə çəkilən Əhmət kişi ömrünün sonana kimi

həyatını şərəflə başa vurmuş, elinin, obasının xeyir-şərində şərəflə iştirak etmiş, 80 yaşında rəhmətə getmişdir.

Şəkil

Əhməd Bədəl oğlu (Qara Əhməd)

Burda təəccüblü bir şey görmürük. Bu kimi xəyanətlər erməni xislətinin daxili tələbləri ilə bağlıdır. Tarixən nəsil-nəsil ermənilər başqa xalqlara qarşı düşmənçilik hissləri ilə yaşamış, özlırini hakim millətçilik zirvəsində görmək arzusunda olmuşlar. Bu arzu ilə doğulmuş və özlərindən sonra gələn nəsilləri də belə ruhda tərbiyə etmişlər. Ali irq xülyası ilə yaşayan bu xalq fürsət düşdükcə ilk növbədə türklərə (azərbaycanlılara) qarşı zaman-zaman milli ədavət hisslərini gah gizli, gah da aşkar büruzə vermişlər, qonşu xalqlara, onların ayrı-ayrı vətəndaşlarına qarşı şər, böhtan atmaq, milli ədavət törətmək ermənilərin istər ümumi, istərsə də fərdi mərəzləridir. Ona görə də azərbaycanlılar bir-birinə xeyir-dua verəndə belə bir fikir işlədirdilər: “Allah sizi erməni şərindən saxlasın”. Bu da təsadüfi deyilməmişdir. Ermənilərin yaratdığı qarşıdurmalar çox zaman qanlı faciələrlə nəticələnmiş, hətta dövlətlər arası səviyyəyə qalxmışdır.

Bu sayaq faciələrdən sonra yaylağa gediş-gəliş Lök yüksəkliyi – Sərçəpet istiqamətindən kəsilmiş, bir müddət daha təhlükəsiz olan Başkeçid istiqamətində olan yol əsas hesab edilmişdir. Ancaq hərdən bu yolda da xoşagəlməz hadisələr baş verirdi. Köç son mənzilə çatmamış bəzən basqınlara məruz qalırdı. Hətta belə hallarda atışmalar da olurdu. Elə ki, mal, qoyun sürüləri, at ilxıları dağ kəndlərinin ərazisinə ayaq basdı, kəndlərin qoruqçuları addım başı köçün qabağını kəsər, urusumu verin, – deyə həngamə açardılar. Nəticədə isə puldan, çörəkdən, ya da ayran sovqatından alıb köçə yol verərdilər.

Adətən köç zamanı qoyun sürüləri – sağmal, subay qoyun, toğlu, quzular ayrı, çıxdaş-arıq mallar, doğmaq ərəfəsində olan inək və camışlar köçün arxasınca aparılardı. Buzov və kalçaların ipləri-çatılarıboğazına dolanar, sağlam naxıra qatılardı. 7-10 yaşlı körpələr (uşaqlar) atın tərkində, bir qədər iri yaşlılar çamışların belində oturardılar.

Köç yolunda yeni doğulmuş buzovlar və kalçalar ya köç arabasına qoyular, ya da mal-qoyun sürüləri ilə birlikdə atların üstündə, xurcunların gözündə aparılardı. Bəzən elə hal olurdu ki, atın belində xurcunun bir gözünə buzov və ya kalça/balağ/, digər gözünə isə körpə uşaq, ya da daş qoyardılar.

Dağ köçü vaxtı sağilan süd yığıntı dərisinə tökülər, körəməz adlanan sərin və dadlı bir içki hazırlanardı. Dəriyə tökülmüş süd yol boyu çalxanar, içməli, ləzzətli körəməzin dadı damaqdan getməzdi.

Köç zamanı malın-atın gecə düşərgələrində qalması, başga köçlərin mal-qarasına qarışması halları da olurdu. Belə anlarda bütün köç əhli ayağa qalxar, axtarışlar başlardı.

Qoyun və mal köçündən bir qədər sonra araba karvanları ilə ailələr yola düşərdi. Hər kəs öz imkanına görə, varlı ailələr iki, ortabab və yoxsul ailələr isə bir arabalıq yük, daha doğrusu ev ləvazimatı ilə köç edərdilər. Köçü əsasən dağ kəndlarindən (Yirğancaq, Soyuqbulaq, Cücəkəndi, İlməzli, Hamamlıdan) gələn araba sahibləri apardı. Hər tayfanın dağ kəndlərindən dədə-babadan qalma ailəvi dostları-kirəçiləri vardı. El köçünə bir neçə gün qalmış kirəçilərin

gəlməsi xəbəri kəndə yayılardı. Bu xəbərə böyüklərdən daha çox uşaqlar sevinərdi. Dağ kəndlərinin qoşqu ulaqları çox iri və qüvvətli olardı. Ona görə də yük nə qədər ağir olsa da arabanı asanliqla çəkər, dağ yollarnda, yoxuşda sahiblərini darda qoymazdılar.

Borçalı və Qarayazı əhalisi Qaraqoc (Qaraxaç) yaylağında düşərgə salardi. Bu yaylaqların bir sərhəddi Ov dərəsi deyilən yer, maldarlıq və qoyunçuluq üçün geniş otlaq sahələri (Qarayazi elatının yurd yerləri), bir tərəfdən isə Xram çayının geniş sahilləri, göz işlədikcə sonsuz dərələr, düzənliklər, dağlar idi. Daha doğrusu indiki Ermənistan və Gürcüstanın yaylaqlarının əsas hissəsi Borçalı, Qarayazı, Qaraçöp camaatına məxsus idi. Yaylaqların sərhəddi həm də Türkiyə torpaqlarına, Ermənistanın vaxtilə azərbaycanlılar yaşayan (1988-ci ilə qədər) Amasiya (Ağbaba) rayonu ərazisinə sökənirdi. Bu yaylaqların gözəlliyini vəsf edən qoşmalar, xatirələr, nağıllar, bayatılar indi də dildən-dilə gəzməkdədir.

Zərər çəkmədən köçü yaylağa çatdırmaq xoşbəxtlik sayılardı. Bir ənənə olaraq uşaqlar özlərini yurd yerlarinə böyüklərdən tez çatdırardı. Hər tayfanın dədə-babadan qalma, dəyişməz tarixi yurd yerləri vardi. Bu yurdlar həm də nəsilin, tayfanın adı ilə bağlı idi:

- **Ördəkli gölün yanı** – *Şeşəpapaxların,*
- **Tərəlinin qaşı** – *Kovxalının,*
- **Aralıq deyilən yer** – *Hasanlılar və Aşırlının,*
- **Qaranlıq dərəninin qılıcı** – *Qasımlının, Güllərin, Hüseynoğullarının, Kələşdinin,*
- **Cənnət bulağı** – *Alməmmətlinin,*
- **Qaradaş** – *Babaşdını,*
- **Soyuqbulaq** – Məsimöyünün,
- **Qaranlıq dərə** – *Qazaxlının, Baytallının*

yurd yerləri adlanırdı.

Bu yurd yerlərinin hər birinin yaxinlığında suyu can dərmanı olan buz bulaqlar:

- **Cənnət bulağı,**
- **Nazaroğlunun bulağı,**
- **Sarıbulaq,**
- **Tərəlinin bulağı,**
- **Ayranlı bulaq,**
- **Aralığın bulağı,**
- **Soyuqbulaq və s.**

kimi bulaqlar vardı.

Faxralı yayalaqlarnın ərazisində olan

- **Ördəkli göl,**
- **Dibsiz göl,**
- **Keçiqıran gölləri**,

- **Yolumçınqıl**

deyilən daşlanmış tarixi abidələr bu yaylaqlara xüsusi gözəllik verir.

Hər daş yığını uzaqdan baxanda yatmış qoyun sürüsünü, ətrafindakı hündür daşlar isə çomağına sökənmiş çobanı xatırladır. Maraqlıdır ki, xalq arasında çoban və sürüsünün daşlaşması haqqında əfsanələr də vardır. Dağ yaylaqlarının özü də iki yerə bölünürdü. Varlı ailələrin qoyun sürüləri "O üz" deyilən daha uzaq ərazilərə, **Dibsiz gölünün** ətrafına aparılardı. Bu qoyun sürüləri aşağılara yalnız aran köçünə yaxın, qırxın zamanı endirilərdi.

El-obanın köçü yaylağa çatan kimi hər kəs öz yurd yerini, dəyə, alaçiq yerini müəyyən edər, dəyələr, alaçıqlar qurulardı. Ötən illərdən qalma ləpir daşlar dəyələrin ətrafına düzülərdi. Ocaq yerləri müəyyən edilər, yumru, oda davamlı ocaq daşları seçilərdi. Dəyələrin qarşısında mixçalar çalınar, dana, körpə buzov, kalçalar analarından ayrılaraq bağlanar, iri mal-qara isə yaxın örüşlərə ötürülərdi. Min-bir ətir saçan çiçəkli, çəmənli sahələrə səpələnən heyvanlar da sanki insan kimi sevinərdi. Belə şəraitdə yaylaqda yaşlı qocalar keçmis xatirələri yada salar, vaxtilə burada dövran sürən igidlər yada düşərdi. Tayfa igidləri, dünyadan köçmüş qoca və cavanlar xatırlanardı. Dodaqlardan həsrət dolu yanıqlı bayatılar qopardı:

*Əzizinəm dəyə-dəyə,*
*Qurulmuş dəyə-dəyə,*
*Yetim qapına gəlib*
*Daşlara dəyə-dəyə.*

Çox vaxt elinyaşlı adamları, təpərli cavanlar dəyələri, alaçıqları qurarkən dodaqaltı bu bayatıları təkrar edərdilər.

Belə anlarda ərgən oğlanlar pərvanə kimi cəldlik göstərər, nişanlılar əl-qol açar, bir güldən min gül olar, gözaltı bir-birlərini süzər, deyikli qızlar isə üz gizlədib köks ötürərdilər. Bir sözlə, dəyə və alaçıqların qurulması ilə hamı, kiçikdən böyüyə məşğul olardı. Əslində bu proses özüdə xüsusi təcrübə tələb edirdi. Dəyələrin böyük və kiçikliyindən asılı olaraq əvvəlcə eni və uzununa ölçü ipləri tutular və iki tərəfdən bir-birinə eyni məsafədə aralı yan çubuqları, sonra da arxa və qabaqdan çubuqlar sancılar, əyilib xüsusi iplərlə bağlanar. Dəyənin bir tərəfində xırda çubuqlarla artırma "nəmilik "(yığıntı dərisi üçün yer) düzəldirdilər. Çubuqlar səliqə ilə bağlandıqdan sonra dəyənin üstü keçə qəliblərlə (baş keçəsi) örtülərdi. Varlı ailələrin dəyə örtüyü əsasən bütün keçədən ibarət olar, bununla yanaşı qonaqlar üçün xüsusi alaçıq da qurardılar. Bu barədə aşıq Hüseyn Bozalqanlı gözəl deyib:

*Sizin olsun, eyvan otaq, alaçıq,*
*Bizə bəsdi ya kölgəlik, ya dəyə…*

Yoxsul və ortababların dəyələrinin üst örtüyü küçə, yanları isə adətən kilim və çətənlə örtülərdi. Çətənlər ya qarğıdan, ya da yüngül itburunu və ya fındıq çubuğundan hazırlanar və xüsusi səliqə ilə iplə hörülərdi. Bu çətənlər ildə bir dəfə köç qabağı təmir edilər, hazır vəziyyətə gətirilərdi. Yaylaqda dəyələrin ətrafına tutulmuş çətənlərin üstündən səliqə ilə ləpir daşlar, bəzən də kəsmə çümbüzlər düzülərdi. Şiddətli yağışlar zamanı dəyənin içərisinə su axmasının qarşısını almaq üçün dəyələrin ətrafı boyu qarımlar qazılardı. Dəyələrin qabaq hissəsində xüsusi qapılıq qoyular, içərisində yük və qab-qacaq taxtları, çıraqlıq, motal və yağ qarınları üçün xüsusi yer ayrılardı. İyun ayının əvvəllərində yaylaqda şiddətli yağış yağardı, ancaq bu yağışlar Qaranlıq və tərəli dərələrinin buz örtüyünün əriməsinə ciddi təsir göztərməzdi. Arası kəsilməz yağışlar olanda cavanlar məhəllə-məhəllə qodu-qodu gəzdirərdi. Qodu-qodu isə xüsusi zövq və səliqə ilə hazırlanardı. Belə ki, bir metitlik ağaca baş, əl-qol düzəldər, bəzən oğlan, bəzən də qız paltarı

geyindirərək qapı-qapı dəstə-dəstə gəzər və pay yığardılar. Bu zaman mərasimdə iştirak edən gənclər xorla qodu-qodu nəğməsini oxuyardı.

*Qodu-qodumu gördünmü,*
*Qoduma salam verdinmi,*
*Qodum burdan keçəndə,*
*Qırmızı günlər gördünmü?*
*Yağ verənin oğlu olsun,*
*Verməyənin qızı olsun.*
*Adı Fatma olsun, başı keçəl olsun,*
*Təndirə düşsün, qırmızı bişsin!..*
– deyə ev sahibinə müraciət edərdilər. Elə vaxt olurdu ki, bir vedrədən artıq yağ yığılırdı. Uşaqlar yığılan yağı halva bişirtdirib doyunca yeyərdilər. Yağmurlu günlərdə bəzən də gənclər 40 dəyədən 40 damcı yağış suyu yığıb ocaqda qovurardılar. Bu tədbirlə yağış kəsmədikdə isə qurbağanı dalı üstə torpağa basdırar və bu mahnını avazla oxuyardılar:

*A qurbağa, ağla-ağla gün çıxsın,*
*Yer yarılsın sən çıx.*
Yaylaqda əsasən yanacaq üçün mal-qoyun təzəyindən istifadə edilirdi. Günəşli havalarda yaşlı qadınlar, oğlanlar və qızlar mal-qaranın örüş yerlərinə, qoyun arxaçlarına təzək yığmağa gedər, bəzən də qurumamış təzəkləri çevirər, sonrakı gün yığardılar.

Mənbə: **Hüseynqulu Məmmədli (Məmmədov) – *"Görüm Faxralının biri olsun beş…"***

## Faxralının torpağıdı bu yerlər

*(Rəşid Faxralı – "Oğuz eli Faxralı" kitabından)*

Faxralı qayım-qedim türk ellərindəndir. Borçalının (və deməli Faxralının da!) əksər adət-ənənəsinin oğuz tayfalarınm güzəranı ilə bağlı olduğunu Mirəli Seyidov, M.F.Qırzıoğlu, U.Şaiq, V.V.Bartold, G.Yoloğlu, Abbas Abdulla, Hüseynqulu Məmmədli, Valeh Hacılı və basqaları elmi dəlillərlə təsdiqləyib. Türkdilli xalqların ilkin yazılı abidələrindən biri olan "Kitabi-Dədə Qorqud"da işlədilən sözlərin, söz birləşmələrinin bir çoxu Faxralıda bu gün də yaşamaqdadır.

Borçalıdakı (həm də Faxralıdakı!) bəzi yer adlarının oğuzlarla səsləşdiyini, bəzi məqamlarda eyniyyət təşkil etdiyini göstərən Qorqudşünas Hüseynqulu Məmmədli yazır ki, Dədə Qorqud boylarında adı gedən yer adlarının 11-i müştərəkdir. Doğrudan da, Ağ qaya, Qara qaya, Quru dərə və s. kimi adlar olduğu kimi, Dumaneşən, Qazan qaya, Kor bulaq və s. kimi adlar təhrifə uğramış şəkildə Faxralıda da var.

Yeri gəlmişkən, bu və bu qəbil adların – toponimlərin, hidronimlərin, aykonimlərin… yozumlarının "Kitabi-Dədə Qorqud" kontekstində araşdırılması Faxralının tarixini gümanlardan qoparar, dəqiqləşdirilmə istiqamətində səmərəli olardı. Bununla bərabər, əksər adların yerin quruluşu, relyefi, rəngi ilə əlaqədar olduğunu da nəzərdən

qaçırtmaq olmaz. Hər halda, "…boylarda cərəyan edən hadisə və əhvalatlar, əsasən…Gürcüstan… bölgələrində cərəyan etmişdir" fikri ilə razılaşmaq lazımdır.

# Çaylar

Faxralı kəndinin ortasından keçən çay ***Dələver*** adlanır. Bu çayın mənbəyi kəndin arxa tərəfində olan yuksək dağlardan başlayır, mənsəbi kəndin içində başa çatır.

Yaz, payız aylarında yağıntıların gur vaxtında "selləmə"lər baş verdiyi zaman çay öz yatağına sığışmır və ətraf sahələri su basır.

İsti aylarda isə ***Dələver*** çayı quruyur. Çayın yatağına xalq arasında ***Dələver dərəsi*** deyirlər.

# Bulaqlar

## Ana bulaqlar

Faxralıda ilk dəfə içməli su probleminin həlli **1919-cu ildə 7 ədəd** bulağın çəkilməsi ilə başlanmışdır. Həmin bulaqlar aşağıda göstərilən "Ana bulaqlar" kimi tanınır:

1. **"Noy bulağı"** – 1919-cu ildə Koxallı nəsli (Hövüd Məhəmməd) tərəfindən çəkilib. Sonralar həmin bulaq Bahəddin Qənbərov tərəfindən nakam həyatdan köçmüş oğlunun şərəfinə əsaslı təmir olunmuşdur.
2. **"Koxallı məhəlləsindəki bulaq"** – 1919-cu ildə Hövüd Məhəmməd tərəfindən çəkilib.
3. **"Duzdaxlı bulağı"** – 1921-ci ildə Hasanöyü nəslindən Veysəlin vəsaiti hesabına Məmi kişi çəkdirib. Bulağın "əymə hissəsi" isə Qasımıllı nəslindən Məhəmməd kişi tərəfindən inşa olunub.
4. **"Qənsə bulağı"** – 1921-ci ildə Aşır oğlu Həci tərəfindən çəkilib.
5. **"Əhmədallılar məhəlləsindəki bulaq"** – 1920-ci ildə Məhəmməd Əhmədalı oğlu və Oruc Omar oğlu (Uğurlu Hüseynovun atası) tərəfindən çəkilib.
6. **"Kaxının bulağı"** – Kaxılar məhəlləsində yerləşir və 1947-ci ildə Gön Alının oğulları (İlyas, Məhəmməd, Əhməd, Nadir) və Yetər Məhəmməd qızı tərəfindən çəkilib.
7. **"Molla Qurbanın bulağı"** – "Qurbanov İlyas Qurban oğlunun (ləqəbi: Şandıl) evinin qabağı"nda yerləşir *(bu yer kənddə belə tanınır)*. 1922-ci ildə Molla Qurbanın rəhbərliyi ilə Kəblayi Qara (şair Qara Qərib) və Dəryahlının Dəryah tərəfindən çəkilib.

## Fərdi şəxslərin hesabına çəkilən bulaqlar

1. **"Şahbuzlunun bulağı"** – Tistel Mustafa tərəfindən çəkilib və nəvəsi Arzu tərəfindən isə təmir etdirilib.

2. **“Usubun bulağı”** – “Dambatın evinin qabağı”nda yerləşir *(bu yer kənddə belə tanınır)* və Şeşəpapaqlıların Usub tərəfindən çəkilib.
3. **“Mehrəlinin bulağı”** – “Təhlə Kazımın evinin qabağı”nda yerləşir *(bu yer kənddə belə tanınır)* və Babaşlının Mehrəli tərəfindən çəkilib.
4. **“Kamranın bulağı”** – “Şərifov Məmmədəlinin evinin yaxınlığındakı körpü”nün *(bu yer kənddə belə tanınır)* yanında yerləşir və Kamran Şükür oğlu Eyyubov tərəfindən çəkilib.
5. **“Arxac bulağı”** – Arxac məhəlləsində yerləşir və 1963-cü ildə Allahverdi Şahmuradov tərəfindın çəkilib.
6. **“Aşırlının bulağı”** – Veysəl Aşırov tərəfindən öz evinin qarşısına çəkilb.

## Rəhbər şəxslərin göstərişi ilə və ya məhəllənin hesabına çəkilən noylu bulaqlar

1. **Kasıb Hümbətin evinin yanındakı bulaq** – kəndin rəhbərliyi və kəndin vəsaiti hesabına çəkilib.
2. **“Amaşlının bulağı”** – Amaşlı məhəlləsinin yuxarı hissəsində yerləşir və məhəllənin vəsaiti hesabına çəkilib.
3. **Pircələrin Əlinin evinin qabağındakı bulaq** – kənd sovetinin sədri Mahal Əliyevin rəhbərliyi ilə çəkilib.
4. **Qubuşöyü məhəlləsində yerləşən bulaq** – məhəllənin vəsaiti hesabına çəkilib.
5. **Xosurlar məhəlləsində yerləşən bulaq** – məhəllənin vəsaiti hesabına çəkilib.
6. **“Ocağın” yanındakı bulaq** – Hümbət müəllimin rəhbərliyi ilə məhəllənin vəsaiti hesabına çəkilib.
7. **“Cabbar pres” deyilən yerdəki bulaq** – Kərim Gülməmmədovun rəhbərliyi ilə məhəllənin vəsaiti hesabına çəkilib.
8. **Məşədi Hüseynin evinin yanındakı bulaq** – Əli Xəlilovun rəhbərliyi ilə məhəllənin vəsaiti hesabına çəkilib.
9. **Kərimov Səməndərin evinin arxasındakı bulaq** – Kərimov Allahverdinin rəhbərliyi və Kərimov Bayraməlinin vəsaiti hesabına çəkilib.
10. **Musayev Tahirin evinin yanındakı bulaq** – Musayev Tahirin rəhbərliyi ilə məhəllənin köməyi ilə çəkilib.
11. **Qədirin** *(ləqəbi: Qəqi)* **evinin qabağındakı bulaq** – bulaq Qurbanov Seyran (Alqullar nəsli) tərəfindən çəkilmişdir. Bulağa ***Seyranın bulağı*** da deyirlər.

Kənddə iri həcmli bulaqlardan başqa, kiçik həcmli məhəllə bulaqları da var. Bunlara misal olaraq

1. Həbilov Allahverdinin
2. Babaşov Rəşidin (Şümü)

3. Həsən Hüseyn oğlunun
4. Quyraxlı məhəlləsinin
5. Dadaşların Bayramın
6. Nəbilərin
7. Balaməmmədlinin
8. Ayvazov Şuranın
9. Maşadıferanların
10. Zənci *(ləqəb)* Eldarın
11. Xudiyev Əlinin
12. Budaqov Sabirin və s.

məhəllələrdə olan kiçik həcmli bulaqları göstərmək olar.

Yuxarıda göstərilən bulaqlardan başqa, 1971-1972-ci illərdə kolxozun vəsaiti hesabına və kolxoz sədri Kərim Kərimovun rəhbərliyi ilə kənddəki hər bir ailənin həyətinə içməli su çəkildi. Bununla demək olar ki, kənd əhalisi içməli su ilə təmin olundu. Təəssüflər olsun ki, sonraki rəhbərlik həmin təminatı saxlaya bilmədi.

## Binə bulaqları

- **“Ayvazın bulağı”** – Qızılqayada Yahaların binə yerlərinin yaxınlığında Yahaların Ayvaz tərəfindən çəkilib.

- **“Qoşa bulaq”** – Ayvazov Nəbi tərəfindən əsaslı təmir olunub.
- **“Şamilin bulağı”** – Tənəklidə həkim Şamilin şərəfinə Əlizadə Oruc və onun övladları tərəfindən çəkilib.
- **“Allahmanın bulağı”** – Tənəklidə Güllərin Rüstəm tərəfindən çəkilib.
- **“Miyirdişdəki bulaq”** – Çöllüöyünün Aydın tərəfindən çəkilib.
- **“Təhməzdəki qoşa dağdağanın yanındakı bulaq”** – Koxallının Bayraməli tərəfindən çəkilib.
- **“Bejanazarandakı bulaq”** *(“Sarı bulaq” deyirlər)* – Bayrışdarın Oruc tərəfindən çəkilib.
- **“Miyirdişin Başbulaq deyilən yerindəki bulaq”** – Babaşov Rəşid (Şümü) tərəfindən çəkilib.
- **“Qaramadakı bulaq”** – Çöllü öyünün Oruc və Məhərrəm Qasımov qardaşları tərəfindən çəkilib.
- **“Qaramanın altı, çöl yerindəki bulaq”** – Qasımov Məhərrəm tərəfindən çəkilib.
- **“Daşkəsənin arxasındakı bulaq”** – əsası Aşırov Usub tərəfindən qoyulub, sonra isə Qazaxlılar tərəfindən nizama salınıb.
- **“Dumaneşəndəki bulaq”** – Əli Xəlilovun rəhbərliyi və kənd sovetinin vəsaiti hesabına çəkilib.
- **“Darvaz bulağı”** – Kəndin içində yerləşir.

- **“Torenin bulağı”** – Darvazdan yuxarı Darvaz dərəsinin üzərində yerləşir.
- **“Moşdunun bulağı”** – Darvaz dərəsinin baş hissəsində yerləşir.

## Xatirə bulaqları

1. **“İlqarın bulağı”** – Xəmmətdidə 20 Yanvar şəhidi İlqar Əhmədovun şərəfinə çəklimiş bulaq.
2. **“Səyyadın bulağı”** – Gavkeçiddə Səyyad Ələkbərovun şərəfinə çəklimiş bulaq.
3. **Təhməzdə “Daşınaltı”ndakı bulaqlar:** 1.Fəxrəddin Yasin oğlu Xəlilovun bulağı 2. Məhəmməd Abbasovun *(ləqəbi: Qaqarin) bulağı*
4. **“Fikrətin bulağı”** – yuxarı kənd qəbrstanlığında Məmmədov Fikrətin şərəfinə çəkilib;
5. **“Nabadov Dünnünün bulağı”** – Kiçik Qaradaşdakı bulaq.

Bu xatirə bulaqlarının hamısının yanında üstü örtülü istirahət stolları da qurulmuşdur.

Mənbə: **Allahverdi Kərimov** – “***Faxralı kəndinin tarixi haqqında yaddaş kitabçası***“.

# Qədim toy adət-ənənələri

Faxralıda toy adət-ənənələrinin böyük tarixi kökü vardır. Bu tarixi həqiqəti araşdıran Faxralının dəyərli oğlu Hüseynqulu Məmmədli tarixə səyahət edərək öz dövründə gördüyü, eşitdiyi toy adət-ənənələrini böyük ustalıqla “***Görüm Faxralının biri olsun beş****...*” əsərində qələmə alaraq bu günkü nəsillərə ərmağan etmişdir. Həmin adət-ənənələrin bir qismi hal-hazırda yenə də Faxralıda qorunub saxlanılır.

*REDAKTOR*

“Oğul toyu, qız toyu görəsən”, – xeyirxah adamlar, dostlar, qohumlar belə xeyir-dua verər, belə dilək edərdilər bir-birinə. Payız olanda isə bu diləklər, arzular çin olardı. Toylar başlardı, elçilər ayaq açardılar qız qapılarına. “**El köçüb, adət köçməyib”** – deyərək sözə başlatdılar. Niyə belə deyərdilər, el də yerində idi, adətdə yerində idi. Heç kəs dərindən mənasına məhəl qoymazdı. Qədimdən bəri bu sözlər dildə-ağızda gəzər, öz hökmünü göstərərdi.

Yaşlı qocalar belə nəql edərdilər ki, qədim zamanlarda hər tayfanın doqqazında – çadırına, alaçığına, binəsinə yaxın böyük daşlar qoyurlarmış. **Elçi daşları** adlanarmış bu daşlar. Elə ki, bir el ağsaqqalı, ağbirçəyi gəlib oturdu bu daşın üstündə, daş sahibi başa düşərdi ki, “döyülən qapı” onunkudur. Tayfada bir neçə ərgən-yeniyetmə qız olanda maraq daha da artarmış. Görəsən yenə hansı qızın baxtı açılıb, parlayan bəxt ulduzu kimindi? Qohumlara-qonşulara tez xəbər yayılardı. Adətən belə elçilər axşam üstü gələrdi. Tayfanın ağsaqqalları, ağbirçəkləri tərəfindən hörmətlə qarşılanar, evə dəvət olunardı. El arasında belə ilk görüşə “**ağız aramaq**” da deyərdilər.

İlk görüşdə razılıq verilməzdi. Qızın nənə-babası, tayfa ağsaqqaları müəyyən bəhanələr gətirər (qızın uşaq olması, qohum-əqrəbanın fıkrinin öyrənilməsi və s.) elçini qaytarardılar. Elçilər bir

neçə gündən sonra bir nəfər deyil, bir neçə nəfər yenə gələrdilər. Hətta elə vaxtlar olurdu ki, bu get-gəl, ayaq döymə aylarla çəkərdi. Nəhayət razılıq alınar, elçilərə şirin çay və ya bal şərbəti verilərdi. Və qıza ilk hədiyyə olaraq kalağay bağışlanardı. Bir neçə gündən sonra isə 10-15 nəfərin iştirakı ilə nişan taxılar, qıza üzük, başqa hədiyyələr verilərdi. Bu hədiyyələr içində mütləq güzgü olmalı idi. Güzgü xoşbəxtlik rəmzi hesab edilirdi. Uzun müddətli get-gələ səbəb isə adətən qız və oğlanın yad tayfadan olması zamanı yol verilirdi. Əksər hallarda oğlanı qohumdan evləndirərdilər. Əmiqızı, dayıqızı, xalaqızı və s. kənara çıxmazdılar. **Belə deyərdilər ki, yaxın qohumların nigahını göydə mələklər kəsib**. Bir də belə bir fikir vardı ki, **"süddü qoyun sürüdən çıxmamalıdır"**, başqasına qismət olmamalıdır. Oğlumuz da var, qızımız da var, yad qapılan döyməyə ehtiyacımız yoxdur.

Qızın da yaxşı, pis olmasını bilmək üçün müyyən meyarlar mövcud idi. El arasında çox zaman "**anasına bax, qızını al**" deyərdilər.

Qızı ata-ana seçərdi. Oğlanın, qızın rəyi çox zaman nəzərə alınmazdı. Yad tayfadan qız alanda qızın qoçaqlığı, ata-anasnın rahat, sakit, xeyirxah adam olması əsas sayılardı. "**Filankəsdə bir qız var, dili-ağzı özündə, yıxılı evin dirəyidi**" deyə ağız dolusu" təriflənərdi.

Yaxın qohumlar arasında, xüsusən gənc ailələrdə sövdalaşmaya da tez-tez rast gəlmək olardı. Belə sövdalaşma – əhdi-peyman əsasən hər iki ailədə uşaqlar dünyaya gəlməzdən qabaq bağlanardı. Şərtlə-şərdilər ki, kimin qızı olsa dostunun və ya qohumunun yeni dünyaya gələn oğluna versin.

Belə qohumlaşmaya el arasında "deyikli", "ad etmə", ya da 'beşik kərtmə" deyərdilər.

Qız 13-14 yaşa çatan kimi nişan taxılar, sonra da təzə qohumlar arasında gediş-gəliş başlardı. Bütün bayramlarda nişanlı qızın adı anlardı. Toy mərasiminə qədər iki dəfə qıza paltar aparardılar. Dəbdəbə ilə qız evinə qarpız, yemiş, üzüm verilərdi. Kəndə səs yayılardı ki, fılankəsin qohumları qız evinə 30-40 səbət üzüm aparıb. Nişanlı oğlan və qız evləri Novruz bayramını səbirsizliklə gözlər və xüsusi hazırlıq görülərdi. Elə ki, bayram gecəsi oldu, oğlan ətrafına tay-tuşunu yığar, məhəllədə, tayfada olan gənclər ya müxtəlif, növ-növ şirnyyatdan yaylıq bağlar, ya da boğazına qırmızı kalağay bağlanmış əmlik quzu aparılardı.

Gənclər qız evinə çatanda parta-part tüfəngdən atəş açar, qız evinə xəbərdarlıq edərdilər.

Toydan qabaq nişanlı oğlan və qızın bir-biri ilə görüşməsinə, söhbət etməsinə yol verilməzdi. Onlar uzaqdan-uzağa bir-birilərini görə bilər, yaxud da oğlan öz bacısından qıza sifariş göndərər, ürək sözlərini çatdıra bilərdi. Uzaqdan-uzağa oğlanla qızın göz–qaş işarəsi zamanı bəzən ciddi anlaşılmazlıqlar da olurdu. 70-80 il bundan əvvəl 80 yaşını keçmiş rəhmətlik nənəm Səkinə gənclərə belə bir məzəli əhvalat danışardı və deyərdi ki, yaxın qonşumuz və qohumumuz olan Məmmədhəsən öz əmisi qızı Səkinəyə nişanlı idi və onların yaxından görüşməsinə imkan verilmirdi. Bir gün təsadüfən Məmmədhəsən uzaqdan damın üstündə duran Səkinəni görür. Qız əvvəlcə Məmmədhəsənə gözlə-qaşla nə isə demək istəyir. Sonra qız iki əlini boğazının altına tutur və oğlana işarə edir. Məmmədhəsən nişanlısının bu hərəkətlərindən bərk qəzəblənir. Dərhal evə qayıdır. Nişanlısından imtina etdiyini anasına bildirir. Anası səbəbini soruşur, oğlan bildirir ki, bu gün təsadüfən uzaqdan qızı görüb, qız əli ilə ona işarə edib və iki əlini boğazının altına tutaraq bildirib ki, boğazının altından yara sallansın, sonra da başına qaralayıb. Məmmədhəsənin anası əvvəl təşvişə düşür, qızın yanına adam göndərir. Məlum olur ki, qız işarə ilə oğlana demək istəyib ki, ona o zaman dəbdə olan muncuqdan hazırlanmış boyunbağı

alsın. Bu hadisə 150-160 il bundan əvvələ aid olsa da, o dövr nişanlı gənclərin vəziyyətini göstərən hadisədir.

Nadir hallarda qızın ata-anasından xəlvət nişanlı qız və oğlanın görüşü də olurdu. Oğlan qızın xalasını, bibisini, yaxın qohumlarından birini dilə tutar, görüş üçün şərait yaradılardı. Oğlan şirniyyat və müxtəlif hədiyyələrlə qızın görüşünə gedərdi. Belə gizli görüşə "**qız yanına getmək**" deyərdilər.

Elə ki, vaxt-vədə çatdı, toy tədarükü görülərdi. Toylar adətən payızın sonunda başlardı. Əvvəlcə hər iki ailə razılığa gələr, toyun vaxtını təyin edərdilər. Sonra başlıq və toy xərci haqqında söhbət gedərdi. Söhbət zamanı ağsaqqallarla yanaşı, adətə görə oğlanın və qızın dayılarından biri də iştirak edərdə. Hər iki vəkil toyda qiymətli hədiyyə alardı. Qız vəkili qıza damazlıq ya bir düyə, ya da bir neçə qoyun verməli idi. Başlıq haqqı (süd pulu) nəqd pul, toy xərci – ətlik mal, düyü, yağ, un, çay, qənd, və s. alınardı. Qohumlar arasında ən çox qıza veriləcək paltar və gümüş kəmər üstə söhbət gedərdi. Gümüş kəmərsiz köçən gəlin kənddə tək-tək olardı. Yalnız həddindən artıq imkansız ailələr gümüş kəmər ala bilməzdilər. Kəmərin biri isə bir inəyin haqqına başa gələrdi. Qızıl üzük, sırğa, başqa zinət əşyaları haqqında söz-söhbət belə olmazdı.

Danışıqlar başa çatandan sonra ümumi razılıq əsasında qıza paltar aparılardı. El arasında buna "**paltar kəsdi**" deyərdilər. Paltar kəsdiyə çağrılan qadınlara qonaqlıq təşkil edilərdi. Əvəzində isə onlardan "**qayçı kəsməz**" adı ilə pul yığılardı. Yığılan pul qıza çatardı. Bu adət Faxrallda indi də qalmaqdadır.

Toya yalnız bəylə gəlinin ailəsi deyil, bütün qohumlar, sağdış və soldışların ailələri hazırlaşardı. Yaxın qohumların yaşlı və cavanlarına, subay oğlan və qızlarına təzə paltar tikilər, nəmərlər və hədiyyələr hazırlanardı.

Sağdış və soldışlar toya bir ay, iyirmi gün qalmış qonaqlıq təşkil edər, qız və oğlanı növbə ilə qonaq çağırardılar. Sonra da bu qonaqlığı qohumlar davam etdirər, onlara dadlı-ləzzətli yeməklər verərdilər. Çox zaman bu mərasim bir aydan artıq davam edərdi. Köçməzdən bir-iki gün qabaq isə qızın dayısı (vəkili) onu rəfiqələri ilə birlikdə qonaq çağırar, yemək təşkil edər və bir neçə saat toy çaldırardı. Bu qonaqlıq "**saz çıxarma**" adlanardı. Beləliklə, toy qabağı oğlanla qız yaxşıca cana-hala gələrdilər.

Qeyd etdiyimiz kimi, sağdış və soldış evində də toy üçün tədarük görülər, oğlana və qıza "**şax çıxarmaq**"dan ötəri irili-xırdalı şamlar alınar, lopa ağacı hazırlanar, şax bəzəmək üçün müxtəlif növlü meyvə, şirniyyat, bəzəkli yumurta tədarük edilərdi. Oğlanın və qızın bəzən də iki sağdışı və iki soldışı olardı. Belə hallarda toy daha dəbdəbəli keçərdi. Dörd evdən şax çıxardı.

Toya başlamazdan bir neçə gün əvvəl oğlan evindən qız evinə yemək, toy xərci aparılardı. Hamıya məlum olsun deyə, toy xərcini və yeməyi qara zurna müşayət edərdi. Toy azuqəsi arabaya yüklənər, ətlik mal arabanın dalına bağlanardı. Oğlan vəkili toy xərcini və yeməyi özü aparardı. Danışıq zamanı oğlan evi tələb olunandan az un, düyü, yağ apardıqda, yaxud ətlik malın çəkisi aşağı olduqda bəzən söz-söhbətlər baş verərdi.

Qız evinin toyu oğlan evinin toyundan əvvəl başlardı və üç gün üç gecə davam edərdi. Birinci gün hazırlıq olardı, həm də qızın və rəfiqələrinin əllərinə, ayaq barmaqlarına xına yaxılardı, buna "**xına yaxdı**" deyərdilər. Qız toyuna yalnız qadınlar dəvət olunardı. Toyun ikinci günü yığnaq, axşam qız mağarı olardı. Üçüncü gün isə qızın sağdışları və soldışları şax çıxarardılar,

həm də qızlara yemək verilərdi. Şax qaranlıq düşəndə, əllərində şam, cərgə ilə düzülmüş və bir-birinin qolundan tutan qızların müşayəti ilə qız evinə gətirilərdi.

Qız toyunda əsas fəallıq qızlarda, qadınlarda olardı. Həm gündüz məclisinə, həm də mağara qızın yengəsi rəhbərlik edərdi. Ancaq qadınlar adət üzrə üzü duvaxlı, əllərində dəsmal oynardılar. Səbəb də o idi ki, zurnaçılar dəstəsi kişilərdən ibarət olardı. Mahir oyunçular seçilər, beli gümüş kəmərli, əli xınalı gəlinlərin, nişanlı qızların üzünə kalağay örtülər, yengə əllərindən tutub meydana çıxarardı. Oyun agar ritmli havalarla başlardı.

"Ağır qaradonlu" havasında meydana çıxarılan əli dəsmallı oyunçular əvvəlcə qarşı-qarşıya gələr, musiqinin ahənginə uygun ayaqlarını tərpədər, sonra hər iki əllərini yanlarında yavaş-yavaş aşağı-yuxarı hərəkət etdirər, daha sonra əllərini bellərinə qoyar üzbəüz,bir-birinə yaxınlaşar, əvvəl əllərinin birini, sonar da digərini yuxarı qaldırıb başlarının üstündə dəsmal oynadardılar. Bu qədim havaya ən çox yaşlı və orta yaşlı qadınlar oynardılar. Sonra da toyda qadınların əsil oyun yarışları başlardı. Mahir oyunçuların öz sevdikləri havaları vardı. Qız toylannda "Aman Pəri", "Ağız a Yetər", "Ağır qaradonlu", "Yüngül qaradonlu", "Arazbarı", "Gəl məni də apar, a dilican", "Urfanı' və s. onlarca birbirindən təsirli havalar çalınardı. Yengə nişanlı qızlara da geniş meydan verərdi. llk növbədə onların oynamaları oğlanların yaxın qohumları (bacısı, anası, xalası, bibisi) tərəfındən xahiş edilər, nişanlı qızlar oynarkən oğlanın qohumları tərəfindən "**quyruqlanardı**". Daha doğrusu, üzlərinə örtülmüş kalağayın ucuna pul, qollarına böyük kalağay, bəzən də bahalı parçadan donluq bağlanardı. Beləliklə, bir qız toyunda bəzən 15-20 nişanlı qız quyruxlanar, toyda iştirak edən nişanlı qızların heç biri tay-tuşu qarşısında məyyus qalmazdılar.

Bəzi hallarda qadınlar, qızlar da yallı gedərdilər. Yallıya təcrübəli oyunçular başçılıq edər, orta yaşlı qadınlar ağzı yamşaqlı, cavanlar üzü örtülü olardı. Yallı havasını sazandalar xüsusi zövqlə çalar, havadan-havaya keçərdilər.

Həmin günün axşamı qız mağarı olar, eyni adətlə səhərə qədər davam edərdi.

İstər qız, istərsə oğlan evində toy mərasimi zurnaçıların müşayiəti ilə səhər tezdən hələ adamların bir hissəsi yuxuda ikən "sabah sazının" sədaları ilə başlardı. Sazandalar qara zurnada bu havanı elə məharətlə çalardılar ki, bütün yatanlar oyanar, qonşular uşaqdan-böyüyə toy qapısına axışardı.

Qız evində toy mərasimi başa çatan kimi oğlan evində davam etdirilərdi. Burada da birinci gün ümumi şənlik, ikinci gün yığnaq və oğlan mağarı, üçüncü gün cıdır və axşam bəylərin müşaiəti ilə sağdışların, soldışların şaxı, gəlin və onun cehizi gətirilərdi.

Oğlan evində də üç gün zəhər tezdən "sabah cazı" havası ilə başlanan toylar gecəli-gündüzlü davam edərdi. Burada əsas meydan güləşənlərə verilərdi.

Yuxarıda qeyd etdiyimiz kimi, birinci gün toy çalınar, yaxın qohumlar, dost-tanışlar yığılar, cavanlar oynar, güləşər, axşamlar mağar başlardı.

İstər qız, istər oğlan mağarı böyük, qara damlarda, mal tövlələrində keçirilərdi. Axşamdan başlanan mağar səhərə qədər davam edərdi. İkinci gün bir neçə saat fasilədən sonra sazandalar yenə gələr, qara zurnanın səsi kəndə yayılardı. Günortadan sonra oğlanın sağdışı və soldışı evlərində qonaqlıqlar başlar, sazandalar çalar, cavanlar məclisi qızışdırardılar. Oğlan toylarında

kəndin say-seçmə, qoldan qüvvətli cavanları bir ənənə olaraq meydana çıxar, var-gəl edər, özlərinə bərabər güclü və basılmaz xasım istərdilər. İndi o aylar, illər xatirələrə dönüb. Bir dəfə də olsun arxası yerə dəyməyən, rəsmən pəhləvanlıq edən və müasirlərindən fərqlənən həddindən artıq iri gövdəli Feran, el toylarında meydanlara sahib kəsilən Abdıoğlu Bədəl, Tanıquluoğlu Həsən, Baytallıların Alval, Budalıların Alı, Yahyahların Rəhim, Qazaxlıların Hətəm, Qasımlıların Köşə Bayram və onlarla tökmə bədənli, pəhləvan cüssəli, yenilməz gəncləri zaman-zaman "əcəl aldı, yer gizlədi", kimisi sonralar Sovetlər imperiyasının haqsız qəzəbinə uğradı, kimisi 1941-1945-ci il almanlara qarşı müharibəyə getdi, bir daha geri dönmədi, kimisi də vaxtsız dünyadan köçdü.

Güləş arası hərdən yallı başlardı. Yallıya kəndin sayılan cavanları başçılıq edər, yallı başı seçərdilər. Yallı başı iki nəfərdən ibarət olardı. Hərəsi cərgənin bir başında, əllərində yumşaq çubuq oyun zamanı cərgənin pozulmasına yol verməzdilər. Yallı çəkərkən kim cərgəni pozsa yallı başı çubuqla onun ayaqlarına amansızcasına döyərdi. Yallı zamanı bəzən ürəklərində şəxsi ədavətləri olan gənclər ədavətlərini büruzə verərdi. Və bütün tayfa ayağa qalxardı.

Oğlan toyunun ikinci günü yığnaq olar, nəmər verilərdi. Məclisə isə evbaşı bütün kənd dəvət olunardı. Əsas yemək plov və bozartma ət hesab edilərdi. Havalar yaxşı olanda yemək açıq havada, həyətdə münasib yerdə, yağmurlu, qarlı rüzgarda isə böyük damlarda, bəzən də üstü örtülü talvarların altında təşkil olunardı. Yerə uzunu 1045 metr olan qabaq süfrələri (yerdə toxunma) sərilər, iki nəfərə bir fətirin üstünə plov tökülər və bir qab ət qoyulardı. Plov və ət yalnız əl ilə yeyilərdi.

Toy kağızını kənd kovxası paylardı. Kovxanın "səlahiyyətləri" böyük idi. O, toy kağızı paylar, oğlanın və qızın sağdışları, soldışları evindən şax gətirər, məclisdə verilən nəmərləri səsləndirər və qarşısına qoyduğu siniyə yığardı. 1941-ci ilə qədər kənddə bu vəzifəni Mazan Qurban adlı ayaqdan yüngül, nurani bir qoca icra edərdi.

Toyda nəmər yığan kovxa qarşısına sini qoyar, sininin üstü qırmızı kalağayla, yaxud da qırmızı atlasla örtülərdi. Sininin içərisində şirniyyat qoyulardı. Məclisdə iştirak edənlər nəmər verdikcə kovxa nəmərin miqdarını və nəmər verənin adını uca səslə elan edər, "filan-kəsin evi abadan 100 manat, çox bərəkət, oğlunun, qızının toyuna qismət olsun" deyərdi. Və bütün nəmər verənlər belə xalqa çatdımlardı.

**Toya gözəllik verən ənənəvi mərasimlərdən biri də şax çıxarmaq idi.** Şax 70–80 sm uzunluğunda ağaclardan hazırlanardı. Eyni ölçüdə olan 4 ağac parçası stol ayaqları kimi dörd künc yuxarıdan və aşağıdan bir-birinə bağlanırdı. Ağac sütunlara 4-5 sm uzunluqda çubuqlar keçirilirdi. Bu çubuqlar konfet, yumurta, alma və digər dadlı təamlarla bəzənərdi, baş hissəsinə iri alma və rənglənmiş yumurta keçirilərdi. Şaxın ətrafında yuxarıda qeyd etdiyimiz kimi, qız şaxında qızın rəfiqələri, oğlan şaxında isə oğlanın dostları, həmyaşları 40-50 nəfər, bəzən də daha çox qol-qola verər əllərində şam, bəy durardılat. Bəylər sağdış və soldış evindən qızın və oğlanın evinə qədər şam yandırar, cərgəni pozmadan yol gedərdilər. Şaxın və bəylərin qabağınca lopa aparılardı. Lopa 5-6 metr uzunluğunda düz ağacların (sırıx) ucuna ya əski, ya da mal peynindən hazırlanmış kərmə bağlamaqla hazırlanardı. Lopanın sırığının yuxarı hissəsinə nazik, bir metrlik çubuq, çubuğun ucuna isə alma keçirilər, yol boyu almaya atəş açılardı, kim hədəfi vursa idi ona mükafat verilərdi.

Cavanlar şaxm qabağını bir neçə yerdə kəsər, güləşər və toy sahibindən nəmər alardılar. Şax bəy qapısına çatanda bəylərdən nəmər yığılardı. Adət üzrə ilk nəməri bəyin sağdışı və soldışı salar, sonra da qalan bəylər növbə ilə hərəkətə gələrdilər.

Qız şaxı da eyni adət üzrə gətirilər, rəfiqələr əlləri xınalı bir- birinin qoluna girər, cərgə ilə düzülər, şam yandıra-yandıra sağdış-soldış evindən qız evinə kimi cərgəni pozmadan qara zurnanın müşayiəti ilə oynaya-oynaya gedərdilər.

Oğlan mağarının səhərisi, yəni üçüncü gün günortadan sonra cıdır başlardı. Cıdır üçün ən yaxşı atlar seçilər, hədiyyələr aynlardı. Cıdır 45 km məsafədən gələrdi. Sürəkdə bəy qapısına birinci çatan atın boynuna kalağay bağlanar, bəzən də erkək bağışlanardı.

Yaşlı qocalar nəql edirdilər ki, keçmiş zamanlarda kəndin varlı adamlarının sürək zamanı atını keçmək böyük münaqişəyə səbəb olarmış. Hətta bəzi dikbaş, "qan-qan" deyən adamların atlarını cıdırda keçən adamlar arxadan atəşə tutularmış, ya da bir neçə gün keçəndən sonra atı ilə birlikdə xəta yetirilərmiş.

Tarixi qaynaqlardan aydın olur ki, keçmiş toylarda Borçalıda cida oyunu da dəbdə olub. 1915-ci ildə Tula əhərində Kəpənəkçi Emin Ağa Acalov haqqında nəşr edilmiş kitabda, rus jurnalisti Kanevski yazır ki, Emin Ağa bir toy məclisində cida oyunu zamanı 12 nəfər rəqibinə qalib gəlmiş və bir nəfər gənc rəqibini isə cida ilə elə vurmuşdu ki, həmin zərbədən rəqibi atdan yıxılmış və uzun müddət müalicəyə məruz qalmışdı. Emin Ağa isə toy sahibi tərəfindən bu qələbəyə görə yüksək mükafatlanmış, hətta toy sahibinin qadını göstərdiyi igidliyə görə ona yeganə qızı ilə evlənməyi təklif etmişdi.

Görünür, at üstü cida oyunu Borçalıda get-gedə unudulmuş, sonralar toy şənliklərində təsadüf edilməmişdi.

Cıdır olan günün axşamı qız köçərdi. Əvvəlcə cehiz gətirilərdi. Keçmişdə cehiz bir neçə dəst yorğan-döşək, gəbə, kilim, çuval, böyük və kiçik xurcun, farmaçdan ibarət olardı. Əlavə mis qabqacaq (sənək, müxtəlif həcmli qazanlar, sinilər, sərinç, badya və s.) verilərdi. Qızın ailəsi cehizə damazdıq mal da əlavə edərdi. Cehizin üstündə qızın vəkili oturar, oğlan qapısına çatanda nəmər almamış arabanı boşaltmağa icazə verməzdi.

Gəlin köçərkən oğlan evinə çatana kimi cavanlar tərəfindən bir neçə dəfə toyun qabağı kəsilər, nəmər alınardı.

Bu havaya "**gəlin atdandırması**" deyilərdi. Hava ağır və təsirli oldüğü üçün çalınarkən qızın ata–anası, yaxın qohumları özlərini ələ ala bilməyib ağlayardılar.

Köç qabağı gəlin bəzədilərdi. Məşşatələr çağrılar, gəlinə xüsusi bəzək verər, toy paltarı geydirərdilər. Gəlinin belinə gümüş kəməri ya bəyin kiçik qardaşı, ya da yaxın qohumlarının yeniyetmələrdən biri bağlardı.

Qız yengəsi qızın cehizinin üstünə oturar və gəlin olan otagi arxadan bərk bağlar, oğlan evinin nümayəndələrindən "**qapi basması**" nəməri almamış nə cehizin, nə də gəlinin evdən çıxarılmasına raziliq verməzdi. Nəmər aldıqdan sonra qız yengəsi də oglan yengəsi ilə bərabər gəlinin qollarından tutaraq ata evindən xeyir-dua ilə çıxarar, bəzədilmiş faytona (keçmişdə gəcabəyə) mindirərdiiər. Gəlinin yanıda oturan yengələrdən biri əlində güzgü tutardı. Əlavə edək ki, gəlin yaxın məsafədən gətiriləndə onu bəylər müşayiət edər, əvvəlinci cərgədə əli şamlı qızlar, sonrakı cərgədə isə bəy duran əli şamlı oğlanlar gedərdi. Qız oğlan evinə gələndən sonra sağdışların və soldışların səlahiyyəti bitərdi.

Elə ki, qız oğlan evinə çatdı, qaynana qızın ayağının altına boşqab atardı, qız faytondan düşən kimi ayağı ilə boşqabı sındırardı. Daha sonra qapıda bir müddət qara zurna məhəlləni başına götürər, qohumlar, qonşular sıra ilə oynayar, ortaya qaynata, qaynana çıxarılardı. Onlar oynayarkən başlarından şabaş tökülərdi. Gəlin bəy evinə girən zaman ayağının altında erkək kəsilər, o, ayaqlarını qana bulardı. Yaşlılar xeyir-dua verərdilər. Gəlinin başından aşağı çəngə ilə pul, konfet, şirniyyat, qənd tökərdilər. Körpə uşaqlar bir-birinə dəyə-dəyə yığardılar.

Bəy otağının yanında oğlan və qız yengəsi səhərə kimi gözlər, səhər qızın bəkarətli olmasına şahidlik edər, ata-anaya, qaynanaya, qaynataya göz aydınlığı verərdilər. El adətinə görə, qiz köçəndən sonra bir neçə gün ata evindən qıza xüsusi yemək hazırlanıb göndərilərdi.

Toy valideynlərin arzu etdiyi kimi, ürək dolusu sevinciə başa çatdıqdan sonra ata-analar sazandalara – qara zurnada 6 gün 6 gecə fasiləsiz gözəl el havalarını xüsusi zövqlə ifa edən Sadix və Vəli kişiyə, dəfi özünə, özü dəfinə yaraşan Kaxı Məhəmmədin oğlu Əhmədə razılıqlarını bildirib, xüsusi hədiyyələrlə yola salardılar.

Bu el toyunun bir tərəfi idi. İkinci və daha maraqlı tərəfi aşıq məclisləri idi (Aşıq məclisləri bölməsinə keçid).

Mənbə: **Hüseynqulu Məmmədli (Məmmədov) – *“Görüm Faxralının biri olsun beş…”***

# Toylarda aşıq məclisləri

Faxralıda ən imkansız ailə belə, aşıq məclisi olmadan nə kiçik toy, nə də böyük toy məclisi keçirməzdiiər. Tarixən toya dəvət olunan yaşlı adamlar, hətta bəzi gənclər də günlərlə davam edən aşıq məclislərində, həvəslə iştirak edərdilər. Belə məclislərdə isə dastan danışılardı. Kənddə

- Qubuş oğlu Oruc,
- Kələş oğlu İsmayıl,
- Minalının oğlu Hümbət,
- Hüseynqulu oğlu Məmməd,
- Kaxının oğlu Əhməd,
- Tanrıqul oğlu Həsən

və başqaları kimi çox saylı dastanlarımızı əzbərdən bilən həvəskarlar var idi.

1940–cı illərə qədər toy məclislərində xalq dastanlarının ən mahir ifaçısı **Şair Nəbi** idi. O, 40-dan çox dastan bilirdi. Şair dastan danışarkən dinləyicilər ona heyranlıqla qulaq asardılar. Şair Nəbi Qurbani, Abbas Tufarqanlı, Aşıq Qərib, Kərəm, Dilqəm, Mehdi bəy, Alıxan, Nəcəf haqqında olan dastanları üç gecəyə danışardı. “Koroğlu” dastanın qolları isə onun repertuarının əsasını təşkil edərdi.

1940-cı ilə kimi Faxralıdan kənar kəndə qız verməzdilər. Kənardan gələn gəlinlər isə barmaqla sayılardı və nadir hadisə hesab edilərdi. Gəlinlər hansı kənddən-obadan gəlmişdilərsə, o adla da adlanırdılar. Türkiyədən iki gəlin .. biri Aşırlıya, digəri Alqullara, Borçalıdan üç nəfər,

Sadaxlıdan üç nəfər, Tiflisdən bir nəfər gətirilmişdi. El arasında onlar Osmanlı qızı, Borçalı qızı, Sadaxlı qızı, şəhərli qızı kimi çağrılardı.

Xatirimdə qalan təmtaraqlı el toylarından biri də 1927-ci ildə yaylaqda Faxralı kəndinin katxudası Təhməzqulu kişinin oğlu Nadirin toyu idi. Nadir Cücə kəndindən adlı-sanlı nəsildən olan Hilal adlı qıza nişanlanmışdı. Yaşlı qadınlar və kişilər qızın hədsiz dərəcədə gözəl olmasından danışardılar. Bu illərdə Şura hökuməti hələ Gürcüstanda yenicə bərqərar olmuşdu. Kəndlərdə, o cümlədən də Faxralıda varlı və nüfüz sahibi olan adamlara qarşı xüsusi siyasət aparılırdı. Hələlik onlara dəyib-dolaşan yox idi. Hətta Təhməzqulu kişinin böyük oğlu İman kənd şurasına sədr seçilmişdi. Ona görə də kəndin imkanlı adamları bir qədər yeni hökumətə inanırdılar. Əllərini iş-gücdən soyutmur, oğul evləndirir, qız ərə verir, hətta əvvəlki illərdə olduğu kimi dəbdəbəli toy məclisləri də keçirirdilər.

Toy üçün yaylaqda əvvəlcədən ciddi hazırlıq işi görülmüşdü. Aralıq deyilən yerdə, Hasannı tayfasının dədə-baba yurdunda böyük alaçıqlar, çadırlar qurulmuşdu. Borçalı kəndlərinin ən adlı-sanlı adamları toya dəvət olunmuşdu. Avqust ayının ortaları olduğundan kəndin bütün yeniyetmə cavanları və yaşlı ailə başçıları yaylaqda idi.

Arandan yaylağa bir neçə bəzəkli fayton da gətirilmişdi. Onlardan biri də varlı adamları həmişə şəhərə, bazara aparan, kəndin toylarında qız evindən gəlin gətirən Səfər kişinin faytonu idi.

Gəlin Cücə kəndindən yaylağa yengələrin və cıdırçıların müşayitilə faytonla gətirildi. Cıdırçıların əvvəli Qaranlıq dərənin ayağında olanda, axırı hələ Cücə kəndindən çıxırdı.

Məclisi el aşıqları aparırdı. Aşıq məclisi üçün xüsusi çadır ayrılmışdı. Məclisə sazın-sözün sərrafları, xırıdarları yığılmışdı. Bu mötəbər məclisdə Faxralı Şair Nəbi, Aşıq Bayramla yanaşı Borçalının və Göycə mahalının adlı-sanlı sənətkarları da istirak edirdilər. Dünyagörmüş məclis iştirakçıları danışırdılar ki, hələ yaşadıqları müddətdə iştirak etdikləri açıq məclislərinin heç birindən belə zövq almayıblar. Məclis üç gün davam etmişdi. Şair Nəbi dinləyicilərin xahişinə görə dastan danışmış, Göyçədən dəvət olunan aşıqlar Aşıq Alının, Aşıq Ələskərin "Görüm səni var ol yaylaq", "Dağlar" qoşmalarını oxumuş, "Dəli Alının toyu" dastanını, Dərəçiçəkli Nağı bəyin oğlunun toyunda Dollu Abuzərin başına gələn əhvalatlardan, qısqanclıq üzündən başqa bir toy məclisində Aşıq Şenliyin zəhərlənməsindən maraqlı epizodlar söyləmişlər.

Səsinin gur zəguləsi ilə Faxralı Aşıq Həsəni xatırladan Aşıq Sadıq Sultanov Şair Nəbidən icazə alıb o üçün maraqlı olan "Dünya" Eləsı val", "Qocalıq" qoşmalarını avazla oxumuşdu. Sonra da Aşıq Sadıq qardaşı Məmmədlə üz-üzə dayanaraq Sair Nəbinin dagların hüsnü-təravətinə qoşduğu şerləri sazın sehrli ahəngi ilə birləşdirmişlər:

**Aşıq Sadıq:**

*Getdim, gördüm bir safalı yurd olub,*
*Əməli, aqıbəti düz olan dağlar.*
*Hər şeyə bərabər gülab suları,*
*Qaynar bulaqları göz olan dağlar.*

**Aşıq Məmməd:**

*Duman-çisgin ətrafını bürümüş,*
*Gahdan bir açılar talalı dağlar.*

*Əlvan çiçəklərin zənbur müşəsi,*
*Qondarı pətəkdən bal alı dağlar.*
**Aşıq Sadıq:**

*Sanasan bağçadı, saynşır güllər,*
*Bir ayna qabaqlı sabbikar söylər,*
*Tələsmə, nazənin, tez ola rüzgar,*
*Gün çıxar bulutdan yaz olan dağlar.*
**Aşıq Məmməd:**

*Səhər-səhər dan yelləri əsəndə,*
*Şərbət bulaqların tən edər qəndə,*
*Yığılar gözəllər dövr edər səndə*
*Çiçəkli, çəmənli gül olan dağlar.*
**Aşıq Sadıq:**

*Yaxşı bildim növarağını, işini,*
*Vaxt olanda yurddan-yurda daşını.*
*Duman-çisgin bürümüşdü başını,*
*Açılmaz qabağı naz olan dağlar.*
**Aşıq Məmməd:**

*Açılıb nəbatat hər irəng güldü,*
*Ötüşür bülbüllər nə şirin dildi,*
*Ayaqdan başına üç mənzil yoldu,*
*Köhlən ayağından nal alan dağlar.*
**AŞIQ Sadıq:**

*Mən Nəbiyəm, gəlib burda yaylaram,*
*Səyyad olsam bina salıb oylaram,*
*Bu cəh-cəlalını tərif eylərəm,*
*Düşərsən dillərə söz olan dağlar.*
**Aşıq Məmməd:**

*Köçüb ellər yurddan-yurda qonubdu,*
*Sürüb səfasını heyran qalıbdı.*
*Neçə pəhləvanlar məskən salıbdı,*
*Bəllidi hasarın, qalalı dağlar.*
**Aşıq Sadıq:**

*Şair Nəbim səndə gəzdi bir zaman,*
*Çəkilməz sinəndən çiskinli duman,*
*Çuxur günavarda bənövşə, reyhan*
*Süsənli, sümbüllü, lalalı dağlar.*

Axırıncı gün məclisin sonuna yaxın ağsaqqalardan kimsə Faxralı meşəsində Aşıq Şenliyin gənclərlə ova getməsi və ov zamanı onların göstərdiyi məharəti barədə qoşduğu dastanı təfsilatı ilə danışmağı və oxumağı Şair Nəbidən xahiş etmiş, Şair Nəbi bu təklifi məmnuniyyətlə qəbul edərək, dastanı Aşıq Şenliyin bu sözləri ilə bitirmişdi:

*Şefil Şenlik bu lisanı gördü xoş,*
*Görüm Faxralının biri olsun beş.*
*Abbas tülək tərlan, Musa qızıl quş,*
*Əhli-mərfət kamandan gördünmü?!*

Məlumat üçün bildirim ki, Aşıq Şenlik Türkiyənin Çıldır vilayətindən idi. Deyilənə görə, Borçalı mahalı ilə keçmiş soy bağlılığı da var imiş. Borçalıda saz-söz həvəskarları onu çox sevirdilər. Ona görə də tez-tez Borçalıya gələrmiş. Yaşlı adamların dediklərinə görə, Faxralıda bir neçə dəfə Aşıq Orucun və Əfəndinin qonağı olub. O, Şair Nəbinin istedadını yüksək qiymətləndirmişdi. Sonuncu dəfə Faxralıda 1914-cü ildə olmuş və kənd cavanları ilə meşəyə ova gedib. Aşıq Şenliyi Borçalıda sevdirən bir də onun cəsarəti, qorxmazlığı və türk qeyrəti idi. Onun çar Rusiyasının siyasətinə qarşı mübarizə aparan Borçalı qaçaqlarını türk çavuşu qarşısında mədh etməsi və qoşduğu "dastanı" tez-tez sifariş verərlərmiş:

*Al-Osman elinə talan saldılar,*
*Urum ölkəsinə qılınc çaldılar.*
*İran ölkəsindən xaraç aldılar,*
*Şahı da qoydular yasa, əfəndim!*

Şair Nəbi böyük həvəslə məclisdə bu dastanı da danışır, sonra məclısı bır dastana sığmayan bəyin toyunun tərifı ilə başa çatdırır, yekunlaşdırır. Bəyın qardaşları, yaxın və uzaq qohumları hər biri ayrılıqda Şaır Nəbıyə və qonşu rayonlardan dəvət olunan aşıqlara ağır hədıyyələr bağışlayırlar. Təəssüf ki, zamanın tərsinə dönən gərdişi Aşıq Ələsgərin "Dəli Alının toyu", Şair Nəbinin "Uzunbaş oğlu Məhəmmədin toyu"nu tərif edən dastanlar kimi bu dastanın da uzun ömürlü olmasına imkan vermədi. Atalar yaxşı deyiblər ki, "Sən saydığını say, gör fələk nə sayır", bu təmtəraqlı toy məclisi hasanlıların son şadlıqları oldu. Hamının qibtə etdikləri toyun bəyi Nadir, öz sevgilisi ilahə gözəli Hilal xanımla ancaq üç il bir yastıqda baş qoydular. Az keçmədən elə bir qorxulu, səksəkəli dövr başladı ki, nəinki bu toyun tərifi və xoş təəsüratları yaddan çıxdı, unuduldu, hətta bu tayfanın adını çəkənlər belə, xalq düşmənləri kimi təqibə məruz qaldılar.

Eldə adət-ənənəyə beləcə hörmət edilərdı, ağsaqqal, agbırcək yolu gözlənər, sözləri qiymətli tutulardı. Nəsildən-nəsilə qeyrət, namus, el şərəfi hamı tərəfindən qorunardı. Qorqud nəfəsli, Qorqud təpərlli kişilır elə-obaya, nəslə, tayfaya ağsaqqallıq edər, şərin, böhtanın ayaq tutub yeriməsinə imkan verməzdilər.

Mənbə: **Hüseynqulu Məmmədli (Məmmədov) – *"Görüm Faxralının biri olsun beş…"***

# Toya qədərki adətlər

**Beşik kəsmə (beşikkərtmə)** nişanlandırmanın bir formasıdı. Tədqiqatçılar bu adətin çox-çox qədim tarixlərlə səsləşdiyini, əksər türksoylu xalqlara xas olduğunu təsdiq ediblər, Bu adət Faxralıda təkəm-seyrək şəkildə indi də yaşamaqdadır. Türk alimi O. Şaiq "Dədəm Qorqudun kitabı" əsərində yazır ki, yaxın qohumlar, bir-birinə ehtiram bəsləyən ailələr hələ körpələri beşikdə ikən onları nişanlandıracaqlarına söz verirlər (bəzən belə əhd-peyman uşaq dünyaya gəlməmişdən əvvəl də bağlanır); beşikkəsmə əhdpeymanla bağlı olan qədim adətlərdəndir.

**Ad eləmə** beşikkəsmənin bir qədər fərqli formasıdır: valideynlər (atalar) arasında belə əhd-peyman uşaqlar müəyyən yaş həddinə (13-15 yaş) çatanda bağlanılır, uşaqları bir-birinə ad edilirlər.

Elə ki, oğul böyüyür, oğul atası nəyisə bəhanə eləyib qızın atası ilə görüşür (təbii ki, bu haqda ər-arvad arasında əvvəlcədən razılaşma olur). Keçmişdən-gələcəkdən danışdıqdan sonra oğlanın atası mətləb üstünə gəlir, vaxtilə aralarında olmuş söhbəti xatırladır. Əksər vədlərə, əhd-peymana əməl olunur, elçiliyə razılıq verilir. Yeri gəlmişkən, beşikkəsmə və adeləmə **deyikli** kəlməsi ilə ümumiləşdirilir.

Oğlanın deyiklisi yoxsa, anasının gözləri qonum-qonşu toylarında, bulaq üstündə "dörd olur"; ana qız sonulamağa başlayır. Məsəl var deyirlər: Çox sonulayan ya kora rast gələr, ya da keçələ.

Oğlu lüyəndə olan ana hara, bulaqda növbədə dayandı hara? – cavan qızlar onun səhəngini, vedrələrini növbəsiz-filansız doldurub yola salırlar. Nə isə, bulaq üstə, toyda-nişanda könlünə yatan qız oldusa, ana onun kimliyiylə maraqlanır. Kənd yeridi, qızın ailəsinə öz ailələrinin rəğbəti, ehtiramı varsa qızı göz altılayır ("Anasına bax qızını al" deyiminə tapınanlar da olur); **gözaltılama** nəzərdə tutma anlamındadır. Sözün kəsəsi, "yerə göyə sığışmayan" ananın könlünə yatan qız "qızlar bulağından su içibsə", onda ana əvvəl əri ilə, ərinin razılığı ilə oğlu ilə "dərdləşir", məqsədini oğluna da bildirir… Oğlanın anası bir bəhanə ilə gedir qız evinə, qızın anasının (xalasının, böyük bacısının) yanına ağız aramağa.

**Ağız arama** qız evinin fikrini öyrənmək deməkdir. Qız hələ uşaqdırsa, oğlanın anası ağızaramanı təxirə salır, vədə gözləyir… Elə kı, qız anası "qızımızın deyiklisi yoxdu, ancaq atası ilə da məsləhətləşim. Ağsaqqallarımıza gənəşməmiş heç nə deyə bilmərəm. Sonra sənə bir xəbər çatdıraram", – deyir, deməli işin düzələcəyinə güman var. Qızı deyiklidirsə, yaxud qızı həmin oğlana vermək istəmirlərsə, bu gəliş (ağız arama) "bir daş altda, bir daş üstə" kəlmələri ilə yekunlaşır. Ağız aramamış, qız evinin fikrini öyrənməmiş elçi getmək qanqaraçılığı da yarada bilir, əməlli-başlı umu-küsü də… Ağızaramadan sonra oğlanın anası qız evindən cavab gözləyir; qız anası "ağır oturub batman gəlir". Onda oğlanın anası yenə üz tutur qız evinə… Oğlanın özü qız bəyənibsə əlaltından qızın kimliyini öyrənir, bacısına, üzü tutursa xalasına (mamasına) sirr açır. Onlar da al dili ilə öyrəniləsini öyrənirlər, hələ desən qızın özü il də görüşüb kəlmələşirlər….

**Elçilik** üçün düşərli günə vədələşirlər. Adətən, elçilik də payızda adna axşamlarından birinə təyin edilir. Elçiliyə oğlanın ata-anası, yaxın qohumları, nəslin ağsaqqalları gedir. Bu tədbirə qız evinin də yaxın qohumları, ağsaqqalları dəvət olunur. Bir qədər dünyanın gedişatından, olandan-keçəndən söhbətləşirlər. Sonra oğlan evinin ağsaqqalı ustalıqla mətləb üstünə gəlir:

*Allahın əmri ilə, peyğəmbərin şəriəti ilə qapınıza bir diləyə gəlmişik. Oğlumuz qızınızı bəyənib. Nəsil-nəcabətimizə də bələdsiniz. Bir stəkan şirin çay verin, "Allah mübarək eləsin!",–* deyək, qız evinin ağsaqqalı təmkinlə cavab verir.

*Xoş gəlib, səfa gətiribsiniz. Uşaqlar bir-birini bəyənməsəydi qapımızı döyməzdiniz. Dədələr "Rəhmət düzənə, nəhlət pozana" deyiblər. Na deyirik ki, Allah mübarək eləsin!*

Ağsaqqalın xeyir-duası şirin çaya işarədi. Şirin çay razılığın təsdıqidi. Adı şirin çay məclisidi, özü əməlli-başlı ziyafət olur…

**Nişanlanma** toya bərabər bir mərasimdi. Qudalar, elçilikdə olduğu kimi, nişan gününü də vədələşirlər. Hər iki tərəf nişana hazırlaşır: oğlan evi qız üçün pal-paltar, ziynət əşyaları, qızın anasına (buna **süd haqqı** deyilir), nənələrinə, bacılarına müvafiq hədiyyələr alır. Bəzən nişan üzüyündən savayı qalan ziynət əşyalarını imkanı çatan qiymətə yaxın qohumlar alır. Əksər

nişan mərasimləri tavar sazın xeyir-duası ilə – ustad sözü ilə açılır, **duvaqqapma** ilə qapanır. Kiçik saylı musiqiçi kollektivinin iştirakıyla keçən nişan mərasimləri də olur…

Haşiyə:

*Aşıq Alıynan Hacı Nəsibin oğlu Həsən dost idilər. Günlərin birində Alı Həsənlə bir az soyuq görüşür. Bu görüş Həsənin pərinə dəyir: – Niyə məndən köntöy gəzirsən, qardaş? Aşıq Alı yarızarafat, yarıciddi cavab verir: Bə köntöy gəzmiyib nə eləməliyəm, ay qağa? Siz çıxalı (Həsən gitara çalır) bizim urvatımız azalıb Camaat bizi xorruyur. Sözə qüvvətə söz ardı: Allah da şahiddi ki, Faxralıda saz layiq olduğu urvatı saxlamaqdadı. Aşıq Alının ayar adam olduğunu da hamı bilir…*

Qohum-qonşuda toy olanda oğlanın bacısı (xalası, yengəsi) nişanlı qızı da toya gətirir (bu haqda əvvəlcədən razılaşma olur). Elə ki, toyda qələbəlik yarandı, gələnlər gəldi, oğlan evindən bir başıpapaqlı meydançıya sifariş verir ki, bir babat hava çalınsın. Qara zurna meydanı dingildədir, ürəkləri tellərdirir. Oğlanın bacısı, cavan qohum-əqrəbaları meydana çıxır. Oğlanın ya bacısı, ya da yengəsi nişanlı qızı da oyuna dəvət edir. Qohumlar növbəylə qızın qoluna, belinə qıymaça, kələğayı, parça (buna atrez də deyirlər) bağlayır, sancaqla üzük, pul taxırlar. Qıza pul verənlər də olur. Heç kim toyçuları da unutmur – onların nəməri ayrıcadı. Nəmər çatan kimi dəf az qalır toyu dağıtsın. Bu adət **quyruxlamaq** adlanır. Elə ki, yaz, payız gəldi, oğlan evi qız evinə **xurcun** (qarpız-yemiş), **səbət** (üzüm, gilas) göndərir. Xurcunda da, səbətdə də qıza hədiyyə qoyulur. Qız evi də göndərilən paydan yaxın qohumlarına pay çıxır. Xurcunu, səbəti, bir qayda olaraq, oğlanın yengəsi gətirir… Novruz bayramında qız evinə **yaylıq** aparılır (neçə il nişanlı qalmadan asılı olmayaraq hər il). Oğlanın qardaşdığı, yaxın qohumları, dostları şirniyyat dolu çamadan (hər çamadanda qız üçün hədiyyə), yaxud nəmər (pul) aparır. Yolboyu atılan güllələrin səsi kəndi başına götürür, lopalar kəndin yollarını nura qərq eləyir. Bu ağır eldə Novruz axşamı neçə evə yaylıq gedir!.. Bunlar toya qədərki adətlərdi… Faxralının toyları bir ayrı aləmdi!..

Toy qız evinə verilir. Gün əyilənə yaxın "**Atlandırıma**" (bu, "Vağzalı"ya müvafıq havadır. Professor V.Hacıyev qəyd edir kı, bu havanın bir adı da "Ağlama, gəlin"dir) çalınır. Bu sözun də tarıxı qədimdir. Uzaq keçmişlərdə qız ər evinə at üstündə aparılardı. O, ata minincə atlanınca çalınan hava belə adlandırılardı və indinin özündə də bu adla yaşamaqdadı.

Toyun qabağını kəsmək də yaşarı adətlərdəndi. Gəlini aparan maşın yola düzələndə kimsə maşının qabağına çıxır. Buna **toy qabağı kəsmə** deyirlər. Toyçular bir himə bəndlərmiş kimi "Güləşəngi" "qaynadır", qara zurnanın Allahı ha yoxdu "göyü yerə ələyir". Meydanda gərdiş eləyən cavanın nəməri veriləndən sonra yol açılır. Burdan oğlan evinə kimi yola toyun qabağını kəsib nəmər almış adam cavabdeh olur. Bəzən toyun qabağını kəsən dəliqanlı verilən nəmərə qane olmur. Onda ya nəmər artırılmalıdı, ya da oğlan evindən bir nəfər onunla qurşaq yapışmalıdı…

Yeri gəlmişkən, Başqa kənddən gəlin gətirəndə oğlan evi **torpaq basd1** verməlidi. Bu da qabaqkəsdi kimi təzahür edir. Elin adı, şöhrəti həmişə sayğı tələb elədiyi üçün başqa kəndə gəlin gətirməyə gedəndə kəndin yaxşı güləşən cavanlarından da apardılar.

Haşiyə:

*Məhəmməd Musa oğlu (kolxozun komsomolçu gənclər briqadasının başçısı olanda kolxoz sədri Əli Əliyev (Alyoşa) onu bağa göndərir, özü isə maşınla gedir. Alyoşa bağa çatanda görür ki, Məhəmməd burdadır. Təəccüblənir: "Sən piyada məndən tez gəlibsən. Qaqarin kimı uça-uçamı*

*gəldin?” 0 gündən Məhəmməd Qaqarin adı ıılə tanınır. Məmmədəlı Qazaxlı kənd klubunda nömrə göstərəndə Məhəmməd də səhnəyə çıxır, iki daşı biri-birinə bağlayıb hər əli ilə bir cütünü qaldırır. Pəhləvan onun gücünə heyran 0lur, onu yanına aparmaq istəyir.*

*Atası dolanışıq ucbatından razılıq vermir, Bolnisida texnikumda oxuyurdu. Bir gün dərsdən çıxanda toy səsi eşıdır. Sən demə, Arıxlıdan Dağ Muğanlıya gəlin aparırlarmış, Gürücülər toyun qabağını kəsib azərbaycanlı güləşçini yıxmışdı. Bu, Məhəmmədə təsir edir. O, gürcü ilə güləşir və onu yıxır. Gurcülər onun qabağına başqa birisini çıxardırlar, Məhəmməd onu da yıxır. Daha iki gürcünü də yıxan Məhəmməd meydanı qalib kimi tərk edir. Gürcülər “Bu ki pələngmiş” deyirlər.*

*Nurani bir kişi Məhəmmədə yaxınlaşıb: “Nəmər nə istəyirsən, oğul?” deyir. Məhəmməd yeknəfəsə dillənir: “Bir erkək”. Kişi razılaşır. Məhəmməd Musa oğlu toyu Dağ Muğanlıyacan gətirir…*
Başqa kəndlərdə olduğu kimi, **qız qaçırma** adəti Faxralıda da qalmaqdadır. Qız iki səbəbdən qaçırılır:

1. Qızla oğlan bir-birini sevir, valideynlər bu izdivaca razı olmur (qoşulub qaçma).
2. Qızı oğlana vermirlər, qız onunla ailə qurmaq istəmir (götürülüb qaçma).

Hər iki halda oğlana yaxın dostları, tay-tuşları kömək eləyir. Oğlan ailə quracağı qızı başqa kəndlərdəki qohumlarından birinin evinə aparır. Qızın qohumları onları axtarır ki, qızı oğlanın əlindən alsınlar. Axtarışa milis-polis də qarışır. Nəticə etibarilə qızın yaxın qohumlarından biri (əmisi, dayısı) milisin iştirakı ilə qızla goruşür. Əkşər hallarda qız bu və ya digər səbəbə görə “Özüm gəlmişəm, şikayətim yoxdur” məzmunlu məktub yazır. Oğlan evi barışıq uçun qız evınə minnətçilər göndərir. Elin minnətini tutmayan adam kənddə nüfuzunu itirir…

Beş-altı gündən sonra toya ciddi hazırlıq görülür. Butün çalarları əməl edilməklə toy olur…

Rəşid Faxralı: “Faxralının toyları (lirik anım)”

*Mənbə:* **Rəşid Faxralı, *“Faxralı tək ağır elim var mənim”***

# Faxralının toyları (lirik anım)

**FAXRALININ TOYLARI (lirik anım)**

*Saza-sözə beşik olan bir eldə,*
*Saz ünvanlı ocaq eldə, pir eldə*
*Hər məclisdə köynəyindən çıxardı,*
*Havacatlar ürəklərə axardı.*

*Özü boyda od olardı tavar saz,*
*Duyğulara dad olardı tavar saz.*
*Görəndə ki, dinməyənlər məst olub,*
*Şadlanardı, şad olardı tavar saz.*

*…Meydan boyu ləngər yeriş ozanın,*
*Hər havası bir murazı yozanın*
*Barmaqları şah pərdədə gəzərdi.*
*Titrəyərdi çıraqların piltəsi,*
*Can əridən muraz üstə əsərdi.*
*Cavanların sevdasının laylası*
*Havacatlar "dərdə dərman gəzərdi"…*

*…Şah pərdədə çırpınanda söz qəmi,*
*Bir kimsəni yandırmazdı öz qəmi;*
*Göz-göz yanan köz olardı "Dilqəmi",*
*Yanan közə "göz olardı" "Dilqəmi".*
*Ərköyünlər yaxşı-yaman seçərdi,*
*"Dağ arana, aran dağa köçərdi".*
*İntizardan dad çəkəndə cavanlar,*
*Qılınc olub gümanları biçərdi…*

*"Sarıtel"də tellənərdi könüllər,*
*Dil açardı, dillənərdi könüllər.*
*"Gözəlləmə" için-için yanardı,*
*Sevdalılar sevdasını anardı.*
*Qaynayardı, coşdanardı toy damı;*
*Cavanların əllərindən yapışıb,*
*Meydan boyu oynayardı toy damı…*

*Neçəsinin təngiyərdi nəfəsi,*
*Neçəsinin səngiyərdi həvəsi.*
*Toyçuları tərlədərdi çoxusu,*
*Əfəlləri pərt edərdi çoxusu.*
*Sıyrılanda meydançının çubuğu,*
*Söz-söhbəti pərdələrdi çoxusu…*
*Boz küləklər bozarardı, əsərdi,*
*Duyğusuzun ovqatını kəsərdi.*
*Həvəslənib oxuyardı qocalar,*
*Günü ilə toxuyardı qocalar…*

*Qarayaxa bir dəvətə dönərdi,*
*Qız-gəlini dəstələrdi havalar.*
*Söz daşından qoruduğu qızları,*
*Toy damında dost elərdi havalar.*
*Gözgörəki bir gecənin içində,*
*"Şirin cana qəsd elərdi" havalar.*
*"Yurd yeri"nə boylanardı "Yurd yeri",*
*Dərdə dərman bəstələrdi havalar.*
*Hikkəsindən "qılıncından qan daman"*
*dərdi-qəmi üstələrdi havalar…*

*Simlər üstə gəzişdikcə təzənə,*
*Xırd elərdi, köhnə nədi, təzə nə?!*
*"Ruhani"yə qul olardı neçəsi,*

*Dil-dil ötən dil olardı neçəsi.*
*O zamandan bu zamana yol gələn*
*“Kərəmi”də kül olardı neçəsi…*

*Bir murazın istisinə gələnlər,*
*Pərdə-pərdə yanan kəsə yanardı.*
*“Yananlarm” yanğısını duyunca*
*Saz od tutub birnəfəsə yanardı.*
*Olanları, keçənləri unudub*
*“Divani”dən “Müxəmməs”ə yanardı…*

*...Saz məclisi sübhə kimi çəkərdi,*
*Ürəkləri pərdə-pərdə çəkərdi.*
*Dikələrdi Gözəldağı, Yastana,*
*Ozan dədə başlayanda dastana…*

*…Ürəklərdə döyünərdi havalar,*
*Gül-gül olub açılardı gülləri.*
*Xallarıyla öyünərdi havalar,*
*Ömürlərə ad elərdi illəri.*

*Qırışığı açılardı məclisin,*
*Dağılardı qocaların yuxusu.*
*Əsnək əsnək gətirsə də yuxunu,*
*Kirpiyində dondurardı çoxusu.*

*...Bəy atası bığlarını eşəndə,*
*Bir insafa əl açardı “Qaraçı”.*
*Bu gecədən açılası sabaha,*
*Pərdə-pərdə yol açardı “Qaraçı”.*

*Tamahlıdı, ruzimizi binadan,*
*Dədə malı kimi satan dünyadı*
*Dirimizin sinəsinə dağ çəkib,*
*Ölümüzə ayna tutan dünyadı. (Mərhumun öldüyünü yəqinləşdirmək üçün ağzına güzgü, ayna tutardılar)*

*Kim yetirib, kim çatdırıb ərsəyə,*
*Azançıdı hər gədəyə, hər səyə.*
*Dar ayaqda arxa durmaz kimsəyə,*
*Məhşər günü ocaq çatan dünyadı.*

*Yaranışdan şırvanandı qılınca,*
*Cam çıxar bir namazı qılınca.*
*Faxralını at üstündə görüncə,*
*Dərdə düşüb, qəmə batan dünyadı!..*

***

*Gündə bir toy başlayardı Faxralıda,*
*Qara zurna dan yerini oyadardı.*
*Uşaqları çəpər-çəpər gəzdirərdi,*
*Cavanları yol uzunu oynadardı.*
*“Qaradonlu” həvəsinə gələnlərin*
*acığına “Cıdır-həngi” qaynadardı…*

*At tərlədib yol yorardı cıdırçılar,*
*Kim deyir ki, yorulardı cıdırçılar.*
*Acığını mənzil-mənzil əritsə də*
*Nəmər alcaq “durulardı” cıdırçılar…*

*Gözəl dağı ağır-ağır dikələrdi,*
*Dımbıl təpə ney səsinə boylanardı.*
*Bir mağarın işığına uyub gələn*
*Kor duyğular uyğusundan oyanardı.*

*Nişanlı qız oynayardı,* daldada
*kövrələrdi aşıb-daşan gözəllər.*
*Təzə eşqin havasından təntiyib*
*Xısın-xısm pıçıldaşan gözəllər.*

*Toybabası bığlarını eşərdi,*
*Cəhəl-cümrü atdanardı, düşərdi.*
*– A zurnaçı, “Yallı” yaman ləngidi,*
*Gözləməkdən savırımız təngidi.*

*…”Yallı” gedən cavanların yaylığı,*
*Meydan boyu göyərçinə dönərdi.*
*Həvəslilər atılardı meydana,*
*Hər birisi bir laçına dönərdi.*

*Toy babası “səd çəkərdi” meydana,*
*Dan üzünə boylanardı qonaqlar.*
*Əlidüşməz bu mağarda könüllü*
*yüz ovqata boyanardı qonaqlar..*

*…Kimlərisə qınayardı toy damı,*
*Korun-korun “qaynayardl” toy damı.*
*Dürlü-dürlü baxışların içində,*
*Sevdalılar arayardı toy damı.*
*Cığallara, şuluqlara göz qoyub*
*Qalmağalı darayardı toy damı…*

*Şax dalınca qardaşlığın evinə*
*Gedənlərə qarışardı uşaqlar.*
*Bu məhlədən o məhləyə yol boyu*
*Lopa olub alışardı uşaqlar…*

*Təzə bəyi oğurlamaq həvəsi,*
*Neçəsinin ürəyini üzərdi.*
*Qardaşlığın qonaqlığı hamını,*
*Bir məclisin dövrəsinə düzərdi…*

*…Şax gəldimi, meydan yenə coşardı,*
*Oyun-oyun əriyərdi toy damı.*
*Təzə bəyin qollarından yapışıb*
*Uçunardı, səyriyərdi toy damı…*

*…Ay işığı vumuxardı, gecənin*
*son ümidi əsə-əsə keçərdi.*
*Ha ətəklə, yel tərsinə əsəndə*
*Ocaq közə küsənməsə keçərdi.*
*Mürgü vuran qocaları görüncə*
*Ozan dədə "Müxəmməs"ə keçərdi:*

*Sevincinə yığışmışıq,*
*Qonum-qonşu – biz, təzə bəy!*
*Zili-zildi, bəmi-bəmdi,*
*Coşa gəlib saz, təzə bəy!*
*Daha çıraq əvəzinə*
*Alışdıraq söz, təzə bəy!*
*Üzərrik yandıraq, axı*
*dəyər sənə göz, təzə bəy!*

*Bu meydanın işığında,*
*Neçə incəbel oynayır.*
*Göylər sevincdən ağlayır,*
*Dərələrdə sel, oynayır.*
*Adın dillərdə əzbərdi,*
*Qonaq-qara, el oynayır.*
*Neçə yerdən evinizə*
*Düşüb təzə iz, təzə bəy!*

*Bizə əyri baxanların,*
*Baxışından bac alarsan!*
*Faxralının inamına*
*Hünərinlə tac olarsan!*

*El-obanın dayağı tək*
*Piran olub ucalarsan!*
*Xoş günləri muncuq kimi,*
*İllərinə düz, təzə bəy!*
Mənbə: **Rəşid Faxralı,*"Faxralı tək ağır elim var mənim"***

# Çağdaş dövrün toy adət-ənənələri

Toy möhkəm ailənin mirası kimi bizə gəlib çatan ən böyük mərasimlərimizdəndir. Başqa xalqların toy mərasimlərindən fərqli olaraq Borçalı toylarının, xüsusilə Faxralı toylarının özünəməxsus xüsusiyyətləri vardır. Həmin xüsusiyyətlər aşağıdakılardır:

- ***"ŞAX çıxartmaq";***
- ***"Qapı pusmaq";***
- ***"Toy karvanının qabağını kəsmək";***
- ***"Toyda silahlardan atəş açmaq";***
- ***"Qardaşlıq – bacılıq tutmaq";***
- ***Toy axşamı "Ciyər qonaqlığı";***
- ***Toyun səhərisi günü "Xaş qonqlığı".***

Ta qədimdən Faxralıda toylar "qara zurna" və "dəf" müsiqi alətləri ilə keçirilib.

Son zamanlarda isə toylarda "qarmon", "sintezator" və digər müasir musiqi alətlərindən istifadə olunur. Toylar, adətən "Palatka"larda keçirilir. Məclisdə səs gücləndiricilər qurulur. Toyda "tamada"nın və müsiqinin səsi bütün kəndı əhatə edir. Qız-gəlinlər məclisin bir tərəfində oturaraq "nəmər" verib rəqs edənlərə tamaşa edər, məclisin digər tərəfində isə kişilər, xüsusilə cavanlar yeyib-içib şadlanarlar. Məclisin sonu "mağarla" bitər. Başqa sözlə, yemək-içmək məclisi dayandırılar, oynamaq, rəqs etmək üçün xüsusi meydança təşkil edilər və cavanlar – qızlar, oğlanlar səhərədək oynayırlar.

# Novruz bayramı

Faxralıda Novruz bayramı çox maraqlı keçir. Əvvəlcə kəndin cavanları çərşənbələrdən başlayaraq imkan olduqca ilboyu topladıqları irili-xırdalı avtomobil və traktor təkərlərini dağlara daşıyırlar. Hər məhəllənin öz tonqalı olur və kimin tonqalı daha uzunmüddətli yanacaq deyə bir prinsipiallıq da vardır, bu kənddə.

Hava qaralan kimi Faxralını əhatə eləyən "Gözəl dağı", "Yovşanlı təpə", "Orta sivi" kimi dağ, təpə və yüksəkliklərdə tonqallar alovlandırılır.

Bayram günü hər məhəllədən bir igid hava qaralan kimi atını minərək gedib öz məhəlləsinin tonqalını alovlandıraraq geri dönürlər. Bayram tonqalları gecənin bir yarısına kimi yanaraq insanlara bayram sevinci bəxş edir.

Kənddə əsas Novruz atributlarından biri də maskalıların qapı-qapı gəzməsidir. Cavan-cümrü bayram axşamı müxtəlif cür maskalanaraq dəstə-dəstə yaxınların, qohumların evlərinə baş çəkərək həm bayram paylarını alırlar, həm də ev sahiblərini təbrik edirlər. Bəzi hallarda hətta ev sahibləri maskalıların kim olduqlarını bilmirlər.

Nişanlı oğlanlar, istəkli olanlar da bayram axşamı maska geyinərək adaxlılarını evlərinə gedirlər. Bu gözəl adət hələ də Faxralıda qorunub saxlanılır.

Qədim türk yurdu olan Faxralıda bayram adətləri öz türkçülük tarixini qorumuş və elliklə keçirilən “Novruz” və digər bayramlar, “At yarışları” və s. mərasimlər çox maraqlı keçirilir. “Novruz” bayramında maskalı uşaqlar, dağ başında yandırılan tonqallar, yumurta toqquşdurma, tonqal üzərindən tullanma və s. hadisələr bayrama faxralıların necə böyük məhəbbətlə yanaşdığını, müsbət dəyər verdiklərinin göstərir.

Faxralıda “Novruz” bayramı Bakıda və Azərbaycanın bir çox digər bölgələrindən fərqli olaraq mart ayının 21-i qeyd olunur.

Hər il “Novruz” bayramı qədim adətlərə uyğun keçirilir. Bu bayramda Faxralıda qonşu kəndlərin sakinlərinin iştirakı ilə at yarışları, cıdır təşkil olunur. Qaliblərə kəndin maddi imkanlı şəxslərinin və “Borçalı” Cəmiyyətinin xüsusi hədiyyələri təqdim olunur.

Tədbirlərdə Qara zurnanın və Dəf toyunun sədaları insanlara əsl bayram əhval-ruhiyyəsi aşılayır, hər kəsin üzündə bayram sevinci əks olunur.

At yarışlarında yarışda iştirak eləmək istəyən at sahibləri, tamaşaçılar və süvarilər “Qənsələrin” qabağında toplaşaraq oradan hamı birlikdə cıdırın keçiriləcəyi kəndin ayağındakı düzənliyə doğru hərəkət edirlər.

*Faxralıda kənd meydanına xalq arasında “Qənsələrin qabağı” deyirlər. “Qənsələr” sözü rus dilindəki “kanselyariya”- yəni idarə sözünün kənd camaatının dilində təhrif olunmuş forması idi. Hələ sovetin vaxtından burada dövlət və hökumət idarələri olub və camaat öz dərdini-sərini, sevincini bölüşmək üçün bu meydana toplaşarmışlar.*

Faxralıda artıq neçə illərdir At yarışları “Borçalı” Cəmiyyətinin nümayəndəsi və Faxralı kəndinin ağsaqqalı olan **Əmirxan Babaşovun** rəhbərliyi ilə keçirilir.

Tədbirlərin sonunda Ə.Babaşov tərəfindın qaliblər mükafatlandırılır. Onlara müəyyən məbləğdə pul və elin qədim adətinə uyğun olaraq kəlağayı yaylıqlar təltif edilir. Birinci yerin sahibi atın boynuna qırmızı kəlağayı, ikinciyə mavi, üçüncü gələnə isə ağ kəlağayı bağlayırlar. Beləcə izdihamlı tədbir yekunlaşır.

# Gəlinlərin “Yamşaq tutmaq” adəti

Faxralıda gəlinlərin qaynataya, qayına hörmət, onlardan utanıb-çəkinmək adət-ənənəsi ta qədim zamanlardan bu günə kimi davam edir. Bu, gəlinin hüquqlarının məhdudlaşdırılması deyil, onun böyüklərə hörməti, sayğısıdır. Gəlin-qaynata, qayın, qaynana münasibətləri yüksək əxlaqa söykənir. Gəlin onların yanında yüksəkdən danışmaz, yersiz gülməz, bəzənib-düzənməz və s. O, ərə gəldikdə adətə görə başını örtər, həmin şəxsləri gördükdə və ya onlarla danışdıqda baş örtüyünün qolları vasitəsilə üzünün dodaq nayihəsini bağlar (buna “yamşaq tutmaq” deyilir), alçaqdan danışmaqla onlarla ünsiyyətdə olar.

Faxralıda qədim adət-ənənə saxlanmaqla paralel olaraq, müasir adət-ənənələr də mövcuddur. Yəni, bəzi gəlinlər müasir dəbdə geyinsə də, "yaşmaq" tutmasa da, yenə qaynata, qayın münasibətləri böyük hörmətlə yerinə yetirilir. Gəlinlər həmin şəxslərlə utancaqla sakit təbdə danışar, ünsiyyət qurarlar.

Bir sözlə, Faxralıda gəlin qaynata, qayın və s. münasibətləri formasından asılı olmayaraq yüksək əxlaq və müsbət dəyərlər üzərində qurulmuşdur.

# Uşaqların "Belə şəllənmə" adəti

Bu adət, Borçalıda, xüsusilə Faxralıda qədimdən bəri qorunub saxlanılır.

"Belə şəllənmə" o deməkdir ki, qadınlar, adətən uşağın anası öz kiçik yaşlı övladının ayaqlarını aralamaqla kürəyə qoyub böyük ölçülü şal və ya digər vasitələrlə onu belinə sarıyır. Bu zaman uşağın ayaqları və bel nahiyəsi müəyyən məsafə gözlənilməklə anaya kip bağlanılır. Yəni, uşağın ananın belindən düşməsi heç zaman mümkün olmur.

"Belə şəllənmə" zamanı uşaq özünü rahat hiss edir. Çünki, o ananın bədəninin istiliyindən, onun zümzümə ilə oxuduğu laylasından xoşallanır və nəticədə çox zaman o, tez bir zamanda ananın belində yuxulayır.

Uşağın "Belə şəllənmə"si, onun sakitləşdirilib yatızdırılmasından başqa, həm də böyük tibbi əhəmiyyəti vardır. Çünki, körpə uşaqlarda çanaq-oyanaq mexanizmi bəzi hallarda işkişaf etməmiş olur. Bu tipli şəllənmə zamanı uşağın büd sümüyü çanaq oynağına toxunaraq onu bərkidir və nəticədə körpələrdə "yırğalanma" yerişi kimi adlanan anadangəlmə qüsur baş vermir.

# Faxralıların "yeyib-içmək" ("kef") məclisləri

Faxralı camaatı əməksevər olmaqla bərabər, çox qürulu, qormaz, şən, yeyib-içən insanlardır. Onlar istirahət və bayram vaxtlarını (məsələn, 1 may bayramını -"mayovka" gününü) mənalı keçirmək üçün kəndin yaxın ətrafında yerləşən səfalı meşələrin, buz kimi soyuq bulaqların ətrafında yeyib-içib kef məclisləri qurmağı çox sevirlər.

Faxralılar həm də qonaqpərvərdirlər. Onların qonağa xüsusi hörməti vardır. Heç ola bilməz ki, Faxralıya qonaq gələsən, onun gözəl meşələrində yeyib-içməyəsən.

Faxralının meşələrində "kef" məclislərinin yerləşdiyi yerlərdə üstüörtülü xüsusi "stollar" qurulmuşdur. Həmin "stollar" adətən zamanında bu yerlərdə yeyib-içən kimi tanınan şəxslərin, şəhid və həyatdan nakam köçənlərin xatirəsinə adlandırılmışdır. Məsələn, onlardan aşağıdakıları qeyd etmık olar:

- **“Təhməz”in “Daşın altı” bölgəsində yerləşən “kef-məclis” stolları**:

1.Fəxrəddin Yasin oğlu Xəlilovun adına
2.Məhəmməd Abbasovun adına *(ləqəbi: Qaqarin)*
3.Fəxrəddin Qiyas oğlu Abdıyevin adına
4.Qulam Namaz oğlu Göyüşov adına *(“Baba” deyirlər)*
5.Qumara Bədəlin adına
6.”Böyük stol” (“Sovxoz” tərəfindən qurulub)

- **“Təhməz”in yuxarısında yerləşən ”kef-məclis” stolu:**

- **“Xəmmətli”də yerləşən “kef-məclis” stolları:**

1.”20 Yanvar” şəhidi İlqar Əhmədovun şərəfinə “İlqarın bulağı” və eyni adlı stolu

2.”Tək cöyüzün dibi”ndəki stol

- **“Yovşanlı” kimi adlanan təpədə qurulan “kef-məclisi” stolu:**
- **“Qızıl Qaya”nın ətəyində yerləşən “Qoşa bulaq” və s.**

“Kef” məclislərini aşıqsız, sazsız təsəvvür etmək mümkün deyildir. Borçalının Aşıq Ələsgəri hesab olunan Şair Nəbinin sözləri bu məclislərin yaraşığı hesab olunur.

Faxralılar elliklə bayram etməyi çox sevirlər. Aşağıdakı şəkildə faxralı cavanları Qaradaşın zirvəsinə qalxaraq “Kef” məclisi açıblar:

# Köç adətləri

Yaylağa gedəndə. Elə ki, Novruz bayramında bayramlaşma başa çatır, camaat əl-ayağa düşür, yaylağa, dağa-binəyə hazırlaşır.

Qadınlar məhləliklə əriştə kəsir; əriştə köməkliklə aşan işdi xəmir yoğurmaq, kündələmək, yayıb kəsmək, məxsusi hazırlanmış kəndirə sərmək, quruyandan sonra sacda qovurmaq…

Qadınlar ***kirkirədə*** duz, qovrulmuş taxıldan ***qovud*** çəkirlər.

Çadır günə verilir, sökülən yerləri səliqəylə tikilir, lazım gəlsə yamaq salınır. Nəmi üçün kisələrdən, köhnə, yararsız çadır hissələrindən ayrıca örtük, dəyə çubuqlarını bağlamaq üçün 2 qarış uzunluğunda kəndirlər, bağlanmış çubuqları dəyənin orta dirəyinə sarımaq üçün möhkəm, uzun bağ da hazırlanır…

Qadınlar yaylaq üçün yığıntı dəriləri də hazırlayırlar: yundan təmizlənmiş qoyun dərisi palıd qabığı ilə qaynadılır boyanır. Küncləri və arxa hissəsi möhkəm tikilən dərinin ağzına dairəvi ağızlıq (çəmbərə) düzəldilir. Ağızlıq, adətən, dağdağandan hazırlanır.

Kişilərin öz qayğıları var. Kişilər odun tədarükü görür, dəyə çubuğu kəsir, axşamlar dana-buzovu arxacda bağlamaq üçün mıxçalar hazırlayırlar.

Uşaqlar da yaylağa ciddi hazırlaşırlar; ***çilik-ağac*** üçün ayrı, ***mərə qazma*** üçün, ***müştük atma***, ***azbalı*** üçün ayrıca ağaclar lazımdı axı. Uşaqlar yığışıb yaxın meşələrdən birinə gedir, irdələyib-sonulayıb kəsdikləri ağacları (adətən zoğaldan) ocaqda ütələyirlər (onda ağacın sərtliyi artır). Ala-bula ağac həvəsliləri də olur (göyrüc qabığından nazik, uzun zolaqşəkilli hissələr kəsilir, ağaca dolanır, sonra közə dönmüş ocaqda ütələnir. Qabığın altında qalan hissələr ağ olur (zolaq dolanmamışdan əvvəl ağacın qabığı soyulur).

Mal-qara köçdən bir gün əvvəl yola düşür.

Vaxtilə yaylağa maşınlarla deyil, arabalarla çıxardılar. Onda mal-qara da köçlə bərabər aparılardı…

**Arana qayıdanda.** Köç ərəfəsində qadınlar yavaş-yavaş yır-yığışa başlayır. Köçə iki gün qalmış mal-qaram aparacaq adamlar üçün yol azuqəsi tədarükü görülür, ***dələmə***, ***körəməz*** hazırlanır, ***fəsəli*** bişirilir. Yağ qarınları, motallar, qurutlar daha ehtiyatla qavqarılır.

**Dələmə.** Südə isti-isti maya qatılır, üstü basdırılır. O, iki-üç saat beləcə qalır. Maya qoyun qursağından, taxıldan və zoğal qurusundan tutulur. Ona kifayət qədər duz da qatılır. O, hazır maya şəklinə 10-15 gündən sonra düşür.

**Körəməz**. Qatıqla süd dəriyə tökülür. Arabada yırğalandıqca bir-birinə qarışır, ayranı əvəzləyir.

**Əkin-səpin qayğıları.** Torpaq kotanla əkilərdi. Kotanı, atı, öküzü olmayanlara qohum-qonşu əl tutardı. Kəndə əkin təmayüllü texnika (traktor) gətiriləndən sonra da torpağını traktorla şumlaya bilməyənlər (torpaq sahəsi texnikadan istifadə üçün əlverişli olmayanlar) indinin özündə də kotandan istifadə edir. Payız və yaz əkininin hər birinin öz vaxtı var. Payız əkini bir qayda olaraq, məhsul yığımından sonra aparılırdısa, yaz əkininin vaxtını (ilindən asılı olaraq) torpağın nəmliyi-quraqlığı ilə müəyyənləşdirirlər.

Mənbə: **Rəşid Faxralı,*“Faxralı tək ağır elim var mənim”***

# “YAS – Matəm” mərasimləri

İstər Azərbaycanda, istərsə də Borçalıda yas mərasimlərinin keçirilməsi və idarə edilməsi üçün vahid qayda-qanun yoxdur. Bu mərasim ümumilikdə islam adət-ənənəsinə uyğun keçirilsə də, bütün bölgələrdə yas mərasimlərinin keçirilməsində müəyyən fərqliliklər vardır.

Belə ki, bəzi bölgələrdə rəhmətə gedən şəxsi həmin gün dəfn edildiyi halda, Faxralıda dəfn mərasimi 3 günədək gecikdirilə bilir (uzaqda yaşayan yaxın və qohumların rəhmətə gedən şəxslə vidalaşması məqsədilə gələnədək). Bundan başqa, dəfn günü rəhmətə gedən şəxsi qəbrstanlığa bir qrup yaxın, qohum insanlar apardığı zaman, digər qrup yaxın və qohumlar isə “başsağlığı” üçün gələnlərə “ehsan” verilməsi üçün yeməklər qoyulmuş stollara dəvət edirlər.

# Dastanlar, əfsanələr

## Folklor

Xalqın əvəzsiz söz xəzinəsi olan şifahi xalq ədəbiyyatı ayrı-ayrı bölgələrin, kəndlərin özümlü folklorundan ibarətdir. Yaşantıları yüz-yüz illərlə söz yaradıcılığına cığırdaş olan Faxralının da özünəməxsus söz yaddaşı – söz yaradıcılığı ümummilli folklordan bəhrələnmiş, eyni zamanda onun çoxşaxəli inkişafına, məzmun baxımından zənginləşməsinə az da olsa təsir göstərmişdir. Bu anlamda yüz-yüz illərin sınağından çıxan, yaşadılan Faxralı folklorunu Azərbaycan folklorunun tərkib hissələrindən biri kimi qəbul edə bilərik; bənzərsiz bayatıları cinaslar üstə qurulduğundan klassik nümunələr səviyyəsindədir, oxşamaları şirinliyi ilə seçilir, epik janra aid nümunələri istər əhatəli məzmunuyla, istərsə də variantlı olmasıyla, unudulmaqda olan sözləri, ibarələri yaşatmasıyla… səciyyəvidir. Zülmdən qurtarmaq istəyənlərin daşa, quşa dönməsi əfsanələrin çox-çox qədim zamanlarla səsləşməsinin və deməli, Faxralının tarixinin qədimliyinin təsdiqidir.

Ümumiyyətlə, Faxralının folkloru “söz sənətinin başlanğıcı” (M. Qorki) olan ümummilli folklorda təmsil olunmağa layiqdir.

## İsmayıl ilə Qızyetərin dastanı

İsmayıl Oruc oğlu əmisi qızı Qızyetəri sevirdi. Qızyetərin əmisi Məşədi Usub qızı ona vermirdi. Qızla oğlan qorxularından heç yerdə görüşə bilmirdi. Nə yaxşı ki, onlara can yandıran varmış; bir imanlı qarı onların sirr sözlərini bir-birinə çatdırırdı. Bir ümidə sığınmış cavanların qəlbi dəmirçi körüyü kimi alışırdı. Günlərin birində Qızyetəri zorla Şəki Söyünə nişanlayırlar. Zavallı sevənlər neyləyə bilərdilər? Məşədi onlara zülm eləmişdi. Aşır oğlu Allahverdinin Şəki Söyünlə qohumluğu da işi xeyli çətinləşdirmişdi.

Məşədi Usub Qızyetərin Şəki Söyünə könlü olmadığını bilirdi, Ona görə də Qızyetəri ciddi nəzarətdə saxlayırdı; İsmayılla Qızyetərin günü göy əsgiyə düyülmüşdü.

İsmayıl nə müddətiydi ki, Qızyetəri görə bilmirdi. O, sevgilisinə ismarıc eləyir ki, qızlarla sabah dağa, gül-çiçək yığmağa o da gəlsin, qoşulub qaçaq. Sonrası da nə olar-olar. Üstəlik bir namə də göndərir:

*Gedib deyərsiniz o nazlı yara,*
*Səhərdən çıxarıq dağlar başına.*
*Bülbüləm, fəryadım dağlar əridir,*
*Məskənini salsın bağlar başına.*

*Görünsə gözümə çarpaz ətəklər,*
*Yetirrəm özümü bil ki o dəmlər.*
*Dözsün, gözlərindən axmasın nəmlər,*
*Dolanaq batanda tağlar başına.*

*Seyraqublar doğru xavar gətirsin,*
*İsmayılın həsrətini bitirsin.*
*Qızyetərin cavabını yetirsin,*
*Çağ olsun damağı, çağlar başına.*

Qızyetər naməni oxuyanda ürəyi titrəyir. Bəs nə bilmişdin? – sevgilisindən ismarıc gəlmişdi. O, araçıya bildirir ki, qoy İsmayıl narahat olmasın, gələcəyəm.

İsmayıl səhərin gözü açılmamışdan “Yovşanlı” ya çıxır. Bir azdan qızlar görünür. İsmayıl Qızyetəri onların arasında görməyəndə ürəyi qana dönür. Məlum olur ki, Qızyetəri Məşədi Usub buraxmayıb. Biçarə İsmayıl dərd əlindən girinc olsa da ümidini sabaha bağlayır; nə çoxdu Allahın sabahları. Qızyetər səhərisi gün də gələ bilmir. İsmayılın sevdalı könlü qübar eləyir:

*Dizdə taqət yoxdu, gözdə də qara,*
*Gözləməkdən yollarını bir qızın.*
*Bəxtəvər başına, günbəzi kəmər,*
*Nə qucmusan bellərini bir qızın.*

*Tükənibdi səbrim, gəlmir qərarım,*
*Gündən günə artır dərdim, məlalım.*
*İlqarına xilaf çıxdı maralım,*
*Şana tutub tellərini bir qızın.*

*Oturmuşdum Dələverin üstündə,*
*Biri gəldi Qızyetərin şəstində.*
*Sənəyi belində, dolça dəstində,*
*Dərəsiyəm güllərini bir qızın.*

*İlqar verən ilqarına düz olsun,*
*İstəmiyən əlli olsun, yüz olsun.*
*Öz sözümüz aramızda düz olsun,*
*Dolanaram çöllərini bir qızın.*

*İsmayılın başı çəkər qovğalar,*
*Sevgi sevən sevgisiynən ucalar.*

*Çata bilməz bizə heç vaxt qarğalar,*
*Mən tutanda əllərini bir qızın.*
Nə isə, Şəki Söyünün toyu ələ alınır. Bu xəbər İsmayılı varından yox eləsə də özünü toxdada bilir. Sevgisi yolunda hər əzaba qatlaşmağa hazır olan bu cavan yenə həmin imanlı qarıya yalvarıb-yaxarır ki, gedib Qızyetərdən bir soraq gətirsin. Əhdindən dönməyibsə, toy gecəsi xəlvətə salıb damın dalına gəlsin, qoşulub qaçaq…

…Qardaşliq evindən şax gələn vaxtı Qızyetər fürsəti fota verməyib damın dalına keçir. İsmayıl onu görəndə gücü birəbeş artır. İki sevgili atlanıb üzü Türkiyəyə yol alır…

İsmayılla Qızyetər minbir zillətlə gəlib çıxırlar Qars vilayətinə. Sən demə, onların qonaq kimi qaldıqları kənd Baş Sarıköy kəndinə yaxınmış. Bu, 0 Baş Sarıköy kəndidi ki, Faxralıdan gəlmiş iki qardaş da bu kənddə yaşayırmış: Hacı Sarı ağa və Hacı Bayram.

Hacı Sarı ağaya xəbər çatır ki, qonşu kəndə Borçalıdan qonaq gəlib. Torpaq həsrəti onun ürəyini kövrəldir, eli yadına düşür. Oğlu Məhəmmədi həmin kəndə göndərir ki, qonaqlardan müfəssəl bir xəbər gətirsin. Məhəmməd İsmayılla görüşüb kəlmələşir, onun Faxralıdan, **Güllər nəslindən** olduğunu öyrənir.

Oğlunun gətirdiyi xəbər Hacı Sarı ağanın ürəyini telləndirir. Sevindiyindən bilmir neylesin. Məhəmməd nəfəsini dərməyə belə imkan vermir, İsmayılın yanına göndərir ki, onları qonaq gətirsın:

– De ki, biz də Faxralıdanıq, Avış öyündən. Mənim başım götürməz ki, eloğlum başqa yerdə qalsın. Bizə gəlsinlər, burdan beləsi mənim boynuma düşür.

İsmayılla Qızyetər Hacı Sarı ağanın sözlərini eşidincə şad olurlar, gəlirlər Baş Sarıköyə. Hacı Sarı ağa bu iki cavanın qəzyəsindən xəbər bilən kimi bir molla gətirdib onların kəbinini kəsdirir.

Sizə kimdən xəbər verim – Şəki Söyündən. Şəki Söyün eşidir ki, İsmayıl Qarsdadı. Qarsa göndərri ki, valiyə şikayət eləsin. Vali Şərif bəy İsmayılla Qızyetəri divana gətizdirir. İsmayıl işi başa düşür, bilir ki, Şərif bəy onları Borçalıya qaytarmaq niyyətindədi. Ona görə də üzünü Şərif bəyə tutub deyir:

*Baş götürüf vətənimdən gəlmişəm,*
*Aman bəyim, məni geri yollama.*
*Canımı bu yolda qurban vermişəm,*
*Aman bəyim, məni geri yollama.*
Şərif bəy İsmayılın üstünə qışqırır:

– Necə yəni geri yollama? Sən başqasının nişanlısını götürüb qaçmısan, cəzanı da çəkməlisən.

*Uzaq yollar qədər etdi dizimə,*
*Türk çuğulu iy salıbdı gözümə.*
*Bir insaflı məhəl qoymor sözümə,*
*Aman bəyim, məni geri yollama.*
Şərif bəyi od götürür: – Ayə, pəzəvəng, gəmidə oturub gəmiçi ilə davamı eləyirsən? Sən nə haqla türkə çuğul deyirsən?

İsmayıl axıracan mərdana dayanmağı qərara alır:

– Şərif bəy, bir quş bir qanada sinər. Fikirləşdim ki, öz dinim-dilimsiniz, məni ətəyinizin altında saxlayarsınız. Məni geri yollasanız qoluma qandal vurub Sibirə sürgün eləyəjəklər. Gəl mənim qanıma bais olma:

*Səni and verirəm imana, dinə,*
*Qoyma ki, İsmayıl dərdindən dinə.*
*Allah qonağıyam, Allah eşqinə,*
*Aman, bəyim, məni geri yollama.*

Şərif bəy insafa gəlir:

– Oğlan, sözlərin mənə təsir elədi. Görürəm mərdliyinlə bərabər söz qoşmağın da var. Bizim bu mahalın Qəzəli adlı bir aşığı var, onu bağlasan, şikayətçiləri qaytarıb səni burda saxlayacam, bağlaya bilməsən səni dalınca gələnlərə qatıb el-obana, qaytaracam, orda başına nə gələr-gələr. İsmayıl razılaşır. Çapar Aşıq Qəzəlәlini çağırmağa getməyində olsun, sizə xəbər verim Hacı Sarı ağadan. Hacı Sarı ağa səfərdən qayıdanda ona xəbər verirlər ki, bəs, İsmayılı Şərif bəy çağırtdırıb. O, birbaşa gedir Şərif bəyin yanına. Çatanda görür ki, Aşıq Qəzəli ilə İsmayıl deyişməyə hazırlaşır. Hacı ağa narazı baxışlarla İsmayılı süzür. İsmayıl gülümsünür, yəni narahat olma, Qəzəliyə bac verməræm. Hacı Sarı ağa deyişmənin şərtini öyrənincə toxdayır. Deyişmə başlanır.

**Qəzali:**

*Çətin meydanlara girib–çıxmışam,*
*Ustadam, qarşımda duran olmuyuf.*
*Urufatdan tutdum sual-cavabı,*
*Hələ cavabımı verən olmuyuf.*

**İsmayıl:**

*Qəzali, özünü atma irəli,*
*İndi cavabını alar, gedərsən.*
*Elə bir girdaba salaram səni,*
*Sazın da burada qalar, gedərsən.*

**Qəzali:**

*Unutma ki, dəvə çəkməz adım var,*
*Yaxın durma, yandıraram, odum var.*
*Basılmaram, imdadım var, dadım var,*
*Hünər meydanıma girən olmuyuf.*

**İsmayıl:**

*Faxralıdan gəlmişəm ki, bac alam,*
*Bu yerlərdə meydan açam, ucalam.*
*Hacıların duruşundan güc alam,*
*Əcrini burdaca bular, gedərsən.*

**Qəzali:**

*Qəzəliyəm, alışmağa qorum var,*
*Diz çökdürrəm, qüvvətim var, zorum var.*
*Balıq kimi ovlamağa torum var,*
*Qoşa qollarımı buran olmuyuf.*

**İsmayıl:**

*İsmayılam, leysan ollam qoruna,*
*Qüvvəm çoxdu, güc gələrəm zoruna.*
*Oz tayların düşəsidi toruna,*
*Hikkəcllən alışıb yanar, gedərsən.*

Hacı Sarı ağa irləi çıxıb deyir ki, indi də İsmayıl qabağa düşsün. Hamı raziglaşır.

**İsmayıl:**

*Aşıx, bilirsənmi nə hikmətdi o,*
*Agah ol ki, onun sənnən işi var.*
*Əlinə düşəni xırd edər, onun*
*Neçə damağı var, neçə dişi var?*

Aşıq Qəzəli cavab verə bilmir, daşdan səs çıxır, Qəzəlidən yox, – qalır gözlərini döyə-döyə. Şərif bəy bığlarını eşib İsmayıla xitabən dillənir:

– Davam elə, oğlum.

*Arxayın getsə də mənzillər kəsər,*
*Nə zaman istəsə onda da əsər.*
*Yanı nə çəpərdi, nə də ki hasar,*
*Əcayıfdı, dörd irəngli daşı var.*

*İsmayıl başına yağdırar dolu,*
*Qırx səkkiz qapıdı, yeddidi yolu.*
*İyirmi d6rd bədəndi, otuzdu qolu,*
*Üç yüz altmış altı gözün üççə qaşı var.*

Hamı İsmayıla afərin deyir. Elə bil dünyanı Hacı Sarıya bağışlayırlar. Şərif bəy İsmayılı yanına çağırır:

Oğlum, mən fikrimdən daşındım. Deyəsən sən haqq aşığısan. Haqq aşığına da mədəd eləmək savabdandı. Daha səni cəbrnən geri yollamaram. Ürəyin nə qədər istəyirsə, burda qala bilərsən.

Sonra üzünü Şəki Söyünün nisvəndinə tutaraq:

Bu iki cavan mənim ətəyimə sığınıb, özləri də bir-birini sevirlər. Onlara zulum eləmək günahdı. Get, de ki nə özləri gəldi, nə də Şərif bəy verdi.

Şəki Söyünün adamı kor-peşman qayıdır Faxralıya…

Nağıl, dastan dili yüyrək olar deyiblər. İsmayılla Qızyetər Hacı Sarı ağanın verdiyi torpaqda ev tikib yaşayırlar.

İllər keçir, Güllər Pərisi qardaşının həsrətinə dözə bilmir, İsmayıla bir namə göndərir. Namə gəlib Qarsa çatır. İsmayıl naməni alanda onu xoş, doğma bir ətir vurur. Sən demə, Pəri göndərdiyi namənin içinə gül-çiçək ləçəkləri də qoyubmuş. Doğma yurdun gül-çiçəyinin ətri onun ürəyini nar kimi sıxır, könlü el-obasna sarı atdanır. Bacısının sözləri də, illərlə ətrinə tamarzı qaldığı gül-çiçək də onun həsrət gözlərində beş gilə göz yaşına dönür:

*Qarsa doğru baxıb-baxıb ağlaram,*
*Yapmışam könlümdə qalalar, qardaş.*
*Urəyimi çalın-çarpaz dağlaram,*
*Çökər gözlərimə qaralar, qardaş.*

*Eşqin badəsini yaman içifsən,*
*Faxralıdan Alosmana köçüfsən.*
*Qohumdan, simsardan niyə keçifsən,*
*Divan işə baxıb aralar, qardaş.*

*Qoburnat incidir, qoymayır yatam,*
*Zorum-gücümmü var onlara batam?*
*Neyləsin qardaşlar, neylesin atam,*
*Həsrətin bağrımı paralar, qardaş.*

*Pəriyəm, bu dərdə dözə bilmirəm,*
*Həsrəti yollardan üzə bilmirəm.*
*Sən gəzən yerlərdə gəzə bilmirəm,*
*Gəlməsən bacılar saralar, qardaş!..*

İsmayıl məktubu da götürüb Hacı Sarı ağanın yanına gedir:

– Hacı, səndən dünyalarca razıyam. Qəriblikdə mənə arxa-dayaq oldun. Əməyini halal elə. Kəndə qayltmalıyam. İndilik bircə xahişim var. Gedək Şərif bəyin yanına. Bəlkə mənə bir kağız verə, orda məni çox incitmiyələr.

Hacı Sarı ağa eloğlusunun xahişini yerinə yetirir, birlikdə Şərif bəyin yanına gəlirlər. İsmayıl dil-ağız eləyir:

– Şərif bəy, hamınız bilirsiniz ki, mən başqa bir adamın nişanlısını qaçırtmışam. Neçə illərdi mənə yaxşılıqlar elədiniz. Sizdən dağlarcan razıyam. Daha burda qala bilmirəm. Ancaq qayıdanda məni çək-çevirə salacaqlar. Sənin mərdliyini, eyliyini də ölüncə unudan döyüləm. Mümkünsə, mənə bu işdə də kömək eləyin.

Şərif bəy ani fikrə gedib deyir:

– Oğlum, sən bizim qonağımızsan, Hacının də xətrini çox istəyirəm. O ki, gedirsən, səndən köməyimi əsirgəmərəm.

Şərif bəy İsmayılla Qızyetəri silahlı adamların müşayiəti ilə Lüksemburqa yola salır…

Hadisə köhnəlmişdi. Elin ağsaqqaları araya barışıq salır…

# Əfsanələr

**Cənnət bulağı**

Kasıb bir qarının aman-zaman körpə nəvəsi naxoşlayır. Nə illah eləyirlərsə ona bir çarə tapılmır. Qarıya məsləhət görürlər ki, "O üz"ə Divsiz gölünün arxasına getsin. Orda hər dərdə əlac eləyən bir loğman var, zavallı uşağa əlac eləsə ancaq o eləyə bilər.

Qarının minəyi olmadığından naçar qalıb nəvəsini də dalına şələləyir, düşür yolun ağına. Avand uğurlu bir qonşusu qarının arxasınca bir dolça uğur suyu atır…

Yaş səksənin astanasında, yol da ki, yoxuş biçarə qarı əməllicə yorulur. Köməyinə yetəsi bir Allah bəndəsi ümidiylə dönüb arxaya boylanır. Xeyli uzaqlarda bir atlı görünür. Dərdəcar qarı onu gözləməyi qərara alır. Bir hovurluğuna dincini almaq istəyir. Susuzluqdan təpimiş dodaqlarını yalayır. Nəvəsinin də iniltisi kəsilmir ki, kəsilmir.

Bu imanlı qarı əl açıb Allaha yalvarır:

– Ey bütün köməksizlərin pənahı! Mən bu gün-savaxlığam, ban bu tifılə rəhm elə!

Birdən… qarı yaxınlıqda su şırıltısı eşidir. Bir qədər çaşır. Bu hənədəvərlərdə çeşmə, bulaq olduğunu nə görmüşdü, nə də eşitmişdi…

Qarı su səsinə tərəf gedir. Yox, bu, qarabasma-zad deyildi. Yerdən su poqquldayırdı. O, tələsik nəvəsinə bir ovuc su içirdir. Sonra ovuclayıb özü də içir. İlahi, bu nə möhüzəymiş, nə sehriymiş! – nəvənin iniltisi xırp kəsir, bət-bənizi, rəngi-rufu düzəlir. Bu əsnada atlı da gəlib çatır. Bulağı çeşməni görəndə o da quruyub qalır…

Qarı bir nəvəsinə baxır, bir də dum-duru göz yaşını xatırladan bulağa. Pıçıltıyla:

– Şükür kəramətinə, Xudaya!, -deyir.

Dönüb bulağa bir də baxır: – Cənnət suyuymuş suyun, ay bulax!

Bu pıçıltı çölə-düzə yayılır, binələrdə əks-səda verir: "Cənnət suyuymuş suyun, ay bulax!"

O gündən bu bulağın adı qalır Cənnət bulağı. Cənnət bulağı Qaraxaç yayalağında indi də çağlamaqdadı…

**Cənnət bulağı (variant)**

Aralıqda binələnən el ağsaqqalı bərk xəstələnir. Ağrı onu əldən salır. Heç kim ona əlac eləyə bilmir.

İllər yormuş bir loğman onun dərdinin adını deyir, dərmanının çətin tapılacağını da bildirir: Dərmanı cövhər sulu bulağın üstündə bitən çəhrayı rəngli güldü. Xəstə o bulağın suyunda o gülü çay əvəzi dəmləyib içməlidi.

Elin cavanları həmin gülü axtarmağa yollanır. Fəhmli cavanlardan biri gülü də, həmin gülün yanındakı bulağın suyundan da gətirib gəlir. Loğman gülü görüncə gülümsünür; həmin gülüymüş.

El ağsaqqalı sağalır. Onun şəfa tapdığı bulağın adı qalır Cənnət bulağı…

**Daş çoban**

Çox-çox qədim zamanlarda bu həndəvərlərdə bir çoban qoyun otarırmış. O çağlarda nə Dibsiz varmış, nə də Keçiqıran. Çoban da, sürü də susuzluqdan çox əziyyət çəkirmiş. Çoban Allaha yalvararaq ondan imdad istəyir, su olarsa qurban kimi bir ağ, bir də qara qoç kəsəcəyinə and içir. Çobanın əhdi yerinə yetir; hər qoça görə Tanrı bir göl yaradır: Dibsiz göl, Keçiqıran göl. Çoban andına əməl eləmir – qoçları kəsmir. Allah onu sürüsü ilə birlikdə daşa döndərir.

**Keçiqıran**

“Yastı qar”dan yuxarıda adsız bir göl varıymış. Bu göllərin həndəvərləri nəhayətsiz otlaqlardı. Aran Borçalıdan bir ağa hər ay burda binələnər, davarmı, mal-qarasını burda otartdırar, bol mənsil götürərmiş.

Bu ağa çox əzazil, qaniçən bir adamıymış. Nökərlərinə, qulluq, çularına “göz verib işıq vermirmiş”, hər xırda suça, diqqətsizliyə görə onlara zülüm verdirərmiş. Arxacdan beş dana oğurlandığına görə danaçını qaniçən itlərin qabağına atdırıbmış. Belə xasiyyətinə görə ona Zulum ağa deyərmişlər.

Zulum ağanın mağmın, dili özündə olan bir çobanı varmış. Yetim, yiyəsiz-suavsız bir adam olduğuna görə Yetim Çoban adıyla tanınırmış. Bir gün Yetim Çoban sürünü Dibsiz gölün həndəvərinə yayır. Özü isə yapıncısını sərib bir hovurluğuna dincini almaq istəyir; gecə “ağzımurdarlar” arxaca təpgi elədiyindən yuxusuymuş. Qoyunlar xarpa-xarpla otlayırmış. Bir qədər aralıda həzin ney səsi gəlir. Yetim çoban pıçıldayır: “Naxırçıdı. Yenə dərdindən çalır”. Urəyi kövrəlir Yetim çobanın, doluxsunur…

O, xəyaldan ayrılıb sürüyə tərəf boylamr. Gözlərinə inana bilmir: sürü gölə tərəf qaçışırdı. Sürünün arxasınca cumur. Təkələr göldə boğulmuşdu. Suyun üzündə qoyun leşləri görünürdü. Yetim Çobanın harayı, Bozdarın ulartısı dağlara yayılır. Yetim Çobanın “urvası uçmuşdu”. Soyuqdan yox, qorxudan titrəyirdi; Zulum ağa onu zulum günlərə qoyacaqdı. Qaçıb getməyə, başını daldalamağa heç bir simsarı yoxuydu. Qaçıb getsə də Zulum ağanın çaparları onu tapıb qaytaracaqdı. Naxırçı ona toxtaqlıq verməyə söz tapa bilmirdi…

Zulum ağanın qara-qışqırığı eşidilir…

Yetim çoban əllərini göyə açır: – Allahım! Məni Zulum ağanın zulumuynan öldürməkdənsə, itlərinə yem eləməkdənsə qara daşa döndər!..

Möcüzə baş verir; Yetim çoban da, Bozdar da, davar da bir anın içindəcə daşa dönür.

O gündən o adsız gölə – Yetim Çobanın daşa dönməsinə baiskar olan gölə “Keçiqıran” (keçilər qırılan) göl deyirlər…

**Qoşa bulaq**

Öz tükünün üstə dolanan kasıb bir kişi aranda mənsil yığa bilmədiyi üçün hər il sonralar Qoşa bulaq adlandırılacaq yerdə binələnərmiş. Adına Mağmın Əli deyirlərmiş.

Mağmın Əlinin su sonası kimi iki növrəstə qızı varmış. Bu qızlar hər gün inək sağınından sonra çox da iti axmayan nazik sulu dağ çayında çimib sərinlənərmiş.

İsti günlərin birində iki bacı bir-birinə qoşulub yenə çaya enir, Dörd yana boylanırlar ki, birdən yoldan-izdən keçən olar. Heç kim görünmədiyindən soyunub çimirlər…

Dünyanın dürlü-dürlü qayğılarından uzaq olan bacılar daşın üstündə oturub qurulanada analarının səsini eşidir:

– Nərgiz! Bənövşə! Hardasınız, a günü qaralar? Gəlin, buzoylar mıxçada qalıb axı!

Qızlar tələsik geyinməyə başlayanda gözləri qarşı yaxada dayanıb onlara baxan qıvçax geyinmiş iki bığıburma cavana sataşır. Qızlar ismətdən donub qalırlar. Beş-altı saniyə ötür…

Oğlanlar dərəyə tərəf enirlər.

Nərgiz bacısını köksünə sıxıb əllərini göyə açır:

Ey gözəgörünməz! Qoyma ki, el içində rüsvay olaq! Ata-anamızın xəcil-xəcalət olmasına imkan vermə!..

Oğlanlar dərəni keçib dayanırlar; qızlar yoxuydu. Göy üzündə iki göyərçin dolaşırdı qızlar göyərçinə dönüb göyə çəkilmişdi…

Mağmın Əli hər yanı axtarır, hər yana soraq salır, qızlarından xəbər tuta bilmir. Kişi dərddən üzülüb canını tapşırır. Onun məzarı üstündə iki göyərçin lələk tökür…

Qızyetər hər gün mal sağınından sonra dağ çayının sahilinə enir. Həmişə qızlarının qurulandığı yerdə dayanır, göz yaşları quruyunca ağlayır. Onun göz yaşlarından iki yanaşı bulaq yaranır – “Qoşa bulaq”…

**Qaradağ**

Ağbabada yaşayan Məmməd kəndin ağasının qızına vurulur. Qız onu bəyənmir. Bu sevda dilə-dişə düşür. O, tay-tuş içində xəcalətli qaldığından Aynişanı götürüb qaçır, Borçalıya üz tutur. Qara xaçdan aşıb gecə-gündüz at sürür, gəlib çıxır Faxralıya, sonralar Qara dağ adlandırılacaq dağın ətəyinə. Qızın əl-qolunu açır. "Daha hara qaçasıdı ki?" düşünür. Ocaq qalamaq üçün quru odun yığmağa gedir. Bir az keçmiş Aynişanın harayını eşidir. Sən demə, o, Məmmədin əlindən qaçmaq fikrinə düşübmüş. Gəldikləri yolla deyil, dağ-daşdan aşıb uzaqlaşmaq istəyirmiş. Təntidiyindən ayağı büdrəyir, özünü saxlaya bilmir, dağdan uçur. Aynişan ölür…

Məmməd sevdiyi qızın ölümündən sarsılır. "Sinəmə qara dağlar çəkdin, a dağ!" – pıçıldayır və əlini xəncərinə atır…

Bu pıçıltı bir sorağa, səs-sədaya dönür. O vaxtdan bu dağın adı **Qaradağ** qalır…

Mənbə : **Rəşid Faxralı** – ***"Oğuz eli Faxralı"***

# Faxralı lətifələri

## Süpürgəni Mamara ver

Qırxıncı illərdə Söynalı xan (Hüseynəli xan, Poladdıdandı, əsrin əvvəllərində Bakıya gedib, inqilabi hərəkata qoşulub, M.S. Ordubadinin "Dumanlı Təbriz" romanında adı gedən Hüsüynəli xan onun prototipidir) kolxozun inzibatı binasında xidmətçi işləyirdi.

Onun işi kolxoz sədrinin xoşuna gəlmir. Kişi xaylağı o boyda idarədə nə səliqə-sahman yarada bilirdi ki. Günlərin birində kolxoz idarə heyətinin iclası çağrılır. Gündəlikdə bircə məsələ varmış: Söynalı xanın iş məsələsi. Kolxoz sədrinin göstərişi ilə duran-duran Söynalı xanın işdən çıxarılmasını, onun yerinə Mamarın təyin olunmasını təklif edir. Söynalı xan işin nə yerdə olduğunu anlayır. Axırda dözə bilmir, elə yerindəncə dillənir:

– Canım, bi nə həngamədi açırsınız, boş bir şeydən ötrü camaatın başını xarab eləyirsiniz. Belə işdən ötrü də bravlenni çağırarlarmı? Elə bircə kəlməynən deyərdiniz ki, ay Söyün xan, süpürgəni Mamara ver, mən də verəydim…

## Qəbrstanlığa gəlmişəm

Cabbarın qənsəsinə xeyli adam toplaşmışdı. Payızın son ayı ola, bayır-bacadan da iş qurtara, əlbəttə ki, söhbət (Faxralıda yaşlı kişilər söhbətə gap deyirlər) saqqız kimi uzanasıdı, şər qarışana kimi də çəkəsidi.

Cabbarın qənsəsi ayrı aləmdi. Yalan olmasın, dünyanın dürlü-dürlü problemləri də burda müzakirəyə çəkilir, "həll olunur", xırda məişət dedi-qoduları da. Nə isə, toplaşanlar görürlər ki, Namaz Ayvazov da bura gəlir. Biri deyir ki, gəlin onun hazırcavablığını sınağa çəkək: Onsuz da salam verəcək, heç kim onun salamını almasın, görək nə eyləyəcək. Maraq xətrinə bu təkliflə hamı razılaşdı.

Namaz yaxınlaşır. Adəti üzrə bir anlığa dayanıb toplaşanları süzür. Heç kimdən şübhələnmir, kəmali-ədəblə salam verir:

– Salam-əleyküm!

Dillənən olmur. Namaz güman eyləyir ki, onun salamını eşitdəyiblər. Bir də salam verir:

– Salam-əleyküm!

Yenə dillənən olmur. O, işin nə yerdə olduğunu anlayır. Əlini üzünə çəkib salavat çevirir:

– Bissimillah! Mən də elə bilerəm ki, Cabbarın qənsəsindəyəm. Sən demə, qəbrstanlığa gəlmişəmmiş!…

## Bu yandan o yana "Salam-əleyküm!"

Aradan beş-altı gün keçir. Namaz yenə Cabbarın qənsəsinə gəlir. Ayaq saxlayıb toplaşanları süzür. Görür ki, o gün salamını almayanlar da var, başqaları da. Əli ilə "təzələr" olan tərəfi göstərib deyir:

– Burdan o tərəfə salam-əleyküm!..

## Birədən qan alıb filə vurmazlar

Hətəmin oğlu Mübariz motosikletlə İmirhəsən kəndinə tərəf gedirmiş. Gilliyin burnunda görür ki, bir yük maşını dayanıb, sürücü də maşının yan-yörəsində narahatlıqla gəzişir. Güman eləyir ki, maşın xarab olub. Kömək eləmək məqsədi ilə motosikli saxlayıb sürücüyə yaxınlaşır – Lələ Söyünüymüş.

– Nooluf, ay Söyün dayı? – Mübariz qayğıkeşliklə soruşur.

Lələ Söyün sevincək:

– Yaman yerdə axşamlamışam, bajoğlu. Maşının benzini qurtarıf. Maa bir-iki litir benzin ver, kəndə kimi gedə bilem, – deyir.

Mübariz gülümsünür:

– Ay Söyün dayı, dünya görmüş adamsan, heç eşidibsənmi ki, birədən qan alıf filə vururlar?..

## Bunların atasına rəhmət

Hətəmin oğlu Mübarizin evi kəndin qəbrstanlığına bitişikdi. Günlərin birində Qarıv oğlu Oruc oğlu Bahaddin onunla zarafat eləmək istəyir. Camaatın gur yerində onu yanılayıb soruşur:

– Ay Mübariz, sən öz canın, düzünü de, ölülərnən nə təhər qonşuluq eləyirsən? Qorxmosanmı?

Mübariz də Mübarizdi axı, dünyasında sözə gəzinməyib:

– Ay Ziyəddin lələ, belə şeydən ötrü nə and veresən. Ölülərin atasına min rəhmət, çox rahatdılar. Sizlərdən maa ətər-xataf toxunmasın, onlardan çəkinmerem…

## Medomost məsələsi

Yetim Əhməd kolxozun camışlarına qulluq eləyirdi. Allahdan olan kimi, həmin il qış çox sərt keçir. Bir gün alaf tamam qurtarır. Eşikdə qar dizə çıxa, heyvanlar ac, canıyanan da malabaxan ola, onda gör işin harasıdı. Camışlar acından axur gəmirir, böyürtüləri fermanı başına götürür. Səbri daralan Yetim Əhməd qar tığını dizləyə-dizləyə düz gəlir qənsələrə. Qaranəfəs girir kolxoz sədrinin kabinetinə. Əlüstü salam verib deyir:

– A Binnət müəllim, comuşdar ajınnan axur gəmirer. Belə getsə qırılajaxlar. Axırda da günahkar mən olajam. Ferma müdürünün nə vejinə, öz kefindədi. Ona deməkdən can boğaza yığılmışam. Əmr elə, alaf yollasın. Mənim də canım dincəlsin, comuşdarın da.

Binnət müəllim eynəyini düzəldib ağır-ağır dillənir:

– Əhməd dayı, bir-iki gün də səbr elə, təzə tayanın başı açılacaq. Vedomost tutub göndərərik.

Əhməd kişini od götürür:

– A sədr, nə danışdığındı? Qara comuş nə qaner vedomos nədi? Ona alaf lazımdı, alaf!..

## Halalım olsun!

Yetim Əhmədin kiçik boylu, xırda sümüklü bir atı varıydı. Onu elə “ Gödək” deyə çağırırdı. Bir dəfə çaydan keçəndə sel-su atı aparır. Kişi yandığından bilmir nə desin:

– Get, a Gödək, get! İşdətdiyim də halalım olsun!

## Ay dirildin haa!

Qırğa Bayramla Qara Bayramın möhkəm zarafatları varıydı. Həm də bərk dostuydular.

Qara Bayram ağır xəstəliyə düçar olur. Təbib-loğman onun xəstəliyinə çarə tapa bilmir. Bir axşamüstü Qırğa Bayram yenə qonşusunu yoluxmağa gedir. Otaqdakılar onu xəstənin yatdığı çarpayının yanına dəvət edirlər. Qırğa Bayram xəstənin "alt çənəsini kəsdirir" onu diqqətlə, uzun-uzadı süzür. Sonra içini arıtlayıb xəstəyə sarı əyilir:

– A Bayram!

Qara Bayram canını dişinə tutub dillənir:

– Haa!

– Ayə, məni tanıdınmı?

Öz canının hayında olan xəstə başını azca yana əyir, onu söhbətə çəkən adamı qıyğacı süzür. Dodaqları azca qaçır:

– Tanımadım.

– Kiməm?

– Kim olasısan, Şota döyülsənmi?

Qırğa Bayram eşitdiklərinin zarafat, yoxsa gerçək olduğunu anşıra bilmir. Adaşının xasiyyətinə yaxşı bələdiydi axı. Üzünü yana çevirib pıçıltıyla:

– Bu tanımaqla ay dirildin haa! – deyir.

Otaqda xəfif bir pıçıltı dolaşır…

## İçəcəyəm!

Qara Allahyar spirtli içkilərə, əsasən də arağa meyilli adam olub. Oğul-uşağı, nəslin ağsaqqalları nə illah eləyirlərsə Allahyar şakərindən əl çəkmir ki, çəkmir. Axırda son çarə kimi onu Qurana and içdirməyi qərara alırlar:

– Sən xoşa-xoşnan içkini atmadın. Nə ağsaqqal saydın, nə qarasaqqal. İndi ki, belə oldu, qusullanıb Qurana əl basajaxsan. Səni içkidən tərgitməyin yolu budu!

Bu əhlikef kişi bir anlığa duruxur. Qurana and içməyin nə demək olduğunu yaxşı dərk eləyirdi:

– Allahınız olsun, maa belə zulum eləməyin, – deyə xahiş eləyir.

Onun xahişinə, yalvarışlarına məhəl qoyan olmur. Allahyarın əlacı kəsilir. Bir qədər fikirə gedib dillənir:

– Yaxşı, siz deyən olsun.

Qara Allahyar hamamlanır, qüsullanır. Gecdən-gec otağa daxil olur. Hamı sakitciliklə onun hərəkətlərini izləyir. Bir müddət keçir. Allahyar otaq boyu göz gəzdirib onu bu günə salanları tərs-tərs süzür. Və… şəstlə irəli gəlir, Quranı öpüb gözünün üstünə qoyur:

– Allah hamınızdan razı olsun, maa, mənim ailəmə canınız yaner. Əziyyət çəkib gəlifsiniz. Qurana əl basmağa da sizin xatrınıza razı oldum. Qulaqlarınızı açıb eşidin: bu Qurandı, bu haqqı, içəjəyəm. İnnən belə özünüzə, nə də maa zülüm eləməyin…

***Qeyd:*** *Bu əhvalatı Hallavarın oğlu Yusiflə bağlı olduğu da söylənilir.*

## Daa limonad verin

Hümbət öyünün (əslində Balaməmmədlinin) Məhəmmədin yaşa dolmuş vaxtlarıydı. Kişi qəflətən xəstələnir. Həkimlər ona spirtli içki içməyi qadağan eləyir. Araq-çaxıra nə qədər meylli olsa da Məhəmməd kişi məsləhətə boyun əyir – içmir.

Nəslin ağsaqqalı kimi Oqtayın nişanına onu da aparırlar. Qalayçıların Paşa adına layiq süfrə açır.

Yeri gəlmişkən,

*İsmayıl kişi qudası Paşaya deyir ki, bizimkilər çox yeyəndi, ət-filan öz yerində, axşam da göy-göyərtini bol elə…*

Yemək-içmək başlayır. Aşıq da məclisdəkilərin könlünü açır. O illərdə limondan hazırlanan “Limonnaya vodka” da varıydı və rəngi limonaddan qətiyyən seçilmirdi. Məclisin şirin yerində Məhəmməd kişi üzünü cavanlara tutub:

– A bala, maa limonad verin, – deyir.

Namaz ilə Şəmil gözləşir. Kişiyə limonad əvəzinə bir çappa stəkan “Limonnaya vodka” verirlər. Məclisdəkilər, elə Məhəmməd kişinin oğulları da hardan biləydilər ki, onun içdiyi limonaddımı, araqdımı. Məhəmməd kişi arağı limonad əvəzi içir. Təbii ki, heç kim heç nə unamır.

O, bu minvalla cavanlardan üç dəfə limonad istəyir. Cavanlar da ona hər dəfə limonad yox, araq verirlər. Məclisin sonuna yaçxin Məhəmməd kişi bığlarına ötəri bir qumanda verib ağır-ağır deyir:

– A bala, canınız sağ olsun, çox razıyam. Maa daa limonad verin…

## Qapıma atnan gəlmə!

Obexe Vəliynən (Vəli Budaqov) Hümbətoğlu Məhəmməd möhkəm dost idilər. Bir-birlərinə qohumluqları da çatırdı. Aralarında xeyli yaş fərqi olsa da söhbətləri tuturdu.

Bir ili qış çox sərt keçir. Camaatın ot-alafı azalır. Hamı mal-qarasını birtəhər yaza çıxartmaq üçün alafını qənaətlə işlədir. Camaatın imkanı olsa da bu "ağ qarda, göy buzda" dağ kəndlərindən ot, aşağı kəndlərdən tay gətirmək çox çətin olardı.

Obexe Vəlinin də mal-qarası ot-alaf sarıdan korluq çəkir. Vəziyyətdən çıxmaq üçün ayrı çarə tapa bilmədiyindən hər axşam atını minib gəlirmiş Hümbətoğlu Məhəmmədin evinə; Vəlinin gözləri alıbmış ki, qohumunun hələ başı açılmamış bir ot tayası da var. Vəli hər axşam atını həmin ot tayasının yanına bağlayar, özü evə keçərmiş. Allah verəndən yeyib-içərmişlər. Bir gün Məhəmməd kişi fikir verib görür ki, ot tayasının bir böyrü tamam-kamal yeyilib, taya yıxıl-ha-yıxıldı. "Obexenin atın1n işidi" – pıçıldayır. Səhərisi gün şər qarışan vaxtlarda doqqazlarına çıxır ki, Vəliynən yolda qarşılaşsın. Belə də olur. Məhəmməd kişi salam-kalamdan sonra ağır-ağır dillənir:

– A bala, a Vəli! Bilersən ki, xatrını çox isdiyirəm. Hər axşam başınnan beş kişi gətir, yeyin-için, burun-damaq eləsəm kişi döyüləm. Ama bir də bizə atınla gəlmə.

## Çoxdan "moqida" oluf

Davanın ağır vaxtlarında "Qara kağız"lar gündə neçə evin qapısını döyürdü, neçə ocaq söndürürdü. Buna baxmayaraq, camaat yenə bağrına "daş bağlayıb" kolxozun işini aşırırdı, işdən vaxt eyləyib öz həyət-bacasını da becərirdi. O illərdə uşaqlar da yaşlarından qabaq böyüyürdü; hodağa gedirdilər, dərz bağlayırdılar…

Hümbət oğlu İsmayılın bacısı oğlu Ələkbər (Uzun Ələkbər) də davadaydı. Anası çətinlik çəksə də hər əzaba qatlaşıb ailəni birtəhər dolandırırdı. İri cüssəli oğlundan xeyli müddət kağız almır. Ananın ağlına min cür fikir gəlir, rahatlığını itirir. Bir gün obaşdan toxdaqlıq adına qardaşı İsmayılın evinə gedir.

– A bajı, belə tezdən xeyirdimi? – İsmayıl narahatlıqla soruşur.

– Ay Simeel, Balaxanım doluxsunmuş halda dillənir. Canım od tutub yaner, ay Simeel. Ələhvərdən beş aydı kağız gəlmer.

İsmayıl kişi demisini odlayıb bir qullab vurur, acıqlı-acıqlı:

– Aaz, Qızıl qayada Ələhvər yekəlikdə fısdıx ağacı yoxdu, ondan nemesin gülləsi boşa keçməz. İndi oğlun çoxdan "moquda" (gürcü dilində ölüb deməkdir) oluf. Mən də deerəm görəsən bu tezdən atıla-atıla nəyə gəlif. Get o biri uşaxlara göz-qulağ ol!..

## O da sənin kimi it döyülmü?

Hümbətoğlu İsmayıl təzə çarıq tikdiribmiş. Axşam evə gələndə soyunub çölə qoyur ki, iyisi-qoxusu dağılsın,

Əmisi uşaqlarının – Kök Namazın oğlu Səmədin, bir də Məhəmmədin hərəsinin bir səmə iti varıymış. Bu itlər gecə İsmayıl kişinin çarıqlarını aparır – hərəsi bir tayını. Məhəmməd kişinin iti çarığı didik-didik eləyir, Səməd kişinin iti isə çarığa toxunmur, elə həyətə atır.

İsmayıl kişi səhər durub görür ki, çarıqları yoxdu. Malı itənin imanı itər – deyiblər. Kişinin gümanı min yerə qaçır. Çarığı axtarırlar; orda çarıx, burda çarıx – gördüm deyən olmur. Nəhayət, bir tayını Səməd kişinin, o biri tayını isə Məhəmməd kişinin qapısından tapırlar. İsmayıl kişi əl ağacını götürüb düşür Məhəmməd kişinin itinin üstünə:

– Səmədin iti də sənin kimi it döyülmü? Niyə o tamahını boğub çarığa toxunmur, sən onu didik-didik eləyirsən?..

## Bir qav ətdən iki qav sümük

Hümbətoğlu İsmayılı toya çağırırlar. Bir qayda olaraq "Cağrılan yerə ar, çağırılmayan yeri dar" eləməyən İsmayıl kişi gedir toya. Sabahısı gün dilixuruşdunun biri bu ayar ağsaqqaldan soruşur ki, toy necə keçdi. İsmayıl kişi üz-gözünü turşudub cavab verir;

– Pis keçmədi, a bala, ama bir qav ət vermişdilər, iki qav da sümük çıxdı.

## Bəlkə əmim ölör?

Balaməmmədlinin Allahverdi kişi yaşı 120-ni haqlayanda ölüm döşəyinə düşür. Kişinin sağalacağına güman olmadığından ehsanlıq üçün bir inək alıb qardaşı oğlu Musaya tapşırırlar ki, otarsın, kişi keçinəndə kəssinlər. Allah vəkili, Musa heç nə demir. İnəyi örüşə aparır.

Bir ay keçir, ay yarım keçir, Allahverdi kişi ölümə təslim olmur. Musa da ki inəyi otarır, Günlərin birində gün çeşt yerinə qalxmamış inəyi örüşdən qaytarıb evə gətirir. Onu təəccüblə süzənlərə köntöy-köntöy baxıb acıqla: – Nəyə baxersınız? Bəlkə heç Allahverdi əmim ölmör, mən bu inəyi havağa kimi otarajam? – deyir.

## Əngimnənmi vuroydum?

Əhmədin rəngi-rufu Güləsəri "açmır". Hələ desən bir az qorxur da:

– A kişi, nooluf? Əhməd özünü birtəhər taxtın üstünə salır:

– Arvad, çaqqal "paqq" elədi, ürəyim "taqq" elədi, qorxmuşam.

– Bə niyə vurmadın? Ay rəhmətdiyin qızı, belimdə qatar, çiynimdə tüfəng, əlimdə qəmə, əngimnənmi vuroydum? – deyə acıqlanır.

## Tülkününkü bir allaha qalıf

Kəndin çıxacağında Dəmirçi Əlləznən rastlaşan Molla Bayram marağını gizlədə bilmir:

– Nooluf, Hara belə, uğur ola?

Dəmirçi Əlləz soyuqqanlıqla dillənir:

– "Köndələnnər"də tülkü görmüşəm. Yuvasını da bələdləmişəm! Onu tutmağa gedirəm.

– Bu nə yarax-yasaxdı? Elə bil döyüşə gedirsən.

– Bu, köşəndi, qavaxcax tülküyə tüsdü verəjəm, çıxdı ki, cıxdı. Çıxmasa yuvanın ağzını qazmıynan qazajam, belnən genəldib torpağını atajam. Onda tülkü çıxmağa məcbur olajax. Sonra bu tüfəngdi, tülkünün canıdı.

– Pahoo! Daa denən ki, tülkününkü bir Allaha qalıf, – deyə Molla Bayram gülümsünür…

## Bu gələn kimdi?

Arıx Söyün arandan Qaraxaç yaylağına gəlirmiş. Onun mindiyi atı qan-tər içində görən Nədir (Şair Nəbinin oğlu) özünü saxlaya bilmir, bədahətən deyir:

*Ayə, bu gələn Arıxdımı,*
*Ayağında çarıxdımı?*
*Altındakı yağır yavı,*
*Böyründəki nöyüt qavı,*
*Nə minifdi çərrəmişi*
*Baldırları qırıxdımı?..*

## Sənin xəstən olmaram

Payızın yaraşığı, şırqası toylardı. Faxralıya payız gəlmişdi; payız murazlıların fəslidi.

Toyların lala vaxtıydı. Əl-ayaq çöl-bayırdan yığıldığından toylar şamartılı keçirdi. Payızın sərinliyi, qorxacaq küləkləri toy damlarının hərarətini azalda bilmirdi. Sazlı-sözlü mağarlar ahıla da, cahıla da könül xoşluğu verirdi.

Mahmıddarın Şamilin qızının toyuydu. Allahdan olan kimi, toy ərəfəsində İlyaz müəllim (Ayvazov) xəstələnir, kəndin xəstəxanasında müalicə olunur. İlyaz müəllim "Nə olur-olsun

toya getməliyəm, getməsəm qaranoyun xatrına dəyər”, – düşünür və kənd xəstəxanasnın baş həkimi Şərif Ayvazova heç nə demədən toya gedir…

Şərif həkim görür ki, əmisi oğlu İlyaz da toydadı. İş işdən keçmişdi, daha nə deyəsiydi ki, İlyaz müəllim hər ikisinin qohum olan Vəkil həkimlə yanaşı oturur. Bu, Şərifin diqqətindən yayınmır, müalicə olunan əmisi oğlunun araq-çaxır içəcəyindən ehtiyatlanır. Uzaqdan-uzağa da olsa deyir ki, ay İlyaz əmi,..birdən içib eləyərsən, haa! İlyaz müəllim:

– Yox, ay Şərif! Özüm bilirəm ki, iynə-dərmanla içki tutmur. Narahat olma, içmərəm, deyə Şərif həkimi arxayınlaşdırır.

Dörd yanın dost-tanış ola, arəstə məclis ola, aşıq da ki, duyğu. larına sığal çəkə, içmə görüm necə içmirsən. Bunu Şərif də hiss eləyir:

Ay İlyaz əmi, deyəsən yavaş-yavaş Vəkilin fitvasına gedir– sən…

Belə xatırlatma bir neçə dəfə təkrar olunur. İlyaz müəllim “kefi durulanda” dözə bilmir:

Nə zəhləmi tökürsən? Xata eləmədik ki, sənin xəstəxanana gəldik. İndi də sənin xəstən olmuram, Vəkilin xəstəsi oluram. 0 da sənin kimi bir həkimdi!..

## Qara gəl, Yaylax!

Xosuroğlu Hümbətin qızı Dilbər Həcərin qızı Rozanın bacılığı idi. Rozanın toyuna az qalmış Həcər xala Dilbərin anası Gülxana ismarıc göndərir ki, qızın toyunu eləyirik, yaylıx tədarükündə ol.

Təzə bəy Qumbara ayamalı Məmməd idi. Xəbəri eşidəndə Xosuroğlunun “urvası uçur: “Öydə mer-meyvə, qampet-qalet yox, civdə də pul. İndi mən başıma haranın daşını salem?” Ümidi qapıdakı iki-üç arabalıq oduna gəlir.

Xosuroğlu öyrənir ki, sabah Şamratdının Əziz, Qasımıllının Rusdam, Xudatdarın Elman Sarvana odun satmağa gedirlər. O da qonşularına qoşulur. Səhər işıqlaşar-işıqlaşmaz yola düzəlirlər.

Xırda-xırda yağan yağış da onları uğurdan saxlaya bilmir.

İmirhəsənin çayını keçməli idilər. Əzizin arabası keçir, Elmanın arabası keçir, Xosuroğlunun arabası keçəndə su güclənir. Xosuroğlu nə illah eləyirsə, at yeyinləmir. Su arabanı atqarışıq, ağzına alır. Özü bir təhər sudan çıxır, hirsindən-hikkəsindən bilmir nə eləsin. Gücü qurucan sözə çatır:

– Qara gəl yaylax! Öyün yıxılsın, Qumbara! Ayə, a zalım oğlu, beş-on gün də savır eləsən dədənin küməsimi qaralacaqdı?..

## Onlar da adamdı

Söyünqululuların Yetər Bakıya – oğlu Hüseynqulunun evinə gəlibmiş. İş elə gətirir ki, nəvəsi Elxanın Şəki rayonundan olan dostu iki-üç gün dalbadal onlara gəlir. Bir dəfə Yetər nənə kirmişcə Elxandan soruşur:

– A bala, bu oğlan Faxralıdan kimlərdəndi?

Elxan cavab verir ki, ay nənə, bu oğlan Faxralıdan deyil, Şəkidəndir.

Yetər nənə qonağı diqqətlə süzür, mehribanlıqla dillənir:

– Neynək, a bala, neynək. Heç zad olmaz. Onlar da adamdı.

## Fərqimiz yoxdu

Quvuş öyünün Tahar araq-çaxıra, kefinin duru vaxtı qumar oynamağa da meylli adamıydı. Siqaret çəkmək də ki, öz yerində. Əmisi Alaxançal Hasanla maması Əsmər sözü bir yerə qoyurlar ki, Taharı içki içməkdən, qumardan, lap elə siqaretdən də çəkindirsinlər; Tahara and içdirməyi qərara alırlar. Tahar çarəsiz qalıb qurana əl basır ki, bir il nə içki içəcək, nə qumar oynayacaq, nə də siqaret çəkəcək…

Günlərin birində Əsmərin qızı Bənövşə Arxacın üstündə Taharla qarşılaşır. Hal-əhval tutduqdan sonra Bənövşə canıyananlıqla soruşur:

– A Tahar, ağrın alem, nə təhərsən?

Elə bil Taharın döyənəyini basırlar. Təsbehini çevirə-çevirə candərdi gülümsünür, köksünü ötürüb deyir:

– Nə təhər olajam, a Bənöyşə bajı? Bu saat sənnən maa heç tavoot yoxdu. Mən də sənin bir tayın.

## İçməmişəm, yimişəm

Taharın qadağa müddəti qurtarır. Yenə başlayır yeyib-içməyəı tay-tuşlarıynan xoş günlər keçirməyə. Qohum-əqrəba, ərki çatanlar onu yenə danlayıb, məzəmmətləsə də bu dəli-dolu cavan şakərindən əl çəkmir ki, çəkmir. Ona yenidən and içirdirlər, yena Qurana əl basır ki, bir il nəinki araq-çaxır, heç pive də içməyəcək.

Günlərin birində Tahar dəmlənir. Məhləyə pıçıltı düşür ki, bəs, Tahar andını basıb – piyandı. Bu xəbəri əmisi Hasan da eşidir, Əsəbdən kişinin var bədəni titrəyir. Çəpəri o üzə aşıb Taharı “axtaxanın genindən salıb, darından çıxardır”:

– Ayə, qurumsax! Quran saa oyur-oyuncaxdımı? And içmişdin ki, içmiyəssən, bə nooldu?

Tahar bu xəbəri əmisinə çatdıranın “yeddi arxa dönəninə” söyüb yazıq-yazıq dillənir:

– Ay Hasan əmi, vallah içməmişəm.

Hasan kişini od götürür:

– Nejə yanı içməmişəm, görmörəmmi ki dilin söz tutmor, ayağ üstə durammesan!

– Vallah içməmişəm, ay Hasan əmi, yimişəm. Bir litr çaxırı cəmə boşaldıf içinə əppək doğradım, qaşıxlıyıf yidim. Onun dəmliyidi…

Alaxançal Hasan bu cavabdan sonra Tahara nə deyəsiydi ki?..

## Heç Allah qavıl eləməsin!

Usuv öyünün İsrafilin doqqazının qənşərində balaca bir tikili var. Adına “Ojax” deyirlər, yəni pir, niyyət yeri. Diləyi, niyyəti olanlar bu ojağa nəzir deyir, niyyəti yerinə yetənlər gətirib ora nəzir-niyaz qoyur.

Quvuş öyünün Tahar Qurruşa gedirmiş. Yolu Ojağın yanından düşür. Gözünə Ojaxda bir parıltı dəyir. Ayaq saxlayıb baxır xırda pullarıymış. Yaxınlaşıb götürür: 13 qəpik. O illərdə bir paçka “Prima”nm qiyməti 14 qəpiyiydi. Tahar acıqlı-acıqlı deyinir: – Heç Allah qavıl eləməsin. Bəs bunun 1 qəpiyini hardan alem ki bir paçka “Prima”ya çatsın?..

## İçindən komsomol çıxar

30-cu illərin əhvalatıdı. Qara öyünün Bayramın könlünə un xaşılı düşür. Bilənlər bilir ki, un xaşılı bir az gec əmələ gələn xaşıldı. Mütəkkəyə dirsəklənmiş Bayram kişinin səbri daralır: “Nooldu, hazır olmadımı?” Arvadı xəmirli oxlovu göstərib deyir:

– Amanın qırıldımı? Görmösənmi hələ qarışdırıram!

Bayram kişi bığaltı gülümsünür:

– Bir az yavaş qarışdır, a patavasızın nüəsi, birdən içindən komsomol çıxar.

Çuxasını çiyninə atıb məhləyə çıxır çənə söhbətinə.

Səhərisi gün Bayram kişini qənsələrə çağırırlar. Kişi o gedən olur…

## Torpaxla getsin!

Molla Asdan (ona Aslan Allahverdiyeviç də deyirlər) qəbristanlıqda baş daşlarının birinin üstündə oxuduğu "Yasin" surəsini xətm eləyib tələsik addımlarla qazılan qəbrin yanına gəlir. Dəfnin ləngidiyini görüb təəccüblə Molla Mustafanı (Əlizadə) süzür. Molla Mustafa onun nə demək istədiyini başa düşüb pıçıltıyla: "Meyid torpağa tapşırılandan sonra "Yasin" oxuyajam. Onda meyid qəbirdə qalxıb oturajax. Qəbir dayazdı, meyid oturanda başı qəbirin üstünə düzülən piltələrə dəyəjək. Qoy qəbri dərinləşdirsinlər",– deyir.

Molla Asdan acıqlanır:

– Qəribə adamsan, vallah. Oturanıydısa öz xarabasında oturaydı, burda nə azar1 varıydı! Torpaxlat getsin!…

## İki-iki ölərik

Dili xuruşdunun biri Molla Asdandan soruşur ki, dolanışın necədi. Molla Asdan köksünü ötürüb dillənir:

– Çətindi. Ayda bir adam ölür, bunnan nə təhər dolanım. Həmsöhbəti gülümsünür:

– Qəm eləmə, Asdan kişi. Sənin xətrinə daha iki-iki ölərik. İkisi də şaqqanaq çəkib gülür.

## Kərki əhvalatı

Məmmədin kərkisi itir. Orda kərki, burda kərki tapılmır ki tapılmır. Kişini dərd götürür. Günü gündən saralıb- solur. Arvadı ərinin halını görüb ona təsəlli vermək istəyir:

– A rəhmətdiyin oğlu, bir kərki nəmənədi ki, ondan ötrü bu qədər dərdə-fərcə düşüfsən. Bir-iki günə kimi pensiyamız gələr, təzəsini alarsan.

Məmməd dərindən köksünü ötürüb ağır-ağır:

– Arvad, sənin belə işlərdən başın çıxmaz deyir. – Dərd kərki dərdi döylü, qorxoram xam adamın əlinə keçə, tərsinə bülöylüyə…

## Özünüz nə qədər yeyifsiniz?

Allah Qumbaraya gözəl iştah vermişdi. Yeniyetmə vaxtlarında nə qədər yemək versələr də yenə gözünün pisini tökürdü: "Maa az verifsiniz". Onun bu xasiyyəti ailədə hamını təngə gətirmişdi .

Bir gün Qumbara mal sirəsinə gedir. Həmin gün anası bir cücə kəsir. Zavallı arvad canının dərdindən onun payını çox eləyir ki, axşam qulaqları dinc olsun. Qumbara maldan qayıdanda payını görüb yenə ağlamsınır.

– İndi nooluf, a ağlar-mələr qalasan? – deyə anası onu bir-iki tarpaşdıyır.

– İndidəmi deyəjəksən payım azdı?

– Yox, payım az döyül. Ama maa bu qədər saxlıyanda gör özünüz nə qədər yiyifsiniz – deyə yenə cığallıq eləyir.

## Getməzsən malın aj qalar

Bir gün Ayvaz öyünün Bayram müəllim yoldaşları Abbas Nuriyev, Abbas Abbasov (Yahalar) və Şükür Həsənov yeyib-içiflər. Dili xuruşdulardan biri Sona xalaya xəbər verir ki, Bayram müəllim filan yerdə filankəslərlə yeyib-içməkdədi.

Gecə Bayram müəllim evə qayıdanda Sona xala onu qaş-qabaqlı qarşılayır, əsibdən coşur:

– Saa yüz dəfə demişəm ki, içmə, içsən də tay-tuşlarınla iç.

Bayram müəllim işi başa düşür. Özünü o yerə qoymur:

– Ağlına gələni danışma. Adam baval yüməz. Binnət, Nədir, Qurvan tay-tuşum döyülmü? Onlarla içmişəm. Sona xala onun sözlərinə inanmır. Bayram müəllim bir az da hirslanir:

– O ki, inanmırsan, bu saat gedif Qurvanı bura gətirəjəm. Qoy, təsdiq eləsin ki, onlarla içmişəm…

Bayram müəllim özünü dayısı Qurban müəllimgilə yetirir, əhvalatı ona danışır:

– Gedək Sonanı inandır ki, sizinlə içmişəm.

Qurban müəllim tərəddüd eləyib getmək istəməyəndə Bayram müəllim kefini pozmadan deyir:

– Ot-alaf istəyirdin. Yerini eləmişəm. Münasib də qiymətə satır. İndi ki, getmirsən, qoy malın ajından qırılsın.

Qurban müəllimin çarəsi kəsilir. Bayram müəllimnən gedib Sona xalanı inandırır ki, bir yerdə yeyib-içiblər…

## Amanın qırılerimi?

Qaleyçıların Şükür xəstəxanada müalicə olunurmuş. Bayram müəllim xətrini çox istədiyi bu cavan həmkarını yoluxmaq istəsədə işdən-gücdən vaxt tapa bilmir.

Bir gün Qənsələrin qabağında Şükürü də camaatın arasında görən Bayram müəllim şəstlə ona yaxınlaşır, acıqla:

Sən nə təhər adamsan, a Şükür. Amanın qırılerdımı, bir-iki gün də balnisada qaleydın. Savaxda-zadda yanına gələjiydim, – deyir…

## Saa verəsi ha döyüləm

Avış öyünün (Alğulların) Söynalı (Hüseynəli) çobanıydı. O, kənddə sayılıb-seçilən kişilərdən olub. Özünü ona nisvənd bilənlər davarını yenə ona etibar eləyir. Söynalı kişi də Əfgərrinin (əslində Dəryahlının) Niyazalı kimi yay girməmişdən yaylağa çıxacaqdı.

Bir gün səhər tezdən qızı açalağ-umalağ özünü yetirir atası evine. Çatan kimi anası Bəstinin (el arasmda Təpə Bəsdisi kimi tanınıb) üz-gözündən öpür. Təpə Bəsdisi qızını təəccüblə süzür:

– Nooluf, bu nə quloyşalıxdı eliyirsən? – deyə Təpə Bəsdisi qızını süzür.

Məlum olur ki, qızı inəklərini ona tapşırmaq fikirindədi:

– Aranda mənsil yığa bilmiyəjəm. Bizim inəkləri də dağa apar, – deyə anasına yalvarıb-yaxarır. Təpə Bəsdisi bir az nəm-nüm eləyir. Ana ürəyidi, yumşalır, axırda razılaşır…

El arana qayıdanda Təpə Bəsdisi qızına ismarıc eləyir ki, gəlib yağını-qurudunu aparsın. Qızı pay-pürüşnən gəlir anasının yanına. Təpə Bəsdisi ona balaca bir yağ qarını, on-on beş dənə də qurud verir. – Buyy, a ana, üç inəyə elə bucuğazmı?, – qızı təəccüblə anasına baxır. Təpə Bəsdisi onu tərs-tərs süzür, əlini belinə qoyub dillənir:

– Bə nə bilmişdin, aaz? İnəkləri sağan mən, südü ilidən mən, çalan mən, nəhriyi çalxıyan mən, hazır mənsili saa verəsi ha döyüləm!..

## Adamın ağzını çaparlar

Hallavar kişi 50-ci illərin əvvəllərində qonşu kənddə çobanıymış. Niyəsə qardaşı oğlu Haley də yanındaymış. Kənddən süzülüb gələn "Güləşəngi"nin çılğın sədası 12-13 yaşlı uşağı "silkələyir". Onun umacaqlı baxışları əmisinin nəzərləri ilə toqquşur. Hallavar kişi bığaltı gülümsünür…

Xeyli vaxt keçir, Haley qayıtmır. Hallavar kişi narahat olmağa başlayır. Eləmə tənbəllik, qoyunları Allah umuduna qoyub özünü toyxanaya yetirir. Gəlib nə görsə yaxşıdı? – Haley meydanına çıxanı süpürləyib salır dizinin altına. Yıxılanlar aranı qatıb "qayışbaldır qarabalanı" əzişdirmək istəyəndə Hallavar kişi əl atır sırıxlısının altına, xəncərini çıxardıb tiyəsi ilə

cığalların da, onlara havadarlıq eləyənlərin də ağzına vurur:– Ayə, qırışmallar, nə qayırdığınızdı? Bə demirsinizmi adamın ağzına çaparlar?!

## Arvad, səni kursa yazıflar…

30-cu illərdə ortabab bir qulluq yiyəsinin də arvadını savadsızlığın ləğvi kursuna yazırlar. Beş südəmər körpəsini güc-bəlaynan saxlayan ana kursa getmək istəmir. ÇK-da kişiyə necə təppəcə gəlirlərsə, yazıq dili-dodağı təpimiş özünü yetirir evlərinə. Həyəcandan mətləbi qoşma ilə açıqlayır:

*Səni kursa yazıb əli qurumuş,*
*Köhnədən-köşküldən geyin get, arvad!*
*Getməsən dərimə saman təpərlər,*
*Bir az əlli tərpən, yeyin get, arvad!…*

## Heç zaddan ötrü çıxartdılar

Keçəl oğlu Məhərrəm kənd Sovetinin sədri idi. Əlinin altında fırrama telefon, belində tapança, zəhm də ki öz yerində. “Selsovetin sözü zakondu” Keçəloğlu belə düşünürdü.

Günlərin birində yenə nalox yığanları danlayır, məsləhət, göstəriş verirdi. Elə bu zaman qoruqçulardan biri hövlnak içəri girir:

– Ay Məhhərrəm dayı, qonşu kəndin üç qoluzorlusu qoruğu otarer. Məhərrəm kişi bərk hirslənir:

– Necə yəni otarer? Bə sən nəyə lazımsan? Niyə çıxartmesan?

– Məni saymadılar, hələ üsdümə şeşələndilər də.

– Get denən çıxartsınlar, yoxsa axırı pis olar.

Qoruqçu gedir. Aradan bir müddət keçəndən sonra qoruqçu qayıdıb gəlir. Məhərrəm kişi tələsik soruşur ki, nooldu, mal-atı qoruqdan çıxartdılarmı?

Qoruqçu yazıq-yazıq:

– Yox, ay Məhərrəm dayı, çıxartmadılar. Üstəlik məni hədələdilər də.

Keçəloğlu Məhərrəm alnını ovuşdurur. Üzünü kuryerə tutub aclqla “Atı qapının ağzına çəkdir!” – deyir və pencəyini geyinib kabinetden çıxır.

…Bir gün camaat görür ki, Keçəloğlu Məhərrəm kabinetində oturmur. Dili yüyrəklərdən biri kişini sorğuya çəkir:

– Ay Məhərrəm dayı, savaxdan fikir vererem, niyə kabinetinə getmersən?

Məhərrəm kişi bığaltı gülümsünür:

– Məni işdən çıxardıflar, a bala.

Camaat maraqla soruşur: – Niyə, a kişi? Kimin “qatırını hürküdüfsən?”

Məhərrəm kişi halını pozmadan dillənir:

– Heç zaddan ötrü. Bayaqkı dildən zirək oğlan söhbətin axırına çıxmaq istəyir.

– Elə işmi olar, ay Məhərrəm dayı? Heç zaddan ötrü də adamı işdən çıxardarlarmı?

Oğlanın sözləri Məhərrəm kişini haldan çıxardır:

– Nə qırsaqqız adamsan, ayə! İndi mən boyda kişi saa yalan ha danışası döyüləm. O günü qonşu kənddən qoruğumuzu otaran ikicə adamı öldürmüşdüm, ondan ötrü mən boyda adamı işdən çıxartdılar. Bu, boş şey döylü, bəs nədi? O kəndin iki dılğırından ötrü mən boyda kişini işdən çıxardan hökumətin başı boşdu, boş!..

## Aylığı çağırmağa görə  aler

Xosuroğlu Hümbət səhər biçinindən gəlibmiş. Çay-çörəyini yeyib kolxozun biçininə getməli idi. Bu ara Duzdaxlı bulaqdan onu səsləyirlər:

–Ay Hümbət! Ay Xosuroğlu Hümbət!

Xosuroğlu eşitsə də dillənmir, xörəyini yeməyə davam edir. Yenə çağırırlar, yenə dillənmir. Arvadı Gülxan elə güman eləyir ki, əri çağırışı eşitmir: – Ay Hümbət! Savaxdan səni çağırellar, bir hay versənə?!

Xosuroğlu loxmasını udur, halını pozmadan dillənir: – Dəmirpapaxdı, hökumət ona aylığı elə adam çağırmağa görə verer. Qoy çağırsın!…

## Tapmaca əhvalatı

Dəllək Əsəd ayar adamıydı. Onun incə zarafatlarından heç kim inciməzdi.

Bir gün Qazağ Alının oğlu Nədir üzünü qırxdırmaq üçün dəlləkxanaya gəlir. Atını Musayev İsmayılın dükanının yanındakı ağaca bağlayıb dəlləkxanaya girir. Salam-kalamdan sonra “Ay usta, üzümü qırx, toya gedəjəm”, – deyib papağını çıxardır.

Dəllək Əsəd Nədirin üzünü yenicə sabunlayıbmış ki, Aşağı təsərrüfata tərəf bir traktor keçir. At xəflənir, kəndiri qırıb üzü yuxarıya tərəf qaçır. Dəllək Əsəd gözlərini atın qaldırdığı tozanaqdan çəkib müştərisindən soruşur:

– A Nədir, tappa nədi,

*Traktor tırr,*
*At kəndiri qırr,*
*Daşdı buruna tərəf cırr!*
Nədir bu çalpaşıq tapmacadan heç nə anlamır:

– Nə bilem nədi, a rəhmətdiyin oğlu, əlində işini gör.

Dəllək Əsəd dillənmir, müştərisinin üzünü qırxıb qurtarır. Nədir ayağa qalxanda gözü ərik ağacına sataşır, atı orda görməyəndə Dəllək Əsəddən soruşur:

– Mənim atım nejoldu?

Dəllək Əsəd gülümsünür: – Nejolajax, bayaq saa dediyim tapmacanın cavabını tapmağa getdi.

## Qırmızı qarğıdalı qiymata getmer

60-cı illərdə Keçilinin Hümbət (Hakoy Hümbət də deyirdilər) kolxozun qəbristanlığının yanındakı qarğıdalı sahəsinin qarovulçusu idi. Bir gün kolxoz sədri Binnət müəllim sahələri gəzəndə Hümbət kişiylə xeyli səmimi görüşür – əmizadəydilər:

– Çətinliyin varmı, əmioğlu? De, kömək eləyərik.

Hümbət kişinin çiyinlərindən sanki dag götürülür, nə vaxtdan bəri ürəyini üzən bir narahatlığı açıb kolxoz sədrinə deməyi qərara al1r:

– Çətinlik budu ki, mənim yerimi dəyişsən, pis olmaz. Elə bundan ötrü məxsusi yanına gəlmək istəyirdim.

– Niyə dəyişmək istəyirsən ki? Binnət müəllim təəccüblə soruşur.

Hümbət kişi papağını düzəldib ağır-ağır dillənir:

– Nə bilem, əmoğlu, deellər bazarda qırmızı qarğıdalı yaxşı qiymata getmer.

Binnət müəllim gülümsünüb uzaqlaşır…

## Erkəyiniz çox arıxdı

Balamemmedlinin Mirzalı arıq adamıydı. Bu zəhmətkeş kişi əcələ işi olmasa kolxozun işindən qalmazdı…

Mürsəl Alı oğlunun briqadasını sahəyə aparan yük maşını Mollla Qurvanın bulağının üstündə dayananda Şandılın çəpərinin dibində xeyli adam toplaşıbmış. Fudbol Namaz da onların arasmdaymış. Maşının kuzovunda 10-15 qadını, bir də bircə kişini – Mirzalını görən bu ayar adamın dili dinc durmur:

– Uğur ola, hara gedirsiniz?

İşçilərdən biri bu çalpaşıq suala çalpaşıq da cavab verir:

– Ölü yerinə gedirik.

Fudbol Namaz gülümsünərək dillənir:

– Yaxşı yol, gedin, amma erkəyiniz çox arıxdı…

## Niyə yuxudan oyadersan?

Əfgərrinin Niyazalının zarafatından heç kəs inciməzdi.

Niyazalı kişi xəstəxanada müalicə olunurdu. Bir dəfə tibb bacısı palataya girəndə görür ki, Niyazalı yatır. İynə vurmalıydı. Ona görə də xəstəni oyatmalı olur.

Yuxudan kal duran Niyazalı tibb bacısını təəccüblə süzür:

– Nooluf, a qızım?

Tibb bacısı mülayimliklə dillənir:

– Ay Niyazalı dayı, durun, iynənizi vurum.

Niyazah kişi əsəbiliklə:

– Əşşi, iynə əlində, qolum da burda, vurorsan vur, daa bunnan ötrü məni niyə yuxudan eliyirsən? – deyə cavab verir.

## Necə ola bilər?

Kolxozun sədri Binnət müəllimin arvadı Gülpəri xalanın hinduşkaları itir. Nə qədər axtarsa da tapa bilmir. Təsadüfən yolda Fudbol Namazı görür:

– A Namaz, bəlkə bizim hinduşqalar sizin qapınıza gəlmiş ola?

Fudbol Namaz bığaltı gülümsünür. Bu sualın nə sual olduğunu anladığından zarafata salıb deyir:

– A Gülpəri bajı, nə təhər olor ki rayonun, şəhərin bütün ağbaşdıları sizə gələ bilər, sizin bir-iki qotur hinduşqanız bizə gələ bilməsin?.

## Onu demərəm

Yahaların Usuf kişi Qənsələrin qabağında rastlaşdığı müəllimdən oğlu Şərifı soruşur:

– A məllim, bizim Şərif nə təhərdi?

Müəllimin üzü gəlib xətrini çox istədiyi ağsaqqala “zəif oxuyur” deyə bilmir, fikrini bir qədər yumşaq ifadə eləyir:

– Ay Usuf dayı, bir az çalışmalıdı.

Usuf kişi duruxur. Tez də özünü ələ alıb dillənir:

– Oxumağını demerəm, a məllim, deerəm uşaxdan-zaddan qorxuv-eləmer ki?..

İkisi də gülümsünür…

## Mən birtəhər gələrəm

Qurban müəllim öz şəxsi “Pobeda”sında rayondan qayıdırmış. Qoçulu yoluna dönəndə maşını saxlayır ki, eloğlularından da üçdördünü kəndə aparsın. Maşın gözləməkdən bezib-yorulanlar itələşə-itələşə maşına doluşur. Qurban müəllim görür ki, iki nəfər də qabaqda, sürücünün yerində oturub. Heç nə demədən maşından düşür və:

– Siz maşını sürüb gedin, mən nəynən olsa gələrəm, – deyir.

## Xatırınıza dəyməsin

Şamratdının Qiyas ev tikdirirdi. Özü qum dalıyca getmişdi. Arvadı Yasəmən ustalara səhər yeməyi hazırlayır – iki ustaya on yumurtanın qayğanağı. Güman edir ki, ustalar yeməyin hamısını yeyə bilməyəcəklər…

Yasəmən bir də baxır ki, ustalar yeməyin axırına çıxırlar. Dözə bllməyib deyir:

Xatırınıza dəyməsin, qayğanağın hamısını yeyəcəksinizmi?..

## Nə xeyri?

Alı öyünün İmamalı kənd xəstəxanasına gedir. Xəstəxananın baş həkimi Şərif bu ayar kişini hörmətlə qarşılayır, hal-əhvalını tutur:

– Noolub, ay İmamalı dayı? Olmasın azar?

Ay Şərif, başına dönüm, gözüm çıxer, maa bir əlac elə, – deyə İmamalı kişi dərdini həkimə danışır.

Şərif həkim tibb bacısına lazımi göstəriş verir. Dörd-beş dəqiqədən sonra İmamalı baş həkimin yanına gəlir. Səsində bir az qəzəb, bir az da giley olur:

– Sən nə təhər doxtursan, ay Şərif. Saa adam kimi dedim ki, gözüm ağrıyır, bu qız mənim qoluma iynə vurur. Qola vurulan iynədən gözə nə xeyir dəyəsidi?

## Eşidən olmuyuf

Hətəmin oğlu Mübariz bir gün yenə səhər tezdən Qənsələrin qabağına çıxır. Həkim Şərif onu görüb zarafatla deyir:

– Ay Mübariz, hər səhər tezdən bu qədər yolu yuxandan aşağı gəlirsən, yorulmursanmı?

Mübariz gülümsünür:

– Həkim, qadan alem, mənim dərdimi çəkmə. Yuxardan aşağı gələnlərin hamısının geri qayıtmaq imkanı var. Aşağıdan yuxarı gedənlərin geri qayıtdığını nə görən olub, nə də eşidən.

Şərif Mübarizin cavabından sonra nə deyəsiydi ki. Axı, Mübariz yuxarı deyəndə kəndin qəbristanlığını nəzərdə tuturdu.

Mənbə: **Rəşid Faxralının** “***Oğuz eli Faxralı***” kitabından götürülmüşdür

*İlk öncə “**Faxralı toylarında xəngəl verilir**” fikrinə aydınlıq gətirək:*

*Bu barədə Azərbaycan Televiziyasının “Xəzər” kanalının “Səyyah” verilişində də qeyd olunmuşdur. Kadrda aparıcı Faxralı toy və nişanlarında xəngəl verilməsi barədə söhbət açır. Həqiqətə uyğun olmayan bu xəbər bir çox faxralıların haqlı iradına səbəb olmuşdur.*

*Aşağıdakı videonun 40-cı dəqiqəsində bu hadisə göstərilmişdir.*

*Faxralıda dəfələrlə qonaq olub onun milli adət-ənənələrini lentə alan Səyyaha, kənd sakinlərinin böyük hörməti və simpatiyası vardır. Ona görə videoda göstərilən xəngəl hazırlanma prosesi Səyyahın verlişinin daha rəngarəng olması üçün təqdim olunub. Bunula bərabər faxralılar xəngəl yeməyinə də, bu kənddə yüksək dəyər verildiyini nümayiş etdirirlər.*

*Reallıqda Faxralı toy və nişan tədbirlərində heç zaman xəngəl verilmir. Faxralı toylarında adətən "bozartma", "plov", tərəvəz, turşu, pendir, kabablar (ət, toyuq, balıq), salatlar və s. verilir.*

*Faxralı toylarında səhv olaraq xəngəl yeməyinin verilməsnə aşağıdakı hadisə də səbəb olmuşdur.*

*Məlumdur ki, gürcülər Azərbaycan mətbəxinin ləziz yeməyi olan "yayma (yarpaq)" xəngəlini çox sevirlər.*

*Faxralı sakinlərindən birinin övladının toyunda iştirak edən gürcü millətindən olan iş yoldaşları "yayma (yarpaq)" xəngəlinin bişirilməsini xahiş etmişlər. Təbii ki, qonaqların xahişi nəzərə alınmış və yalnız gürcü qonaqları üçün xəngəl bişirilmişdir. Başqa sözlə, bu, gürcülərin istəyi ilə onların şərəfinə verilmiş xəngəl qonaqlığıdır. Yəni, bunun toyla heç bir əlaqəsi olmamışdır.*

*Beləliklə, "Faxralı toylarında xəngəl verilir" fikri tamamilə əsasızdır.*

**Faxralı mətbəxi**

Aşağıdakı yeməklər və yemək məhsulları Faxralı süfrələrinin bəzəyidir:

| | |
|---|---|
| **Aş (əriştəli)** |  |
| **Aş (yalnız düyü)** | |
| **Atlama** | |
| **Axsaqulaq** | |
| **Bal** | |
| **Bəhməz** | |
| **Bozartma** | |
| **Çığırtma** | |
| **Cız-bız** | |
| **Dovğa** | |
| **Əriştəli-isti** | |

| | |
|---|---|
| **Fəsəli** | |
| **Halva** | |
| **Horra (Hörrə)** | |
| **Kabab (tikə)** | |
| **Kömbə** | |
| **Körəməz** | Köç zamanı süd və qatığın qarışığından ibarət sərinləşdirici içki |
| **Motal pendiri** | Qoyun dərisində saxlanılan pendir növü |
| **Qatlama** | |
| **Qaxac** | |
| **Qayğanaq** | |

| | |
|---|---|
| **Qovud (Qood)** | |
| **Qovurma ət** | ***Hazırlanması:***<br>Kiçik tikələrlə doğranmış qoyun və ya mal ətinin üzərinə soyuq su tökülür və qoyulur qaynamağa, üzünə çıxan kəfi yığılır. Təxminən 1.5 saat qaynamalıdır. Sonra ət odun üzərindən götürülür, öz yağında (bulyondan yığılmış) yarımhalqa şəkilində doğranmış soğanla bir yerdə qovurulur. Xırda doğranmış pomidorlar və yaşıl bolqar bibəri əlavə edib, onların şirəsi çıxana qədər qovrulur. Sonra üzərinə süzülmüş bulyonu tökürülür, duz, istiot vurulur və biraz qaynadılır. Süfrəyə verilərkən üzərinə xırda doğranmış göyərti səpmək olar. |
| **Qosara** | Yaz fəsli zamanı Qulançar bitkisinin Dağdağan ağacının soyulmuş qabığından düzəldilmiş borucuğa doldurulması (*kənarlarına isə Turşəng-Quzuqulağı doldurulur*) və sonra ocağın közündə bişirilməsindən yaranan yemək növü.<br><br>***Qulançarın əhəmiyyəti:***<br><br>1. Qulançar “asparagin” adlı maddə ilə zəngindir. Bu maddə damarları genişləndirir və qan təzyiqini aşağı salır. Həmçinin qulançar ürək əzələsini stimullaşdırır ki, bu səbəbdən həkimlər onu ürək xəstəliklərindən əziyyət çəkən və infarkt keçirmiş insanlara yeməyi tövsiyə edirlər.<br><br>2. Saglamolun.az bildirir ki, qulançar görməyə müsbət təsir edir. |

| | |
|---|---|
| | 3. Fol turşusu ilə zəngin olan qulançar anemiya (qanazlığı) zamanı çox faydalıdır.<br><br>4. Qulançar şəkərli diabet xəstəliyindən əziyyət çəkənlər üçün olduqca faydalıdır – qanda şəkərin səviyyəsini tənzimləməyə kömək edir.<br><br>5. Kalsium və fosforla zəngin olan qulançar sümüklərin sağlamlığını qoruyur.<br><br>6. Qulançar qidalı liflərlə zəngindir. Bu liflər bağırsaqlarda şişərək peristaltikanı (bağırsaqların hərəkətliliyi) yaxşılaşdırır, qəbizliklə mübarizə etməyə kömək edir.<br><br>7. Qulançar sidikqovucu təsirə malikdir, odemləri azaldır, sidik kisəsini və sidik yollarını təmizləyir. |
| **Qurud** | Qurudun tərkibi: Süzmə, duz.<br>Hazırlanması:<br>Qurudu hazırlamaqdan ötrü qatıq və ya ayran torbada qatılaşanadək süzülür, süzmə hazırlanır. Sonra ona duz vuraraq xəmir kimi yoğurub yumrulayır və qurudurlar. Qurudu uzun müddət saxlamaq olur. İstifadə zamanı qurud, isti su ilə yuyulub təmizlənərək məhlul halına salınır. Bu məhlula sarımsaq qatmaq və ya sarımsaqsız istifadə etmək olar. Qurudlu yarpaq xəngəli Faxralıda ən ləziz yeməklərədən sayılır.<br> |
| **Quymaq** | |

| | |
|---|---|
| **Səməni** | |
| **Soğança** | |
| **Sucuq** | |
| **Turşu (zoğal, əzgil və s.)** | |
| **Yarpaq xəngəli** | |
| **Gürcü xəngəli** | |
| **Xəşil (Xaşıl)** | |

| | |
|---|---|
| **Yayma** |  |

*REDAKTOR*

# İnzibati idarəçilik

## Mövcud inzibati idarəçilik forması

**Faxralı** – Gürcüstan Respublikasının Aşağı (Kvemo) Kartli diyarının (mxaresinin) Bolnisi bələdiyyəsində kənddir və İmirhəsən, Bala Darbaz kəndləri ilə birlikdə ***Faxralı icma şurasını (sakrebulosunu)*** təşkil edir.

**Qeyd**: *Aşağı Kartli diyarı Gürcüstanda I dərəcəli inzibati – ərazi vahidlərindən biridir. 1994–1996-cı illərdə həyata keçirilmiş inzibati islahatlar nəticəsində təşkil edilmişdir. Diyarın inzibati mərkəzi Rustavi şəhəridir və diyar altı bələdiyyədən (Başkeçid, Bolnisi, Marneuli, Qarayazı, Salka, Tetri Tskaro) ibarətdir.*

**Faxralı icma şurasının (sakrebulosunun) inzibati binası**

***Novruz Şərif oğlu Ayvazov*** **–** hal-hazırda Bolnisi bələdiyyəsinin Faxralı və İmirhəsən kəndləri üzrə icra nümayəndəsidir.

***Dostu Veysəl oğlu Aşırov*** – 2017-ci il tarixdən Bolnisi Bələdiyyəsinin Faxralı sakrebulosu üzrə deputatı seçilmişdir.

***İbrahim Məhərrəm oğlu Qasımov*** – 2017-ci il tarixdən Bolnisi Bələdiyyəsinin Faxralı sakrebulosu üzrə deputatı seçilmişdir.

# Faxralıda tarixi inzibati idarəçilik foramaları və kəndə rəhbərlik edən şəxslər

**1.”Kəndxuda” inzibati idarəçilik forması** *(1872-1918-ci illər, Gürcüstanda müstəqillik yarandığı günədək)*

Bu dövrdə kəndə rəhbərlik edən şəxslər:

- Hasannının Təhməzqulu
- Dəryahlının Əkbər
- Keçəl oğlu Haqverdi
- Ayvaz öyünün Pənah
- İsmayıl Hüseynov
- Haqverdi oğlu Söyün

**2.”Qlava” inzibati idarəçilik forması** *(1918-1921-ci illər)*

Bu dövrdə kəndə rəhbərlik edən şəxslər:

- Gön Alı
- Haqverdi oğlu Söyün
- Hümbət oğlu Rüstəm
- Dəli Eyyub

**3.”Qırmızı komitə” inzibati idarəçilik forması** *(1921-1924-cü illər)*

Bu dövrdə kəndə rəhbərlik edən şəxslər:

- Tat Ağacan

Gürcüstanda Sovet hakimiyyəti qurulduqdan sonra (1921-ci il, 25 fevral) Qızıl Ordunun hissələri ayrı-ayrı kəndlərə “reydlər” keçirirdi. Bu “reydlər” həm burjua dövlətinin süqutunun təsdiqi, həm də “cızığından çıxmağa” meyllənənlərə xəbərdarlıq idi.

Faxralıya daxil olan ordu hissələrini qırmızı bayraqla **Tat Ağacan** qarşılayır (Muxranski 1876-cı ildə İrandan bu tərəflərə rəncbərlər gətirilmişdi və əhali onlara “tat”deyirdi. Tatlar əhali ilə qaynayıb qarışmış, aborigenləşmişdi). Tat Ağacan (sonralar Qıcıların Musanın atalığı olub) kənddə yaradılan “Qırmızı Komitə”nin sədri təyin olunur və 1924-cü ilə kimi bu vəzifədə işləyir.

**4.”Kənd Sovetliyi” inzibati idarəçilik forması** *(1924-1927-ci illər)*

Bu dövrdə kəndə rəhbərlik edən şəxslər:

- İman Həsənov *(Təhməzqulunun oğlu)*
- Keçəloğlu Məhərrəm

- Bayraməli Həsənov *(Mırıx Bayramalı)*

**5."Məhəllə Sovetliyi" inzibati idarəçilik forması** *(1927-1929-cu illər)*

Bu dövrdə kəndə rəhbərlik edən şəxslər:

- Saraclı Gülxanım

1927-ci ildə, "TEM" yaradıldıqdan sonra mərkəzi İmirhəsən kəndi olan məhəlli Sovetliyə Saraclı Gülxanım sədr seçilir və bu vəzifəni 1929-cu ilə kimi aparır.

**6.Yenidən Faxralı "Kənd Sovetliyi" inzibati idarəçilik forması** *(1929-2011-ci illər)*

1929-cu ildə Borçalı quberniyası üç rayona bölünür. Bu inzibati yeniləşmədən sonra Faxralıda da ayrıca Sovetlik yaradılır.

Bu dövrdə kəndə rəhbərlik edən şəxslər:

- 1929-1930 ***Məhəmməd Şahverdi oğlu***
- 1930 -1931 ***Avdı oğlu Bədəl***
- 1931-1932 ***Tat Fətəli (Tiflisdən)***
- 1932-1933 ***Sarı Yusif (Həsənxocalıdan)***
- 1933-1934 ***Alpaşoğlu Namaz***
- 1934-1936 ***Saraclı Əhməd***
- 1936-1937 ***Avdı oğlu Bədəl***
- 1937-1938 ***Alpaşoğlu Namaz***
- 1938-1940 ***Usta Abbas oğlu Kazım***
- 1940-1941 ***Qara Nəbiyev (Veylər)***
- 1941-1945 ***İsa Hüseynov***
- 1945-1947 ***Mehrəli Həsənov***
- 1947-1952 ***Süleyman Şahnəzərov***
- 1952-1962 ***Musa Həsənov (Malay)***
- 19xx-19xx ***İsrafil Məmmədov ?????***
- 1962-1971 ***Əli Xəlilov (Teşərələr)***
- 1971-1973 ***Uğurlu Hüseynov Oruc oğlu***
- 1973-1979 ***Məmmədəli Şərifov***
- 1979-1981 ***Aslan Əliyev Alı oğlu***
- 1981-1991 ***Sədrəddin Namazov***
- 1991-2004 ***Abbas Abbasov İsrafil oğlu***
- 2004-2006 ***Qara Gülməmmədov***
- 2006-2007 ***Məhərrəm Mikayılov***
- 2008-2009 ***Bədəl Xəlilov***

- 2009-2009 ***Mahal Əliyev***
- 2009-2010 ***Nəriman Abdıyev***
- 2011- 2017 ***İbrahim Məhərrəm oğlu Qasımov***
- 2017 – ***Novruz Ayvazov***

Faxralıda da kollektivləşmənin ilk təzahürü artel kimi meydana gəlib: “Kommuna – Artel”. Artellər də ümumi əməyə, ümumi istehsala və ümimi bölgüyə əsaslanırdı. Sonralar – 5 ildən sonra bu artelin bazasında kolxoz formalaşır (1933-cü il). Yaradılan “Yeni yol” kolxozunun sədri vəzifəsinə **İsrafil Əlizadə** seçilir. Onun yaxın qohumu Mirzə Rza 1934-cü ildə ailəsi ilə Türkiyəyə keçmişdi və bu mühacirətlə əlaqədar 1935-ci ildə İ.Əlizadə məsuliyyətə cəlb olunur, Sibirə sürgün edilir.

1935-1945-ci illərdə “Yeni yol”un sədri vəzifəsində Mehrəli Həsənov işləyir. 1945-ci ildə “Yeni yol” kolxozu iki mestəqil kolxoza ayrılır: “Budyonnı” adına kolxoz, “Çarkviani” adına kolxoz.

“Budyonnı” adına kolxozun sədri **İsrafil Məmmədov**, “Çarkviani” adına kolxozun sədri **Əli Xəlilov** seçilir. 1951-ci ildə respublikada kiçik təsərrüfatların birləşdirilməsi haqqında qərar qəbul edilir. Faxralıdakı kolxozlar yenidən birləşdirilir, vahid təsərrüfat yaradılır: “Qələbə” kolxozu. **Binnət Mahmudov** kolxoz sədri seçilir, 1951-ci ildən 1959-cu ilə kimi işləyir. 1959-1964-cü illərdə bu vəzifədə rayon İcraiyyə Komitəsinin sədri seçilənə kimi **Əli Əliyev** (o, el arasında Alyoşa kimi tanınırda), 1964-1968-ci illərdə Binnət Mahmudov, 1968-1973-cü illərdə **Kərim Kərimov**, 1973-1978-ci illərdə **Uğurlu Hüseynov** işləyir. Ümumiyyətlə, “Qələbə” kolxozu rayon miqyasında həmişə qabaqcıllar sırasında olub. Adətən, belə kolxozlara “milyoner kolxoz” deyirdilər.

1975-ci ildə ümimi təsərrüfatlar (kolxozlar) dövlət təsərrüfatlarına (sovxozlara) çevrilir. “Qələbə” kolxozunun bazasında Faxralı üzümçülük sovxozu yaradılır. **Uğurlu Hüseynov** sovxoz direktoru təyin edilir. 1991-ci ildə onu Bayram Əliyev əvəzləyir (rayon partiya komitəsinin katibi idi, İmirhəsən sovxozuna direktor göndərilmişdi. Bu, gürcülərin gözəgötürməzliyinin təzahürü idi). 1995-ci ildə sovxozun direktoru vəzifəsinə Zurab Çaparidze təyin edilir. 1996-cı ildə sovxozlar, o cümlədən Faxralı üzümçülük sovxozu kiçik firmalara parçalanır…

Göründüyü kimi, 1933-cü ildən 1995-ci ilə qədər – 62 Faxralıdakı təsərrüfata ancaq faxralılar rəhbərlik edib; bu ağır elin bacarıqlı kadrları həmişə işgüzarlığı ilə seçilib…

Ümumi təsərrüfat haqqında fikirlər ideoloji baxımdan ikiləşirdi: Şura hökuməti camaatı kolxoza daxil olmağa həvəsləndirir, lazım gələndə məcbur da edirdi. Islam dininə düşmən münasibəti olduğundan din xadimləri Şura hökumətinin zor gücünə yaratdığı kolxozu gözdən salmağa çalışırdı. Var-dövlətini Şura hökumətinə verənlər də (Təhməzqulu, Üçqulaq Bayraməli, Aşıroğlu Mehralı və b.kimi), kolxoza girməkdən boyun qaçırdanlar da bu və ya digər səbəbdən sürgün olunur, güllələnirdi. Məhz buna görə də kənddə kolxozu “görən gözü olmayanlar” da vardı; neçəsi kolxoza girməmək üçün Türkiyəyə üz tuturdu (Yekəxançal Süleyman kimi), qaçaq düşürdü, kolxozdan çıxırdı (Dünyamalı Oruc oğlu, Gözdər Qurban kimi)…

140 il yaşı olan bu rəhbərlik, 6 formada fəaliyyət göstərib və bu illər ərzində Faxralıya 35 nəfər rəhbərlik edib. Onlardan 30 nəfəri Faxralı kəndindən, 5 nəfəri isə kənardan gələnlər olub. Sonuncu rəhbərlik forması indi də davam edir.

Mənbə: **Rəşid Faxralı** ***"Oğuz eli Faxralı" və***

**Allahverdi Kərimov** – "***Faxralı kəndinin tarixi haqqında yaddaş kitabçası***", Bakı-2015.

# Xeyriyyəçilik

## Faxralı kəndinə ilk yolun çəkilməsi

Nazxanım Rüstəm qızı Hümbətova demişdi: "Atam, Balaməmmədli nəslindəndir və Faxralınln adlı-sanlı kişilərindən olub – **Rüstəm Hümbət oğlu Məmmədov**. Hansı ki, sonralar ona Qaçaq Rüstəm də deyiblər. Mənim 4-5 yaşım olanda atam rəhmətə gedib. Mən atam haqqında anamdan və əmim İsmayıl Hümbət oğlundan eşitmişəm. O, sovet dönəmində kəndin ilk bolşeviklərindən olub. Çox təmiz, vicdanlı bir insan olub. Bu səbəbdən onu ilk Faxralı kənd sovetinin sədri təyin ediblər. İşlədiyi müddətdə, çox xeyirxah işlər görüb. Onlardan biri – **Faxralıya ilk yolun çəkilməsi onun adı ilə bağlıdır**. Ona kimi xalqımız çox əziyyət çəkərdi…"

## Faxralıda yeni məktəb binasının tikilməsi və asfalt yolun çəkilməsi

Hüseynqulu Məmmədli xatırlayırdı ki, 1960-cı ildə Faxralı orta məktəbində 18 sinifdə 576 nəfər şagird təhsil alırdı. Sinif otaqları çatışmırdı. Bu isə pedaqoji işin yüksək səviyyədə təşkil edilməsində çətinliklər yaradır, orta məktəb üçün yeni binanın tikilməsinə ehtiyac duyulurdu. Hüseynqulu Məmmədli şəxsi nüfuzundan, Əli Əliyevin (Alyoşa), Binnət Mahmudovun mənəvi dəstəyindən bəhrələnərək 1961-ci ildə bu problemin həllinə nail olmuşdu.

Əli Əliyev 70-ci illərdə rayon Soveti İcraiyyə komitəsinin sədri işlədiyi dövrdə el-obasının sosial inkişafı üçün əlindən gələn dəstəyi göstərirdi. O, "Gilliyin burnu"ndan kəndə kimi yolun asfaltlaşdırlmasına nail olmuşdu. Əli Əliyev, həmçinin səlahiyyətlərindən istifadə edərək Faxralı orta məktəbi üçün əlavə binanın tikintisini də təşkil etmiş və 1973-cü ildə əvvəlki binanı tamamlayan yeni 4 mərtəbəli bina istifadəyə verilmişdi. Hal-hazırda həmin bina Arif Əliyev adına Faxralı 1 saylı ümumi orta məktəbin əsas korpuslarından biridir.

## Kəndin su problemi ilə əlaqədar həyata keçirilən xeyriyyə işləri

Zaman-zaman kənd böyüdükcə, əhalinin sayı artdıqca su problemi yaranmağa başlamışdır. İçməli suyun mənbəyinin Gavkeçiddə olması müəyyən olunduqdan sonra su borularının alınması üçün pul vəsaitinin tapılması lazım idi. Pul vəsaiti kəndin imkanlı adamlarından toplanılmış və işlərin icraçısı Şirəddi nəslindən ***Gön Alıya*** və Koxallı nəslindən ***Hövüd Məhəmmədə*** həvalə edilmişdir. Bu ağsaqqalların rəhbərliyi ilə işlər yerinə yetirilmiş və kəndin 7 yerində su anbarları tikilərək istifadəyə verilmişdir.

Səməndər Məmmədov öz "***Faxralılar və tarix yaradanlar***" əsərində qeyd edir ki, Abbas İsrafil oğlu Abbasov elimizin ləyaqətli, elcanlı oğullarının – rəhmətlik **Arif Əliyevin**, **Süleyman Qasımovun** 1993-1994-cü illərdə su çatışmayan dövrdə iki ədəd dizel generatoru, üç ədəd su nasosu alıb elimizə hədiyyə vermələrini də minnətdarlıqla xatırlayır.Yeri gəlmişkən qeyd edək ki, rəhmətlik Arif Əliyev və Süleyman Qasımov sonralar da elimiz üçün, Borçalı üçün xeyli xeyirxah işlər gördülər. Doğma kəndimiz Faxralı üçün yolların çəkilişinə, asfalt döşənməsinə əhəmiyyətli köməklik göstərdilər, körpülər saldılar. Həmin o iki körpüdən birinə "**Arif körpüsü**" deyilir.

## 1 nömrəli Faxralı orta məktəbində görülən xeyriyyə işləri

- 1969-cu ildə ***Məmmədəli Şərifovun*** təşəbbüsü ilə məktəb açılmışdır (2005-ci ilə kimi natamam, sonralar isə orta məktəb kimi fəaliyyət göstərmişdir)
- 2009-cu ildə ***Bədəl Xəlilov*** *(Keçili nəsli)* məktəbin riyaziyyat kabinetini və ətrafındakı sinif otaqlarını təmir etdirmişdir
- 2010-cu ildə ***Səməndər Yusubov*** *(Usub öyü)* məktəbin 2 sinif otağını əsaslı təmir etdirmişdir
- 2013-cü ildə ***Mirzə Əlizadə*** *(Koxallı nəsli)*məktəbin köhnə binasının giriş qapısından başlayaraq müəllimlər otağınadək olan hissəni təmir etdirmiş və müvafiq mebel avadanlıqları ilə təmin etdirmişdir
- **Məmmədov Asifin** təşəbbüsü və sinif yoldaşlarının köməyilə məktəbin həyətinə üstüörtülü dəyirmi stol düzəldilmişdir
- **Əlləzov Nəbinin** təşəbbüsü və sinif yoldaşlarının köməyilə məktəbin giriş qapısı dəyişdirilmişdir

## Azərbaycan dövləti tərəfindən Faxralı kəndinə edilən xeyriyyə işləri

Azərbaycan dövləti tərəfindən Borçalının bir çox yerlərində olduğu kimi, Faxralıda da aşağıdakı xeyriyyə işləri görülmüşdür:

- Kəndin içməli suya olan ehtiyacını ödəmək üçün su nasoslarının alınması
- 2 nömrəli Faxralı orta məktəbini əsaslı təmir etdirilməsi
- Qoçulu kəndindən başlayan və bir neçə kəndi birləşdirən asfalt yolunun Faxralıyadək çəkilməsi
- Kənddə "Dostluq" körpüsünün tikilməsi
- Kəndin qazlaşdırılması və mavi yanacağın evlərədək çəkilməsi

- Kənd yollarının yenidən təmir etdirilməsi
- Gürcüstanın ali təhsil məktəblərində təhsil alan azərbaycanlı tələbələrin təhsil haqlarının ödənilməsi və onlara təqaüdlərin verilməsi
- Faxralıda və digər kəndlərdə yüzlərlə insanın işlə təmin edilməsi
- SOCAR-ın öhdəsində olan yararlı torpaq sahələrinin münasib qiymətə kənd sakinlərinə icarəyə verilməsi

Yuxarıda sadalanan yardımlara görə Faxralı cammatı Azərbaycan dövlətinə öz minnətdarlıqlarını bildiriblər. Bu məqsədlə Faxralı şairləri Oruc Əlizadə “Can sağlığı diləyin”, Səməndər Məmmədov “Əhsən” adlı şeirlər yazmışlar.

Mənblər: ***Redaktordan*** və **Allahverdi Kərimov** – “***Faxralı kəndinin tarixi haqqında yaddaş kitabçası***“

# Məscid

## *Faxralı məscidi*

XIX əsrin əvvəllərində Faxralıda məscidin olmaması din xadimlərini narahat edirdi. Iman yolunun yolçularının Allahın evində ibadətlə məşğul olmamaları camaat arasında dinin nüfuzunun, təsirinin getdikcə azalmasına səbəb ila bilərdi. Kəndin ağsaqqaları, sözüötgün kişiləri onların təklifinə dəstək verirlər və 1905-ci ildə məscidin himinə ilk daşlar qoyulur…

Məscidin tikintisində canında, dizində taqət, ürəyində təpər olanların hamısı iştirak edir, məscidin inşası üçün “hərə bir daş gətirir”. Faxralılar dini etiqadları naminə hər əzaba qatlaşırdılar. 1907-ci ildə o dövr üçün qənaətbəxş hesab edilən məscid binasının tikintisi başa çatdırılır.

Məscid **Cümə məscid** adıyla tanınır *(ilk zamanlar məscidin adı **Göy məscid** olub)*. Məscidin ilk axundu İranda mükəmməl dini təhsil almış Molla Maşadı Hüseyn olub *(Dəryahlı nəsilindəndir)*. Sonra onu Güllərin Molla Oruc əvəz edib.

Faxralıda dini etiqadına görə sünnülər də var, şiələr də.

***Məscidin girişi***

Nəsillər arasında şiələr çoxluq təşkil etdiyindən birinci Göy məscidin tikintisinə başlanılıb. Sünnilər üçün məscidin olmaması sünniləri də narahat etməyə başlayıb və indiki kənd sovetinin yaxınlığında sünni məscidinin əsası qoyulub. Məscidin tikintisində sünnilər iştirak etsələr də,

tikintinin əsas hissəsini Endirlər öz üzərinə götürüb. Elə onların rəhbərliyi ilə də məscidin tikintisi başa çatdırılıb və xalqın istifadəsinə verilib.

Sünnü məscidinin axundu 1889-1893-cü illərdə İstanbulda təhsil almış Şirrətdinin **Molla Mahmud əfəndi** olub.

Faxralının ilk mollası Molla Məhəmməd olub ki, onu da 1830-1835-ci illərdə Göyçə mahalından koxalılar dəvət ediblər.

Rus imperiyası İslam dinini "gözüm çıxdıya saldığı" vaxtlarda Sünnü məscidi uçub-dağılıb, Cümə məscidi isə kolxozun anbarına çevrilib. O illərdə məsciddən azan səsi gəlməsə də camaat şəriətin tələblərindən uzaq düşməyib, ən ağır təqiblər də faxralıların imanını döndura bilməyib.

Rəhmətə gedənləri

- Molla Əli Namaz,
- Molla Müzəffər,
- Molla Qırıx Mustafa,
- Molla Cabbar,
- Molla Haqverdi,
- Molla Hasanalı,
- Molla Əsədulla,
- Molla Qara (Aşırlı),
- Molla Xoca

urvatlayıb haqq evinə tapşırıblar. Camaatın qulağı Quran səsinə tamarzı olmayıb…

Məscidin ətrafı Sabir Budaqovun vəsaiti, kənd sovetinin sədri Sədrəddin Namazovun rəhbərliyi ilə 1986-cı ildə hasara alınıb…

100 yaşlı **Cümə məscidi** həm də tarixi abidədir…

Faxralıda "İmanın kamil olsun!", "İman yiyəsi olasan" kimi xeyir-dualar da var; imanla yaşayanlar işıqlı adamlardı.

Faxralılar həmişə imanla, inamla yaşayıb. Hökumətin islam dininə qarşı sıyırdığı qılıncın iti vaxtlarında da bu ağır eldə Quran səsi eşidilib; faxralılar ölənlərini urvatla dəfn eləyiblər.

Keçmiş SSRİ-nin respublikaları müstəqillik əldə etdikdən sonra dini qadağalar ləğv olundu. Dini qadağaların ləğv olunmasından istifadə edərək, məscidləri yenidən təmir edib və xalqın istifadəsinə vermək lazım idi.

Yararsız hala düşən Sünni məscidi bərpa edilərək əvvəlki formasına salındı.

Cümə məscidinin isə əsaslı təmiri və bəzi hissələrinin yenidən tikilməsi nəzərdə tutulurdu. Bu işlərin görülməsi üçün xeyli pul vəsaiti lazım idi. Həmin vəsait kəndimizin sakinlərindən və kənarda yaşayan imkanlı eloğullarımızdan toplandı. Pul vəsaiti toplandıqdan sonra, məscidin əsaslı təmiri üçün lazım olan tikinti materialları alındı və məscidin əsaslı təmirinə başlanıldı. Tikinti işlərinin aparıldığı zaman Gürcüstanm dini qurumları tərəfindən müxtəlif bəhanələrlə məscidin tikintisi xeyli müddət dayandırıldı. Bir cox sənəd və sərəncamlar toplandıqdan sonra məscidin tikintisinə yenidən icazə verildi və məscidin əsaslı təmir işləri başa çatdırıldı.

Artıq məscidlərimiz bütün dini tədbirlərin və mərasimlərin keçirilməsinə hazırdır.

Bütün bu görülən işlərin ərsəyə gəlməsində və məscidlərimizin bərpa olunaraq istifadəyə verilməsində Faxralı camaatı ilə bərabər Hacı Validə xanımın *(təmir xərclərinin bir hissəsini öz üzərinə götürmüşdür)*, Hacı Molla Adilin və molla Sahibin əməyi çox olmuşdur.

Bir zamanlar gənclərimiz müxtəlif müsəlman ölkələrinə təhsil almağa getdikləri halda, 1920-ci ildən başlayaraq gənc və yaşlı nəslın nuümayəndələri həmin ölkələrdə olan ziyarət ocqlarına, əsasən də Həcc ziyarətinə gedirlər. 1920-ci ildən bu günə kımi müqəddəs Həcc ziyarətinə aşağıdakı şəxslər getmişlər:

- Hacı Məmmədalı (Koxallı);
- Hacı Molla Oruc (Hacı öyü);
- Hacı Həsən (Molla Qurbanın atası);
- Hacı Mirzə Axund Ələsgər (Koxallı);
- Hacı Əhməd Məmmədalı oğlu *(Məkkədə vəfat edib və orada dəfn olunub)*;
- Hacı Məhəmməd Məmmədalı oğlu;
- Hacı Bayram Allahverdi oğlu (Aşırlı);
- Hacı Həmid Məmmədalı oğlu (Kərimov);
- Hacı Islam Mustafa oğlu (Güllər);
- Hacı Validə xanım Imamalı qızı;
- Hacı Bahar xanım Allahyar qızı;
- Hacı Rəşid Məmişdan oğlu (Hüseynov);
- Hacı Simarə xanım Nəsib qızı;
- Hacı Molla Adil (şair Nəbinin nəvəsi);
- Hacı Mahmud Namazov (Molla öyü);
- Hacı Lamiyə xanım (Molla öyü);
- Hacı Molla Sahib (Alğullar).

2015-ci ildə dövlət səviyyəsində molla Hacı Molla Adilə Bolnisi rayonu üzrə “Axund”, Molla Sahibə isə Cümə məscidinin “İmamı” rütbəsi verilmişdir.

Mənbə : **Rəşid Faxralı** – ***"Oğuz eli Faxralı" və***
**Allahverdi Kərimov – *"Faxralı kəndinin tarixi haqqında yaddaş kitabçası"***

## *İnam və iman yeri – Faxralı məscidi*

Hər bir cəmiyyətdə milli və mənəvi dəyərlərin qorunması həmin cəmiyyətin inkişafı ilə mütləq şəkildə əlaqəlidir. Çünki hər bir xalq özünəməxsus dəyərlərin daşıyıcısıdır. Azərbaycan xalqı da tarixən öz milli, əxlaqi və mədəni dəyərləri ilə böyük inkişaf yolu keçib. Qədim Borçalı mahalı isə Azərbaycanın ayrılmaz tərkib hissəsi kimi tarixən milli və mənəvi dəyərlərimizin qorunub saxlanılmasında mühüm rol oynayıb.

Bildiyimiz kimi, İslam dini humanist bir dindir və tarixən yayılmış bütün ərazilərdə aid olduğu xalqın milli və mənəvi dəyərlərinə hörmətlə yanaşıbdır. İslam dini böyük mənəvi dəyərləri özündə birləşdirir, insanların bir-biri ilə mehriban yaşamasını, daim təkmilləşməyi, öyrənməyi tövsiyə edir. Məsələ burasındadır ki, bizim milli dəyərlərimizin təməlində dayanan əsas meyarlar dinimizdə də öz əksini tapıb. Bu dəyərlərin kökü İslamdan xeyli əvvələ gedib çıxır. Göytürklərdən bəri biz təkallahlığı qəbul etmişik, bütlərə tapınmamışıq, heç kəsin haqqına toxunulmamasını istəmişik. Buna görə də biz İslamı dərin anlamla qəbul etdik və tarix də göstərir ki, İslamın yayılmasında, formalaşmasında və inkişafında türklərin böyük rolu olub. Bundan əlavə, bizim milli dəyərlərimiz sayılan böyüyə hörmət, qadına verilən böyük dəyər və sair İslam dini yarandıqdan sonra bu dində də öz əksini tapıb. Bu faktlar bizim xalqın nə qədər humanist dəyərlərə malik olduğunu sübut edir. Bütün bunlar onu göstərir ki, bizdəki dəyərlər İslamdan xeyli əvvəl var idi və bu din yayıldıqdan sonra dəyərlərimiz daha da kamilləşdi, daha geniş şəkildə təbliğ olunmağa başlandı. Bu gün ölkəmizdəki tolerantlığın əsas kökü də bizim dəyərlərimizdən qaynaqlanır. İslam dini isə bu dəyərlərimizin daha təkmil və kamil formalaşmasına öz təsirini göstərib. Bu mənada, İslam dini dəyərlərimizlə, dəyərlərimiz isə dinimizlə bir vəhdət təşkil edir.

İslam dininin üç əsas simvolu vardır ki, onlardan da birini məscidlər təşkil edir. Əvvəlcə onu qeyd edim ki, məscidlər bir ibadət ocağı olmaqla yanaşı, həm də milli və mənəvi dəyərlərimizin təbliğ olunduğu yerlərdir. Hələ uzaq keçmişdən xalqımız məscidlərdən təkcə ibadət ocağı kimi deyil, həm də elm öyrənmək, vətənimiz üçün mühüm məsələləri müzakirə etmək və qərarlar vermək, birisinə yardım etmək və sair kimi məsələlərdə istifadə edib. Bildiyimiz kimi, məscid (ərəb. مسجد – "səcdə yeri") islam dinində müsəlmanların Allaha kütləvi və tək ibadətləri üçün nəzərdə tutulmuş memarlıq tikilisidir. Məscid namaz qılınan məkanı ifadə edir. Xüsusi ərazidə olan günbəzli və minarəli bina üslubunda tikilir. Bir çox hallarda daxili həyətə malik olur. Minarələrin sayı birdən doqquzacan ola bilər. Daxili ibadət zalının divarları təsvirsiz olmalıdır. Ancaq divarlarda Qurandan ərəb dilində sətirlər yazıla bilər. Məscid Məkkə istiqamətində tikilməlidir. İbadət zalında Məkkə istiqamətindəki divarda mehrab adlanan boşluq olur. Mehrabdan sağda bir qədər yüksəkdə minbər qurulur, oradan vaiz dindarlara xütbə oxuyur, yaxud müraciət edir.

Xalqımızın çoxminillik tarixi var və çox əsrlərdir ki, İslam dininə itaət edirik. İslam dini bizim doğma dinimizdir. Xalqımızın milli-mənəvi dəyərləri, dinimizin adət-ənənələri və dəyərləri hamısı birlikdə bizim milli sərvətimizdir. Biz fəxr edə bilərik ki, xalqımız çox dəyanətli xalqdır və zaman-zaman, əsrlər boyu cürbəcür məhrumiyyətlərə məruz qalaraq bütün bu adət-ənənələri unutmayıb. Nə vaxt ki, rəsmi dairələr bunu qadağan edib, yaxud da buna mənfi münasibət

göstərib, insanlar bunu qəlbində, öz ailəsində, evində yaşadıblar. Hətta bizim bəzi fədakar insanlar bu adət-ənənələrimizi yaşatdıqlarına görə çox əziyyətlər çəkiblər, bəzən də məhrumiyyətlərə, cəzalara məhkum olublar. İslam sülh dinidir, mehribanlıq dinidir, dözümlülük dinidir, tolerantlıq dinidir… Hər xalqın öz adət-ənənəsi var, öz milli-mənəvi və dini dəyərləri var. Biz öz milli-mənəvi dəyərlərimizlə, öz dini dəyərlərimizlə, adət-ənənələrimizlə fəxr edirik. Bizim xalq yüz illərlə, min illərlə adət-ənənələrimizi, milli-mənəvi dəyərlərimizi yaradıbdır və bunlar indi bizim xalqımızın mənəviyyatını təşkil edən amillərdir. Biz azərbaycanlılar- bu, sonralar gələcək bütün nəsillərə də tövsiyə olunur- heç vaxt inamımızdan, dinimizdən uzaqlaşmayacaq və bu mənəvi mənbələrimizdən istifadə edərək gələcəyimizi quracağıq.

Azərbaycan xalqı hər zaman milli dəyərlərə sadiqliyini göstərib, bu dəyərləri əsrlərlə yaşadaraq onu inkişaf etdirib. Tarixin hər bir dövründə ölkəmizdə milli dəyərlərimizin qorunması və onun gələcək nəsillərə çatdırılması aktual olub. Elə günümüzdə də bu müsbət tendensiya özünü qoruyub saxlayır. Azərbaycan xalqı 70 il kommunist rejimində ateist təbliğatın aparıldığı bir şəraitdə yaşasa da, heç zaman öz dini dəyərlərini unutmayıb, onları gizli də olsa yaşadıb.Bu bir reallıqdır ki, bu gün Gürcüstanda təkcə İslam deyil, eyni zamanda digər dinlərin nümayəndələri də bizimlə birgə, bərabər, yaşayır, sərbəst, heç bir məhdudiyyət olmadan öz dini inanclarını icra edirlər. Bu onun fəaliyyət göstəricisidir ki, ölkəmiz dünyada tolerant ölkə kimi tanıdır. Elə bu səbəbdən də Gürcüstandakı tolerantlıq ənənələrini də milli-mənəvi dəyərimiz hesab etmək olar. Ona görə də tolerantlıq bizim əsrlərdən gələn milli xüsusiyyətimiz sayılır. Bu gün Gürcüstanda bir təriqətdən olanlar digərlərinin əqidəsinə hörmətlə yanaşırlar. Məscidlər bütün məzhəbdən olanlar üçün ümumidir. Təkcə dində deyil mill, siyasi və s. məsələlərdə də bu dözümlülük qorunur. Məsələn, antisemitizm bəşəriyyətin bəlası olsa da, Gürcüstanda bir dənə də olsa bu cür hal müşahidə edilməyib. Hazırda Gürcüstanda onlarla xalqın nümayəndəsi dostcasına yaşayaraq öz milli mədəni xüsusiyyətlərini qoruyurlar. Hər bir dini, milli qrup da öz növbəsində ümumi milli mənəvi dəyərlərin formalaşmasına töfhə verir.

Bu dəfə mən oxuculara dil içində dilini, din içində dinini yaşadan, qədim Borçalı mahalının başı çox bəlalar çəkmiş, bir əsrdən artiq yaşı olan memerlıq abidəsi, Faxralı məscidi haqqında məlumat verəcəm. Məscid XIX əsrdə, 1902 – 1905 – ci illərdə inşa olunub. Göründüyü kimi, bu möhtəşəm memarlıq abidəsinin inşasından yüz ildən artıq vaxt keçib. Bu vaxtacan zamanın çox sınaqlarına məruz qalıb, ancaq günümüzə qədəq gəlib çatıb. Zaman – zaman bu məsciddə bir çox din adamları islam təriqətlərini təbliğ ediblər. Onlardan Dəryahlının Xudu oğlu Molla Hüseyn, Göyüş öyünün Şeyx İsgəndər, Şeyx Molla Qurban, Şirrətdinin Molla Mahmud Əfəndi, Güllərin Molla Oruc, Şeşəpapaqların Molla Mahmud, Yahaların Şeyx Səlim, Alğulların Molla Bayram, Güllərin Molla Əli, Koxallının Axund Əsgər, Molla öyünün Əli Namaz, Qasımıllının Molla Namaz və s. başqa – başqa yerlərdə dini təhsil alıb kəndimizdə islam dinini təbliğ etmişlər.

Bu gün də kəndin yas və dini mərasimlərini Bütün Qafqazın Müsəlmanları İdarəsinin rəsmi təyin etdiyi Bolnisi rayonun müftisi Adil Nəbiyev və Faxralı kənd məscidinin imamı Hacı Sahib Qurbanov icra edir. Hacı Sahiblə söhbətləşərkən o, bildirdi ki, sovetlər dövründə məscid yararsız hala düşmüş, ondan anbar kimi istifadə olunmuşdur. Acınacaqlı vəziyyətdə olan məscid dağılmaq təhlükəsi qarşısında qalmışdır. Nəhayət, qədirbilən Faxralıların sayəsində 2009-2010-cu illərdə məscidin klassik memarlıq üslubu qorunmaq şərti ilə, qismən də olsa əsaslı təmiri həyata keçirilmişdir.

Bildiyimiz kimi, Məhəmməd peygəmbərin dövründə tikilmiş bir neçə bina İslam memarlığının ilki hesab olunsa da, ilk məscid Mədinədə inşa olundu. 632-ci ildə Məkkədə Kəbə yenidən bərpa olundu ve rekonstruksiya olundu. VIII əsrdən başlayaraq artıq memarlıqda insan və heyvan rəsmlərinin təsvir olunması qadağan olundu. İlk vaxtlarda islam memarlığında daha sadə binalar inşa olunardı, daha çox peğəmbərin evinin forması təkrarlanardı.

Qeyd edim ki, Faxralı məscidinin nəzərə çarpan xüsusiyyətlərindən biri onun sadə olmasıdır. Hər rəngli daşların harmoniyası diqqətli nəzərlərdən qaçmaz. Məscidin göyə ucalan tək minarəsi İslam dünyasının qələm incəliyində və gözəlliyində ən gözəl nümunələrdən olmağa davam edir. Əzan oxumaq üçün vaiz, minarənin başına daxili pilləkənlə qalxır. Məscidin minarəsi məscidə bitişikdir. Binanın daxili memarlıq nümunələri – sütunlar kaşi ornamental bəzəklər, pəncərələr arasındakı məsafələr, karnizlər və s. relyef stilizə olunan nəbati ornamentlə tərtib olunub.

Daxili bəzək işlərində naxış bolluğu heç də təsadüfi deyil. Çünki o zaman müsəlman incəsənəti ənənəsinə görə, canlı varlıqların, xüsusilə insan təsvirinə qadağalar vardı. Bunun nəticəsində ornament təsvirlərin rolu yüksəlmişdi. Məlum olduğu kimi, ornament müsəlman memarlığında dərin məna kəsb edir. Xüsusilə də, islam tikililərinə qeyri-adi əzəmət və gözəllik bəxş edir. Bu gün də Faxralı məscidi Borçalıdakı çoxsaylı məscidlər arasında öz qədimliyi, möhtəşəmliyi ilə seçilir və memarlıq abidəsi kimi tanınır.

Məscidin iki əsas giriş qapısı var: kişilər və qadınlar üçün. Məscidin dam örtüyü səkkiz sütun üzərində dayanaraq üçlü örtük quruluşuna əsasən örtülmüşdür. Minarəsi dam örtüyünə bağlı şəkildə təxminən divarın üst səthindən 7 metr yüksəklikdədir. İbadət zalının orta hissəsində oval şəkilli pilləvari səs əksetdirici oyuq inşa edilmişdir. Məscidin tavanı düzbucaq örtüklüdür. İki qapının üzərindəki kitabələr, iki quş (göyərçin) rəsmi və divara bərkidilmiş xırda başdaşına bənzər yazılı xitabə məscidin tarixindən xəbər verir. Məscid şərq və cənub tərəfdən 5 pəncərə, şimal tərəfdən isə 2 pəncərə ilə işıqlandırılmışdır. İbadət zalının mərkəzində yerləşən əsas daşıyıcı 2 sütun bütöv dam örtüyünün yükünü daşıyır. Bundan başqa məsciddə imam-xətib üçün hücrə (otaq) nəzərdə tutulmuşdur. Məscidin biri böyük, digərləri kiçik olmaqla 7 günbəzi var.

Məlumdur ki, İslam memarlığı — islam ölkələrində formalaşmış, fərqli üslublara malik olub dini, mədəni, siyasi xarakter daşıyır. Bu memarlıq nümunələrinə həm dini, həm də dünyəvi müəssisələrin binaları daxildir. İslam memarlığı müxtəlif müsəlman dövlətlərinin ənənələrini özündə cəmləşdirir.

Kompozisiya baxımından məscidlər aşağıdakı tiplərə bölünür:

***Frontal kompozisiyalı məscidlər*** — Frontal kompozisiyalı məscidlər ancaq vahid baş ox boyunca inkişaf etmiş fəza əlaqələrinə malikdir. Bu məscidlərin bəzi tipi kümbəz örtüklü tirli taxtapuşlu konstruksiyadan asılı olaraq görünüş ifadə edir.

***Portal kümbəzli kompozisiyalı məscidlər*** — Bu tip məscidlərdə əsas elementlər olaraq kürəvi kümbəzi və portal kompozisiyasını daşıyan kvadrat, yaxud düzbucaqlı prizmatik həcm qəbul edilir. Portal – kümbəzli kompozisiyaya malik məscidlərdə baraban üzərində qaldırılmış kümbəz portalla bərabər nisbətdə ayrılır.
Sütunlu kompozisiyalı məscidlər — Xristianlığın Bazilik məbədlərindən fərqli olaraq sütunlu

məscidlərdən ibadət edənləri mehraba istiqamətləndirən mərkəzi ox olmur. Nizamlı düzülmüş sütunlar bir-birindən bərabər məsafədə yerləşirlər.

Fars memarlığı üçün daha çox konusvarı kərpic sütunlar, böyük tağlar xarakterikdir. Adətən belə tağlar bir neçə sütun üzərində dayanır. Tikintidə daha çox ulduzşəkilli və xaçşəkilli piltələrdən istifadə olunurdu.
Osmanlı memarlığında isə Bizans, Suriya və Fars memarlığının təsiri hiss olunur. Bu memarlıq üslubu XV—XVI əsrlərdə Bursa və Ədirnədə ilkin olaraq formalaşdı. Osmanlılar daha çox daxili genişliyə malik tikililər timəkdə mahir idilər. Böyük günbəzlərinin olması osmanlı memarlığının xatakterik cəhətidir. Ümumən Osmanlı memarlığı özündə fərqli üslubları birləşdirir.

İslam memarlığının əsasını aşağıdakii elementlər təşkil edir:
Günbəz — dairəvi, çoxbucaqlı və ellipsvarı bina və qurğuların üstünü örtmək için istifadə edilən yarım kürə şəklindəki memarlıq və mühəndislik elementi. Günbəz vasitəsilə əlavə dayaqlar qoymadan çəx böyük sahənin üstünü örtmək mümkündür. Vertikal düşən yükdən günbəz konstruksiyalarda sıxılma gərginliyi yaranır və ağırlıq kənar dayaqlara düşür. Qüllə — məscidə girişə yaxın bir yerdə xüsusi qoyulmuş divar, mərmər və ya taxta lövhə, həyətdə mehrab əvəzi.

Göründüyü kimi, Faxralı məscidi Osmanlı nemarlığı üslubunda inşa edilmiş bir tarixi memarlıq abidəsidir. Bu memarlıq abidəsinin yarımçıq qalan hissəsinin tamamlanması isə qəlbində Allah sevgisi olan biz Faxralıların payına düşür. Gəlin heç olmasa, ömrümüzün qalan hissəsində yaddaşlarda və tarixdə qalacaq bir savab iş görək. Quranın 49 – cu surəsinin 13 – cü ayəsində deyilir: “ Müsəlmanlıqda ayrı – seçkilik yoxdur. Müsəlman adını daşıyanların, islam dininə qail olanların hamısı qardaşdır. Müsəlmanlıqda üstünlük yalnız Tanrıdan çəkinməkdir. Allahdan çəkinənlər nə özlərinə zülm edərlər, nə də başqalarına. Tanrıdan çəkinənlər həm özləri üçün, həm də başqaları üçün faydalıdırlar. İnsanların xeyirlisi, insanlar üçün ən faydalı olanlardır.”

Hacı Sahib onu da bildirdi ki, bu gün Gürcüstanda təkcə İslam deyil, eyni zamanda digər dinlərin nümayəndələri də bizimlə birgə, bərabər, yaşayır, sərbəst, heç bir məhdudiyyət olmadan öz dini inanclarını icra edirlər. Bu onun fəaliyyət göstəricisidir ki, ölkəmiz dünyada tolerant ölkə kimi tanıdır. Elə bu səbəbdən də Gürcüstandakı tolerantlıq ənənələrini də milli-mənəvi dəyərimiz hesab etmək olar. Ona görə də tolerantlıq bizim əsrlərdən gələn milli xüsusiyyətimiz sayılır. Bu gün Gürcüstanda bir təriqətdən olanlar digərlərinin əqidəsinə hörmətlə yanaşırlar.

Məscidlər bütün məzhəbdən olanlar üçün ümumidir. Təkcə dində deyil mill, siyasi və s. məsələlərdə də bu dözümlülük qorunur. Məsələn, antisemitizm bəşəriyyətin bəlası olsa da, Gürcüstanda bir dənə də olsa bu cür hal müşahidə edilməyib. Hazırda Gürcüstanda onlarla xalqın nümayəndəsi dostcasına yaşayaraq öz milli mədəni xüsusiyyətlərini qoruyurlar. Hər bir dini, milli qrup da öz növbəsində ümumi milli mənəvi dəyərlərin formalaşmasına töfhə verir. Sonda Osmanlı memarlığının nümunələrindən sayılan, Faxralı məscidinin fəaliyyəti ilə bağlı onu deyə bilərəm ki, məscid hər kəsin üzünə açıqdır və istər dini ayinlər, istərsə də dini bayramlarımız milli və mənəvi dəyərlərimizə, İslam ənənələrinə uyğun olaraq təşkil olunur və keçirilir.

Mənbə: ***Çingiz Haley oğlu Qasımov, 08.12.2017-ci il***

# Faxralıda məktəbin yaranma tarixi

Faxralıda dünyəvi təhsil yüz ilə yaxın bir tarixə malikdir. O dövrə qədər Faxralıda müsəlman dövlətlərində kifayət qədər dini təhsil alanlar var idi. Az-çox maddi imkanı olan ailələrin uşaqları bu din xadimlərinin evlərində dini (təbii ki, sxolostik) təhsil alırdı (mollaxana, mədrəsə tipli məktəblərdə).

Şəxsi adamlar tərəfindən evlərdə təşkil olunan dini məktəblər öz yerini ümumtəhsil məktəblərinə verdi. Bu təhsil sistemi öz inkişafını ibtidai məktəblərdən başladı. Ancaq ibtidai məktəblərin hansı ildə Faxralıda açıldığına dair olan fikirlər ziddiyyət təşkil edir. Belə ki,

- Hüseynqulu Məmmədli qeyd edir ki, Faxralıda dünyəvi məktəbin (ibtidai məktəb kimi) əsası 1919-cu ildə qoyulub.
- Fakt olaraq qeyd etmək olar ki, Həsən İsrafil oğlu Əlizadədə Faxralı orta məktəbinin 1938-1939-cu tədris ilində tərtib edilmiş pasportu saxlanılır. Rəsmi dövlət orqanının təsdiqlədiyi bu tarixi sənəddə "Məktəbin yaranması" qrafasının qarşısında "1921-ci il" yazılıb. Bu o deməkdir ki, Faxralı məktəbinin fəaliyyətə başladığı tarix 1921-ci ildir.
- Məmmədəli Şərifova görə isə ibtidai məktəb öz fəaliyyətinə 1924-cü ildən başlamışdır.

Faxralıda 1921-ci ildə ilk dünyəvi məktəb Koxallı nəslinin maarifpərvər ziyalısı **Mirzə Həbibulla bəy Əlizadəzənin** təşəbbüsü ilə açılmışdır.

**Xarici ölkələrdə dini təhsil alan Faxralı sakinləri**

1. Xudu oğlu Molla Hüseyn (Dəryahlı)
2. Şeyx İsgəndər (Göyüşöyü) – *Xorasanın nüfuzlu ali-dini məktəbini bitirib*
3. Şeyx Molla Qurban
4. Molla Mahmud Əfəndi (Şirətdi)
5. Molla Oruc (Güllər)
6. Molla Mahmud (Şeşəpapaqlar) – *İstanbul universitetinin İlahiyyat fakultəsini bitirib*
7. Şeyx Səlim (Yahalar)
8. Molla Bayram (Alqullar)
9. Molla Əli (Güllər)
10. Axund Ələsgər (Koxallı) – *İstanbul universitetinin İlahiyyat fakultəsini bitirib*
11. Molla Əli Namaz (Mollaöyü)
12. Molla Namaz (Qasımıllı) və s.

Maarifpərvər Faxralılar övladlarının təkcə dini təhsil almaqları ilə kifayətlənməmişlər. Bir çox Faxralı gəncləri Gürcüstanın ali təhsil ocaqlarında müxtəlif elmlərə yiyələnmişlər. Bunlardan,

- Axund Ələsgərin böyük oğlu Həbib, qardaşı oğlu Rza bəy, Poladov Abbas H.oğlu və s. Zaqafqaziyanın maarif akademiyası sayılan Qori Müəllimlər Seminariyasında,
- Mirzə Həbibin qardaşı Seyfulla və digər eloğullar – Tbilisi Müəllimlər Gimnaziyasında təhsil alıblar.

Mənbə: **Rəşid Faxralı** – ***"Oğuz eli Faxralı"*** və

**Allahverdi Kərimov** – "***Faxralı kəndinin tarixi haqqında yaddaş kitabçası***".

# Körpülər

## *Dələver çayı üzərində tikilən körpülər*

1. **Yuxarı qəbristanlığın yanındakı körpü**, 1956-cı ildə Koxallı nəslindən olan Səməd kişi tərəfindən inşa olunub.
2. **Babaşov Məhərrəmin evinin yanındakı körpü** *(Şahbuzlu və Amaşlı məhəllələrinə dönən yer),* 1955-ci ildə Koxallının Mahmudalı tərəfindən tikilib.
3. **Şərifov və Əfəndiyevlərin yanındakı körpü**, Məmmədəli Şərifovun rəhbərliyi ilə tikilib.
4. **Yuxarı təsərrüfatın yanındakı körpü,** Səməd Namazovun rəhbərliyi ilə kolxozun vəsaiti hesabına tikilib.
5. **"Dostluq" körpüsü** *(Arxac məhəlləsinə keçən yerdə),* Mahir Məmmədovun rəhbərliyi ilə inşa olunub.
6. **"Qırmızı" körpü** *(Cabbar presə keçən yerdə),* Arif Əliyevin rəhbərliyi ilə tikilib.

## *Binələrdə salınan körpülər*

1. **Taxta körpü 1** *(Tənəklinin başlanğıcındakı körpü),* 1929-cu ildə Məsim oğlu İmaməli, Hümbət oğlu Süleyman və Qasım oğlu Məhəmməd bu körpünün tikintisinə başlamış, lakin təqiblərdən can qurtarmaq üçün Məsim oğlu İmaməli və Hümbət oğlu Süleyman işləri yarımçıq qoyaraq Türkiyəyə gaçıblar. Bu səbəbdən körpünün tikintisini Qasım oğlu Məhəmməd başa çatdırıb. Körpünün üstü taxta materialı ilə örtüldüyünə görə ***Taxta Körpü*** adlanır. "Gav keçid"lə Taxta körpü arası 1 kilometrdən çoxdur. Taxta körpüdə qarşıya 3 yol ayrılır: Tənəkli yolu, Qoşa bulaq yolu, Bejanazaran yolu, Darvaz yolu .
2. **Taxta körpü 2** *(Gavkeçid deyilən yerdəki körpü).* Bu körpü Molla öyünün Əlinamaz tərəfindən salınmışdır. Müəyyən müddət işlədikdən sonra Dələver dərəsinin sel sularına tab gətirməyərək sıradan çıxmışdır.
3. **Əlinamazın körpüsü** – "Daşlı burun"dan keçən yol "Gav keçid"də dərəyə qarışır. Bir vaxtlar burada həmin bu körpü olub. Bu körpüyə "Molla Maşadının körpüsü də deyirmişlər. Körpü 1930-cu illərdə tikilibmiş. Üstündən keçənlər Molla Maşadının ölənlərinə rəhmət oxuyardı. Körpü 1970-ci illərdə güclü selləmələrdən ciddi xəsarət aldı, az sonra uçub dağıldı. Üzü Tənəkliyə, Qoşa bulağa, Bejanazarana doğru gedənlər yenə "Gav keçid"dən işləməyə məcbur oldular.

Mənbə: **Allahverdi Kərimov** – "***Faxralı kəndinin tarixi haqqında yaddaş kitabçası***", Bakı-2015.

# Dağ və təpələr

Kəndin ətrafını əhatə edən görkəmli yerlərin hamısı formasına və yerləşdiyi əraziyə uyğun olaraq tarixi adlarla adlandırılımışdır. Molla Əhmədli təpəsindən başlayan tarixi yer adları aşağıda göstərilir:

- Haram təpəsi
- Dumaneşən
- Süpürgəli
- Gözəldağ
- Qarama bulağı
- Əzgilli yal
- Yastana
- Qaşqatala
- Miyirdiş
- Təhməz, Təhməzin qayası, Təhməzin bulağı
- Ağzı gödək
- Babaşlının dam yeri
- Quru dərə

- Qaraqayanın qabağı
- Qoşa bulaq
- Yahaların binəsi
- Qızılqayanın üstü (Almalıq)
- Qızılqaya
- Tənəkli
- Xəmmədli
- Sərginə
- Səngər
- Daşkəsən
- Qarabulaq
- Xurdaçılar
- Haça qaya

Təhməzin bulağının suyu sıldırımlı bir qayanın bətnindən süzülüb gəlir. Bu torpaqlar türksoylu xalqların, bu sıradan oğuzların qayım-qədim məskənləri, ov yerləri olub.

Girəcəyi keçən kimi ağacların kökünə sürtünə-sürtünə uzanan yol Təhməz bulağının qənşərində qırılır. Bu tayda dayanan kimi bulağın sehri-ovsunu, suyunun pıçıltılı, təranə

biçimində harayı “əlindən yapışıb” səni özünə tərəf çəkir. Suyu can dərmanıdı Təhməz bulağının. İsmayıl Güllər onu “bulaqların mərcanı” kimi tanıdır.

İllər görmüş, illər yormuş ceviz ağacının kölgəliyində sal daşın üstündə oturub bulağın şırıltısını dinşəyənə qopuz əvəzidi bu səs; olan-qalan qayğılarını da, dərd-sərini də unudursan, qübarın yadından çıxır, könlün açılır. Təhməz bulağının “ayaqları altından” qayğısızlıqla axıb gedən arx misallı dərənin kövrək ləpələrinin səsini, daşlarda çiliklənən “ömrünü” ağacdələnlərin ritmik taqqıltısı, qumruların ötüşməsi, kəkliklərin ələdüşməz təranəsi, bir də uzaqlardan gələn tütək səsi – “Çobanbayatı” tamamlayır; Təhməz bulağı bir ayrı aləmdi! Şırıltısı duyanlara sözdü-şeirdi.

Təhməzin türküsü:

*Dərə çoxdu, dağa sarı*
*Körpü salıb keçən gərək!*
*Bulaqları sonulayıb*
*Yaxşısını seçən gərək!*
*Suyum dirilik suyudu,*
*Ovuclayıb içən gərək!..*

İl boyu Təhməz bulağının qonaq-qarası əskik olmur. Hamı qonağını Təhməzin ecazkarlığına, Təhməzin gözəlliyinə çəkib aparır. Təhməz, özü boyda bir möcüzədi. Təhməzin təkrarsızlığı güzarı düşənlərin ömrünə yazılır.

Təhməz haqqında deyiblər:

*“Təhməz ölüb-qalmalı yerdı’” (aktyor Səməndər Rzayev);*
*“Beş-on çadır qursan hazırca sanatoriyadı” (şair Nizami Saraclı);*
*“Təhməzdə təbiətin gözəlliyindən vəcdə gəlirsən” (professor Əjdər Ağayev).*

Təhməz bulağının suyunun süzülüb gəldiyi qayanın üstü gözişlədikcə genişlənən bir düzənlikdi, biçənəkdi. Bu biçənək yay biçinindən yaz qoruğuna kimi örüş yeri olur; binəçilərin də, arançılann da mal-qarası burdan dolanır.

Bu biçənəyin yan-yörəsində qədim yaşayış məntəqəsinin qalıqları, qəbir yerləri indi də qalmaqdadır. Biçənəyin yaxasından enən nazik cığır **Otaq daşda** sonuclanır. Bir vaxtlar otaq daşın ətrafında açıq olub, sonralar daşla hörülüb. Bu hörgünün yaşı qərinələrlə hesablanır. Biçənəkdəki xarabalıqları, qəbir yerlərinin qalıqlarını nəzərə alsaq, Otaq daşın öz zamanında müşahidə məntəqəsi olduğunu güman edə bilərik. 30-cu illərdə Otaq daş dəfələrlə qaçaqların hoyuna yetib.

Otaq daşa çıxıb-düşmək çətin olduğundan onun zövqü-səfasını ancaq orda çimir alanlar bilər.

20-30-cu illərdə bu həndəvərlərdə “otryadla” ağır atışmalardan çıxıb Təhməz bulağına pənah gətirən qaçaqlar yaralı yoldaşlarını **Otaq daşda** daldalayardılar, özləri dava-dərman, çörək dalınca kəndə enərdilər. Dara-dar qalanda yaralının yaralarına Təhməz bulağının yan-yörəsində ətirə dolmuş bağayarpağı qoyardılar.

Əhvalat:

*Mahmudla Mado çox adlı-sanlı qaçaq olub. Onlar hər il neçə dəfə üzə çıxmaları haqqında edilən təklifləri qətiyyətlə rədd ediblər. Atışmalarm birində Mahmud yaralanır. Mado onu yaxın kəndlərdən birinə – ya Faxralıya, ya da Kəpənəkçiyə aparmaq istəyir. Bu kəndlərdə də "otryad" dolaşa biləcəyindən ehtiyatlandığından qaçaq dostunu Təhməzdə qoyub özü Faxralıya getməyi qərara alır. Mahmudu güc. bəla ilə* ***Otaq daşa*** *çıxardır ki, işdi–şayəd, "otryad" bu tərəflərə gəlib-eləsə Mado qayıdınca Mahmud özünü müdafiə eləyə bilsin…*

*Mahmud Otaq daşda şəfa tapır…*

Mənbə: **Rəşid Faxralı** – ***"Oğuz eli Faxralı"***

## Faxralının torpağıdı bu yerlər

*(Rəşid Faxralı – "Oğuz eli Faxralı" kitabından)*

Faxralı qayım-qedim türk ellərindəndir. Borçalının (və deməli Faxralının da!) əksər adət-ənənəsinin oğuz tayfalarınm güzəranı ilə bağlı olduğunu Mirəli Seyidov, M.F.Qırzıoğlu, U.Şaiq, V.V.Bartold, G.Yoloğlu, Abbas Abdulla, Hüseynqulu Məmmədli, Valeh Hacılı və basqaları elmi dəlillərlə təsdiqləyib. Türkdilli xalqların ilkin yazılı abidələrindən biri olan "Kitabi-Dədə Qorqud"da işlədilən sözlərin, söz birləşmələrinin bir çoxu Faxralıda bu gün də yaşamaqdadır.

Borçalıdakı (həm də Faxralıdakı!) bəzi yer adlarının oğuzlarla səsləşdiyini, bəzi məqamlarda eyniyyət təşkil etdiyini göstərən Qorqudşünas Hüseynqulu Məmmədli yazır ki, Dədə Qorqud boylarında adı gedən yer adlarının 11-i müştərəkdir. Doğrudan da, Ağ qaya, Qara qaya, Quru dərə və s. kimi adlar olduğu kimi, Dumaneşən, Qazan qaya, Kor bulaq və s. kimi adlar təhrifə uğramış şəkildə Faxralıda da var.

Yeri gəlmişkən, bu və bu qəbil adların – toponimlərin, hidronimlərin, aykonimlərin… yozumlarının "Kitabi-Dədə Qorqud" kontekstində araşdırılması Faxralının tarixini gümanlardan qoparar, dəqiqləşdirilmə istiqamətində səmərəli olardı. Bununla bərabər, əksər adların yerin quruluşu, relyefi, rəngi ilə əlaqədar olduğunu da nəzərdən qaçırtmaq olmaz. Hər halda, "…boylarda cərəyan edən hadisə və əhvalatlar, əsasən…Gürcüstan… bölgələrində cərəyan etmişdir" fikri ilə razılaşmaq lazımdır.

# Faxralı kəndi ətrafındakı yer adları (hissə 1)

**Gilliyin burnu.** Faxralının yolu Gilliyin burnu deyilən yerdən başlayır. Faxralının ilk ocağı Molla Əhmədli təpəsininin yanında çatılıb. Sonralar otaracaq yeri darlıq eləyəndən sonra faxralılar ordan köçüb. O vaxtların qəbir yerləri – qəbrstanlığı indi də aydınca bilinir…

Bu yol Faxralının yoludu. Ad-sanı şan-şöhrəti, salğarı-sanbalı yaxın-uzaq ellərdə yetərincə bəlli olan Faxralını böyük dünyayla bu yol qovuşdurur. Tanrımız bu yolu da, bu yolun vaxtlı-vaxtsız yolçularını da neçə əsrlərdi pənahında saxlayır… Bu yol 30-cu illərdə aşağı kəndlərin, Sarvanın, Qazağın, Tovuzun hökumətdən gizlənən, üzə çıxmaq istəməyən, şura hökumətinə düşmən

kəsilən qaçaqlarının hoyuna yetib, onları "qüdrətdən səngərli-qalalı dağlara" (Aşıq Ələsgər), atkeçməz meşələrə, buralarda qalmaq istəməyənləri Türkiyəyə yetirib…

Faxralı kimi ağır bir elin, həm də şəriksiz qonaqpərvərliyi ilə ad-san qazanmış obanın ziyarətinə Səməd Vurğun, Osman Sarıvəlli, Hüseyn Arif, Aşıq Şenlik, daha kimlər, kimlər bu yolnan gəlib. Təpənin üstünə çıxan kimi Faxralının yaşıllıqlar içində ağban evləri, əlvan sarayları görünür.

**Təpələr**. Bu həndəvərlər *Təpələr* adı ilə tanınır. Təpələr bir-birindən yaraşıqlı təpəliklər silsiləsidi. Yaz gəldimi, gül-çiçəyinin ətri yolçunu yolundan eləyir…

**Saraclı yolu.** Faxralının bir yanı ustad Aşıq Hüseyn Saraclının böyüyüb ad aldığı, ucaldığı Saraclı kəndidi. Faxralıya aparan yollardan biri elə belə də adlanır: *Saraçlı yolu.*

**Karyer**. Bu yol *Karyerin* (üzlük daş karxanasıdı, buranın daşı damar-damar zehlərlə, zolaqlarla zəngindi. Dünyanın 50-dən çox dövlətinin nümunəvi binaları, bu sıradan Tbilisidəki hökumət evi Faxralının üzlük daşı ilə bəzənib, ərsəyə gətirilib) yaxasından keçir.

**Böyük Qaradaş** və **Kiçik Qaradaş**. Əsrarəngiz təbiəti, bihuşedici gözəlliyi kifayət qədər bəlli olan Faxralının ziyarətinə bu yolnan gələnlərin diqqətini yolun solunda qalan daş gövdəli qayayabənzər iki təpə çəkir. Elə bu səbəbdən də onlar daş kimi tanınır: Böyük Qaradaş, Kiçik Qaradaş (daş tərkibi qaya sözünün sinonimi, əvəzləyicisi kimi işlədilib). Bu adlardakı qara komponentini oğuzlarda olduğu kimi böyük, iri, azman anlamlarında da götürmək olar; bu qayalara bütöv bir daş kimi baxanda onlar həqiqətən də iridi, böyükdü, azmandı. Böyük Qaradaş da, Kiçik Qaradaş da əsmər daşdı – qarayaçalandı.

Bu yerlər əski tarixlərdə türk soylarının, qədim oğuzların ov yerləri, yurd yerləri olsa da Böyük Qaradaşın da, Kiçik Qaradaşm da adı rəngi ilə bağlıdı. Yaxın olduqlarına görə birinə böyük, digərinə kiçik deyilib: qara rəngli böyük daş (qaya), qara rəngli kiçik daş (qaya).

Könülaçan, gözdoyduran gözəlliyi ilə seçilən qara daşlar – Qaradaşlar kəkliklərin də yar-yaraşığı olub, həmdəmi, dərddaşı olub. İndi perikən, perikdirilən kəkliklərin məhrəm səslərinə sarı boylanır Qaradaşlar; könlü qubarlanır, bu üzüdönüklüyə yanıb-yaxılır. Yüz-yüz illərlə ayaqlarını xınaladığı kəkliklərinin yolunu gözləyir…

**Qaradaşın türküsü:**

*Ürəyi kədərlə yüklənənlərinn,*
*Dərdinin adını qara daş bilər.*
*Urvası uçanı, baxtı yatanı.*
*Beli qırılanı qar adaş bilər.*

*Çox düşübdü boşa, bərkə Faxralı,*
*Ömründə minməyib tərkə Faxralı.*
*Əzəldən qardaşdı türkə Faxralı,*
*Qaradağ çəkəni Qaradaş bilər…*

**Kərimin qəbri**. Qaradaşın ətəyindən keçirsən, bir az qabaqda – yolun solunda bır tək məzar görürsən. Təklik, tənhalıq bu məzarın da baş daşının qəddini əyib. *Kərimin qavrı* (qəbiri) deyirlər orta. Kərim Saraclı kəndindən olub. Hökumətdən qaçaq düşübmuş. 30-cu illərdə

“otryad” onu təqib eləyəndə anlayır ki, Saraclıda duruş gətirə bilməyəcək. Canını qurtarmaq üçün Faxralının qaçaqlarına qoşulmağı qərara alır. Atma süvar olub yola çıxır. Bundan xəbər tutan “otryad” onu izləyir və burda haqlayır. Kərim atışmada ölür. Elə öldüyü yerdə də dəfn edilir. Sonralar bura kəndin qəbristanlığı olub və ***Aşağı qəbrstanlıq*** adı ilə tanınır.

**Gözəldağ**. Qaradaşın yaxınlığından *Gözəldağın* ətəkləri başlayır. Xırdaca kolluqlar (Faxralıda bu bitgi tikən adıyla tanınır) dağın döşünə doğru sıxlaşır. Bu adaş-qardaş qayaları Faxralılar qürur, əzəmət rəmzi olan Gözəldağın daş qolları, daş yumruqları sanırlar…

Yüz-yüz illərdi Faxralının ad-sanı, şöhrəti ilə Gözəldağın gözəlliyindən, əzəmətindən, duruşundan birgə söz açılır. Gözəldağın ağayana duruşu söz nəhəngi olan ellər vurğununu – Səməd Vurğunu da valeh eləyib. Şair 1953-cü ildə dağ qardaşından söz – şeir qardaşını soraqlayıb:

*Gözəldağ, Gözəldağ, de Nəbin hanı,*
*Hanı söz mülkünün sönməz ərkanı?*
*Növrağı pozulmuş o mərd insanın*
*Yoxsa unudulmuş ömür dastanı?*

Uzaqdan baxanda döyüşdən çıxmış igidə bənzəyən *Gözəldağ* yaranışından Faxralının haqsız-muzdsuz keşikçisidi. Qulu Əhməd oğlu deyir ki, Gözəldağın adı 1880-1885-ci illərə kimi **Qaradağ** olub. Tanrıverdi oğlu Mehdi Allahmana elçi düşür, el adətincə onunla evlənmək istəyir. Arvadlar arasında razılıq olsa da qızın qohumları bu işə pəl vurur. Mehdi inada düşür və qızı qaçırdır. Əvvəlcədən nəzərdə tutduğu kimi, Qaradağı özünə sığınacaq bilir. Allahmanın anası Qaradağın döşündə haray çəkir, ağlayıb-sızlayır: Gözəlim heyyy! Bu haray, bu ana fəryadı, ana naləsi, ananın dərd şikəstəsi kənddə əks-səda verir. Elin ağsaqqalları, sözü tutulan kişiləri araya barışıq salır, qohumları barışdırır.

Bu hadisə Qaradağın adına ad qoyur: *Gözəldağ*. Bu hadisə, bu adqoyma öz yerində, Gözəldağın adının yozumu, insafı arada görəndə, yaraşıqlı, gözəl qamətli kəlmələrinə daha çox münasibdir; Qaradağ – Gözəldağ həqiqətən gözəl dağdı!..

Gözəldağdan baxanda kəndin özü bir yana, aşağı kəndlər də ovuc içi kimi görünür. Faxralının girəcəyindəki ilk evlə kəndin sonuncu evi arasındakı məsafə 6 kilometrdən çoxdu. Gözəldağdan baxanda gözlərin bu genişlikdən rahatlıq tapır.

Yeri gəlmişkən,

*Hər il Novruz bayramında Arxac məhləsindən Cabbarın qənsəsinə kimi bütün cavanlar, ürəyi atdanan uşaqlar il boyu yığdıqları işdənmiş, köhnəlmiş maşın təkərlərini Gözəldağa çıxardır. Şər qarışan kimi hər qayada, hər iri daşda bir tonqal alışır; Novruz gecəsi Gözəldağ özü boyda bir bayram tonqalına dönür...*

**Qavır dərə, Sozulu dərə.** Gözəldağın kəndəbaxar tərəfində iki dərə var: *Qavır dərə, Sozulu dərə.* Qavır dərəsi dərin dərədi. Dərin olduğu üçün də adına Qavır dərə deyirlər; qavır – qəbir sözünün təhrif olunmuş şəklidi. Sozulu dərə Qavır dərə ilə müqayisədə xeyli dayazdır…

**Arxac məhəlləsi**. Arxac məhləsi Gözəldağın ətəyindədi. Burdan Gözəldağa tərəf gedən yol **İki təpənin arası**-nda haçalaşır. Sol tərəf – **Dərə yolu**, sağ tərəf – **Sarı yol** adlanır.

Dərə yolunda iki bulaq var: **Göz bulaq** , ondan bir qədər aralıda, yolun solunda **Bayda bulaq** . Hər ikisi qaynama bulaqdı. İstilər düşəndə Bayda bulağın suyu azalsa da yazda, payızda özünə gəlir.

Əhvalat:
*Maldan qayıdanlar yanğılarını söndürmək üçün özlərini verirlər Bayda bulağa. Alı öyünün Dünyamalı dolçanı doldurmaq istəyəndə duruxur, qanı qaralır: – Saa bir də Bayda bulax desəm atama nəhlət. Sən heç dolça bulax da döyülsən. Bir dolçalıq canın yoxuymruş…*

Göz bulağın suyu göz yaşı kimi dumdurudu. Tanrı bir möcüzə də burda yarad1b; daşların bətnindən çıxan Göz bulağın suyundan ikicə qurtum içən yolçunun yanğısı sönür. Yayın bürküsündə təntiyən, tasalanan yolçuların hoyuna bu həndəvərlərdə Gözbulaq çatır. Adını da suyunun şəffaflığından alıb. Bir vaxtlar Arxac məhləsi içməli suyu Bayda bulaqdan, Göz bulaqdan aparardı (20-ci illərə kimi).

**Gəzdək**. Bu kiçik bir düzənlikdi. Təkəm-seyrək kolları, tikanları nəzərə almasaq, gözəl bir çəmənlikdi, könül açan seyrəngahdı. “Gülü-nərgizi açılanda” bura da “təzə murğuzar olur“ (Aşıq Ələsgər). Gözəldağa bu səmtdən çıxmaq daha asandı. Gəzdəkdən üzü aşağı baxanda göz tutduqca genişlik görünür. Çəmənlik görkəmində, çəmənlik biçimində olun bu genişlik **Dağın ardı** kimi tanınır. Kənd tərəfdən baxanda bu genişlik Gözəldağın arxasında qalır. Adı da elə Gözəldağa nəzərən yerləşməsi ilə baglıdı: Gözəldağın arxasındakı yer. Dağın ardı da Gəzdək kimi Qaramada binələnənlərin obaşdan örüş yeridi.

**Yolçu keçən qaya.** Gözəldağın köksünə sığınmış adlı qayalar da var. Dağın Saraclıya baxar səmtindəki qayalardan biri *Yolçu keçən qaya* adlanır. Tənbəllər qayanın o biri tərəfinə oval şəkilli oyuqdan keçirlər. Bu oyuğa qabuga sürtmüş Yolçunun kimliyini bilən yoxdu; qaya onun adına ad olub. Talvarşəkilli, maili quruluşa malik olduğundan altı etibarlı dal-dalanacaqdı. Bu həndəvərlerdə təntiyən yoluçuları da, sığırçıları, mal sirəsinə gələnləri də yağan yağışlardan Yolçu keçən qaya qoruyur. Bela quruluşlu bir qaya da Sallamaların güneyindədi: **Talvar qaya.**

Gözdəkdən aşağı enəndə qarşıya çıxan qaya **Əhməd ölən** qayadır. Sağdakı ərazi **Böyük harava açılan** (odunçuların arabalarının açdıqları yer) adlanır. Sağsağannı yala tərəf gedən yolun solundakı kiçik biçənək isə **Balaca harava açılan** adlanır. Gəzdəkdən sağ tərəfə ayrılan yol Qaramaya aparır.

**Qarama.** Bura binə yeridi. Arxac məhləsinin 3-4 kilometrliyindədi. Səfalı yer olsa da kəndəbaxar səmti ağac sarıdan kasaddı. Hər halda, Qarama camaatın köməyinə çatır. Yazda, payızda *Qızıl qayaya* (bu adda dağ da var), *Səriynəyə*, *Tənəkliyə*, *Qoşa bulağa, Bejanazarana* getməyə imkanı olmayanlar Qaramada binələnirlər.

Qarama sərin sulu qaynama bir bulağın zümzüməsiylə illər yorub. Bir vaxtlar bu həndəvərlərdə elə bu bulağın suyundan yaranmış gölməçələr, bataqlıqlar olub. Bu gölməçələr, bataqlıqlar yağan yağışların suyu ilə siləl変nib. Yaraşıqlı, məlhəm havalı dağavar bir yerə Qarama deyilməsi bununla əlaqədardır…

**Əzgilli yal.** Qaramanın üst tərəfindəki yal belə adlanır (bu adda yer kəndin yuxarısındakı Taxta körpünün yanında da var). Əzgilli yalın sağında bol otlu bir açıqlıq var. Burda bineyi-qədimdən **Maral yatışan boyun** adı ilə tanınır. Mehrini bu həndəvərlərə salan marallar bir vaxtlar bu boyunda gecələyərdi…

**Daşın boynu.** Qaramanın üst tərəfi belə adlanır. Daşın boynu dikdirdi. Adını qayım-qədim dayanmış iri bir daşdan alıb: bozumtul rəngli daşın arxa tərəfindəki yer. Daşın boynundan kəndin mərkəzi hissəsi, əsasən, *Aşırlı, Kələşdi, Alğullar, Qazaxlı* məhəllələri aydınca seçilir. Buradan yanan ocağın tüstüsünü də ayırd eləyə bilərsən, tüstüsü gələn o evin kiminki olduğunu da.

**Tatın cığırı.** Daşın boynundan on-on beş addım sağdan *Tatın cığırı* başlayır. Əkinçiliyi daha intensiv inkişaf etdirmək məqsədilə Knyaz Muxranski 1876-cı ildə İrandan Borçalıya rəncbərlər gətizdirmişdi. Onlar həm əkinçiliklə, həm də digər sahələrlə, bu sıradan kömürçülüklə məşğul olurdular. Niyəsə, camaat İrandan gələnlərə "tat" deyirdi. *Tatın cığırı* söz birləşməsinin "tat" sözü ilə bağlı olması da istisna deyil. Bu ətraflarda kömürçülüklə məşğul olan iranlı azərbaycanlılar azuqə almaq, kömürünün satışını təşkil etmək üçün kəndə burdan keçib gedirlərmiş. Onların ayaq izlərindən yaranan cığır sonralar *Tatın cığırı* adlandırılıb.

Digər bir versiya da diqqəti çəkir: bu cığır vaxtilə cələfsiz (nazik, arıq) bir cığır olub, burdan bir at güclə keçərmiş. Bu ad dəyişməsi *At cığırı – Atın cığırı – Tatın cığırı* şəklində dəyişmə ilə bağlı olan fonetik hadisədir.

**Həmidin yeri.** Bu yer bir düzənlikdi. Qoruya bilsən, otu kərəntiyə gələndi. Fərdilik vaxtı buranı Alı öyünün Həmid çəpərləyibmiş. Sonralar çəpər sökülüb-dağıdılsa da ad qalıb: Həmidin yeri.

**Kosanın yolu.** Həmidin yerinə *Kosanın yolu* (cığırı) ilə də getmək mümkündür. Bu cığır ağıla-şayına gəlməyən yerdən başlayır; cığırın başladığı yer yöndəmsiz bir kolluq olub, cığıra düşmək üçün bu kolların başına dolanılmalıdı. O kosa kim imiş, bilən yoxdu. Bəlli olan budur ki, həmin adam çoxbilmiş olub, yoxsa belə bir yerdən cığır salmazdı…

**Kömürxanalı.** Həmidin yerinin kəndəbaxar səmtində qalan xırdaca meşəlik *Kömürxanalıdı*. Buranın qulançarının, quzqulağının dadı-tamı öz yerində, nərgiz-bənövşəsinin ətri müşk-ənbərdən geri qalmır. Qasımıllının, Ayvaz öyünün, Arxac məhləsinin uşaqları quzqulaq, qulançar yığmaq, evlərini nərgiz-bənövşə ətrinə bələmək üçün çox vaxt bura gəlirlər. Kömürxanalı adı kömür hazırlanan yer anlamındadı: kömür və xana (bu məqamda xana sözü yer, məkan kimi işlədilib) komponentlərindən yaranıb. 30-cu illərə kimi burda odun doğrayıb kömür hazırlayar, arabalarla Sarvanın (indiki Marneuli), Tiflisin, Cəlaloğlunun (Stepanavan), Gümrünun (Leninakan) draxdınlarına (yemakxanalarına), çayxanalarına aparardılar. Çox zaman bu işlə xüsusi adamlar məşğul olardı. İndi Kömürxanalıda papaqsalan qollu-budaqh ağac qalmayıb; neçə onillərdi Kömürxanalıda kömür hazırlanmır…

İlkin yazda Kömürxanalıda göylərin göy gözlərini sürmələyən qaraca-qaraca tüstü topaları qullançardan **qosara** bişirən uşaqların qaladıqları ocaqların tüstüsüdü. Hər ocaq çatılanda neçə yemşən ağacının qabığını soyur, qol-budağını pis günə qoyur qosara həvəsliləri.

Haşiyə:
*Cavan yemşən ağacının qol-budağından, bəzən körpəsinin gövdəsindən də bir qarış (15-20 santimetr) uzunluğunda qabıq soyulur. Onun alt hissəsi tuvluğu çubuğu ilə çarpaz şəkildə "tikilir". Silindr (boru) şəkli almış qabığın alt hissəsinə xeyli quzqulağı yığdıqdan sonra*

*qulançar xırdalanıb onun içinə doldurulur. Quzqulaqla doldurulduqdan sonra "borunun" üst hissəsi də alt hissə kimi "tikilir". Bu müddət ərzində qalanmış ocaq əməlli-başlı köz tökür. Hazırlanmış forma közün içinə qoyulur. 25-30 dəqiqədən sonra qosara adlandırılan təam hazır olur; qosara çox dadlı, ləzətli təamdı…*

**Dımbıl dərə.** Kömürxanalıdan bir az aralıda – əkin yerinin üst tərəfində "boynunu büküb" mağmın-mağmın dayanan təpəyə deyirlər. Dımbıl-dımbılı, balaca anlamındadı: Balaca təpə. Yaz girəndən payızın son ayına kimi bu balaca təpənin döşündən şamartı əskik olmur; quzu otaran kim, nərgiz-bənövşə yığan kim, çilik-ağac, azbalı, mərəqazma… oynayan kim…

**Mustafoğluçalağan**. Gözəldağa bitişik qayanın ayrıca adı var: *Mustafoğluçalağan.* O, dağ duruşlu, dağ görkəmli qayadi. Əslində Mustafoğluçalağanı Gözəldağdan ayırmaq günahdı. Bu qayanın adında bir dolaşıqlıq var – anlaşıqlı deyil. Mustafa oğlu şəxs bildirir, çalağan yırtıcı quşdur. Bu iki sözdən yeni məzmun ifadə edən sözü təbii ki, anlamaq çətin olardı. Adın məzmununu nəzərə alsaq, aydın olur ki, onun ikinci tərəfi diləyatımlılıq baxımından təhrif olunub. Sözün ilkin forması "çalağan" deyil, "ot çalan" olub -yəqinki. Onda yer "Mustafa oğlu ot çalan yer" anlamını verir. Yer ot çalmaq üçün uyarlı deyil. Məhz bu səbəbdən də camaat belə bir yerdə ot çalınmasını qəribəliklə qarşılayaraq Mustafa oğlunu bu adqoyma ilə atmacalayıb…

***

**Sarı yarğan.** Kəndi çıxırsan, bir qədər uzaqlaşdıqdan sonra qarşıya bir yarğan çıxır. Adına Sarı yarğan deyirlər. San yarğanın üst tərəfi Daşdı burun adı ilə tanınır.

**Daşdı burun.** Daşdı burun çox naqolay yerdi. Yolun bu hissəsi təbii sal daşlarla örtülüb. Daş örtüklü bu yoldan maşınla, arabayla keçənlər həmişə ehtiyatlanır. Yüklü arabalar burdan "Allah, Allah"la keçir. Ona görə də arabaçılar təkərlərin sürtünmə qüvvəsini artırmaq məqsədilə onlardan ya birini (arxa təkərini), ya da ikisini (sağ təkərləri) zəncirlə arabanın gövdəsinə (arabadakı iri ağacların birinə) bağlayırlar. Bu yol çisəkli, yağışlı ayamlarda daha sürüşkən olur.

**Gavkeçid.** Daşdı burundan keçən yol Gavkeçiddə dərəyə qarışır. Bir vaxtlar burda bir körpü olub: Əlinamazın körpüsü (Molla Maşadının körpüsü). Körpü 1930-cu illərdə qurulmuşdu. Körpü 70ci illərdə güclü selləmələrdən ciddi xəsarət aldı, az sonra uçub dağıldı. Üzü Tənəkliyə, Qoşa bulağa, Bejanazarana… doğru gedənlər yenə Gav keçiddən işləməyə məcbur oldular.

**Əzgilli**. Taxta körpünü keçəndən sonra sol tərəfdə qalan ərazi *Əzgilli* adlanır.

**Qara qaya.** Əzgillinin yuxarısındakı qaya *Qara qayadı.*

**Qarağaclı**. Sağ tərəf Qarağaclı adı ilə tanınır. *Qarağaclı* bineyi-qədimdən qoruq yeri olub. Otu biçildikdən sonra payız binəsinə çıxanların mal-qarasının, qoyun-quzusunun ələdüşməz örüş yeridi. 80-ci iilərdə bu biçənəyin ağaclarını kökündən kürüdülər, sinəsində şırımlar açdılar. Bu "yaralar" sonralar sağalsa da Qarağaclı kökündən qopardılan o ağaclarla daha gözəliydi, könülaçanıydı, gözoxşayanıydı.

**Qızıl qaya.** Bir az qabaqda, Bejanazaran yolunun sağında bir qaya görünür. Bu, *Qızıl qaya* adıyla tanınır. Qınından sıyrılmış qılınca bənzəyən, günəşin şoxundan par-par parıldayan bu azman qayanın əzəməti, duruşu duyumlu yolçunu yolundan eləyir. Özü boyda bir tamaşadı

qızılı qaya – Qızıl qaya! Qızıl qayanın adı rəngi ilə bağlıdı; qızılı rəngli qaya. Qaya kimi tanınsa da Qızıl qaya dağdı, dağlıq massivdi. Ətrafı sıx meşəlikdi, zəngin bitki örtüyü var. Burda ürəyin istəyən yabanı meyvə tapa bilərsən. Bir vaxtlar əliklərin səsi ilə uyuyan Qızıl qaya indi az qala kəklik, turac, qaratoyuq… səsinə də həsrətdi – ovçular perikdirib.

Yeri gəlmişkən,
*Qasımıllının Usub Oruc oğlunun tüfənginin qundağında 127 cızıq – xətt varıydı. Bu, onun vurduğu əliklərin sayını göstərirdi.*

Qızıl qaya dağlıq silsiləsində adlı qayalar da var: Zağalı qaya, Quyulu qaya, Ballı qaya…

**Zağalı qaya**. Zağa kaha, mağara sözləriylə eyni mənalı sözdür. Bu qaya çox da böyük olmayan bir biçənəyin *Maşadı Söyünün biçənəyi*-nin altındadı. Girəcəyi zağa (kaha, mağara) görkəmində olduğuna görə belə adlandırılıb: “zağası (kahası, mağarası) olan qaya” anlamındadı. Zağalı qaya var olalı neçələrini qəfil yağan yağışlardan, ölüm güllələrindən qoruyub, xilas edib, bir Allah bilir.

**Quyulu qaya.** Yarnağı olan bir qayadı. Qayanın bu hissəsi iti dəmir alətlə deşilib (!), quyu halına gətirilib. Hündürlüyü təxminən 3 metrə çatan bu quyudan içməli su quyusu kimi qaçaqların bəhrələndiyini güman eləmək mümkündür.

**Ballı qaya.** *Zağalı qaya* ilə üzbəüz dayanan, görkəmindən şirinlik yağan bəstəboy bir qayadi. Bu iki məhrəm qayanın baxışları hər səhər bir-birinə dikilir – hallaşırlar. Neçə-neçə yüz illərdi Zağalı qaya Ballı qayaya, Ballı qaya Zağalı qayaya hayançıdı. Ballı qayanın irili-xırdalı koğuşlarına, daş çıxıntılarının qoltuğuna neçə-neçə arı ailəsi sığınır, bəlli deyil. Bəlli olan budur ki, Ballı qaya arılara sinəsində səxavətlə yer verir.

**Qırıq qaya, Amanat qaya.** Qızıl qayada əsas gövdədən iri bir daş qopub. Əslində, ona daş demək günahdı. O, iri bir qayadı. Əsl möcüzədi! Daş üstündə qaya! Ana qayadan qopub (qırılıb) düşdüyünə görə ona *Qırıq qaya* , daş üstündə dayandığına görə *Amanat qaya* deyirlər. Adama elə gəlir ki, bir-iki çiyin vursan Amanat qaya bərkidiyi daşın üstündən düşəsidi. Ancaq belə deyil. Adı amanatdı. Özü bəlli olmayan illərdən bəri mərdi-mərdana dayanıb. “Ürəyi qırıqdı” Amanat qayanın. Hər ayaq səsinə uçunur-sevinir, hər təması oxşama, əzizləmə bilir. Bu dərdəcar qayanm rəngi də Qızıl qayanın rəngindən bir qədər solğundu…

Amanat qayanın Qızıl qayadan qopmasının, ayrı düşməsinin səbəblərini gümanlarda axtarmaq lazımdır. Yeri gəlmişkən, amanat sözü toxtamamış, yerini bərkitməmiş mənasındadır.

***Birinci güman:***
*Tarixin hansı dönəmindəsə Qızıl qayanın gövdəsində çat əmələ gəlib. İsti-soyuq zaman keçdikcə bu çatı dərinləşdirib. Bunun nəticəsində də sonralar Qırıq qaya (Amanat qaya) adlandırılacaq daş (qaya) əsas gövdədən qopub, ayrılıb.*

***İkinci güman:***
*Amanat qayanın Qızıl qayadan qopmasına, ayrılmasına yerin tərpənməsi zəlzələ səbəb olub. Bu gümanda da çat önəmli rol oynayıb.*

Hər iki halda ayrılmanın, qopmanın tarixi qədimdir. Tarixi qaynaqlar, salnamələr təsdiqləyir ki, Gəncə-Borçalı bölgəsində XVIII yüzillikdə nəzərə çarpacaq zəlzələ qeydə alınmayıb. İkinci

versiyanı əsas götürsək, onda adı gedən qopmanın tarixi daha qədimlərlə bağlı olur… Tarix bizlərdən hələ çox hadisələri gizlədir…

* * *

Qızıl qaya 20-30-cu illərdə hökumətdən qaçanların qaçaqların ən etibarlı sığınacaq yerlərindən biri olub. “Otryad” səngər misallı bu dağ-qayaya sığınanlara bata bilməzdi… Həmin dövrdə Borçalının, Qazağın, Tovuzun əksər qaçağı həm etibarlılığına, həm duz-çörəkli olduğuna görə faxralılara pənah gətirər, özlərinin dediyi kimi, “qan çanağından” nisbətən uzaqlığına görə Faxralının dağlarına, meşələrinə sığınardılar. “Qaçağı el saxlayar” – deyiblər. Faxrall öz qaçaqlarını da, ona pənah gətirən qaçaqları da naümid qoymayıb – Şair Nəbi demişkən: səxavət kanıdı Faxralı, damarlarmda qan əvəzi qeyrət axan faxralılar…

XIX yüzilliyin adlı-sanlı qaçaqlarından biri də Qaçaq Kərəm olub. Yeri gəlmişkən, gürcülər Data Tutaşxiyanın qaçaqlıq bioqrafıyasını Qaçaq Kərəmin qəhrəmanlıqlarından bəhrələnərək zənginləşdiriblər.

Faxralıda adıbəlli Qaçaq Kərəmin adına ad edilən yer var: **Kərəm talası**. Tənəklidə, Fındıqlıqdan yolaçıxan yerdə gözdoyduran, könülaçan açıqlıq Kərəmin adını Faxralıda indi də yaşadır.

Haşiyə: Qaçaq Kərəm Faxralıda (Onun Güllərin Dəli Söyünlə dostluğu).

Növbəti bölməyə keçid : Faxralı kəndi ətrafındakı yer adları (hissə 2)

Mənbə : **Rəşid Faxralı** – ***“Oğuz eli Faxralı”***

# Faxralı kəndi ətrafındakı yer adları (hissə 2)

**Almalıq.** Qızıl qayanın üstü *Almalıq* adlanır. Cır, yabanı alma ağacları ilə zəngin olduğu üçün belə adlandırılıb (Qarağaclıda qara ağac, Süpürgəlidə süpürgəyə bənzər kol, Moruqluda moruq və s. bol olduğu kimi ). Almalığın dar keçidini keçən kimi dikdirdi.

*Bu keçidi addamaq istəyən qaçaqlar – Hümbətoğlu Sülöymən, Məsimoğlu İmamalı və Sarvandan olan cavan bir oğlan qəflətən “atıyadla” qarşılaşırlar. Sülöymənlə İmamalı fıstığın dalına keçib atışır, oğlan vələs ağacının dalında çox dayana bilmir. Ağacın dalından çıxanda güllə sinəsini yandırır. Eyni andaca çekist Şərifoğlu -“otryadın” başçısı yerə sərilir. Şərifoğlunun iki silahlısı da öldürülür…*
Həmin yer **Şərlfoğlu vurulan yer** adlandırılır…

Faxralıda beş rəngdə 20-dən çox irili-xırdalı qaya var.

**Sarı qaya.**

1. Təhməzdə, Daşın altından sağda Otaq daşın qarşısındakı qaya.
2. Qızıl qayanın girəcəyini keçəndə sağ tərəfdəki hündür, əyri gövdəli qaya.

**Göy qaya:**

Miyirdişin bulağına gedən yolun üstündəki qaya. Oğuzlarda “qara” sözü rəng bildirməklə bərabər, iri böyük anlamı da verib. Faxralıda “qara” təyini ilə qoşa işlədilən yer adı çoxdu: Qarabulaq, Qarasu, Qaradaş… Bu adların məhz rəng bildirdiyini güman olunur. Beş yerdə “qara” təyinli qaya var:

**Qara qaya:**

1. Əzgilli binəsində – Əzgillinin bulağının günçıxan tərəfindəki qaya.
2. Tənəklidə, Anbar bulağına çatmamış yolun solundakı qaya.
3. Tənəklidə, Şeşəpapaxların yurdunun yanında, Anbar bulağın sağındakı qaya.
4. Qoşa bulaqda, Uzun Novruzun damının üstündəki qaya.
5. Maraluçan, Qaravullu qayalarının alt tərəfindəki qaya.

“Qara” təyini ilə qoşa işlədilən bu beş qayadan savayı Faxralıda dağ da var: **Qaradağ** . İndi nisbətən seyrəlsə də vaxtilə sıx, qalın meşəliklə əhatələnib. Qara dağın adı ilə bağlı əfsanə də var.

**Qızıl qaya**: Qoşa bulağa çatmamış yolun sağında qalan dağ silsiləsi və bu dağ silsiləsində qaya. Şair İsmayıl Giillər onu “qayaların başı” kimi tanıdır.

**Ağ qaya**: Əzgillidən yuxarıda Qamışdının ayaq tərəfindəki qaya.

Azərbaycan Respublikasının Şəmkir rayonundakı Ağ qaya da, adları “Kitabi-Dədə Qorqud” və “Koroğlu” dastanlarında çəkilən Ağ qayalar da adlarını rənglərindən alıblar. Faxralının Ağ qayasının da daşları ağaçalandı, ağımsovdu. Sonralar onun taleyi qara gəlib, “başına oyun açılıb”, rəngi öz başına bəla olub; Ağ qaya kənddə genişlənən tikintilərin “badına gedib”. 40-cı illərdə camaat əksər tikinti materiallarını kəndin təbii ehtiyatları hesabına əldə edirdi. Meşədən çatmalıq, millik, qapı-pəncərəlik oduncaq gətirərdilər. Gildən kərpic bişirərdilər (kərpic sexi indiki dəyirmanın yanında olub), daşdan kirənc. Kirənc üçün, əsasən, ağ daş seçilərdi ki, alınacaq məhsulun rəngi də ağımsov olsun.

Bu mənada 30-cu illərdə Balaməmmədlinin Nəbi, Əhmədalı, İmamalı, Zurav oğlu Hümbət kolxoz üçün kirənc yandırmaq məqsədilə Ağ qayanı seçir.

Əhvalat:

*Hümbət oğlu İsmayılın güzarı Ağ qayanın yanından düşür. Hər dəfə dədə-baba binə yerlərinə gedib-gələndə gördüyü Ağ qayanın görkəmi kişini kövrəldir. İsmayıl kişi onun “əriyib getdiyinə” təəssüflənir, köksünü ötürür: – Vaxt varıydı ki, görkəmin ac qarınlar doydururdu. Gör indi nə günə düşübsən. Orduqırxıq tərəkəmə səni də yedi, Ağ qaya, səni də yedi!..*
Qızıl qayanın ətəyindən keçən (bu adda meşə də var: **Qızıl qayanın üstü**) , gün işığı düşməyən meşə yolu yol adamını **Qoşa bulağa** çatdırır.

Qoşa bulaq dərə misallı, nazik sulu dağ çayının yaxasındadı. Dərəni keçən kimi biri digərindən yaraşıqlı, sərin sulu iki bulaq görünür; biri digərinin qoynuna sığınıb. Əsrlər yormuş ağacların üç-dörd addımlığındadırlar. Uzun Novruz sağdakı bulağa ana bulaq deyərdi və niyəsə həmişə o birisi bulağın suyundan içərdi. Nazik sulu dağ çayının suyu burda bir az gurlaşır – qoşa

bulaqların suyu da ona qarışır. Adı da, bulaqların qoşalığı ilə bağlıdı. Bu ad bir əfsanə ilə yaşdaşdır.

Qoşa bulağın sərin suyu can dərmanıdı, bircə qurtum içənin dillərinin taqəti artır, yorğunluğu çıxır. Onlar da digər meşə bulaqları kimi qaynama bulaqlardı. Üst tərəfi sərt yarğandı. Ömrünü bu yarğanda tapmış cavanlı-qocalı ağacların irili-xırdalı kökləri torpağı "dördəlli qamarlayıb"; bu ağacların həyat eşqi görənlərə görk olur.

Kökləri bu ağacları əyilməyə, qopmağa qoymur. Nabələd adamlara – Bejanazarandakı, Qızıl qayanın üstündəki ağacları görməyənlərə elə gəlir ki, göyləri çiyinlərində bu ağaclar saxlayır. Onların budaqları bəlkə də indiyə kimi insan təmasına, insan əllərinə tamarzıdı. Hər oğul ürək eyləyib bu ağaclara yaxın düşə bilmir.

Əhvalat:

*Mahmuddarın (əslində Keçilinin) İsmayıl qıvçaq yüklənmiş odun arabasıyla kəndə gəlirmiş. Dərəyə çata-çatda uçqun səsi eşidir. Az qala at xəflənəcəkdı – atın başını çəkir, dönüb uçquna tərəf baxmaq istəyir. Bu məqamda qənşərində bir küp görür – qızıl dolu küp.*

*O vaxtlar parça – bez qıtıydı. İsmayıl kişi cibinə bir qədər qızıl qoyub yol alır Lemsəyə – rayon mərkəzinə. Satıcıya üç qızıl verib "Buna nə qədər düşürsə bir o qədər parça ver" deyir. Bu qızılların dəyəri qədər parçası olmayan satıcının qəlbinə şeytan girir. Parçasının az olduğunu o biri dükanlardan gətirəcəyini bəhanə eləyib eşiyə çıxır və geri milis işçiləri ilə qayıdır. Bir küp qızıl dövlətə qismət olur. Qızıl dolu o küp kiminiymiş, kim gizlədibmiş, nə vaxt gizlədibmiş, indi də bilinmir.*
…**Göyrüşdünün** (göyrüc ağacları ilə zəngin olan yer) yanında bir qaya var. Adına **Tək qaya** deyirlər. O, yazıq-yazıq boylansa da məğrurdu, dərdini üzə vurmur. Əsən yellər, yağan yağışlar onun bir çarpanasını da qoparda bilməyib. Baxışları yollardan yığılmır Tək qayanın – təkcə qayanın. Elə təkliyin, tənhalığın sıxıntısıdı ki, sinəsindən, yan-yörəsindən dikələn, qorxacaq böyüyən ağaclar da mağmın görkəmindədi; bu ətrafdakı ağacların, kol-kosun bət-bənizindən solğunluq, küskünlük yağır.

Faxralıda "dik" kəlməsi "tik" kimi də ifadə olunur. Tək qaya tək olmağına təkdi. Bu qürurlu qaya həm də şax dayanır, dik dayanır – düz qamətlidi Tək qaya. Təkliyi, tənhalığı öz yerində, bəlkə ilkin adı elə **Dik qaya** olub? Səs dəyişməsi ( d-t fonetik hadisəsi) ad dəyişməsinə təsir göstərib? Hər halda, neçə-neçə əsrlərdi ki, dik dayanır, şax dayanır Dik qaya – Tək qaya!..

***

Onda hələ dünyanın arşını əyilməmişdi. Onda kəsək daşdan ağır deyildi. Onda Faxralının meşələrində ağaclara dəyən baltalara bir az insaf varıydı, balta tutanlar "insafı arada görürdü". Onda Faxralının ocaqlarının istisi də, tüstüsü də bir ayrı cürəydi…

Onda bircə kəlmə ağsaqqal sözünə qan bağışlanırdı, illərlə çəkən qan davasına son qoyulurdu. Minnət tutmayanlar el arasında hörmət-izzətini itirirdi, urvatdan düşürdü. Onda bu ağır elin sözüötgün kişilərinin hər kəlməsi qılıncdan itiydi. Onda ərənlərin, igidlərin qılıncından qan damırdı…

Onda böyük duran yerdə kiçik danışmırdı…

Onda Faxralının meşələri də turac səsinə, qırqovul, qaratoyuq səsinə uçunurdu, kəklikləri öz qayalarında xınalanırdı, çeşmələri, bulaqları əliklərin ayaq səslərindən diksinirdi, səksənirdi. Onda Faxralının "göylərə baş çəkən" (S.Vurğun) dağları, dağ gövdəli qayaları göy üzünə könül xoşluğuyla gülümsünürdü…

Onda Faxralıdan uzaqlarda Faxralının dağlarına qovuşmaq üçün ömür əridənlərin həsrəti də təcnisləşirdi, ürək üzən, könül qübarlandıran sözə dönürdü:

Təcnis:

*Ömürə vəfa yoxdu,*
*Görəydim səni, dağlar!*
*Ürəyimi üzən qəm*
*Gəlməsəm səni dağlar.*

*Ömür verrəm bir ana,*
*Aylar illəri ana.*
*Məni ağlayan ana,*
*Kövrələr, səni də ağlar!.*

Bu təcnisə duruşunda bir ağayanalıq olan **Səngər** hay verərdi. Elə onda da, indi də Səngəri görənlər istər-istəməz Qazaxdak1 Göyəzən dağını xatırlayır. Tanrı elə bil onları cüt yaradıb – birini Qazaxda, birini Faxralıda…

**Səngərin** bitki örtüyü zəngindi. Bu dağlıq massivin otuna ot çatmaz. Səngərin gül-çiçəyinin ətri də möcüzədi. Səngər öz zamanında qaçaqlara səngər olub, neçəsinin hoyuna yetib, neçəsinin canını çor güllələrdən qoruyub.

Səngər həm də Huseynqulu oğlu Məmmədin şair oğli oğlunun, Rəşid Məmişdan oğlunun ustadı Əlinin adı ilə qoşa yaşayır, Əli Əngərli!

Səngərin özü də şair durıışludu, şair baxışlıdı. İnada düşsən hər daşından, hər çarpanasından bir qoşma, bir gəraylı umarsan. Yaxınlaşanların ayaq səsinə sevinən, fərəhindən bir boy da dikələn, yol adamı görüncə ürəyi atdanan Səngərin daş dili şeir pıçıldayır:

*Kəhərini öyənlərə,*
*Yol-yolağı söyənlərə,*
*Ayağımı döyənlərə –*
*Yolçulara salam olsun!*

*Quzeydən güneyə gedən,*
*Daşa dəyə-dəyə gedən,*
*Arandan binəyə gedən*
*Elçilərə salam olsun!…*
***

Son 40 ildə suyu ancaq yağışlar yağıb sellər oynayanda gələn dərə Faxralını iki yerə ayırır: dərənin sağ sahili, sol sahili. Cabbarın qənsəsi, Ocağın yanı, Arxac məhləsi, Gözəl dağı Şahbuzlu dərənin sol sahilindədi. Bu məhlələri birləşdirən yol Şahbuzluya (indi Faxralının bir məhləsidi, əvvəllər ayrıca kənd olub), ordan da Təhməzə, Miyirdişə tərəf uzanıb gedir.

Faxralının yuxarı hissəsi **Şahbuzlu** (el arasında Şalvızdı deyilir) adlanır. Bu adla Naxçıvan Muxtar Respublikasının ərazisindəki Şahbuz yaşayış məntəqəsi arasında ad oxşarlığı – ad eyniliyi göz önündədir.

…1864-cü ildə Gürcüstanda torpaq islahatı haqqında Fərman verildi və 1872-ci ildə başa çatdırıldı (Faxralının Qaraxaç yaylağı da həmin il icarəyə götürülmüşdü, icarədar Aşırlının Allahverdi olub. Qaraxaç 1873-cü ildən sənədlə Faxralının daimi torpağıdır. İslahata əsasən torpaqlar knyazlara və pay torpaqları kimi əhaliyə verilmişdi. O vaxtlar bu tərəflər üç knyazın – ***Mantaşovun***, ***Yanqulanın***, ***Muxranskinin*** sərəncamında idi; pay torpaqlarının vergilərini onlar toplayırdı. Faxralı knyaz Mantaşova tabe idi. Bu knyazın vergilərini ayrı-ayrı kəndlər üzrə inandığı səlahiyyətli nümayəndələri toplayırdı. O, İmirhəsənə Şahbuz oğlunu təyin eləmişdi. Şahbuz kişi Borçalıya Naxçıvandan gəlibmiş. Şahbuz oğlu Muxranskinin indiki Şahbuzluda ona verdiyi torpaqda ev tikir. Sonralar Şahbuz oğlunun başına toplaşanlar tək evi məhlə, məhləni kənd eləyir.

…Şahbuzlunun 2 kilometrliyində haçalaşan yollardan biri **Miyirdişə**, digəri isə **Təhməzə** aparır. Təhməzə gedən yol da ikiləşir; sağa dönən yol **Gav keçidə** gedən yola qarışır – bu yol Gəzdəyin çiynindən keçir. Miyirdişə gedən yolun sağında duruşu nabələd yol adamını eyməndirən, nə vaxtsa daşlarında diz qanatmış yolçulara qucaq açan bir qaya görünür – **Göy qaya**. Sinəsi, daşları göyümsovdu. Göy qayanın bərabərinə çatanda Təhməzin şərti sərhəddi başlayır…

Miyirdişə gedən yol **Miyirdişin bulağı**nın ətəyindən keçir. Bulaqdan bir qədər uzaqlaşdıqdan sonra sol tərəfə bir dərə uzanır. Bu, **Baş bulağın** dərəsidi. Adını qoynunda çağlayan iki bulaqdan birinin adından ad alıb. Aşağıdakı bulaq **Cülyənəli bulaq**, yuxandakı isə **Baş bulaq** kimi tanınır. Hər ikisinin gur suyu var. Miyirdiş yolu **Canavar** kalafasından, **Göyəmli** kalafasından keçib **İt körpüsü**nəcən uzanır.

Yeri gəlmişkən,

*İt körpüsünün quruluşu Qoçulu körpüsünü xatırladır. Onda onun 7-8 əsrə qədər yaşı olduğunu güman etmək olar. Çox nazik körpüdür; kənarları açıq olduğundan arabaçılar burdan ehtiyatla keçirlər.*

Bu yol **Dərvənddərə** qədər uzanır. Burdan o yana **Lök dağı**di. Qaraxaça bu yolnan da getmək mümkündü; vaxtilə aran kəndlərin yaylaqçıları yaylağa bu yolla gedərdilər. Bu yol Dumaneşəndən başlayıb, Qara xaça, ordan da o üzə – Türkiyəyə qədər uzanır. Bu yol qədimlərdə ticarət yolu – karvan yolu olub. İndi urvatdan düşüb. Hardan keçməsindən asılı olamyaraq irili-x1rda11 bütün yollar bu yola qovuşur.

…Su aydınlıqdı. Su həyatdı…

Bu inanclar öz yerində, "Kitabi-Dədə Qorqud"dan da bir müraciəti xatırlayıram: "**Şırıl-şırıl qayalardan çıxan su!**."

Hər sözün, hər kəlmənin qədrini bilən, hər sözü öz adına ad eləyən (iynə, tikən, gəlin, ayran sözlərini çıxmaq şərti ilə) Qorqud Dədə hər suyu öyməzdi, hər suyun adına soy soylamazdı. Qolça qopuzun səsinə uçunan o suyun Təhməz bulağı (Təhməzin bulağı!) olduğunu güman eləsəm suçmu olar? Axı, Təhməz bulağının da suyu sıldırımlı bir qayanın bətnindən süzülüb

gəlir! Bu torpaqlar da türksoylu xalqların, bu sıradan oğuzların qayım-qədim yaşayış məskənləri, ov yerlər olub! Təhməz bulağının abi-kövsər suyundan içənlər mənə haqı qazandırar.

Girəcəyi keçən kimi ağacların kökünə sürtünə-sürtünə uzanan yol Təhməz bulağının qənşərində qırılır. Bu tayda dayanan kimi bulağın sehri-ovsunu, suyunun pıçıltı, təranə biçimində harayı "əlindən yapışıb" səni özünə tərəf çəkir. Suyu can dərmanıdı Təhməz bulağının. İsmayıl Güllər onu "bulaqların mərcanı" kimi tanıdır.

İllər görmüş, illər yormuş ceviz ağacının kölgəliyində sal daşın üstündə oturub bulağın şırıltısını dinşəyənə qopuz əvəzidi bu səs; olan-qalan qayğılarını da, dərd-sərini də unudursan, qübarın yadından çıxır, könlün açılır. Təhməz bulağının "ayaqları altından" qayğısızlıqla axıb gedən arx misallı dərənin kövrək ləpələrinin səsini, daşlarda çiliklənən "ömrünü" ağacdələnlərin ritmik taqqıltısı, qumruların ötüşməsi, kəkliklərin ələdüşməz təranəsi, bir də uzaqlardan gələn tütək səsi "Çobanbayatı" tamamlayır; Təhməz bulağı bir ayrı aləmdi! Şırıltısı duyanlara sözdü – şeirdi. Təhməzin türküsü:

*Dərə çoxdu, dağa sarı*
*Körpü salıb keçən gərək!*
*Bulaqları sonulaylb*
*Yaxşısını seçən gərək!*
*Suyum dirilik suyudu.*
*Ovuclayıb içən gərək!..*

İl boyu Təhməz bulağının qonaq-qarası əskik olmur. Hamı qonağını Təhməzin ecazkarlığına, Təhməzin gözəlliyinə çəkib aparır: Təhməz özü boyda bir mö'cüzədi!.. Təhməzın təkrarsızlığı güzarı düşənlərin ömrünə yazılır.

Sözə qüvvət:

*"Təhməz ölüb-qalmalı yerdi" (aktyor Səməndər Rzayev);*

*"Beş-on çadır qursan hazırca sanatoriyadı" (şair Nizami Saraclı);*

*" Təhməzdə təbiətin gözəlliyindən vəcdə gəlirsən" ( professor Əjdər Ağayev).*
Təhməz bulağının suyunun süzülüb gəldiyi qayanın üstü gözişlədikcə genişlənən bir düzənlikdi, biçənəkdi. Bu biçənək yay biçinindən yaz qoruğuna kimi örüş yeri olur; binəçilərin də, arançıların da mal-qarası burdan dolanır.

Bu biçənəyin yan-yörəsində qədim yaşayış məntəqəsinin qalıqları, qəbir yerləri indi də qalmaqdadır. Biçənəyin yaxasından enən nazik cığır **Otaq daşda** sonuclanır. Bir vaxtlar otaq daşın ətrafında açıq olub, sonralar daşla hörülüb. Bu hörgünün yaşı qərinələrlə hesablanır. Biçənəkdəki xarabalıqları, qəbir yerlərinin qalıqlarını nəzərə alsaq, Otaq daşın öz zamanında müşahidə məntəqəsi olduğunu güman edə bilərik. 30-cu illərdə Otaq daş dəfələrlə qaçaqların hoyuna yetib.

Otaq daşa çıxıb-düşmək çətin olduğundan onun zövqü-səfasını ancaq orda çimir alanlar bilər.

20-30-cu illərdə bu həndəvərlərdə "otryadla" ağır atışmalardan çıxıb Təhməz bulağına pənah gətirən qaçaqlar yaralı yoldaşlarını Otaq daşda daldalayardılar, özləri dava·dərman, çörək

dalınca kəndə enərdilər. Dara-dar qalanda yaralmm yaralarına Təhməz bulağının yan-yörəsində ətirə dolmuş bağayarpağı qoyardılar.

Əhvalat:

*Mahmudla Mado çox addı-sanlı qaçaq olub. Onlar hər il neçə dəfə üzə çıxmaları haqqında edilən təklifləri qətiyyətlə rədd ediblər. Atışmaların birində Mahmud yaralanır. Mado onu yaxın kəndlərdən birinə – ya Faxralıya, ya da Kəpənəkçiyə aparmaq istəyir. Bu kəndlərdə də “otryad” dolaşa biləcəyindən ehtiyatlandığından qaçaq dostunu T əhməzdə qoyub özü Faxralıya getməyi qərara alır. Mahmudu güc-bəla ilə Otaq daşa çıxardır ki, işdi-şayəd, “otryad ” bu tərəflərə gəlib-eləsə Mado qayıdınca Mahmud özünü müdafiə eləyə bilsin…*

*Mahmud Otaq daşda şəfa tapır…*
Növbəti bölməyə keçid : Faxralı kəndi ətrafındakı yer adları (hissə 3)

Mənbə : **Rəşid Faxralı** – ***“Oğuz eli Faxralı”***

# Faxralı kəndi ətrafındakı yer adları (hissə 3)

**İmarət** adı ilə tanınan tikili Tənəklinin qayası tərəfdə, meşənin ətəyindədi. Yan-yörəsindəki şirəxanalıqların (el arasında uçub-dağılmış tikililərin qalaqları – xarabalıq belə adlandırılır) geniş ərazini əhatə eləməsi, yaxınlığında bulaq olması (sonralar həmin bulağı sel-su batırıb) yüz-yüz illər əvvəl imarətin yaşayış məntəqəsi olduğunu təsdiqləyir.

İmarət tarixi abidədir; damı primitiv də olsa xüsusi texnologiya ilə işlənərək bir-birini tamamlayan plitə formalı daşlardan düzəldilib. Pəncərə kimi qəbul edilməs mümkün olan oytuqları iç tərəfdən geniş, çöl tərəfdən isə nazikdir. Bunların orta əsr qalalarına xas xüsusiyyət olduğunu nəzərə alsaq, onun orta əsrlərdə qala-şəhər kimi tikildiyini, qapısının Qibləyə baxdığını nəzərə alsaq, bu dövrün VIII-X əsrlərlə səsləşdiyini güman edə bilərik.

Faxralının 6-7 kilometrliyində çox-çox qədim zamanlarda **Dumaneşən** adlı yaşayış məntəqəsi sıx meşəliklə əhatə olunubmuş. Yuz illər boyunca qırılıb, seyrəlib. Dumaneşənin qalıqları – xarabalığı, dağılmış hasarlarının izləri indi də qalmaqdadır (belə xarabalıq Almalığın solunda, dərənin kənarında və İmarətdə də var). Xarabalığın əhatə etdiyi ərazi bu yaşayış məntəqəsinin kiçik olmadığına guman yaradır. Dumaneşən tarixin hansı çağında şen, abad olub, hansı çağında dağılıb (və ya dağıdılıb), bəlli deyil. Arxeoloji qazıntılar aparılarsa torpaq altında qalmış əşl tarixi (tariximizi) görərik. Bəlkə Dumaneşənin xarabalıga çevrilməsinə əhalinin bu və ya digər səbəbdən köçməsi, baxımsızlıq səbəb olub? Maraq doğuran gümandır Güman isə əsl tarix deyil.

Güman – türkü:

*Dərd nədi, qəhər nədi,*
*Gecə nə, səhər nədi,*
*Bar nədi, bəhər nədi,*
*Dərzdən, köşəndən soruş.*

*Kəhər atım kişnədi,*
*Yad atını döşdədi.*
*Ruzi nədi, iş nədi? –*
*Dərdə düşəndən soruş.*

*Sirri çoxdu qalanın,*
*Qala yaman talanıb.*
*Tarix nədi? – olanı*
*Dumaneşəndən soruş!.*

Türksoylu xalqların əksəriyyətində şenlik sözü kənd, el, oba, yaşayış məntəqəsi anlamını ifadə edir. Bu baxımdan Dumaneşən adını "Dumanın şenliyi", "Dumanın el-obası" kimi yozmaq mümkündür. Bəs onda Duman kim olub?

Tədqiqatçı Hüseynqulu Məmmədli Dmanisi və Dumaneşən adlarının kökündə eyni sözün – adın (Tuman) dayandığını bildirir və onun adı b.e.ə. III yüzillikdə çəkilən Tuman xan olduğunu ehtimal edir. Bu ehtimalı qəbul etmək olar. Dumaneşənin Tuman xanla olmasa da onun adını daşıyan sələflərindən birinin adı ilə bağlı olduğunu güman etmək olar.

Faxralı Gözəldağ adlandırılan dağa söykənib. Onun Dumaneşənə baxar tərəfi sıldırımlıqdır. Bu sıldırımlığın hündür yerlərindən biri **Qazanqaya** ad1 ilə tanınır. Adətən, bu və ya digər mürəkkəb adın yozumunda, başlıca olaraq, birinci tərəf (komponent) əsas götürülür. Bu baxımdan Qazan qaya adının birinci tərəfi maraq doğurur. "Qazan" sözü ilə məişət əşyası olan qazan arasında heç bir məzmun əlaqəsi yoxdur – Qazan qaya qazana bənzəmir.

Qazan qayada kiçik bir mağara var. Yeganə giriş-çıxışı olan bu mağaradan qədim dövrlərdə qazamat (bu sözün məhbəs, qala çalarları da var) kimi də istifadə oluna bilərdi. Bu gümana əsaslansaq, Qazan qayanın adının ikinci tərəfinin "qaya" deyil, "qala" olduğunu gümanlamaq mümkündür. H.Məmmədlinin "…Qazan xan bəlkə də qədim Dmanisidə deyil, Dumaneşəndə düstaq saxlanmışdır?" fikrində tarixi reallıq çalan görsək, Qazan qayanın Qazan qalası adlandırıldığını, sonralar təhrif olunduğunu (y-l səs dəyişməsi fonetik hadisədir) ehtimal etmək olar.

Bu mövqedən yanaşdıqda, öz zamanında Dumaneşənin iri yaşayış məntəqəsi olduğunu da gümanlamaq mümkündür. Belə ki, kiçik yaşayış məntəqəsində qala (qazamat) ola bilməzdi. Burda qala (məhbəs) olubsa, onda Dumaneşən kifayət qədər iri şenlik imiş. Digər tərəfdən, iri yaşayış məntəqəsinin hərbi yürüşlərə ünvan seçilməsi də təbiidir. Sonuncu tezisə əsaslansaq, Dumaneşən yaşayış məntəqəsinin xarabalığa çevrilməsinə hərbi yürüşlərin səbəb olduğunu güman etmək olar.

***

Bəziləri təhrifə, dəyişilməyə məruz qalsa da görümlə, relyeflə bağlı yer-yurd adlarına Faxralıda da təsadüf olunur…

…Qızıl qayanın üstündə, Port-porta çıxan yolun sağında qalan təpə **Tüklü təpə** adlanır. Bu adda təpə Ağcaqala (Marneuli rayonunun ərazisində XV əsrə aid qala) tərəfdə də var. 1809-cu ilin payızında Fətəli şahın oğlu Məhəmmədəli bu təpənin ətrafına çadır qurmuş, hərbi yürüşü müddətində buranı özünə ordugah eləmiş, Dmanisdən Godayacan çapıb talamışdı. Borçalılar ciddi müqavimət göstərsələr də nizami ordu hissələrinin hücumunun qarşısını almaq mümkün olmamışdı…

Tüklü təpənin bitki örtüyü Qızıl qayanın üstü ilə, Bejanazaranla müqayisədə xeyli fərqlidi – buranın ağacları bəstəboydu. Elə bu səbəbdən də onun görkəmində bir nizamsızlıq var. Təpəyə çıxan kimi açıqlığın – böyük bir biçənəyin güney tərəfindəki bulaq da təpənin adaşıdı – **Tüklü təpənin bulağı**.

…Kor – dünya işığına həsrət qalan, görməyən adama, canlıya deyilib (Kor Alı, Kor ilan və s.). Bu söz bəzən məcazi mənada da işlədilib. "Gözü" tutulanda, suyu quruyanda bulağa, çeşməyə də kor deyilib. Gözünün nuru azalan adama, suyu azalan bulağa, çeşməyə də kor deyildiyini bilirik. Daşkəsənin dalında bir bulaq var. **Kor bulaq** adı ilə tanınır.

Bu bulağın üstünü Aşıroğlu Usub götüzdürüb. Suyu bir qədər kəm olduğundan belə adlandırılır. Kor bulağın güneyləri camaatın mal-qarasının otaracaq yeri olub. Kor bulağın azırğa suyundan ancaq sığırçılar yarınıb.

…Faxralının torpaqları çox münbitdi. Bu torpaqlara "qum da atsan bitəsidi". Qədərdən, **Keçəl təpəyə** sitəm olub. Bu təpədə kol-kos da, ağaclar da azdı. Eyni relyefə (quruluşa) malik olan digər ərazilərlə – təpələrlə müqayisədə onun bitki örtüyü hiss ediləcək dərəcədə kasıbdı, seyrəkdi. Seyrək sözünün bir çaları da "keçəl"di. Bitki örtüyü – ağacı, kol-kosu seyrək olan təpəyə bu anlamda Keçəl təpə deyilib…

Bitki örtüyünə görə adlandırılan təpələrdən biri də Miyirdişdəki Kollu təpədi. Həndəvərləri ürəyin iştəyən biçənəklərdi – otu kərəntiyə gələn olub, indi də belədi. Ozünün otunu isə biçmək mümkün deyil; **Kollu təpə** sıx kollarla əhatələnib. Kolların arasından ilişmədən keçmək mümkün deyil – çətindi. Elə bunun təsiridi ki, uşaqlar nərgiz-bənövşə ilə, quzqulaq, qulançarla zəngin olan Kollu təpəyə az-az, seyrək, könülsüz gedərdi; uşaqlar üç-dörd qoma nərgiz·bənövşəyə, qulançara görə pal-paltarını, əllərini kol-kosa yem eləməzdi. Kollu təpənin tikanları dəhrələnib kəndin çəpərlərinə vurulandan sonra uşaqların "dini dirilərdi"…

***

Kənd mühitinə yaylaqlara, oylaqlafa, seyrəngahlara yaxmdan bələd olanlar bilir ki, bəzi daşları yaşlayıb şumal daşla sürtndə ya maviyə çalan, ya da sabalıdı-qırmızımtıl rəngli qatı maye alınır. El arasında bu mayeyə xına deyilir.

**İnanc.**

*Kəkliklərin ayaqları daşlarda xınalanır. Xınalı kəklıyin beşiyi xınalı daşlardı…*
Yazın ilk aylarında – torpaq cana gələndə uşaqlar Dəll Smeylin (Dəli İsmayılın) dərəsinə – bir tərəfi Xosur oğlunun binəsi, sağ tərəfi Nurməmmədin gölməsi olan bozumtul daşın yanına yön tutur, əllərinə, dırnaqlarına, barmaqlarına xına qoymağa gəlır. Xınası uşaqların barmaqlarında günlərlə sevinc közünə dönən **Xına daşı**nın – Xınalı daşın həndəvərlərində cığır cığıra qarışır. Orda köhnə cığır, köhnə iz tapmaq mümkün deyil. Xına daşının xınasının yanında İranın-Turanın xınası əfsanədi…

Neçə mənim kimisinin əlləri, barmaqları Xına daşının xınasından ötrü göyüm-göyüm göynəyir.

**Qəriblik bayatıları:**

*Həsrətim yaşda qaldı,*
*Kirpikdə, qaşda qaldı.*
*Qayğısız uşaqlığım,*
*Xınalı daşda qaldı.*

*Gəlləm, ağıla gəlləm,*
*Dönüb nağıla, gəlləm.*
*Əlim, kəkliyə dönüb,*
*Xınamı saxla, gəlləm!*

*Daş, daşdan xına çıxart,*
*Baxtımı sına, çıxart.*
*Uzaqdayam, gələrəm,*
*Yolları qına, çıxart!*

**Xına daşının türküsü:**

*İllər başım üstündə,*
*Tufan qopardı, getdi.*
*Saxladığım payını,*
*Yadlar apardı, getdi…*
***

**Üçtəpə** adı ilə tanınan ***Təpələr*** bir-birinin qoynuna sığınmış təpəliklərdi. Yar-yaraşığı, könülaçan gözəlliyi öz yerində, bura həmişə ovçuların üzünü də ağ eləyib. Dobrı Şəmil deyirdi ki, yüzlərnən bərə görmüşəm, ov gözləmişəm, ancaq Üçtəpə kimi uyarlısına rast gəlməmişəm; sürəknən qaldırılan ov mütləq ovçunun tüfənginin altından keçir.

**Əhvalat:**

*Kənddə bir nəfərin işi işgilə düşür. Onu KPZ-yə salırlar. Xəbər kənd Sovetinin sədri Musa Həsənova da çatır (ona el arasında Malay deyirdilər). Musa kişi eloğlusuna kömək eləmək məqsədi ilə cinayət-axtarış şöbəsinin rəisinin yanına gedir. Xoş-beşdən sonra gəlişinin səbəbini bildirir:*

*– Arada ölüm-itim olmayıb. Şikayətçi də yoxdu. Düz-qoş, düzəlt. Borclu qalmarıq.*

*Rəis bir qədər duruxur. Sonra asta-asta dillənir: – Musa, sən gəlibsənsə bu iş düzəlməlidi. Kəndə qayıt, sabaha, uzağı o birisi günə bir cüyür gətir, rəisə verək, işi həll eləyər.*

*Musa kişi: – Sən işi düzəlt, cüyür asan məsələdi, – deyə onu əmin edir…*

*Musa kişi cuyur vurmağı Dobrı Şəmildən xahiş eləyir.*

*– Arxayın ol!, Musa kişi, Üçtəpə bizi xəcalətdi eləməz,– deyir Dobrı Şəmil.*

*– Səhərisi gün rəis cüyürü görəndə gülümsünür: – Sən gələnə kimi dediyin oğlanı buraxdırdım…*

****

**Səryinə** gözəl təbiətə malik olan binədi. Bulağının suyu diş dondurur. Havası da ki, dilnən deyiləsi deyil.

Adın birinci hissəsi (sər) baş, yuxarı, üst tərəf anlamındadır. Təhrif olunmuş iynə sözünün ilkin şəkli bəlkə binə olub? Belədirsə, Səriynənin adı baş binə, binələrdən yuxarıdakı binə yeri, məkan, ərazi kimi yozulmalıdır. Çadır-çadır binələrin arasından keçib Səriynə adıynan tanınan cənnət misallı məkana çatırsan. Əsrarəngiz bir gözəlliklə əhatələnirsən. Mehmanlarına həmişə könül xoşluğu verən bu gözəllik yüz-yüz il bundan əvvəl də türksoylu xalqların könlünə yatıb. O tarixin izləri, nişanələri indi də qalmaqdadır. Dinşəsən bulağının pıçıltısını aydınca eşidərsən…

Səriynədən bir az aralıda Saxundura (saxunsakın, çəkin tərkibi türksoylu xalqların leksikasındandır. Bu fakta istinad eləsək, Saxundurda da türksoylu xalqlar yaşadığını güman edə bilərik) gedən yolun üstündə qəbristanlığı xatırladan bir ərazi var. Pərakəndə şəkildə dayanan daşların (baş daşlarının? – R.F.) əksəriyyətinin rəngi misəçalandı. Daşlardan biri elə bil daşlaşmış dəvədi, bu saat ayaq açıb yeriyəcək. Digər daşlardan fərqli olaraq onun rəngi ağımsovdu. Daşların heç birinin üstündə ortaçağ və müasir başdaşlarında olduğu kimi yazı, qeyd (ad, soyad, tarix) yoxdu. Daşların üzərində ancaq şəkillər (müxtəlif heyvan rəsmləri) oyulub. Bu rəsmlər qəbirdə uyuyan adamın – türksoylu xalqlardan birinin ölüsünün ölümündən əvvəlki məşğuliyyətini göstərən şimvoldu bəlkə? Qəbirlərdə onun şəxsi əşyalarının (silahlarının, zıynət əşyalarının) da olacağını güman etmək olar; qədim şumerlərdə, hunlarda, Turan boyu yayılmış digər qədim tayfalarda olduğu kimi. Belədirsə, Faxralının ərazisində türksoylu xalqların məskunlaşması, yaşaması tarixi miladdan əvvəlki dövrlərlə səsləşir!..

Bu versiya Səriynə toponiminin yeganə yozumu deyil.

İranda, Ərdəbillə Astaranın arasında gözdoyduran gözəlliyi, məlhəm havası, sərin suları ilə tanınan **Səreyn** adlı yaşayış məntəqəsi ilə Səriynə arasında həm ad oxşarlığı var, həm də coğrafi şərait uyğunluğu (relyef, iqlim, bitki örtüyü). Bunlar da gümanları bir məcraya yönəldir.

Tarixi faktlar təsdiqləyir ki, VII əsrin II yarısında yadellilərin Borçalıya da hərbi yürüşləri çox olub. İstər belə yürüşlərdə, istərsə də miqrasiya ilə bağlı bu və ya digər əraziyə xatırlatdığı, bənzəri olduğu ərazinin adının verildiyi istisna deyil (Mosul kimi – İraqda və Qaxda). Səriynədə orta əsrlərə aid yaşayış məntəqəsinin xarabalığı indi də qalmaqdadır. H.Məmmədli gürcü müəllifinə istinadən yazır ki, "1932-ci ildə Gürcüstandakı kəndlərin siyahısında Sərginə (Səriynə) xaraba ərazi kimi göstərilib." Xatabalığı XIV əsrə aid olan yaşayış məntəqəsinin özünün tarixi XII–XIII əsrlərlə səsləşməlidir. Deməli, Faxralının hüdudları daxilində XIII–XIV əsrlərdə Səriynə adlı yaşayış məntəqəsi – kənd olub. İynə-iyn-eyn (yaxud eyn-iyn-iynə) fonetik dəyişməsi Səriynənin Səreyn (yaxud Səreynin Səriynə) kimi ifadə olunmasına səbəb olub. Səreyn, Səriynə adlarından hansı ilkindir? – tarix hələ ki bu suala cavab vermir.

"Sər" tərkibinin baş, yuxarı mənaları ilə bərabər uca, üstün çalarları olduğunu, eyn tərkibinin ərəbcə göz anlamı verdiyini (tarixdə sakinləri türk olan əraziyə yadellilərin ad verdiyi istisna deyil) nəzərə alsaq, Səreyn toponiminin (bu anlamda Səriynənin) "gözəl, gözəgəlimli yerlərin yuxarı hissəsi" (ərəb poeziyasında göl; həm də yaraşıq, gözəllik rəmzlərindən biri kimi qəbul edilib) mənasını verdiyini yəqinləşdirərik. Səriynə də olduqca səfalı yerdir, təbiəti etibarıilə heç Səreynə də bac verən deyil – Səryinə təbiətin gözdoyduran gözəllik tablosudur!

Növbəti bölməyə keçid : Faxralı kəndi ətrafındakı yer adları (hissə 4)

Mənbə : **Rəşid Faxralı** – ***"Oğuz eli Faxralı"***

# Faxralı kəndi ətrafındakı yer adları (hissə 4)

**Qızıl qayanın üstün**də, Almalıqda yol haçalanır: sol əldə qalan yol Əzgilliyə, orta yol Hümbətin kalafasına aparır. Sağ yol binələrin atasıyla uzanıb Bejanazarana çatdırır yolçuları. Bu yol Bejanazarandan enib Göyəmli kalafada Dumaneşən Qaraxaç – Türkiyə karvan yoluna qarışır. Əzgilli yolu Ağ körpüdən, Dardaşa (iki qayanın arası olduğuna görə belə adlanır) keçib uzanır. Kalafadan, Qamışdıdan keçib gedən yol Gədikdə karvan yoluna birləşir. Almalıqda haçalaşan – sağa uzanan yolun solundakı böyük biçənək Balaməmmədlinin, Nağıların, Məsimoğlunun, Yerəbaxanların binəsi kimi tanınır. Yolun sağındakı gözişlədikcə genişlənən açıqlıq Qasımıllının binə yeridi. Gürcü dərəsindən keəndən sonra solda qalan biçənək açıqlıq Alməmmədlinin binəsidi. Bu yerlər "bınə" adlandırılsa da yurd yerləridi. Adı gedən nəsillər vaxtilə mal-qarasını yay-qış burda saxlayıb; otu burda, suyu – burda, məlhəm hava da ki, öz yerində. Burdan o yana Bejanazaranın şərti sərhəddi başlayır. Bu və ya digər yer adının yozumu, əslində gümandır. Həqiqət isə gümanların qarşılaşdırılması, assosiasiyası ilə üzə çıxır (Faxralıdakı yer adları ilə bağlı mənim gümanlarım da ehkam deyil!). **Bejanazaran** toponimini Hüseynqulu Məmmədli "Bejanoğuzaran" kimi yozur. Bu yozumun ərazinin qədim oğuzlarla baglılığına yönəldilməsi göz önündədir. Bu amilə iradım yoxdur. Sözün birinci tərkib hissəsi ad bildirir – Bejan (Becan), ikinci tərkib hissəsinin isə (azaran) "azan" sözünün təhrif olunmuş şəkli olduğunu güman edirəm (azan – azmaq felinin üçüncü şəxsə aid təsriflənmiş şəklidi, yəni Bejanın (Becanın) azdığı, yolu itirdiyi yer).

Yozum – seir:

*Oğuzların gözlərindən*
*Dərdi-qəmi dərdi bu yer.*
*Dəstələyib Yastı yala,*
*Düzdaxlıya sərdi bu yer.*

*Haray çəkir Nəzik dərə,*
*Gözdən yağış dərə-dərə.*
*Sığınıb Lökə, Lələvərə,*
*Becan azan yerdi bu yer.*

Bejanazaran faxralıların ən uzaqdakı binə yeridi. O, zəngin bitki örtüyünə malikdir, sıx meşəliklə əhatələnib: fıstıq, cökə, göyrüc, palıd,dəmirqara, nadir qara ağac. Vaxtilə burda binələnənlər obaşdan ceyran-cüyür səsinə oyanardı yuxudan. Çor güllələr onları bu həndəvərlərdən də perikdirib.

Bejanazarana aparan yolun bir hissəsi daşlıqdı. Bu səbədən də həmin yerə **Pis daş** deyirlər ("pis" təyini çətin keçilən anlamındadır). Ordan azca yuxarı **Batdaxlı keçididir**.

**Sarı bulağın** solunda qalan meşəli dağ **Bülöylük** adıyla tanınır. Bu yüksəklikdən boylananda Sarvan "ovuc içi kimi" görünür. Bülöylüyün zirvəsindən göylərə dikilən tək-tənha cır armud ağacı (faxralılar buna "daş armud" deyirlər) neçə-neçə onillərdi əsən yellərə sinə gərir. Sağda qalan meşə **Yastı yaldı**. Bejanazaram əhatələyən Qaradağ, Yasdı yal, Darı yeri, Əzgilli tala, Gədik Göyəmli kalafa, Moruqlu boyun… gözəlliyi ilə göz oxşayır, könül açır.


Bejanazaranda vaxtilə kömür yand1r111b. Kömür yandırılmış kalafaların qalıqları indi də durur. Orda həm də kirənc yandırıldığını güman edirəm. Belə olmasaydı bu ətraflarda yaşayan "berzenlər" (borçalıda yunanlar belə adlandırılır) Bejanazarana Kirəcli deməzdilər…

***

Ulu yaylaq! Gur bulaqları buz sulu yaylaq! Qədirbilməzlərə can ağrısı, qədirbilənlərin qulu yaylaq!

Sən ta bineyi-qədimdən türksoylu xalqların yurd yeri olmusan İndi **Qaraxaç** adıyla tanınsan da adındakı "xaç" sözü ilə heç zaman heç bir bağlılığın olmayıb. Sən hara, xaç hara? – nəinki xristian, heç alban xaçının da üzünü görməmisən. Görsəydin bunca ecazkar, bunca könülaçan, dərddağıdan olmazdın. Görsəydin rəngin-rufun bunca duru olardımı?..

"Xaç" sözü "arxac" sözünün təhrif olunmuş şəklidi. Qədimlərdə oğuzlarınmı yurdu olubsan, yoxsa oğuzlarla yanaşı yaşayan digər türksoylu xalqlardan birininmi – deyə bilmərəm. Hər halda, adındakı "qara" tərkibi irilik, böyüklük bildirir. Səni böyük-böyük arxacları olan yer kimi tanıyanlar adına da elə "Böyük (qara) arxac" deyiblər. Zaman keçdikcə sənə isinişənlər adını diləyatımlı ifadə eləmək istəyib: Qara arxac – Qərarxac – Qaraxaç. Sənə olan qədərsiz sevgimdəndi ki adının başqa yozumunu qəbul edə bilmirəm…

Səni 1872-ci ildə kəndin adına **Aşıroğlu Allahverdi** icarəyə götürmüşdü. Həmin ilin yayında faxralılarınnəfəsiylə isindin, buzlarını faxralıların sevinci, fərəhi əritdi, bulaqlarının qırışığı faxralıarı görəndə açıldı.

1873-cü ildə qonşu kəndlərin imkanlıları sənə yiyələnmək istəyiblər. Onlar Başkeçidə – tavadın yanına gediblər. Sövdələşmədən sonra tavad onlara bir nümayəndə qoşub sən adda, sən nişan da bir məkana göndərib…

**Əhvalat:**

*Allahverdi kişinin arvadı Tükəzban Qaraxaçm gözəlliyini hərisliklə gözlərinə köçürənlərin məqsədini al diliylə öyrənir. El təəssübü ona əsər eləyir. Nökərərdən birini kəndə göndərir…*

*Allahverdi kişi xəbəri eşidən kimi kəndin beş-altl nüfuzlu kişisi ilə bərabər Başkeçidə gedir. Tavad 0nları səmimi qarşılayır. 0, Allahverdi kişinin "Deyirlər bizim torpağımızı başqalarına satırsan?" sorğusunu eşidincə çaşır. "Nə tez xəbər tutublar? – düşünür. Tavadın dıllənmədiyini görən Allahverdi bir addım da yaxına gələrək "Bəlkə sənə pul vəd eləyiblər? Belədirsə, açıq de. Onların verdiyindən də çox verərəm"– deyır və qızıl*

*pulla dolu kisəni stolun üstünə atır: "Torpaqlarımızın əlimizdən çıxması bizə baş töhməti olar. Bu pul azdısa, de, yenə verim!" Tavad dinməz-söyləməz yerölçəni çağırıb göstəriş verir ki, bu kişi ilə gedərsiniz, yeri ölçüb xəritəyə köçürərsiniz. Qaraxaç qanuni şəkildə Faxralının torpağı olur.*
Səni faxralılardan almaq istəyənlərin murazı gözündə qalır, ulu yaylaq, gur bulaqları buz sulu yaylaq!..

Sən faxralılara layiq yaylaqsan, Qaraxaçım mənim!

Yığnaqlı günlərində, mehmanlı anlarında bət-bənizin "ac qarınlar doydurub" sevinmisən. Binəçilərin yurd yerlərində girdəcə- girdəcə ocaq daşları axtarıb-arayanda könlün açılıb. İllər uzunu qoynuna sığınanların nazını çəkmisən. Yorğun mehmanlarına yasd1ca daşların yasdıq, boz buludların yapıncı olub.

Çadır-çadır binələrinin sayı artdıqca fərəhindən coşmusan, qürrələnmisən. Qışda buzlaşan həsrətin yayda Vüsal selinə dönüb dərələrə sığışmayanda bir boy da böyümüsən. Payız gələndə qübarlanmışan; yaxana çökən həsrət boz dumana, qəhər çən-çisəyə dönüb. Ömrünə ömür caladıqların köç eləyəndə dərdin dərin-dərin dərələr silələyib…

Dünyanın heç bir yaylağı sənə tay ola bilməz!..

* * *

**Qaraxaç yaylağı** Kiçik Qafqaz dağlarına aid olan Cavaxetiya yaylasındadır. Kəndlə yaylağın arası 100 kilometrə yaxındır.

Cavaxetiya yaylasının şərq hissəsi Cavaxet silsiləsi (Yaş dağlar1, Keçut dağları) adlanır və Ağlağan dağlarına qədər uzanır. Ağlağan dağları qədim Borçalının cənub sərhədləri olub. Ağlağandan şimala doğru yayılan düzənlik Çılğın düzüdü. Rəvayətə görə, bu düz Koroğlunun dəlilərinin sürək-cıdır yeri olub.

Cavaxet silsiləsinin ən hündür zirvəsi Qaraxaç yaylağına aid olan **Divsiz gölünün** söykəndiyi qoşa zirvəli **Dəlidağdır** (erməni mənbələrində Açkasar kimi qeyd edilir).

Cavaxet silsiləsinin şərq yamacında yerləşən Qaraxaç rütubətli kontinental iqlimə malikdir. Alp çəmənliklərindən ibarət olduğu üçün yay otlaqları kimi istifadə olunur. Əsas bitki örtüyü qarabiçək, asırğal, sapaq, əvəlik, kəklikotu (el arasında kəkotu deyilir), dəvə qanqalı, çobançiçəyi, çobanyastığı, su tərəsi, andız, mixək, yarpız və s.-dir. Üzü Türkiyə sərhədlərinə getdikcə bitki örtüyü seyrəkləşir, onları alp xalılar (cil otlar) əvəzləyir.

Qaraxaç dəniz səviyyəsindən 1300–1500 m. hündürlükdədir (aran yerlər, həmçinin Faxralı 600-650 m.).

**Dəvəqoruğu** kifayət qədər geniş əraziyə malik olan bir düzənlikdir. Ətirli çiçəkləri ilə səciyyəvidir. Bu çiçəklərdən herbari düzəldənlər bilir ki, onların ətri uzun müddət itmir tədricən azalır. Dəvə qoruğunun dikdirindən baxanda qarşıda görünən qaya **Qaranlığın qayası**d1r. Arxası şimala baxan bu qaya (hündürlüyü 25-30 metrdir) uzaq keçmişlərdən indiyə kimi yazbaşı yaylağa tez gedənləri, payızda aran köçünə ləngiyənləri çovğundan, borandan qoruyub.

Qaraxaçı Ermənistandan **Qaranlıq dərə** ayırır. Mənbəyini Divsiz və Keçiqıran göllərindən götürən, nəticə etibarilə Xram çayının ən böyük qollarından biri olan Debeda çayına qovuşan bu dərə coşqundur, dəlisovdur. Qaranlıq dərənin adı bir-neçə gümanla yozula bilər:

1. Dərin konyona malikdir;

2. Çənli-dumanlı günlərdə dərənin yatağı qaranlığa qərq olur;

3. Axşamçağı, gün batanda ilkin olaraq qaranlıq bura düşür.

Qaranlıq dərə, əsasən, qar və yeraltı sularla qidalanır. Suyu maviyəçalandır. Yatağı boyunca buz bulaqlar qaynayır.

**Nazaroğlunun bulağı** əslmöcüzədi; qışda,yazda artmayan suyu, yayın ən isti vaxtlarında da azalmır. Olduqca sərin sulu bulaqdı. Bu bulağın yaxınlığında Qazaxlı nəslindən bir uşaq dünyaya göz açıb. Adını Nazar qoyublar. Bulaq da bu addan ad alıb: Nazar olan (doğulan) bulaq – Nazar oğlunun bulağı.

Nazaroğlunun bulağından yuxarıda, Qaranlıq dərənin sağ tərəfindəki qar qalağı **Yastı qar** adlanır. Qışda quzey tərəfin gündöyməz novunda sovrulub toplaşan bu qar örtüyü avqust ayının əvvəllərinə kimi, yay sərin keçəndə il boyu ərimir; qar üstünə qar yağır. Adı da qar qalağının maili quruluşa malik olması ilə əlaqədardır.

Yastı qarın üstündəki yastana **Bədəllinin arxacı** adlanır.

Yastı qardan dərə boyunca bir qədər yuxarıdan axan bulaq **Nəzik** (Nazik) sudu. O, öz mənbəyini **Babaşdının çeylindən** götürür. Nəzik suyun dərəsinin "boğazındakı" çökəkliyə yığılan davamlı qar qalağı – qar örtüyü istilər düşdükcə dərənin suyunu artırır. Bulağın adı da dərənin suyunun azlığı ilə bağlıdır. Nəzik suyun həndəvərləri **Aşırrının arxacı**dır.

Nəzik sudan 100-150 addım yuxarıdan **Yolum çınqıl** (yoluma çıxan çınqıllıq anlamında) uzanır. Sal daşlı bu çınqıl yığını Qaranlığın güneyini boya-boy kəsir…

**Qoşabulaq** Şeşəpapaxların Yasının arxacının alt tərəfində, dərənin kənarındadı. İl quraq keçəndə Qoşa bulağın suyu quruduğu halda, ondan cəmi 100-150 addım aralıda çağlayan **Səkili bulağın** suyu azalmır. Bulağın üstündəki daşda **səki** (su qablarını qoymaq üçün oyuq) var. Adı da buradan yaranıb: səkisi olan bulaq. Bu bulaqların hər ikisi su mənbəyini çınqıl altından toplayır və elə çınqıllıqda da itib-batır.

**Xudu öyünün arxacınandan** dərəboyuqalxan cığır kiçik bir düzənliyə – **Qazaxlının çeyilinə** dirənir. Bu çeyilliyin kənarındakı arxac yerinin üst tərəfi **Hasannının çeyilliyi**, onun yanındakı kiçik təpənin üstü isə **Hasannının yal arxacı**,Hasannının çeyilininyanı **Ayvaz öyünün çeyili** adlanır.

Cavaxetiya yaylası tektonik və vulkanik göllərlə zəngindi. Belə göllərdən ikisi də Qaraxaçdadı: **Divsiz göl**, **Keçiqıran göl**.

**Divsiz göl** Keçiqıran gölünə nisbətən dərin və bol sulu olsa da, sututar sahəsinə görə ondan kiçikdir. Keçiqıranın üstündə qaynayan bulağın suyu da ona qarışır. Göldən ayrılan suyun

miqdarı ona qarışan suyun miqdarından çoxdur. Onda belə nəticəyə gəlmək olar ki, Keçiqıran başqa mənbələrdən də qidalanır.

**Keçiqıranın** üstü qayalıqdı. Hər daşın üstünə illərin həsrəti hopub elə bil. Yağan qar yağış bu daşların üstündəki həsrətin ömrünə ömür, verir; göm-göy göyərir bu həsrət. O daşlara indiyəcən insan əli, insan təması dəyməyib. Bəlkə buna görə də o daşların rəngi durulmaq bilmir. Burdan azca aralıdakı daşlar baxanı heyrətləndirir: əli çomaqlı çoban və daşlaşmış qoyun sürüsü. Adama elə gəlir ki, çoban yerindən dirsəkləndisə qoyunlar üzü aşağı teylənəcək. Bu daş-çobanla bağlı rəvayətlər, əfsanələr indi də yaşamaqdadır.

**Əfsanə**:

*Çoban surünü duzənllyə-otlağa yayıbmış. Qəflətən güclü çovğun qopur. Buna tablaşa bilməyən keçilər yerindən oynayır, burdan uzaqlaşmağa, hardasa daldolanmağa çalışır. Özlərini saxlaya bilməyən keçilər qabaqlarına çıxan gölə tökülüb qırılır. O gündən sonra bu gölün adı Keçiqıran qalır.*

Divsiz göl Keçiqırandan 400-500 addım cənub-şərqdə, **Dəlidağın** ətəyindədi. Sahili boyunca dayazdır, getdikcə dibi görünməz olur. Adı da bununla bağlıdır. Bu göllərin suyunun rəngi şit sulara xas olmayan yaşılımtıl rəngə çalır. Divsizdə də, Keçiqıranda da canlılar, bu sıradan balıqlar müşahidə edilməyib…

Cavaxet silsiləsinin ən hündür zirvəsi olan Dəlidağdan Türkiyənin ərazisi apaydın görünür. Divsizin üstündən qalxan cığır Dəlidağın boynuna – **Qırmızı gəzdəyə** qovuşur; dəmir oksidi ilə zəngin suxurdan ibarət olan gəzdəyin rəngi, adından da göründüyü kimi, qırmızımtıldır…

Qaranlıq dərənin sol qanadındakı qılıcın döşü **Qasımıllının arxacı** adı ilə tamınır. Bu yerlər sonralar Saraclı kəndinə verildiyindən indi **Saraclının qılıcı** adlanır.

Qaranlıq dərə ilə **Tərəli çayını** (dərəsini) bir qılıc ayırır. Bu qılıc Qaranlığın qayasından başlayıb **Asırğallı byunun** sol cinahında tamamlanır. Məcrası boyunca çoxlu su tərəsi bitən bu çayın adı da elə "tərə" sözü ilə ilgilidi: tərəsi çox olan çay (dərə). Tərəli çayının sağ qolu mənbəyini **Cənnət bılağından** götürən **Aralığın dərəsidir.** Tərəlinin qayası və Aralığın qayası adlarını bu çayların (dərələrin) adından alıb. Əksər yurd yerlərinə yol nisbətən aşağılarda olan **Aralıqdan**, (ayrılan yer) ayrılır; ən isti aylarda belə buranın içməli suyu azalmır.

Ərazisi Tərəli çayının sol sahillərini əhatə edən və **Qoşakilsənin yeri** kimi tanınan maili düzənlik də əvvəllər Faxralının torpağı olub. Burda Hövüt Məhəmmədin adını daşıyan yurd yeri, Aşırrı nəslinin adına ad olmuş arxac yeri var. **Arallq**dan **Xram** istiqamətində 600-700 metrlik məsafədəki yurd yeri **Hasannının yurd yeridir** (Kürən yolunun kənarındadır). Çox əlverişli örüş" imkanları var. Kiçik bir təpə üstündəki qoyun arxacının yanında gur sulu bir bulaq çağlayır. Adına **Hasannının bulağı** deyirlər. Aralıqla Hasannının yurdu arasındakı kiçik təpə **Əzən təpəsi** adı ilə tanınır. Əzən – Azan – Əzan səsləşməsinə istinad edərək qədim dövrlərdə bu təpədə iman yolu ilə gedənlər üçün namaz azanı verildiyini güman edirəm və təpənin adını da Azan təpəsi kimi anlayıram. **Asırğallı boyun** Qaradaşın qılıcının sonucunun sağındadı. **Ayrannı bulaq** kişinin bulağı (Nağıların Hasan), **Sarı bulaq** bu ərazidədi. Asırğallı boyundan 400-500 metr aralıda **Qaradaş** adı ilə tanınan yurd yerinin adı ərazinin başlanğıcındakı iri daşların rəngi ilə bağlıdır.

Asırğallı boyunun və Qaradaşın üstü **Qaravulun döşü** adlandırılır. Qaravul daş hörgülü, orta hündürlüklü qüllədir, çənli-çiskinli ayamlarda yol adamına səmti nişan verir. Qaravulun üst

tərəfindən bir-birinə söykənən, bir-birini tamamlayan yastanalar uzanır. Bu yastanaların **Xram** səmtində, Qaradaşın dərəsinin boğazında ecazkarlığı ilə yolçunu yolundan eləyən bir bulaq var, adına **Cənnət bulağı** deyirlər. Bu ətrafların  ot örtüyü də zəngindir, gül-çiçəyi də. Mas-mavi sulu bu bulaq həndəvərləri ilə birlikdə doğrudan da cənnət misallıdı. Cənnət bulağının adına ad olmuş əfsanələr indi də yaşamaqdadır.

Qaranlığın qayasında heyrət ediləsi bir daş var, Molla Qurbanın adına ad olub: **Molla Qurbanın taxtı.** Daşın taxta bənzədilməsi təsadüfi deyil. Daş şumaldı, yuxarı hissəsi ilahidən bir qədər qabarıq yaranıb, elə bil balıncdı. İlk dəfə o daş döşəkdə Molla Qurbanmı yatıb, yoxsa 0 daş döşəyin “yumşaqlığın1” ondan əvvəl duyan olubmu – deyə bilmərəm. Hər halda, bu möcüzə daş Molla Qurbanın adı ilə qoşa yaşayır.

Molla Qurnanın taxtından baxanda Dəvə qoruğuna, Hacıxalıl ocağına, Soyuqbulağa aparan yol ovuc içi kimi görünür.

Hər adna günü dağçılar da, bu məqsədlə arandan – kənddən gələn arançılar da Hacıxalıl babanın ziyarətinə gedəndə bu yolda at yorardılar. Ziyarətə piyada gedənlər də olardı….

Faxralılar 50-ci illərə kimi Qaraxaçda rəhmətə gedənlərini Tərəlinin qaşında dəfn edərdilər. Bura qəbristanlıqdı. Yan-yörəsindən əl-ayaq çəkiləndən sonra payızın sazağı başlanandan yaz küləkləri əsənə kimi həsrətdən qəddi əyilən qəbir daşlarına Qaraxaç hayançı olur…

***

Ulu yaylaq! Səni görənlər hüsnündən doya bilmir, aynla bilmir səndən. Qaranlığın qayasınan dönüb sənə bir də baxır və kövrəkliklə pıçıldayır:

*Bir-birinə sığınsa da bu yerdə,*
*Dağ qayaya, qaya dağa bənzəməz!*
*Ürəyimi burda qoyub gedirəm,*
*Heç bir yaylaq bu yaylağa bənzəməz!..*

Mənbə : **Rəşid Faxralı** – ***“Oğuz eli Faxralı”***

# Oyunlar, bayatılar, deyimlər…

## Oyunlar

### a) Sözlü oyunlar

Dən-dən, dən-altı,
Dəniz-dəki qaral-tı.
İnan-mırsan gəl sayaq,
Onal-tıdı, onal-tı.

***

Bəli, beli, bətir keçi,
Qoz ağacı, qotur keçı.
“Haldırın” – dedi,
“Huldurun” – dedi.
“Dağı dağ üstə qaldırın” – dedi.
Happan, huppan.
Dağdan hoppan.
Yığrıl, yırtıl,
Su iç, qurtul!

***

– Molla Əhmədin nəyi var?
– Qulpu qırıq sənəyi var,
Südü qurumuş inəyi var,
Piltəsi çürük çırağı var,
Tiyəsi qırıx yarağı var,
Dişi tökülmüş darağı var.
Biçənəyi var, düzü var,
Düzlərində quzu var…
Bunlarda gözüm yoxdu,
Al yanaqlı qızı var…

***

Bir-iki – bizimki.
Üç-dörd – qapını ört.
Beş·altı – Daşaltı.
Yeddi-səkkiz – Firəngiz,
Doqquz-on – qırmızı don.

***

Dümbərə!
İkisidi!
Üçdə ağır vurallar!
Dörddə qulunc qırallar!
Beşdə sappa!
Altıda zoppa!
Yeddidə yemiş!
Səkkizdə siviş!
Doqquzda qovuş!
Onda getdim bir öyə qonax,
Bişirdilər umanc aşı,
İçindən çıxdı siçan başı!
Onu da verdim özünə,
On barmağım gözünə!
A hayla, hayla, hayla,
Al papağını məni qoyla!..

***

Bajadan baxdım: Çərələgöz,
Biri kəhər, biri boz.
Mindim bozun boynuna.
Düşdüm Urum yoluna.
Urum yolu diz əzər,
Ustündə meymun gəzər.
Meymunu yerə vurdurm,
Yer mənə yemlik verdi.
Yemliyi tata verdim.
Tat mənə darı verdi.
Darıyı quşa verdim.
Quş mənə qanad verdi.
Qanadlandın uçmağa,
Haqq qapısın açmağa!..

***

## b) Adi oyunlar

**“Çilik-ağac” oyunu**

Oyunçular hər tərəfdə üç və daha çox oyunçu olmaqla iki yerə bölünür: komandaların başçıları dayanır, oyunçular özlərinə şərti adlar verməklə iki- iki onlara yaxınlaşır. Kapitan hansı adı çəksə, həmin oyunçu onun tərəfində dayanır. Oyunda üstünlük aşağıda qalanlarda olur. Oyunçu üç çilik atmalıdı, buna **toxma** deyilir. Çilikləri atdıqdan sonra ağacı **mərəyə** (çiliklərin atıldığı yer) qoyurlar. Yuxarıdakılar ağacı çiliklə vurmağa cəhd göstərir. Çilik ağaca dəyərsə, oyunçu “**ölmüş**” hesab edilir. Üç çilikdən heç biri dəyməsə oyunçu **yanqı**-ya çıxır. Toxma atan oyunçunun çiliyi “kəsilərsə”, o, hər kəsilən çilik üçün iki çilik də atmalıdır. Hamı yanqıya çıxdıqdan sonra **işlətmə** (yozumu: yorma, əldən salma) başlayır.

Yanqıda çiliyi kəsilən oyunçu da “ölmüş” hesab olunur. “Ölmüş” oyunçuları “diriltmək” hüququ ancaq yanqıya çıxanlara verilir. O, kimi diriltmək istəyirsə, onun adını çəkir: “Filankesin qolları!” Yuxarıdakılar çalişırlar ki, yanqı üçün atılan çiliklər mərəyə yaxın düşsün; mərəilə çilik arasındakı məsafə **ağacla** ölçülür. Toxmadan yanqıya çıxmaq üçün beş, yanqıda “öləni” diriltmək üçün yeddi “ağac” lazım gəlir. İstər toxmada, istərsə yanqıda kəsilən çilik mərəni keçərsə (buna **“Mərə keçdi”** deyilir) komandalar yerini dəyişir. Oyun qeyri-müəyyən müddətə davam edir.

**“Apartma” oyunu**

Çilik-ağac üslubunda iki nəfərlə oynanılan çöl oyunlarındandır. Oynayanlar müəyyən məsafədə qarşı-qarşıya dayanır. Birincinin ağacla atdığı çiliyi ikinci oyunçu ağacla vurub onun özünə tərəf atır. Oyun bu qayda ilə qeyri-müəyyən müddətə davam etdirilir. Oyuna başlanılan yerdən daha çox uzaqlaşan oyunçu uduzmuş hesab olunur.

**“Mərə qazma” oyunu**

Uç və daha artıq oyunçu ilə oynanılır. Oyunçular dairəvi şəkildə, bir-birindən eyni məsafədə yer nişanlayır. Bu yer onların **mərə**-si adlanır. Oyuna başlayan oyunçu çiliyi qonşu oyunçuya atır. Bu oyunçu çiliyi ağacla vurur. Birinci oyunçu çiliyi tapıb gətirincə digərləri onun mərəsini qazır. Çiliyi tapan gələnə kimi hər biri qaçıb öz mərəsinin yanında dayanır, gecikərsə – çilik onun mərəsinin sərhədlərinə (mərəni əhatələyən dairəvi cızığın içinə) düşərsə çiliyi həmin oyunçu atmalıdır. Oyunçu ona tərəf atılan çiliyi vura bilməyəndə çiliyi özü atmalıdır. Oyunçulardan birinin mərəsi ayaqlar sığınca qazılıbsa, oyun başa çatmış hesab edilir. Onun ayaqları çuxura salınır, torpaqla doldurulur. O, çuxurdan çıxana kimi digərləri onu papaqları ilə "döyür".

**"Müştük atma" oyunu**

Bu oyun vaxt öldürmək üçün oynanılsa da, adətən, mal-qaranı örüşə ötürüb geri qayıdanda oynanılır. Müştük atma oyunu üçün nisbətən uzun, nazik ağac seçilir ki, atanda uzağa düşsün. Oyunçu ağacını çiyni bərabərinə qaldırıb gücü çatdığı qədər uzağa atır. Hamı atdıqdan sonra ağacı ən geridə qalan oyunçu şapqasını (papağını) yerə qoyur, o birilər onun şapqasına (papağına) bir ağac vurur. Oyun qeyri-müəyyən müddətə davam edir. Yaylaq mövsümü başa çatınca neçə uşağın, cavanın şapqası, yaxud papağı didik-didik olur…

**"Dirədöymə" oyunu**

Oyunun adı r-z səsdəyişməsi ucbatından təhrif olunub. Oyun, əslində, dizədöyümə adlanmalıdır. Oyunçular iki yerə bölünür. Geniş radiuslu dariə çəkilir. Dairənin içində qalan oyunçular ayaqları altına kəmər qoyurlar, biri sərbəst qalır. Buna **çapar** deyirlər. O, dairədən çıxmadan dairədən kənardakı oyunçuları ayağı ilə vura bilərsə komandalar yerini dəyişir. Dairədən kənardakı oyunçular çırpma ilə kəmərləri almağa çalışır. Bu məqsədlə kəməri mühafizə edənlərə ling də vurulur (qaçaraq kəmər yerindən aşağı vurulan təpik). Kəmərlərdən istifadə edib daxildəkiləri tarpaşdayırlar. Dirədöyümə cəsurların, çeviklərin oyunudur. Hər cavan bu oyunu oynamağa ürək eləmir…

## Bayatılar

**…yurda sarı,**
Ömrümü yurda sarı.
Ürəyim dərdli-dərdli,
Boylanır yurda sarı.

**…qala dərdi,**
Sinəmdə qala dərdi.
Can verərəm, qoymaram
bu dərdnən qala dərdi.

**…qar adamda,**
Qar gəzər qar adam da.
Əlvan saray gəzərdim,
Çürüdüm qara damda.

**…sinə dağlar**,
Daş düşə, sinə dağlar.
Oğlu ölən ananın
naləsi sinə dağlar.

**…qarası nə,**
Ağı nə, qarası nə.
Taleyim çöllər gəzər,
Yol aldım qarasına.
Yetimin yekə dərdi,
Yüklənib lökə dərdi.
Bacım yox “Qardaş!” deyə
Anam yox çəkə dərdi.

**…ağrı mənə,**
Yol vermir Ağrı mən?.
Ağrı məndən süd əmıb,
Neyləyər ağrı mənə?!

**…gözdə nəm,**
Görünməsin gözdə nəm.
İtiyimi tapmasam,
Koram, iki gözdənəm.

**…qar altıdı.**
Qar yağıb, qar-altıda.
Görən deyir: Adamdı,
Demir ki, qaraltıdı.

**…qəlbi dağa,**
Dağ çəkdin qəlbi dağa.
Bir hayançı tapmadım,
Uz tutdum qəlbi dağa.

**…lələ dağlar,**
Sinəsi lalə dağlar.
Mən yetim bir quzuyam.
Dalımca mələ, dağlar!

**…quru daşı,**
Yeməyə qurud aşı.
Yurd qəbri, yurd azan,
Göyərdər quru daşı.

Əzizim, ay azaldı.
Gün keçdi, Ay azaldı.
Gedən ömürdən gedir.
Əbləh der: Ay azaldı.

Maral qaçdı qalından,
Ovçu düşdü dalından.
Mərdi namərdlər qovur,
Fələk vursun qolundan.

Saçlarımda əl gəzdir,
Qələndərəm, el gəzdir.
Dərdimi yellərə ver,
Sinəm üstə vəl gəzdir.

Fələk öy tikəndimi,
Savırm tükəndimi?
Qoy saçına toxunsun,
Əllərim tikəndimi?

## Deyimlər

Süddü qoyun sürüsündən ayrılmaz.
Deyən qadir deyil, dedizdirən qadirdir.
Bilsəydim babam öləcək, qulaq dolusu darıya verərdım.
Toy-toy olub, soy da soy.
Divanın sabaha qalanı yaxşıdı.
Yetim böyüyür, Əzrayılın paxıllığı özünə qalır.
Tamarzıdan al, dadamala ver.
Arvadın əri kişidi, kişinin əri – borc.
Xaçoyun xançalı var.
Yağ yağnan qovuşar, yarma da yavan qalar.
Qurdalıyıb qurdunu çıxartma.
Həm dayım öyünə, hər daylağım öyrənə.
Tasa verə-verə misin haqqı çıxır.
Qumaşımın halına bələdəm.
Acından dəyirman işlədir, qırtdığından şaad almır.
Kələşdinin atı kimi geri gedir.
Dilin zəkatı xeyir söyləməkdi.
Kefi (m) ala buluddan nəm çəkər.
Unamaz yanınnan köç aiddatma!
Urvan mənnən olmasa, kündən küt gedər.
Qazaxlının ağzı açıldı.
Bismillah eləməmiş Əlhəmdirüllah elədi(m).
Çörəyimin yarğanın qaşında nə işi varıydı ki, o da dığırlanıb dərənin dibinə düşdü.
Ev süpürəndə kiçik qız olur, ərə gedəndə böyük qız.
Qonşu əppəyi qonşuya borcdu.
Hamı da heç, Dıdı Məmməd.
Canavardan soruşurlar: – İşin necədi? Cavab verir: – Mənimki elnəndi.
Qaçağa nə yümək, nə yemək.
Özgə özgənin ölüsünü toynan düdüknən ağlayar.
Ev yiyəsinın işinə qarışan qonaq urvatını itirər.

İlanlar yerisin balaları da dalıycan.
Yeriyənin dalından yumaq asar [san]
Tatın nəyi var, kürdə nə verə.
Şah yanında şadlıq olmaz.
Ev buzovundan dana olmurmu?
Dinmə, dilini kəsərlər.
Qonağa “get” deməzlər, altından palazı (stolu) çəkərlər.
Qırx qazanın çalasısıdı.
Gələnə çəpik, gedənə təpik.
Bildiyini babasına vermir.
Kök demə, köküm ağrıyar.
Edən bular.
Tanrısına təpik atır.
İşi işgilə düşüb.
Bugünkü bağır-öfgə sabahkı quyruqdan yaxşıdı.
Qorxa-qorxa cənnətə getməkdənsə, qorxmuya-qorxmuya cəhənnəmə getmək yaxşıdı.
Dişinin dibində şirə qalıb.
Alma kimi malım olsun, satılmaz qax elərəm.
Dədənlə dədəmi deyincə, özünlə özümü de.
Siçan eşələdi, pişik çıxartdı.
Dağ iti gəlib bağ itini qovur.
İşləmək yaxşı şey olsaydı, Qasımıllının Rəhim də işləyərdi.
Beşiyin o üzü qürbətdi.
Ağzını Allah yoluna qoyub.
Axşam axıra, sabah naxıra.
Dartınan it tez boğular.
İti tayı ilə boğuşdurallar.

Əlisi – dəli,
Vəlisi – dəli.
Qırılmışın,
Hamısı dəli.

Əti yeyilmir,
Gönü geyilmir.
İnsan insana,
Yağı kəsilib.

Sabah saz ilə,
Axşam naz ilə.

….ara damı,
Damları aradamı?
Özün seç, özün bəyən,
Ev yıxar ada adamı.

Ağ ərik,
Göy ərik,
Dərərik,
Görərik!

Unu yox, urvası yox,
Peçinin durbası yox,
A Qəlyanlı Bayramalı!

Tat məni döydü, Əlcəfər,
Patavana döyöm, Əlcəfər!

…xal-xala,
Yaraşıqdı xal-xala.
İtinə ət yedirt ki,
Qurd gəlməsin xalxala.

Gec elər,
Güc elər.

Cibində yox urvalıx,
Könlündən keçir darğalıx.

…xal-xala,
Şırğa verir xal-xala,
Nə zülümnən qız secdim,
Qoyarammı xalq ala?!

Dağlarda bitər kəkotu,
Ağzıyın ipin çək otu!

…usdadı,
Bilmişdikdə ustadı,
At görəndə axsadı,
Su görəndə usdadı.

Qırmızı papaq qırmızı,
Ölərəm, a dəllək qızı.

Atı sürəjəm daşlığa,
Nəhlət belə qardaşlığa.

Əvvəl Allah əmri ilə,
Qanmasa yan dəmiri ilə.

Qılıx nəyin qılığıdı,
Pendir-əppəyin qılığıdı.

Sarmaşıx aşdı-daşdı,
Soğan bircədi-başdı.

Saçın qılandı,
Ucu ilandı.

Ürəkdən isdə,
Sözün yalandı.

Leylisən, nə Leylisən,
Kimə saldın meyli sən?
Ozün sevdin, özün seçdin,
Yenə də gileylisən?

Əzəldən nəyidi hüsnü-camalı,
İndi də olubdu Dəli Bayramalı.

## Alğışlar

Dilin zəkatı xeyır soyləməkdir (Faxralı deyimlərindən).

Qayım-qədim olasan!
Surun yerisin!
Qazanma, qarşı gəlsin!
Arşının əyilməsin!
Ruzun bol olsun!
Sur-sərhəd açasan!
Allah “Ver” dedikcə versin!
Neyliyim, nece edim deməyəsən!
Dörən-döşən!
Bala dağı görməyəsən!
İman yiyəsi olasan!
İmanın kamil olsun!
Allah üstünlə getsin!
Dilin uzun olsun!
Dırnağı bərk olsun!
Göz dolusu görəsən!
Torpağı sanı yaşayasan!
Ustünə Gün doğsun!
Oğul-uşaq yanında üzün ağ olsun!
Pis gunə həsrət qalasan!
Allah sənə filankəsin torpağı sanı ömür versin!
Dirsəyin dizində, əlin üzündə qalmasın!

## Qarğışlar

Qarğa, a şallı qarğa,
Yaşıllı-allı qarğa.

Gününü kösöyə döndərim,
Nənən gilə göndərim.
Gərdəyin qurulu qalsın!

Qulağın Quran səsi eşitməsin!
Qazancın qana dönsün!
Gözüyün yeri qalsın!
Əlin cibindən söyünməsin!
Allah sənə qotur versin, dırnax yox!
Qurda-quşa yem olasan!
Arxacın qurusun!
Sözün ağzında qalsın!
Gözdü gəlibsən, gözsüz gedəsən!
İşin işgilə düşsün!
Dilin Allah-vallaha dönməsin!
Yayllğın qara gəlsin, göy boyansın!
İki gözdən olasan, iki də qulaqdan!
Murazına yetib, mətləbinə çatmayasan!
Qapın bağlı qalsın!
Baxtın zil düyünə düşsün!
Qurdla qiyamətə qalasan!
Dilin ağzında yansın!

## Bağlamalar

Mən aşıq qısa bağlar.
Uzun don, qısa baglar
Ölən qoyun ağlamaz,
Öldürən qəssab ağlar.
*(Soğan)*

Sözü əmir sözüdü,
Özü ocaq közüdu.
Tikər, qurar, axırda
Dağıdan da özüdü.
*(Uşaq, körpə)*

…dağdadı,
Arandadı, dağdadı.
Astarı – od üstündə.
Avandı – ayaxdadı.
*(İnəyin əti, gönü)*

…Kür mələdi,
Kür güldü, Kür mələdi.
Sağıynan çaldı sonam,
Soluynan kürmələdi
(Əl iyi)

Dağların qarı mənəm,
Gün düşsə əriməräm.

Anamdı, arvadımdı,
Bacımdı, əri, mənəm.
*(Kimsə ev yiyəsini səsləyir. Ev yiyəsi hay verir. Gələn adam evdə kimlərin oldugunu soruşur: – Özumüzük. Anamdı, arvadımdı, bacımdı, əridi, [bir də] mənəm, cavab verilir).*

## Oxşamalar

Qızım qızlar ağası,
Başında var tomağası.
Qızıma elçi gələr,
Elin böyük ağası.

A qızım, qızım, dur oyna,
Tellərini bur, oyna.
“Əşrəfi”yə qol qaldır,
Cığalları yor, oyna.

Gəzdəkdən çıxdı yüz atdı,
Nə durubsan, süz, atdı.
A quzum, baban odurana,
Qara papaqlı, boz atdı.

A qaya, qaya, xallı qaya,
Gül-çiçəyi ballı qaya.
Bal ver balam bala dönsün,
Urvatım ol, Ballı qaya!

Sağıra ver, sağrını,
Yiyim qara bağrını.
Çözdərimin nurusan,
Özüm alım ağrını.

Mənbə: **Rəşid Faxralı – “Oğuz eli Faxralı”**

# Şair Nəbi ilə Quşçi kəndindən olan Aşıq İsmayılın deyişməsi

Şair Nəbinin uşaqlığı ağır keçib. On dörd, on beş yaşlarında Quşçu kəndində varlı bir kişinin nökəriymiş. Uzüyolalığı, xasiyyətinin mülayimliyi ilə yanaşı, hazır- cavablığı, bədahətən şeirlər qoşmasına görə nökərlər də, ev sahibləri də onun xətrini saxlayırmış. Ona görə də fürsət düşəndə onun toy məclislərinə, mağara getməsinə mane olmazmışlar.

Borçalının kəndlərində keçmişdə toylar payızın son ayından başlamış üç ay qışı davam edərmiş. Quşçu kəndində belə toyların birinə mahalın sayılan aşıqlarından hesab edilən Aşıq İsmayıl dəvət olunubmuş. Məclis, arası taxta ilə ikiyə bölünmüş uzun bir tövlədə keçirilirmiş. İş elə

gətirir ki, bu məclisdə yeniyetmə cavanların və nökərlərin də iştirak etməsinə imkan yaranır. Aşığın söhbətinin şirin yerində kəndin dəliqanlılarından biri aşığa işarə edir ki, "Aşıq İsmayıl, ehtiyatlı ol, məclisdə şair var". Aşıq İsmayıl ətrafda oturanları gözdən keçirir, cərgə ilə yerdən oturanların arasında ona tanış olmayan adam gözünə dəymir. Kiminsə onunla zarafat elədiyini güman eləyir, söhbətini davam etdirmək istəyir. Həmin adam aşığın sözünü yenə kəsir: "Siz mənə inanmırsınız" – deyə məclisin ayaq tərəfində aşığa maraqla qulaq asan yeniyetməni göstərir, "Bu Faxralı balasından yəqin ağlın bir şey kəsmir" sözlərini əlavə edir.

Bu sözlər aşığa bərk toxunur. Kinayəli bir tərzdə Nəbini utandırmaq üçün əda ilə qəhqəhə çəkib gülür. Bu hal Nəbiyə təsir eləyir. Bir tərəfdən aşığın rişxəndli baxışlarına, digər tərəfdən yoldaşlarının təkidinə dözə bilməyib meydana çıxır. Beləliklə, gərgin şəraitdə deyişmə başlayır.

**İsmayıl:**

*Gəl ustad yolundan uzaq dolan sən,*
*Yazıqsan, əlimdən qaça bilməzsən.*
*Olmasa qismətin çərxi-gərdişdən,*
*Mən içən badəni içə bilməzsən.*
**Nəbi:**

*Hərçəndi gəndini ustad sanırsan,*
*Bir ovuc darını seçə bilməzsən.*
*Gəmisiz düşübsən dərin dəryaya,*
*Təkində qalarsan, keçə bilməzsən.*
**İsmayıl:**

*Alim olan tarix yazar yaşına,*
*Sən yetik deyilsən dünya işinə.*
*Arif gərək sözlərimi düşünə,*
*Mənası dərindi, aça bilməzsən.*
**Nəbi:**

*Söhbət üçün mən də gəldim yanına,*
*Yetik oldum hesabına, sanına.*
*Qəsd eyləyib bir ox vurram canına,*
*Qanadın qırılar, uça bilməzsən.*
**İsmayıl:**

*İsmayılam, belə düşdü guzarım,*
*Sözlərimi dəftərimə yazarım.*
*Hər mətahdan işlədəndi başarım,*
*Sərhədsiz zəmiyəm, biçə bilməzsən.*
**Nəbi:**

*Bəs budurmu sözləriyin olanı,*
*Qorxum yoxdu, gəl söyləmə yalanı.*
*Çox aşıqlar özgəsindən dolanı,*
*İlməksiz düyünəm, aça bilməzsən.*

Hər ikisi sözlərini hərbə-zorba ilə tamama yetirir. Hamı Nəbini alqışlayır, bacarığına heyran qalır. Bu əsnada məclis üzvlərinə və aşığa çay gətirilir. Üstü qırmızı güllü bəzəkli çaydan və samovar Nəbinin diqqətini çəkir. Deyişmə yenidən başlayır. Bu dəfə qabağa Nəbi düşür:

**Nəbi**:

*Bizdən salam olsun ustad olana,*
*O necə şeydi ki, yanı qırmızı.*
*Sahib-kamal görsə ondan dərs alar,*
*Cansız cəsəd gördüm, qanı qırmızı.*

Növbə aşıq İsmayıla çatır. O, cavab vermək əvəzinə üzünü camaata tutub: "Camaat, görün bu boyda yalan olarmı? "Cansız cəsəd gördüm qanı qırmızı" – necə ola bilər ki, həm cansız ola, həm də qanı qırmızı ola? Bu uşaq bizi masqarıya qoyub, siz də ona inanırsınız". Beləliklə, Aşıq İsmayıl cavab verə bilmir. Şair Nəbi sözünə davam edir:

*O da bir xandı ki, yoxdu baratı,*
*Yanar atəş ilə çoxdu möhnəti.*
*Ali məclislərin şanı, şöhrəti,*
*Nəylə aşkar eylər yanı qırmızı.*

*Mən Nəbiyəm, söz deyərəm qanana,*
*Baş qoşmaram hər deyilən hədyana.*
*Tilsimdən donu var, gələr meydana,*
*Görən olmaz onun dəni qırmızı.*

Söz tamama yetir. Aşıq İsmayıl incik halda camaata deyir ki, bu uşaq yenə yalan danışır. Təklif olunur ki, sözlərin mənasını Nəbinin özü açsın, cavab inandırıcı olsa camaatın qarşısında Aşıq İsmayıl məğlub edilmiş sayılsın və el qaydası ilə sazını Nəbiyə versin. Şərt qəbul edilir. Nəbi deyir:

*Sataram matahım öz şəhərimdə,*
*Açan olmaz bu qəndanı qırmızı.*
*Özü kamandardı bu sözü deyən,*
*Üstünün yatağı, yanı qırmızı.*

*Mən eşqə düşmüşəm saz almaq üçün,*
*Aşkara söyləyim söz almaq üçün.*
*Deyim müxtəsəri, az olmaq üçün,*
*Nəynən şirin olur payı qırmızı.*

*Nəbim sözlərinə ayna çəkərdi,*
*Özü sərrafıdı, məna çəkərdi.*
*Biri samovardı, biri şəkərdi,*
*Əcəb səfalıdı çayı – qırmızı.*

Aşıq İsmayıl sazını çiynindən çıxardıb Nəbiyə verir. Nəbi sazı sahibinə qaytarır və bildirir ki, bundan sonra tanımadığı və mərifətinə bələd olmadığı adamlarla nəzakətli olsun, onlara gülməsin.

***"Yazılanlar gəldi başa" (B. 1991) kitabına Elxan Məmmədlinin yazdığı ön sözdən götürülmüşdür.***

# Şair Şabanla Qara Qəribin “küsüşməsi”

Şair Şaban haqqında

Şair Şaban: “Payız çiçəyi” (şeirlər, deyişmələr) kitabı

Şair Şabanın Bolnisi rayonunda çayxanası vardı. Ötən günlərin birində həmin çayxanada “Gürcüstan” qəzetinin, rayon maarif işçilərinin və şeirsevərlərin təşəbbüsü ilə şeir məclisi təşkil olunur. Məclisi aparmağı ustad Hüseyn Saraclıya həvalə edirlər. Hüseyn Saraclı biləndə ki, Qara Qəriblə deyişəcək, etiraz edərək deyir: “Mən xırmana yığılmış dərzi döyürəm. Qara Qərib isə həm dərzi xırmana yığır, həm də döyür”. Belə olduqda şeirsevərlər deyişmək üçün şair Şabanın razılığını alıb, Qara Qəribin dalınca adam göndərirlər. Qara Qərib gəlib şair Şabanı məşq edən görür. “Şaban, bu sənsən?” – müraciətindən sonra belə deyir:

*Gəl sənə söyləyim, ay şair Şaban,*
*Vədəsiz açılan yaz olmaz-olmaz,*
*Yaşılbaş sonadır göllər bəzəyi,*
*Qarğa suda çimsə, qaz olmaz-olmaz.*

**Şair Şaban**

*Çox doğru deyirsən, ay Qara Qərib,*
*Zimistan çağında yaz olmaz-olmaz.*
*Buzlayıb dərələr, donanda göllər,*
*Tərk olar sonalar, qaz olmaz-olmaz.*

**Qara Qərib**

*Əlinin dəstindən içməyən kəs də,*
*İnsanı şeytandan seçməyən kəs də,*
*Girəndə meydana tablamaz bəhs də,*
*Aylarla düşünüb yaz,olmaz-olmaz.*

**Şair Şaban**

*Özündə hünəri görməyən kəs də,*
*Girib meydanlarda durarmı bəhsdə?*
*Qüvvətli şairlər xasımlar üstə,*
*Gedəndə qeyrəti az olmaz-olmaz.*

**Qara Qərib**

*Yaxşı bax Qaranın sən havasına,*
*Qoç oğlu qoç gərək qoç davasına,*
*Nahaqdan toxunub batma yasına*
*Qəm basar qəlbini, saz olmaz-olmaz.*

**Şair Şaban**

*Mən Şabanam şairliyin bəhsində,*
*Ötən bir bülbüləm gül həvəsində,*
*Güllər Pərisinin nəticəsində,*
*Şair meydanında naz olmaz-olmaz.*

Deyişmə davam edir. Qara Qərib yenə qabağa düşür:

**Qara Qərib**

*Şaban, danışma daldada,*
*Meydan aç, mərdi-mərdana!*
*Kükrəyib dəryalar kimi,*
*Qayna, daş mərdi-mərdana!*
*Yer titrəsin, göy kişnəsin,*
*Nərə çəkib dayangınan,*
*Dağıt düşmən qalasını,*
*Qoyma daş, mərdi-mərdana!*

**Şair Şaban**

*Qurmuşam nər meydanında,*
*Mən savaş, mərdi-mərdana.*
*Sallam düşmən qalasından,*
*Kərpic , daş, mərdi-mərdana.*
*Yaxan keçibdir əlimə,*
*Tufan qopsa buraxmaram,*
*Vurub salaram meydanda,*
*Bu gün baş, mərdi-mərdana.*

**Qara Qərib**

*Mən sənə səcdə qılaram,*
*Sannı bir şair olasan.*
*Çıxasan ər meydanına,*
*Düşmənə qarşı durasan.*
*Tutasan Ərən güləşi,*
*Kürəyin yerə vurasan*
*Çəkəsən əyri qılıncı,*
*Düşə baş, mərdi-mərdana.*

**Şair Şaban**

*İstədim bilmək təbimi,*
*Zehnində olmadı kəsər.*
*Nuh tufanı tuğyan edər,*
*Düşmən mənə etsə əsər,*
*Meydanını tərk eyləsəm,*
*Tərlan könlüm məndən küsər.*
*Tələsiyib nər oğlanla,*
*Oldun tuş, mərdi-mərdana.*

**Qara Qərib**

*Əzəldən yoxla özünü,*
*Tez özünü atmagınan.*
*Şələndə yoxdursa əgər,*
*El başını qatmagınan.*
*Danışaraq hərzə-hədyan,*
*Rüsvayçılığa çatmagınan.*

*Qaram deyər: nəsihətdi,*
*Durma, qaç, mərdi-mərdana.*
**Şair Şaban**

*Şabanam, qeyzə gələrəm,*
*Vardır hünərim davada.*
*Gözləginən, bülbülünü,*
*Tərlanım çalar havada.*
*Qoymaram qanad açmağa,*
*Sarını bullam yuvada.*
*Zülfüqarım qan istəyir,*
*Gəl savaş, mərd-mərdana.*
Qara Qərib bu yerdə deyişməni bir az da "dərinləşdirir":

**Qara Qərib**

*Ay Şaban, şairlik zorunan olmaz,*
*Cadalar bağlıdır, keçə bilməzsən!*
*Şairlik hesabı yaman bəladır,*
*Şərbəti zəhərdir, içə bilməzsən!*
**Şair Şaban**

*Verrəm cavabını al, Qara Qərib*
*Aslanlar yolunu kəsə bilməzsən!*
*İçmişəm badəni, o Pirim verib,*
*Hərcayı danışma, nəsə bilməzsən!*
**Qara Qərib**

*Mən sənə söz dedim, aylar il oldu,*
*Dolandı yaşımız yetmişə doldu.*
*Dediyim bağlama cavabsız qaldı,*
*Səpməsən toxumu biçə bilməzsən.*
**Şair Şaban**

*Döğrudur, meydanda davamız oldu,*
*Ərən güləşində rəng-ruhun soldu.*
*Qarlı qasırğamdan gözlərin doldu,*
*Vermişəm payını, küsə bilməzsən!*
**Qara Qərib**

*Olmaya Qaranı qoca görürsən?*
*Baxıb öz boyunu uca görürsən?*
*Od kimi alışıb tezcə sönürsən,*
*Naşısan, gövhəri seçə bilməzsən!*
**Şair Şaban**

*Mən Şabanam, çox xasımlar görmüşəm,*
*Bir zərgərəm ləli-gövhər seçmişəm.*
*Hünərim var, meydanına gəlmişəm,*
*Yel olub yanımdan əsə bilməzsən!*

Bu deyişmədən sonra Qara Qərib ətrafa göz gəzdirir. Köhnə dostları şairin ətrafına toplaşmışdılar. Onlar Qara Qəribin inciməsindən narahat idilər.

Qara Qərib kiçik inciklikdən sonra Şair Şabanın rayon mərkəzindəki çayxanasına gəlmirdi. Xeyli vaxt idi ki, kəndlərdən, rayonlardan çayxanaya toplaşan sazdan-sözdən söhbət açan əziz dostlarından ayrı düşmüşdü. Şairin inciyən qəlbi kövrəlir və Şair Şabana belə deyir:

*Əziz dostlar yada düşər,*
*Ayrı saldın sən, ay Şaban.*
*Ac bir toyuq deyiləm mən,*
*Sən ataydın dən, ay Şaban.*

*Dost-tanışa yanaşardım,*
*Deyər-gülər danışardım,*
*Şirin-şirin qonuşardım,*
*Qəlb olardı şən, ay Şaban.*

*Mədəd, Bayram, Sarı qardaş,*
*Deyərdi: de yavaş-yavaş.*
*Gəl mənimlə qurma savaş,*
*Beygünaham mən, ay Şaban.*

*Şükür, Musa, Hümbətinən,*
*Qonuşardıq ləzzətinən,*
*Şirin novraq adətinən,*
*Düşdü aram gen, ay Şaban.*

*Atımı şad çapammaram,*
*Şah Əlini tapammaram.*
*Şirin söhbət yapammaram.*
*Eylədin bir qan, ay Şaban.*

*Çopur Əli qəlbim açdı,*
*Könlümə bir işıq saçdı,*
*Eşqim coşub aşdı-daşdı,*
*Verdi ruha can, ay Şaban.*

*Seyidnən Məşədi Əli,*
*Düşər yada, ollam dəli,*
*Barışaram, desən bəli,*
*Qonuşaram mən, ay Şaban.*

*Qanan kəslər qəlbə dəyməz,*
*Dəyib əlif qəddin əyməz,*
*Əzib ruhun bada verməz,*
*Qoymaz yana-yana, ay Şaban.*

*Mən sənə bir söz demədim,*
*Sinən üstə göz demədim,*

*Nə əyri, nə düz demədim,*
*Olmaz haqqı dan, ay Şaban.*

*Qaram deyər həqiqətdən,*
*Dərsin alıb təbiətdən,*
*Xoşum yoxdu bu adətdən,*
*Nədir karın, din, ay Şaban.*

Şair Şaban xəyala dalmışdı. Sanki rəqibinin suallarına cavab axtarırdı. Qara Qərib sözlərini bitirdikdən sonra Şair Şabanın qəlbində xalası oğluna yenidən mehr hissi yarandı. Çöhrəsində mərhəmət duyulan Şair Şaban ona belə cavab verdi:

*Döndərmə üzünü xalan oğlundan,*
*Xasımlar xasımı sənsən, Qaram, sən.*
*Eşidənlər bilir sinə dəftərsən,*
*Dövrünün Qasımı sənsən, Qaram, sən.*

*Nərlər meydanında yaşa dolmusan,*
*Şairlər çökdürüb, xərac almısan,*
*Ellərin dilində dastan olmusan,*
*Növbahar nəsimi sənsən, Qaram, sən.*

*Şabanam, dünyaya gələnlər qalmaz,*
*Görünməz yollara gedənlər gəlməz,*
*Ustadlar qəlbinin yanğısı sönməz,*
*Ötən sazlar simi sənsən, Qaram, sən.*

Məclis əhlinin qəlbində razılıq hissi baş qaldırdı. Şairlər arasında yaranan əmin-amanlıq hamının qəlbindən oldu. Ağsaqqal, qarasaqqal stol arxasında əyləşdi. Pürrəngi çaylar süzüldü, şirin söz-söhbət başlandı. Şairlər halal-hümbət edib ayrıldılar.

Mənbə: **Şair Şaban** – "***Payız çiçəyi***", Bakı 1999.

# Şair Şaban: "Payız çiçəyi" (şeirlər, deyişmələr)

**ÖN SÖZ** *(Səməndər Məmmədov)*

**Şair Şaban *(Şaban Məmmədəli oğlu Qurbanov)*** Borçalıda yaşayıb-yaratmış el şairlərindən biridir. O, 1914-cü ildə Borçalının saz-söz beşiyi olan Faxralı kəndində anadan olub. Qəlbən el-obaya vurğun olan şair ömrünün sonuna kimi Faxralıda yaşayıb. Natamam orta təhsil almasına baxmayaraq dövrünün qabilliyyətli, məlumatlı və dünyagörüşlü adamlarından biri olan görkəmli el sənətkarı Şair Nəbini özünün müəllimi, ustadı hesab edib. Heç təsadüfi deyil ki, Nəbi onun qabiliyyətini şeirlərinin birində yüksək qiymətləndirmiş və ilhamına qol-qanad vermişdir:

*Səxavət əhlidir Alıynan Şaban,*
*İnşallah, çatarlar bizə şairlər.*

Şair Şabanın istedad və bacarığı deyişmələrində daha qabarıq üzə çıxır. Özünün müasiri olan xalası oğlu, bədahətən şeir demək bacarığına malik şair Qara Qəriblə, dağlar qızı Şövkət xanımla, Dünyamalı Əsgərovla deyişmələri bunu əyani şəkildə göstərir. Onların deyişmələri çox zaman bağlama şəklində olub, dərin mənalı və düşündürücülüyü ilə diqqəti cəlb edir:

Şövkət:

*Sizdən xəbər alım, ay Şaban əmi,*
*İnsan bu dünyaya nə vaxt gəlibdir?*
*Dünya tar-mar olub, alt-üst olanda*
*Həvvanın göz yaşın kimlər silibdir?*

Şaban:

*Atamız Adəmdir, bəyan eyləyim,*
*İnsan bu dünyaya o vaxt gəlibdir.*
*Həvva ana qövr eyləyən zaman,*
*Gözünün yaşını övlad silibdir.*

Yaxud Kərbalayı Qara Qəriblə deyişməsindən bir misal:

Qara Qərib:

*Şaban, danışma daldada,*
*Meydan aç, mərdi-mərdana!*
*Kükrəyib dəryalar kimi,*
*Qayna, daş mərdi-mərdana!*
*Yer titrəsin, göy kişnəsin,*
*Nərə çəkib dayangınan,*
*Dağıt düşmən qalasını,*
*Qoyma daş, mərdi-mərdana!*

Şair Şaban:

*Qurmuşam nər meydanında,*
*Mən savaş, mərdi-mərdana.*
*Sallam düşmən qalasından,*
*Kərpic , daş, mərdi-mərdana.*
*Yaxan keçibdir əlimə,*
*Tufan qopsa buraxmaram,*
*Vurub salaram meydanda,*
*Bu gün baş, mərdi-mərdana.*

Belə deyişmələrdə Şair Şabanın sözü məqamında demək qabiliyyəti özünü açıq şəkildə göstərir. Həm də sözlərin düzülüşü, deyişmənin aşıladığı məna, məzmun şairlərin geniş dünyagörüşə, zəngin eridusiyaya malik olmalarını bir daha sübut edir. Şair Şaban deyişmələrindəki məharət və ustalığa lirik şeirlərində də nail olur:

*Həsrətinə dözəmmərəm,*
*Bircə gəl insafa, gözəl.*
*Bu dünyada gəzəmmərəm,*
*Etmə mənə cəfa, gözəl.*

Şair Şaban həm də gözəl ailə başçısı olmuş, layiqli övladlar tərbiyə etmişdir. Onlardan Əli Qurbanov 1965-ci ildə Bakı Dövlət Universitetinin iqtisadiyyat fakultəsini fərqlənmə diölomu ilə bitirmiş, uzun müddət Sumqayıt şəhər ərzaq ticarət idarəsində məsul vəzifələrdə işləmişdir. elcanlı ata ocağı ilə nəfəs alan oğullarından olmuş, heyf dünyasını vaxtsız dəyişmişdir. Allah rəhmət eləsin.

Övladlarından Qurban, Məmmədəli, Mahal gənc nəslin təlim-tərbiyyəsi ilə məşğul olublar. Mahal həm də doktorluq elmi dərəcəsi də almışdır. Kamal isə ticarət sahəsində çalışır. Yeddi övladının hər biri şairin təmiz adını, xatirəsini uca tuturlar. Layiqli övladlar tərbiyyə edən, şərəflə yaşayan, nüfuz sahibi Şair Şabanla bağlı şirin xatirələr el arasında indi də böyük hörmətlə danışılır. Şair 1980-cı il, iyinin 2-də 66 yaşında vəfat edib.

Şair haqqında ilk dəfə 1997-ci ildə Bakı Dövlət Universitetinnin nəşriyyatında nəşr etdirdiyim "Faxralı tək ağır elim var mənim" kitabında qısa məlumat və yaradıcılığından nümunələr vermişəm. "Payız çiçəyi"ndə topladığım şeir və deyişmələr də Şair Şabanın yaradıcılığını tam əhatə etmir. Onu da bildirim ki, şairin xalqın yaddaşında qorunub saxlanılan şeirləri də az deyil. Ümid edirəm ki, saz-söz üstündə köklənmiş eloğlularımız belə şeirlərin itib batmasına yol verməyəcək, onların ümumxalq malına çevrilməsində bizə köməklərini əsirgəməyəcəklər. Kitabda gedən şeirlərin toplanmasına kömək etmiş Muxtar Allahverdi oğluna, Azərbaycan Respublikası "Aydınlıq" cəmiyyətinin sədri Şərif Qara Qərib oğluna, Məmmədəli Şaban oğluna və xeyirxah məsləhətlərinə görə Borçalının dəyərli ziyalısı şair-alim Miskəroğluna minnətdarlığımı bildirirəm.

***Səməndər Məmmədov***

# İsmayıl Güllər ilə Rəhim Nəbi oğlunun deyişməsi

## İsmayıl Güllər ilə Rəhim Nəbi oğlunun deyişməsi (Səngərdə ot əhvalatı)

**Səngər** dağı bitki örtüyü ilə zəngindi. Bu dağlıq massivin otuna ot çatmaz. İsmayıl Güllərlə Şair Nəbinin oğlu Rəhimin bir deyişməsinə də Səngərin ətəyindəki biçənəyin otu səbəb olub:

**Əhvalat:**

*1972-ci ildə Rəhim Şair Nəbi oğlu meşəbəyi işləyirdi. O ili Səngərdə əlamət ot gəlmişdi. İsmayıl Güllər də yarılığa ot biçmək üçün Səngərə gedir. Rəhimin salıx verdıyi yer də biçilibmiş. Bu, şairin pərinə dəyir. Dayıoğlu-mamaoğlu arasında olan narazılıq deyişməyə çevrilir:*

***İsmayıl Güllər:***

*Səngərin döşündə bir yer vermədin,*
*Məni saldın dağa-daşa, ay Rəhim.*
*Tək Orucu, Mustafanı çağırdın,*
*Demədinmi gəlməz xoşa, ay Rəhim ?!*
***Rəhim Nəbi oğlu:***

*Zəhmət çəkən heç kəs başda qalmadı,*
*Əbəs düşdün dağa-daşa, İsmayıl.*
*Bilirdin ki, Mustafa da yoldaşdı,*
*Niyə vurdun onu başa, İsmayıl ?*
***İsmayıl Güllər:***

*Biçib yığdın zümzüməli, nəğməli,*
*Qara gözəl qaşı-gözü əyməli.*
*Yaxaları mirvaridən düyməli,*
*Deyib gəzdin qoşa-qoşa, ay Rəhim.*
***Rəhim Nəbi oğlu:***

*Biçib yığdım zümzüməli, nəğməli,*
*Nərgiz, Sona, bir də ellər gözəli.*
*Nə axrıdı sözümün, nə əzəli,*
*Həvəskardı onlar işə, İsmayıl.*
***İsmayıl Güllər:***

*Badə versən qaldırardım, içərdim,*
*Sərraf kimi həqiqəti seçərdim.*
*Bir yer versən yarılığa biçərdim,*
*Oturmazdım boşdan-boşa, ay Rəhim.*
***Rəhim Nəbi oğlu:***

*Oruc verdi, hər kəs olsa yarıya,*
*Təbib olan məlhəm edər yarıya.*
*Heç olmayıb dayın oğlu zarıya,*
*Baxmadınmı keçən qışa, İsmayıl?*
***İsmayıl Güllər:***

*Mən haqılyam bil ki səndən kusməyə,*
*Qoymadın da tikanları kəsməyə.*
*Lazım deyil hər şey üst əsməyə,*
*Varın olsun daşa-daşa, ay Rəhım.*
***Rəhim Nəbi oğlu:***

*Kol dediyin özlüyündə bitəndi,*
*Allah verib hər yan dolu tikəndi.*
*Qırasıdı hər kəs zəhmət çəkəndi,*
*Al dəhrəni, sən də döşə, Ismayıl.*
***İsmayıl Güllər:***

*Mən istərəm dərdi-qəmin olmasın,*
*Açan gülün saralmasın, solmasın.*
*İsmayılın bu il otu olmasın,*
*Sən qocalma, yüz il yaşa, ay Rəhim.*
***Rəhim Nəbi oğlu:***

*Keçən illər avırımız itmişdi,*
*İrəhim də ot dalınca getmişdi,*

*Bu il alaf daş ustündə bitmişdi,*
*Nıyə qaldın boşdan-boşa, İsmayıl?!*

# İsmayıl Güllər ilə Rəhim Nəbi oğlunun başqa deyişməsi

***İsmayıl Güllər:***

*Gəndinə güvənib, tək mənəm demə,*
*Salarlar alçağa, el yaman olur.*
*Gur axan sulardan mərdana keçmə,*
*Daşanda, çaylarda sel yaman olur.*
***Rəhim Nəbi oğlu:***

*Xata bəd gətirib, dara düşəndə,*
*Yetəcək dadına, el yaman olmaz.*
*Yağmurlar yağıb, daşsa da çaylar,*
*Üzməyi bacarsan, sel yaman olmaz.*
***İsmayıl Güllər:***

*Qulluq əldən gedər, sən alçalarsan,*
*Keçən günlərini yada salarsan.*
*Tutduğun pis işdən peşman olarsan,*
*Əsəndə tərsinə, yel yaman olur.*
***Rəhim Nəbi oğlu:***

*Yaşdaşıb, sinninə dən düşən vaxtı,*
*Baxtın yatıb, sənnən yan düşən vaxtı,*
*Yayın bürküsündə sən bişən vaxtı,*
*Sərnidər canını, yel yaman olmaz.*
***İsmayıl Güllər:***

*Bir gün olar, baxan olmaz sözünə,*
*Yaxşı-yaman borcun çatar özünə.*
*Getmə ayriliyə, çalış düzünə,*
*Sağalmaz yarası, dil yaman olur.*
***Rəhim Nəbi oğlu:***

*Dağların başı sərindir, sərin,*
*Heç kəsi hündürdən düşməsin dərin.*
*Acıdan acıdı, şirindən şirin,*
*Haqqına söyəndə, dil yaman olmaz.*
***İsmayıl Güllər:***

*Çox da bel bağlama, müvəqqətidi,*
*Tamahnı az eylə, el zəhmətidi.*
*Bir az da parlasan, baş töhmətidi,*
*Açacaq sirrini, pul yaman olur.*

***Rəhim Nəbi oğlu:***

*İnsan oğlu ayaqüstə duranda,*
*Məskən salıb, mülki-bina quranda,*
*Qədəm basıb, bir səfərə varanda,*
*Gərəkdi yanında pul, yaman olmaz.*
***İsmayıl Güllər:***

*Gül İsmayıl belə görüb binədən,*
*Sərraf olan sözü seçər sinədən.*
*Yarananlar köçəcəkdir dünyədən,*
*Tarix yetirəndə, hal yaman olur.*
***Rəhim Nəbi oğlu:***

*Rəhim, ölüm haqdı, yadına gəlsin,*
*Qoy "rəhmət" sözləri adına gəlsin,*
*Yaradan yaradıb, dadına gəlsin,*
*Əməlin düz olsa, hal yaman olmaz*

# Bəkiroğlu Əlləz ilə şair Şabanın deyişməsi

**Şaban:**
İnciməyin yolu da var,
Günahımdan keç, ay şair.
Keçənləri vurma üzə,
Kinnilikdən qaç, ay şair.

**Əlləz:**
İncimirəm, dostlar bilsin,
Qalma intizar, ay şair.
İnşallah, yaram sağalar,
Gedər dərd-azar, ay şair.

**Şaban:**
Qəm əlindən bağrım bişər,
Vurub yaralarım deşər.
Dağlar başına qar düşər,
Ər başına iş, ay şair.

**Əlləz:**
Olasan dövrani dəmdə,
Saxlasın Tanrı məni də.
Nuh sevda qurdu gəmidə,
Sən də bil, aşkar, ay şair.

**Şaban:**
Şaban da qədrini bilər,

Qalxdın, şadlanar, gülər.
Hər zaman yaxşılıq dilər,
Bunu özün seç, ay şair.

**Əlləz:**
Sağlıq olsun, Əlləz gəzər,
Şeir yazar, dastan düzər.
Məclislərdə oynar, süzər,
Kim məndən bezər, ay şair.

# Şair Nəbi ilə Kərbəlayi İbrahim Ağakişi oğlunun deyişməsi

***Nəbi:***

Mən uğradım eşq oduna, bir belə candan ötəri,
Müjganların sinəm üstə dolaşır qandan ötəri.
Ey aqillər, əfsanədi, uymayın dünya malına,
Yanarlar eşq oduna şövkəti-şandan ötəri.

***İbrahim:***

Ey könül, çox havalanma, ol gülü-xardan ötəri,
Seyraqub yollara çıxar bəd nazardan ötəri.
Düşmə xam xəyallara, bir gün düşərsən zillətə,
Bəsləmə gəndini sən marı-şahmardan ötəri.

***Nəbi:***

Əvvəlindən mən bilirəm, dünya Nuh tufanıdı,
Quran gəldi Məhəmmədə, haqdan din islamıdı.
Bütpərəstlik sona yetdi, ol hökm Quranıdı,
Göydən endi Seyfullahı, şahı-mərdandan ötəri.

***İbrahim:***

Qazandığın malı-mülkün axrı fanidi, fani,
Əxrət üçün abad eylə əməlinlə dünyanı.
Əbrüşim, malı-mahut bəzəsin dörd bir yanı,
Qurban eylə şirin canı, bir düz ilqardan ötəri.

***Nəbi:***

Gəl biçarə şair Nəbi, tök mətahın bazara,
Özün haqsan, sözün haqdı, gəlməyəsən nazara.
Söz anlamaz, əxrət qanmaz çıxan zaman güzara,
Haqq yolunda divan qurdun əxrət-imandan ötəri.

***İbrahim:***

İbrahim, gəl, uyma belə bu eşqin sevdasına,
Bel bağlamaq həvəs işdi gözəllər xülyasına.
Qat səsini bu dünyada əhli-dillər səsinə,
Çox canına cəfa vermə yarı-şikardan ötəri.

# Dialektik lüğət

## Faxralı kəndində istifadə edilən dialekt sözlər:

| | |
|---|---|
| Abeşik | Meşəbəyi |
| Açalaq-umalaq | Tələsik |
| Ağuşqa (Aquşka) | Pəncərə |
| Ağzımurdar | Canavar |
| Ağzıpartoy | Etikadan kənar pis söz danışan adam |
| Alaçalpoy | Boz-bulanıq |
| Al diliylə | Dilə tutub söz demək |
| Andır | Ölən adamdan qalan,heç nəyə yaramayan geyim |

| | |
|---|---|
| Anşırmaq | Seçmək |
| Asılanmaq | Öz-özünə gileylənmək |
| Aşqal | Çox arıq |
| Ayar | Zarafatcıl |
| Basarat | Fərasət |
| Basma | Bir yaba tutumu |
| Batdax | Palçıq |
| Beddam | Bədnam |
| Bejit | Tələsik |
| Bölmə | Nəlbəki |
| Bir hovurluq | Az müddət |
| Bordax | Kökəldilən |
| Bulul (Bulun) | Ot tayası |
| Cələfsiz | Çox arıq |
| Cəm | Boşqab |

| | |
|---|---|
| Cımxır | Həqiqi |
| Cırtqoz | Hər şeyə cırnayan |
| Cifsir | Belə |
| Çaqqax | Tökülüb itən |
| Çalpaşıx | Qəribə |
| Çatı | Uzun kəndir |
| Çatma | Nehrə çalxamaq üçün ucu haça şəkilli üç ədəd ağac |
| Çezik | Ərköyün |
| Çəkkildək | Ev ayaqqabısı |
| Çimir almaq | Mürgüləmək |
| Çıtırıq | Çoxlu, bol |
| Çivin | Milçək |
| Daçka | Araba |
| Dalağı sancmaq | Şübhələnmək |

| | |
|---|---|
| Darqursax | Səbirsiz |
| Daylax | Qulun, 1 yaşında at balası |
| Dəhmərləmək | Tələsdirmək |
| Dini dirildi | Işi düzəldi |
| Dingiriş | Yüngül xasiyyət |
| Dımbılı | Balaca |
| Dıncıxmaq | Narahat olma |
| Dınqırıya süzmək | Məcməyi, sini səsinə oynamaq |
| Dızqax | Qorxaq |
| Dönəlgə | Barışığa meyl |
| Dranqalet | Köhnə, tökülüb itən |
| Dümsük | Böyürə vurulan zərbə |
| Eylik | Yaxşılıq |
| Eymənmək | Qorxmaq |
| Əcələ | Tələsik |

| | |
|---|---|
| Əfçi | Hər işə qarışan kişi (arvad xasiyyətli) |
| Əcər | Təsir |
| Əyriplan | Təyyarə |
| Ferşil | Tibb bacısı |
| Fəfi | Fərasətsiz |
| Fəhmələnmək | Şübhələnmək |
| Fır | Şiş |
| Firəngi | Iri bıçaq |
| Gap | Söhbət |
| Göz yağı yemək | Bir-biri ilə yola getməmək |
| Gözünün pisini tökmək | Ağlamaq |
| Havax | Nə vaxt |
| Həncəri | Necə, nə cür |
| Hörrə | Sıyıq |
| Höyüş | Nəm |

| | |
|---|---|
| Hoylanmaq | Yaranın iltihabı |
| Xəflənmək | Hürkmək |
| Xorramaq | Gözə götürməmək |
| Xuruşdu | Şuluq |
| Xuylanmaq | Xoflanmaq, incimək |
| İdim | Görkəm |
| İjmə | Qurğu |
| İkqavax (ilqavax) | Əvvəlcə |
| İncafara | Nə yaxşı ki |
| İsmarıc | Soraq, xəbər |
| İşgil | Dolaşıq |
| Kalça | Camış balası |
| Kıxmıx | Odun qamqalağı |
| Kora | Mismar |

| | |
|---|---|
| Körəməz | Köç zamanı süd və qatığın qarışığından ibarət sərinləşdirici içki |
| Qahmar çıxmaq | Tərəf saxlamaq |
| Qalet | Peçenye |
| Qaxtağan | Son dərəcə simic və xəsis insan |
| Qara bağır | Ciyər |
| Qarım | Dəyəndə yığıntı dəriləri üçün ayrılan yer |
| Qənsələr | Idarə heyətinin binası |
| Qəzyə | Pis hadisə |
| Qıfçax | Səliqəli |
| Qılan | Cod |
| Qırım | Məqsəd, niyyət |
| Qoqara | Baş |
| Qoqarazdanmq | Təkəbbürlük |
| Qosara | Qulançardan hazırlanan qida |

| | |
|---|---|
| Qumanda | Səliqə |
| Quloyşa | Yaltaq |
| Qurdanquş | Hər işə qarışan |
| Quyruxlu | Avgərdən |
| Laxanqa | Paltar yumaq üçün metal təknə |
| Laf | Söhbət |
| Lalıqqa | Dinməz, sakit |
| Ləlöyün | Acgöz |
| Lobbaz | Özünü dartan |
| Lüyən (lüyəndə olmaq) | Evlənmək (evlənmə vaxtı) |
| Mağmın | Fağır |
| Malmadıx | Əlindən bir şey gəlmiyən |
| Mansıra | Mühasirə |
| Masqara (ayar) | Zarafatcıl |
| Müşə | Fəhlə, günəmuzd işləyən |

| | |
|---|---|
| Naqolay | Yöndəmsiz |
| Nəmənədi | Nə olan şeydi, ucuzdu |
| Nıxdı tutulmaq | Danışa bilməmək |
| Nöydərəmət | Çoxbilmiş |
| Öfgə | Ağ ciyər |
| Öddək olmaq | Qorxmaq |
| Öy | Ev |
| Öy damı | Divarları daşla hörülmüş dam |
| Öynə | Yemək vaxtı |
| Patava | Çarığın iç hissəsi |
| Peydar | Durmadan |
| Peşqon | Fətir yaymaq üçün əşya |
| Pencər | Göyərti |
| Pəl vurmaq | Mane olmaq |
| Pələpötür | Yöndəmsiz |

| | |
|---|---|
| Pərinə dəymək | Xətrinə dəymək |
| Pompul | Tomağa |
| Pustal | Ayaqqabı |
| Püfə | Ağac oxantısı |
| Püsür | Zibil |
| Püş | Qyru peyin |
| Raqqı | Əl-üz sabunu |
| Salavey | Selbə |
| Sapılca | Mətbəx əşyası, tava |
| Sədri taxtı | Enli taxt |
| Səmə | Gəzəyən |
| Sim yerimək | Yara olan yerdən infeksiyanın bədəndə hərəkəti |
| Simsar | Hər şeydən iyrənən adam |
| Surux | Nazik, uzun ağac |

| | |
|---|---|
| Sümsük | Nəfsi iti olan |
| Şaad pulu | Dən üyütmək üçün ödənilən pul |
| Şamartı | Səs-küy |
| Şəltə | Qurğu |
| Şərvəti | Kasa |
| Şəvədə | Lağ |
| Şıldır | Qəzəlsiz qoz |
| Şırvanmaq | Yaltaqlanmaq |
| Şumal | Hamar |
| Tarpaşdamaq | Ağır (şiddətli) döymək |
| Tavoot | Fərq |
| Təfcinmək | Tərpənmək |
| Tənəkə | Nazik dəmir lövhə |
| Təppəcə | Hədə-qorxu |
| Tırınqı | Zümzümə |

| | |
|---|---|
| Tosoy | Gödək boylu |
| Törpü | Ağacın kələ-kötürünü götürmək üçün dülgər aləti |
| Tösmərək | Kök |
| Tuncu | Qart |
| Umsux | Nəfsi uzun |
| Unamaq | Güman etmək, hiss etmək |
| Usdufca | Yavaşca |
| Yanqır | Hər şeyi bilən |
| Yayma | Südlü aş |
| Yetik olmaq | Hali olmaq |
| Zağlı | Təp-təzə |
| Zıvıllıx | Qalın kol-kos |
| Zoxma | Yumruq |

Mənbə: **Rəşid Faxralı**, "***Faxralı tək ağır elim var mənim***" kitabı
və bəzi Faxrali sakinlərinin dedikləri

# Qaçaq Kərəm Faxralıda (Onun Güllərin Dəli Söyünlə dostluğu)

…Hökumət Qaçaq Kərəmi izləyirdi, tutub Sibirə göndərmək, imkan düşsə öldürmək istəyirdi, səsi-sədası Peterburqacan çatmış bu cəsur, igid, tədbirli qaçaq nə Qazaxda duruş gətirə bilirdi, nə də Qarayazıda. Onun Faxralı və faxralılar haqqında kifayət qədər məlumatı varıydı. ***Güllərin Dəli Söyünlə dost idilər.*** O, belə bir vəziyyətdə məhz Faxralıya getməyi qərara alır. İnanmr ki, Faxralıda onu heç bir təhlükə hədələyə bilməyəcək…

Fərman Eyvazlının "Qaçaq Kərəm" kitabında qeyd edilir (səh. 53) :

*"… Onlar meşə ilə xeyli yol gedib "Qala bozu"ndan aşağılarda Kürə endilər. Suları yara-yara o taya keçib Ceyran- çölə qalxdılar. Balasöyün təklif elədi ki, burdan birbaşa Biləndərlilərin yatağına getsinlər. Kərəm razı olmadı.*
*– Ora bir az uzaqdır – dedi. Gözdən tez iraq olmalıyıq. Yaxşısı budur, Qara Kazım oğlu Qəhrəmanın yanına gedək.*
*– Hə, nə olar, 0 da etibarlı adamdı.*
*Əlindəki tüfəngi dizləri üstünə qoyan Kərəm sözünə davam etdi:*
*– O, həm bizə bir az güllə verər, həm də bir-iki gün onun yanında qalarıq. Sonra da Allah kərimdir.*
*Balasöyün əlavə etdi:*
*– Gürcüstana gedərik, o tərəflərdə dost-tanış çoxdur.*
*– Faxralıda Güllər tayfasından Dəli Hüseyn adlı mənim də bir çoban dostum var, – dedi Kərəm… "*
Qaçaq Kərəm Faxralıda əziz qonaq kimi qarşılanır. "Casus" (o vaxtlar hökumətə xəbər çatdıranları belə adlandırırdılar) nə ölüb, nə də öləcək" – Faxralı deyimlərindəndir. Faxralının igid, qeyrətli oğulları bura dost adına gəlmiş Qaçaq Kərəmi casusun gözündən yayındırmaq üçün onu Tənəklidə, Qızıl qayada yerbəyer edir.

O, faxralıların qonaqpərvərliyindən vəcdə gəlir. Kərəm kimi igid, qorxu bilməz, mərd bir cavan guşənişin ola bilməzdi və o, Tənəklidə olanda tez-tez sonralar adı veriləcək bu talaya enərdi, bu gözəlliklər məskənini göz dolusu seyr edərdi, dərd-qəmini, qübarını dağıdardı. Faxralının qəçaqları, qaçaqlara arxa-dayaq olan faxralılar Qaçaq Kərəmi layiqincə yola salır. Ona kifayət qədər güllə, ehtiram kımi Qırat misallı bir kəhər, bəynişan bir arxalıq bağışlayırlar.

**Qaçaq türküsü:**

*Çox dedilər, şirin dilə uymadım,*
*Qisasımı qiyamətə qoymadım.*
*Ev-eşikdən doymadım ki, doymadım,*
*Dağ da, daş da mənə evdi, eşikdi.*

*Qovğa günü minəmmərəm hər ata,*
*At büdrəyə, gədə-güdə söz ata.*
*Yağı mənə bata bilməz, ay ata,*
*Taleyimə Qızıl qaya beşikdi!..*

Şair Nəbi Miskin

Şair Nəbi barədə məlumat

DÜNYA

Doğrudan-yalandan dərs verdin bizə,

Çıxmadı işlərin bir yana, dünya.

Nə mənzilin bəllidi, nə də məkanın,

Cadalar düşübdü hər yana, dünya.

Xudam zinət verib dağınnan, daşa,

Nə sultan tanıdın, nə xan, nə paşa.

Çoxları cəhd etdi, çıxmadı başa,

Gəlibdi əlindən amana, dünya.

Ruzidə bəllidi fəsildə yaylar,

Ötür ömrümüzdən həftələr, aylar.

Keçir xəyalımızdan əlvan saraylar,

Dönübsən qızıla, mərcana, dünya.

Dağların dayaqdı ləngərli düzə,

Kimsənin eybini vurmadın üzə.

Şərbətin şəfaət qılmadı bizə,

Axır həsrət qoydun cahana, dünya.

Əzəli görəndə eylədin rəftar,

Münasib olmadı yapdığın divar.

De görüm, necoldu verdiyin ilqar,

Qalmadı onlardan nişana, dünya.

Gələnlər gəlincə bir səni bildi,

Çoxunda ağladı, azında güldü.

Nə gedənlər gəldi, nə gələn qaldı,

Budu etibarın insana, dünya.

Bir gün olar, əsər məhşər yelləri,

Göyərdərsən, çürüdərsən gülləri.

Pünhan olub murğuların dilləri,

Sultan Süleymandan bu yana, dünya.

Murazı mətləbdə diliboz atdı,

Axırda körpülər qıldan isratdı.

Qılıncın qınsızdı, qolun qüvvətdi,

Baxmırsan qocaya, cavana, dünya.

Ağır səltənətli taxtı-divanlar,

Övliya, ənbiya, dini-imanlar,

Turaba qarışdı neçə min canlar,

Xakə bülənd oldu, yeksana, dünya.

Şair Nəbi cəhd eylədi cahana,

Ömür keçdi, sığınmadım səfana.

İnnən belə inanmıram səfana,

Sıtqınnan sığındım Sübhana, dünya.

GÖZƏL

Səhərdən bəklədim mən yollarını,

Bir gəlib qarşımdan keçəsən, gözəl!

Sən özün bilmirsən öz murazını,

Mən yaxşı bilirəm, butasan, gözəl!

Yetmişə yetsən də, mən səni allam,

Dərgah-ilahiyə min dua qıllam.

Aylarnan xəstə düşsəm, sağallam,

Sən gəlib qolumnan tutasan, gözəl!

Mən Nəbiyəm, aşıqların zəriyəm,

Yanıram oduna, eşq əsiriyəm.

Gəlmişəm qapına, bil, müştəriyəm,

Ləbiyin balından satasan, gözəl!

## VAR MƏNİM

İnciməsən bağban edim bağıma,

Aləm bilir dürlü gülüm var mənim.

Əgər sorsan hər birinin adını,

Cavabında imran dilim var mənim.

Söylə siftə kim tanıdı imanı,

Aləmi yaradan sirri-sübhanı?

Necə arif agah edib ərkanı?

O əhvalda xub kamalım var mənim.

Kərəm kimi qaynayaram, daşaram,

Alışaram, eşq oduna düşərəm.

Zorun varsa imtahana qoşaram,

Bu qəlbimdə qara kalım var mənim.

Nəbiyəm, dərsimi oxudum kamil,

Kəndin ustad olsa mən ollam qayıl.

Yolun düşsə təşbehidi İstanbul,

Faxralı tək ağır elim var mənim.

XX əsrin birinci yarısında Borçalının aşıq mühitində tanınan və maraqlı yaradıcılığı ilə yaddaşlarda qalan Şair Nəbi Faxralı.

Nəbi Oruc oğlu Faxralı (Şair Nəbi) 1873-cü ildə Borçalı mahalının Faxralı kəndində dünyaya göz açıb. Nəbi uşaq ikən qardaşı Sibirə sürgün olunur. Bu hadisə üzündən atasının qəddi əyilir. Nəbi erkən çağlardan ağır zəhmətə qatlaşmaq məcburiyyətində qalır.

Ağır günlər yaşayan Nəbi eh¬tiyac içində böyüyüb. 11-12 yaşa çatandan sonra Nəbi ailədə illərdən bəri hökm sürən ehti¬ya¬cın bütün müsibətlərinə şərik olub. Ağır zəhmətə qatlaşıb, ailə, ata-ana qay¬¬ğısı çəkməyə başlayıb.

15 yaşa çatandan sonra isə bir neçə il İmir kəndində Məşədi Hüseyn ad¬¬¬lı bir varlı şəxsə nökərçilik edib. Həmin illər nökərçilik etməklə yanaşı, o, ilk qoşma, təcnis və müxəmməslərini yaradıb. Şair Nəbi 1890-cı ildən 1910-cu ilədək müxtəlif yerlərdə nökər, ço¬ban, mülkə¬dar malika¬nə¬sində gözətçi işləyib.

Allahverdi mis mədənlərində fəhlə işlə¬miş, savad almağa, yazı-pozu öyrənməyə heç bir imkanı olma¬mışdır. Ancaq hafizəsinin itiliyi sayəsində saz çalmağı və gürcü dilini mükəmməl öyrən-mişdir.

Aşıq şeirinin müxtəlif janrlarında bir-birindən gözəl nümunələr qoşur. Bədahətən söylədiyi gəraylı, qoşma, divani, müxəmməsləri dildə-ağızda dolaşır. Borçalı və ətraf bölgələrdə keçirilən el şənliklərinə dəvət olunur. Bir məclisdə Dədə Ələsgərin qıfılbəndini açır.

Ələsgər:

Dünya altı gündə neçə don geydi,

Nə üstə əyləşdi, bərqərar oldu?

Əzəli kimiydi ərşin bənnası,

Ulduzlar nə təhər yerbəyer oldu?

Nəbi:

Dünya altı gündə dörd don geyindi,

Ab üstə əyləşdi bərqərar oldu.

Xey-xalığım haxda ərşin bənnası,

Ulduzun yeddisi səyahətkar oldu.

Ələsgər:

Nə qədərdi müğərrəbin mələyi?

Onların içində kim idi bəyi?

Canlıdı, cansızdı ərşin dirəyi,

Nə ilə çalındı, mötəbər oldu?

Nəbi:

Pənc-yek ayədi müqərrəbin mələyi,

Onların içində Cəbrayıl bəyi.

İsmi-əzəm cansızdı, ərşin dirəyi,

Çaldı lövhü-qələm, mötəbər oldu.

Ələsgər:

Ələsgər əl üzməz etiqadından,

Yer də xəbər verir göy büsatınnan.

Haqqınan peyğəmbər əhvalatınnan,

İslamam deyənə nə xəbər oldu?

Nəbi:

Nəbi də əl üzməz etiqadınnan,

Xilqəti hafizdi göy büsatınnan.

Haqqınan, peyğəmbər əhvalatınnan,

Mərifət İslama o xəbər oldu.

Getdikcə şöhrəti artan aşıq-şair bir çox toy məclislərində tanınmış sənətkarlarla deyişir. Şair Ağacan, Qaraçöplü Aşıq Musa, Aşıq Sadıq Sultanov, Miskinoğlu Allahverdi kimi saz-söz ustaları ilə dostluq əlaqələri qurur.

Onun yaşayıb-yaratdığı dövrdə Borçalı mahalında 100-dən çox şair və aşıq vardı. Bu qədər saz-söz adamı içərisindən Şair Nəbinin ustad məqamına çatması, sözsüz ki, böyük istedadının nəticəsində mümkün ola bilərdi.

Bütün bunlar onun təkcə Borçalı ədəbi mühitində yox, həm də XX əsrin əvvəlləri Azərbaycanın klassik aşıq poeziyasında tanındığını göstərir. Ömrünün axırınadək doğma kəndi Faxralıda yazıb-yaradan tanınmış el şairi 1945-ci ilin oktyabr ayında vəfat edib.

Xalq şairi Səməd Vurğun 1955-ci ildə Faxralı kəndinə gəlir. Bir el şənliyində Şair Nəbinin şeirlərini aşıqların dilindən eşidir. “Dünya” rədifli qoşması böyük şairin xoşuna gəlir. Kənd ziyalılarına onun şeirlərinin toplanmasını tapşırır.

Sonralar qorqudşünas alim H.Məmmədli Şair Nəbinin şeirlərini, onunla bağlı əhvalatları toplayır. Folklorşünas Elxan Məmmədlinin köməyi ilə şairin 200-ə yaxın şeiri əldə edilib.

Şair Nəbi dövrünün ustad sənətkarlarından sayılıb. Görüb-eşitdiklərini ustalıqla yadda saxlamaq, məclis aparmaq, dastan danışmaq bacarığı olub. Mənbələrdə onun "Mehdi bəyin əhvalatı" adlı dastan-rəvayət bağladığı qeyd olunur.

El arasında Şair Nəbiyə 13 yaşı olanda buta verildiyi də söylənilir. O, yuxuda Borçalının Daşlıqullar kəndində Zöhrə adlı bir qızla görüşür. Qız ona barmağındakı üzüyü göstərir, nişanlı olduğunu bildirir və butasından imtina edir. Amma o, Zöhrəni unutmayıb, şeir və qoşmalarında daim nakam sevgisini dilə gətirib:

Vaqeyi-aləmdə sevdiyim sənsən,

Tut gedək vətənə əlimdən, Zöhrə.

Sevgi sevgisini atmaz çöllərə,

Didərgin eləmə elimdən, Zöhrə.

Şairin şeirləri Nizami adına Ədəbiyyat İnstitutunun hazırladığı "Azərbaycan aşıqları və el şairləri" (1984) ikicildliyinin ikinci cildinə daxil edilib. Nəşrdə şairin "Bilmədi", "Gözəl", "Zöhrə", "Gözəlin", "Var bunun", "Gül, ondan ağla", "Yaşda dayanmaz", "Butasan, gözəl", "Addım-addım", "Yar gəldi keçdi" və s.

qoşmaları "Şair Nəbi Borçalı" imzası və kiçik bioqrafik məlumatla çap olunub. Bu nəşr 1986-cı ildə türk dilinə uyğunlaşdırılaraq İstanbulda "Xalq kültürü" seriyasından çapdan çıxıb. Müstəqillik illərində müəllifin "Eləsi var..." (1991) və "Yazılanlar gəldi başa" (2003) kitabları işıq üzü görüb.

Allah rəhmət eləsin!

Güllər Pərisi

Güllər Pərisi barədə məlumat

QARDAŞ

Qarsa tərəf baxıb, baxıb, ağlaram,

Vurulub köksümə yaralar, qardaş.

Sinəm üstün çalın-çarpaz dağlaram,

Dolanır könlümdə haralar, qardaş.

Eşqin badəsini yaman içibsən,

Dərd əlindən Türk elinə qaçıbsan.

Qohumdan-qardaşdan niyə keçibsən,

Divan işə baxıb aralar, qardaş.

Qəlbim qövr eyləyir köhnə yaradan,

Çox keçməz, çıxarsan qorxu-qaradan.

Sıra dağlar çəkilsəydi aradan,

Görünərdi gözümə oralar, qardaş.

Pəriyəm, dərdinə dözə bilmirəm,

Savadım çatmayır, yaza bilmirəm.

Sənsiz bu dünyada gəzə bilmirəm,

Gəlməsən, bacılar saralar, qardaş.

Şair İsmayıl Güllər

İsmayıl Güllər barədə məlumat

Qocalıqdadı

Gələni-gedəni seçə bilmirəm,

Günah məndə döylü, qocalıqdadı.

Astaca gedirəm, qaça bilmirəm,

Günah məndə döylü, qocalıqdadı.

Qaraya baxıram, gözüm torlanır,

Düz yaza bilmirəm, yazım korlanır.

Yazım düz olmasa, söüm korlanır,

Günah məndə döylü, qocalıqdadı.

Əyilib çeşmədən içə bilmirəm,

Darısqal körpüdən keçə bilmirəm,

Qartalı görürəm, seçə bilmirəm,

Günah məndə döylü, qocalıqdadı.

Qulağım yaxşıdı, gözlərim zəif,

Həyat hökmü verib, qəddimi əyib.

Səbəbi səksəndir – babalar deyib,

Günah məndə döylü, qocalıqdadı.

Harada qalıbdı mənim zil səsim,

Daha oxumağa gəlmir həvəsim.

Çünki oxuyanda gəlmir nəfəsim,

Günah məndə döylü, qocalıqdadı.

Gəzdiyim yerləri gəzə bilmirəm,

Gəzməsəm, bir yerdə dözə bilmirəm.

Diş yoxdu, yeməyi əzə bilmirəm,

Günah məndə döylü, qocalıqdadı.

Dediyim arzuya çata bilmirəm,

Ovumu bərədə tuta bilmirəm,

Nişanı düz tutub ata bilmirəm,

Günah məndə döylü, qocalıqdadı.

İsmayıl Gülləröm, ötübdü yaşım,

Ağrını-acını çox çəkib başım.

Nöqsanma gülməsin sirim-sirdaşım,

Günah məndə döylü, qocalıqdadı.

Dünyanın

Ömür keçdi, saç ağardı, qocaldım,

Az dadmadım zəhərindən dünyanın.

Tale məni dolaşdırdı həyatda,

Bəxtim düşdü kəhərindən dünyanın.

Namərd keçdi hey sağıma, soluma,

Kəmənd atdı ayağıma, qoluma.

Qəza-qədər çəpər oldu yoluma,

Kam almadım səhərindən dünyanın.

Qaraxaçda xalxahmız dağıldı,

Vardan çıxdıq, dövlətimiz sovuldu.

Xam atlarım yad ellərə qovuldu,

Baş açmadım təhərı'ndən dünyanın.

Ata mülküm Tənəhlidə yad oldu,

Hər görəndə göz yaşlarını od oldu.

Xeyirini yadlar gördü, şad oldu,

Qəhər dərdim bəhəriondən dünyanın.

İsmayıl Güllərəm, nəsilim ulu,

Sinəm şeiriyyətlə doludur, dolu.

Saldığım cığırı, keçdiyim yolu,

Ayırmaram heç nəhrindən dünyanın.

Olur

Gəndinə güvənib tək mənəm demə,

Salallar alçağa el yaman olur.

Gur axan sulardan mərdana keçmə,

Daşanda dəryada sel yaman olur.

Qulluq əldən gedər, sən alçalarsan,

Keçən günlərini yada salarsan.

Tutduğun pis işdən peşman olarsan,

Tərsinə əsəndə yel yaman olur.

Bir gün olar baxan olmaz sözünə,

Yaxşı-yaman borcun çatar özünə.

Getmə əyriliyə, çalış düzünə,

Sağalmaz yarası, dil yaman olur.

Çox da bel bağlama, müvəqqətidi,

Tamahnı az eylə, el zəhmətidi.

Bir azca parlasan baş töhmətidi,

Açacaq sirrini, pul yaman olur.

İsmayılam, belə gördüm binadan,

Sərraf süzər, sözü seçər sinədən.

Yarananlar köçəcəkdir dünyadan,

Tarix yetişəndə hal yaman olur.

Yat-ha-yat

Hər kəs mətahını bazara çəksə,

Yaxşı malı tez satacaq, sat–a-sat.

Baxan olmaz çürük malın üzünə,

Alan olmaz, dur yanında, yat, ha yat.

Keçi borcu ödənilməz qoyunla,

Kal yerinə öküz getməz boyunla.

Məddah olma min kələklə, oyunla.

At əvəzin at ödəyər: ata-at!

İsmayıl Güllərəm, düşsəm də cəngə,

Namərdin əlindən gəlmərəm təngə.

Boğçamı açaram, pulum bir çəngə,

Xırd elərəm mən üstündə: yat-a-yat!

Keçəcək

Eybini bilməyən arsız adamlar,

Ağzına gələni atıb keçəcək.

Müştəri tapmasa, almayanlara

Dəyər-dəyməzinə satıb keçəcək.

Eləsi var, ar tapılmaz sərində,

İtirər adını el üzərində.

Məclisin, söhbətin şirin yerində,

Araya ixtilaf qatıb keçəcək.

Beləsinin nəynə gərək yaxşı söz,

Yaxşı mərfət, yaxşı nəshət, yaxşı söz.

Öz dediyi özü üçün yaxşı söz,

Deyib məqsədinə çatıb keçəcək.

Ay İsmayıl Güllər, çox belasini,

El istər içindən yox beləsini.

Qəbirə qoyanda bax, beləsini,

İrəhmət yanından ötüb keçəcək.

Şair Kərbəlayi Qara Qərib

Qara Qərib barədə məlumat

Cənnət bulağı

Nə gözəl xəlq edib yaradan səni,

Sirrinin seyrinə dalanlar bilənlər.

Çiçəklərin loğman, otların təbib,

Dərdinə dərmanı bulanlar bilər.

El köçüb üstünə, binə quranda,

Döşlərin bənzəyir mağarlı kəndə.

Sulanıb, köz üstə kabab bişəndə,

Dadını mehmanın olanlar bilər.

Tökülər üstünə min bir mey-məzə,

Çiçəkli çəmənin çalar gülgəzə.

Bülbül cəh-cəh vurar gül gəzə-gəzə,

Nəşəsinə heyran qalanlar bilər.

Enib obaların gəlini, qızı,

Dərər ayağından lilpar, yarpızı.

Mehdən titrəyəndə süsənin üzü,

Gözündən şəbnəmi silənlər bilər.

Kənd qışı

Quşbaşı qar tökür asiman yerə,

Yer-dümağ, göy dümağ, yaylaq-ağappaq.

Çəkib yorğanını yatır təbiət,

Dağ-dümağ, daş-dümağ, oylaq ağappaq.

Cüyür bata-bata gədikdən aşır,

Kəndin qırağında çaqqal ulaşır.

Atlı dəyirmanın yolunu çaşır,

Düz-dümağ, iz-dümağ, sol-sağ-ağappaq.

Sular yuyub keçir dərədə tarı,

Quşlar budaqlardan uçurur qarı.

Qızarır ağacda bir payız narı,

Alt-dümağ, üst-dümağ, yarpaq-ağappaq.

Sənəknən bulaqdan gəlir el qızı,

Qardan inci taxıb kirpiyi, gözü.

Növrəstə lalə tək qızarıb üzü,

Baş-dümağ, döş- dümağ, ayaq-ağappaq.

Palıd kötüyüynən yanır buxarı,

Tüstü burum-burum qalxır yuxarı.

Anbarında elin bəhəri, barı,

Un-dümağ, nan-dümağ, qaymaq-ağappaq.

Qarayam, sinəmdə titrəyir tellər,

Uça güldən-gülə şeyda bülbüllər.

Gözəl gələ elə illər, fəsillər,

Ay-dümağ, gün-dümağ, növraq–ağappaq.

Amandı (Təcnis )

Ver imdad əlini əlimə, gözəl,

Düşmüşəm borana, qara, amandı.

Xəyalım qərq olur dərin dəryada,

Gəlir günüm gündən qara, amandı.

Ciyərim atəşdə, cismim dardadı,

Qəsdindən sinəmə düşüb dərd adı.

Düşmən də görməsin belə dar dadı,

Tökmə güzarıma qara, amandı.

Könlüm qəm üzünə baglı xalxaldı,

Eşqin sitəmindən sinəm xal-xaldı.

Bağrım qanlar sızan xaldı xal, xaldı.

Tüğyan edib ağlar Qara, amandı.

Gözəl (Təcnis)

Gəl bulaq üstünün seyrinə varaq,

Ay işıq çiləyir, tar azdı, gözəl.

Gizlətmə hüsnünü obadan, eldən,

Dövrün ədalətlə tarazdı, gözəl.

Aşıq dastan deyir “Abbas-Gülgəz”i,

Çəmənin çöhrəsi çalır gülgəzi.

Bülbül cəh-cəh vurub yenə gül gəzi,

Ötür telli sazlar, tar azdı, gözəl.

Xoş gəlib il, fəsil, ay qədəmindən,

Nür alıb parlayır Ay, qədəmindən.

Qaramın qəlbinə ay, qədəmindən

Gün düşüb sinədə tar azdı, gözəl.

Şair Əli Faxralı (Əli Qurban oğlu Məmmədov)

Əli Faxralı barədə məlumat

QOCALARMI

Bu dağlara sidq-ürəklə

Meyl salan qocalarmı?

Əzgillidə cah-cəlalla,

Binə quran qocalarmı?

Qoşa bulaq, adın cardı,

Yahalardan yadigardı.

Görməyənlər intizardı,

Gəlib görən qocalarmı?

Sair könlüm, gəzmə xəstə,

Dərmanını burdan istə.

Qara dağdan Gəzdək üstə

Gedib-gələn qocalarmı?

Qızıl qaya sinəsində,

Dincələsən kölgəsində.

Faxralının binəsində,

Ömür sürən qocalarmı?

Əli, götür telli sazı,

Çal-oxu yaylaq avazı.

Barmaqlan al-qırmızı,

Zoğal dərən qocalarmı?

SİZİ

Nə gözəldir bizim dağlar,

Heç görməsin yaman sizi.

Sizdən ayrı düşən ağlar,

Bürüməsin duman sizi.

Ellər öü həmdəm seçib,

Yaz qonubdur, payız köçüb,

Gözlərinnən görüb keçib,

Neçə tarix, zaman sizi.

Özü şahdır, tacı qardı,

Sevgilisi növbahardır.

Bakirəli, düz ilqardı,

Unutmaram, inan, sizi.

ÖLMƏZ

Hər məclisdə söyləmişəm,

Muğanlıdan keçən ölməz.

Mən də niyyət eyləmişəm,

Faxralıya köçən ölməz.

Yolum düşə Til dağından,

Ceyran-cüyür oylağından.

Aşıq Hasan bulağından,

Nəziksudan içən ölməz.

Əli, yetmiş yaşın nəsdi,

Yüz yaşasan, sənə bəsdi.

Etibarlı, yaxşı dostu

Bizim eldən seçən ölməz.

Şair Əli Səngərli

Əli Səngərli barədə məlumat

Papaq

Bizdən əvvəl  dəbdə idi,

Qıvrım telli qara papaq.

Necə gözəl yaraşırmış

Qırğı boylu yara papaq.

Atamın namusu, adı,

Babam onsuz yaşamadı.

Namus qeyrət, ad apardı,

Gedəndə də gora papaq.

Hər birisi at qiyməti,

Kişilərin əzəməti,

Qəbul etməz məzəmməti

Harda düşsə dara papaq.

İndi dəbdən düşüb necə,

Tək oğrular geyər gecə.

Arvadlar da almaz vecə

Gündüz çıxsa hara papaq.

Nəm çəkər

Ömrü-günü gərək olmaz kimsəyə,

Gecə-gündüz araq içər, dəm çəkər.

Diri çıxar, ölü dönər evə o,

Oğul-uşaq boyun bükər, qəm çəkər.

Şalvarını tərs üzünə geyər o,

Lovğalanar, sinəsinə döyər o,

Hər yetənə sataşar o, söyər o,

Yıxılanda torpaq ondan nəm çəkər.

Tez-tez itər bazubəndi, duası,

Ocağından əskik olmaz davası.

El yığılmaz, söndürülməz havası,

Beləsinin azarını kim çəkər?!

Qadan alım

Qadan alım, qoca dünya,

Bir az göyə qaldır məni.

Adamyeyən cəlladların

İştahından saldır məni.

Xeyli vaxtdır çox nasazam,

Gah küləyəm, gah da tozam.

Bir sinəsi sınıq sazam,

Az “Zarıncı” çaldır məni.

İnsafa gəl, qoca dünya,

Hər günü tapmaca dünya,

Aç ömrümə baca, dünya,

Bir işıqla doldur məni.

O əjdaha qarına bax,

Torpaq eşən harına bax,

Özünə bax, yarına bax,

Sanır qayışbaldır məni.

Səngərliyəm, duyanım yox,

Köməyim yox, həyanım yox,

Qəlbim qandır, yuyanım yox,

Az qaz kimi yoldur məni!

Süleymandan qalan dünya

Bu tapdanmış cığırlardan

Heç bilmirəm, necə keçim.

Hara çəksəm, yurda çıxır,

Mənim yolum, mənim köçüm.

Süleymannan qalan dünya,

Hər zərrən bir üzük qaşı.

Heç səsimə səs verməyir,

Nə memarın, nə da daşın.

Elə biz də yaradırıq,

Döşümüzə döyə-döyə.

Yaranmı.lar danışdıqca,

Qalırıq göz döyə-döyə.

Yazdığımız hər misranın

Bəlkə, neçə sahibi var.

Sahibkarlar üzə vursa,

Çox şairlər sözsüz qalar.

Özündən xəbərsiz

Özündən xəbərsiz adam,

Başın özgəyə qarışıb.

Üzlərdə qırış sayırsan,

Urəyin vaxtsız qırışıb.

İçində yollar, cığırlar,

Dağlar, dərələr, çuxurlar.

Səndən ölülər baxırlar,

Canına meyid daraşıb.

Sən ki, heykəlsən küçədə,

Donubsan zülmət gecədə.

Səndən betərdi küçə də,

Gecə gecəyə qarışıb.

Bilən yoxdur

Kötük üstə çırpı kəsən,

Bilən yoxdu kimsən, nəsən.

Ucbatından tir-tir əsən,

Çox silahlı əl görmüşəm.

Gəldik dünyada yaşayaq,

Gəlmədik qorxu daşıyaq.

Qəfəsdəki bülbül sayaq

Neçə dərdli dil görmüşəm.

Ömür, acıq ver acala,

Qoyma qəm səndən bac ala.

De ki, qocala-qocala

İncə-incə bel görmüşəm.

Səhər çağı, axşam üstü,

Ocaqları boğar tüstü.

Qız-gəlinli, toy-məclisli,

Sazlı-sözlü el görmüşəm.

Ay duman, dağın var olsun,

Ay bağban, bağın var olsun!

Səngərli, kefın çağ olsun,

De yetmiş üç il görmüşəm!

14.09.2001

Şair Şabanın şeirləri (Şaban Məmmədəli oğlu Qurbanov

Şair Şaban barədə məlumat

Şair Şabanla Qara Qəribin “küsüşməsi”

Dodaqdəyməz

O dildarı görüncə qeyri dolandı,

Ox atdı hədəfə, yay çəkə-çəkə.

İlqar verdi, ilqarında gec oldu,

Gözlədik yolları ay çəkə-çəkə.

Könül quşu havalanar dağında,

Ötüşər kəkliklər səhər çağında.

Olaydıq yarıynan yar otağında,

Tutaydıq əlindən toy çəkə-çəkə.

Şabanın sinəsi qaynayar, coşar,

Dalğalı dənizdi, həddini aşar.

Sevgi sevgisinnən şirin danışar,

Xoş keçər günləri say çəkə-çəkə.

Qocalıq

Cavanlıq çağım yad olub gedir,

Vədəsiz üstümü alır qocalıq.

Əyir qəddimi, bükür belimi,

Deyəsən, boynumda qalır qocalıq.

Qara saçlar tən ağarır başımda,

Tük uzanır, kirpik sürür qaşımda.

Bu nöqsanı mən görürəm yaşımda,

Ayağımı daşa çalır qocalıq.

Qulaq kəsmir, diş tökülür, göz qalır,

Bədən əsir, hey gözlərim sulanır.

Şair Şaban, niyə qəlbin bulanır,

Səni bu hallara salır qocalıq.

Dünya

İnsi-cinsi mövlamızdı yaradan,

Onları zafına salandı dünya.

Yaranmış insanlar çıxır aradan,

Axırı bilinmir, yalandı dünya.

Əvvəli bilinmir, axırı yoxdu,

Çəkənin əlində kamandı, oxdu.

Xavar al özündən, əhvalat çoxdu,

Neçə yol boşalıb-dolandı dünya.

Mən bilirəm yaman namərddi bizə,

Xudamın cəfası görünmür gözə.

Neçə pəhləvanı vurubdu dizə,

Rusdamı fəndinə salandı dunya.

Əzbər eləsəm də hər bir lisanı,

Kəsibdi qarşımı haqqın divanı.

Füzuli, Firdovsi, Qurbani hanı? –

Saban deyər, namərd olandı dünya!..

Yara

Yarım xəyalımdın ölüncə getməz,

Dəstimdə qələmim, nə yazım yara.

Surəti gözümün önündən getməz,

İllərlə həsrətdi sağ gözüm yara.

Gün kimi dağlara yayılım – dedi,

Ağlaram, açılmaz ayınım – dedi.

A qardaş, sənə də qayınım dedi,

Yetir bu naməni əzizim yara.

Mən Şabanam, dağlar aranı kəsdi,

Çəkdiyim intizar özümə bəsdi.

Yarsız bu dünyada gəzmək əbəsdi,

Budu son təmənnam, son sözüm yara.

Ağlama

Elə durma – qəm içində,

Gül, ağlama, gül, ağlama.

Sən ağlasan mən ağlaram,

Gəl ağlama, gəl ağlama.

Sənin umuddu sözünü,

Ocağıma qat közünü.

Görən itirər özünü,

Göz yaşını sil, ağlama.

Cismim yandı ahu–zardan,

Üzülürəm intizardan.

Gəl Şabanı qurtar dardan,

Ürəyini al, ağlama!

Şair Şabanla Qara Qəribin "küsüşməsi"

Şair Şaban haqqında

Şair Şaban: "Payız çiçəyi" (şeirlər, deyişmələr) kitabı

Şair Şabanın Bolnisi rayonunda çayxanası vardı. Ötən günlərin birində həmin çayxanada "Gürcüstan" qəzetinin, rayon maarif işçilərinin və şeirsevərlərin təşəbbüsü ilə şeir məclisi təşkil olunur. Məclisi aparmağı ustad Hüseyn Saraclıya həvalə edirlər. Hüseyn Saraclı biləndə ki, Qara Qəriblə deyişəcək, etiraz edərək deyir: "Mən xırmana yığılmış dərzi döyürəm. Qara Qərib

isə həm dərzi xırmana yığır, həm də döyür”. Belə olduqda şeirsevərlər deyişmək üçün şair Şabanın razılığını alıb, Qara Qəribin dalınca adam göndərirlər. Qara Qərib gəlib şair Şabanı məşq edən görür. “Şaban, bu sənsən?” – müraciətindən sonra belə deyir:

Gəl sənə söyləyim, ay şair Şaban,

Vədəsiz açılan yaz olmaz-olmaz,

Yaşılbaş sonadır göllər bəzəyi,

Qarğa suda çimsə, qaz olmaz-olmaz.

Şair Şaban

Çox doğru deyirsən, ay Qara Qərib,

Zimistan çağında yaz olmaz-olmaz.

Buzlayıb dərələr, donanda göllər,

Tərk olar sonalar, qaz olmaz-olmaz.

Qara Qərib

Əlinin dəstindən içməyən kəs də,

İnsanı şeytandan seçməyən kəs də,

Girəndə meydana tablamaz bəhs də,

Aylarla düşünüb yaz,olmaz-olmaz.

Şair Şaban

Özündə hünəri görməyən kəs də,

Girib meydanlarda durarmı bəhsdə?

Qüvvətli şairlər xasımlar üstə,

Gedəndə qeyrəti az olmaz-olmaz.

Qara Qərib

Yaxşı bax Qaranın sən havasına,

Qoç oğlu qoç gərək qoç davasına,

Nahaqdan toxunub batma yasına

Qəm basar qəlbini, saz olmaz-olmaz.

Şair Şaban

Mən Şabanam şairliyin bəhsində,

Ötən bir bülbüləm gül həvəsində,

Güllər Pərisinin nəticəsində,

Şair meydanında naz olmaz-olmaz.

Deyişmə davam edir. Qara Qərib yenə qabağa düşür:

Qara Qərib

Şaban, danışma daldada,

Meydan aç, mərdi-mərdana!

Kükrəyib dəryalar kimi,

Qayna, daş mərdi-mərdana!

Yer titrəsin, göy kişnəsin,

Nərə çəkib dayangınan,

Dağıt düşmən qalasını,

Qoyma daş, mərdi-mərdana!

Şair Şaban

Qurmuşam nər meydanında,

Mən savaş, mərdi-mərdana.

Sallam düşmən qalasından,

Kərpic , daş, mərdi-mərdana.

Yaxan keçibdir əlimə,

Tufan qopsa buraxmaram,

Vurub salaram meydanda,

Bu gün baş, mərdi-mərdana.

Qara Qərib

Mən sənə səcdə qılaram,

Sannı bir şair olasan.

Çıxasan ər meydanına,

Düşmənə qarşı durasan.

Tutasan Ərən güləşi,

Kürəyin yerə vurasan

Çəkəsən əyri qılıncı,

Düşə baş, mərdi-mərdana.

Şair Şaban

İstədim bilmək təbimi,

Zehnində olmadı kəsər.

Nuh tufanı tuğyan edər,

Düşmən mənə etsə əsər,

Meydanını tərk eyləsəm,

Tərlan könlüm məndən küsər.

Tələsiyib nər oğlanla,

Oldun tuş, mərdi-mərdana.

Qara Qərib

Əzəldən yoxla özünü,

Tez özünü atmagınan.

Şələndə yoxdursa əgər,

El başını qatmagınan.

Danışaraq hərzə-hədyan,

Rüsvayçılığa çatmagınan.

Qaram deyər: nəsihətdi,

Durma, qaç, mərdi-mərdana.

Şair Şaban

Şabanam, qeyzə gələrəm,

Vardır hünərim davada.

Gözləginən, bülbülünü,

Tərlanım çalar havada.

Qoymaram qanad açmağa,

Sarını  bullam yuvada.

Zülfüqarım qan istəyir,

Gəl savaş, mərd-mərdana.

Qara Qərib bu yerdə deyişməni bir az da "dərinləşdirir":

Qara Qərib

Ay Şaban, şairlik zorunan olmaz,

Cadalar bağlıdır, keçə bilməzsən!

Şairlik hesabı yaman baladır,

Şərbəti zəhərdir, içə bilməzsən!

Şair Şaban

Verrəm cavabını al, Qara Qərib

Aslanlar yolunu kəsə bilməzsən!

İçmişəm badəni, o Pirim verib,

Hərcayı danışma, nəsə bilməzsən!

Qara Qərib

Mən sənə söz dedim, aylar il oldu,

Dolandı yaşımız yetmişə doldu.

Dediyim bağlama cavabsız qaldı,

Səpməsən toxumu biçə bilməzsən.

Şair Şaban

Döğrudur, meydanda davamız oldu,

Ərən güləşində rəng-ruhun soldu.

Qarlı qasırğamdan gözlərin doldu,

Vermişəm payını, küsə bilməzsən!

Qara Qərib

Olmaya Qaranı qoca görürsən?

Baxıb öz boyunu uca görürsən?

Od kimi alışıb tezcə sönürsən,

Naşısan, gövhəri seçə bilməzsən!

Şair Şaban

Mən Şabanam, çox xasımlar görmüşəm,

Bir zərgərəm ləli-gövhər seçmişəm.

Hünərim var, meydanına gəlmişəm,

Yel olub yanımdan əsə bilməzsən!

Bu deyişmədən sonra Qara Qərib ətrafa göz gəzdirir. Köhnə dostları şairin ətrafına toplaşmışdılar. Onlar Qara Qəribin inciməsindən narahat idilər.

Qara Qərib kiçik inciklikdən sonra Şair Şabanın rayon mərkəzindəki çayxanasına gəlmirdi. Xeyli vaxt idi ki, kəndlərdən, rayonlardan çayxanaya toplaşan sazdan-sözdən söhbət açan əziz dostlarından ayrı düşmüşdü. Şairin inciyən qəlbi kövrəlir və Şair Şabana belə deyir:

Əziz dostlar yada düşər,

Ayrı saldın sən, ay Şaban.

Ac bir toyuq deyiləm mən,

Sən ataydın dən, ay Şaban.

Dost-tanışa yanaşardım,

Deyər-gülər danışardım,

Şirin-şirin qonuşardım,

Qəlb olardı şən, ay Şaban.

Mədəd, Bayram, Sarı qardaş,

Deyərdi: de yavaş-yavaş.

Gəl mənimlə qurma savaş,

Beygünaham mən, ay Şaban.

Şükür, Musa, Hümbətinən,

Qonuşardıq ləzzətinən,

Şirin novraq adətinən,

Düşdü aram gen, ay Şaban.

Atımı şad çapammaram,

Şah Əlini tapammaram.

Şirin söhbət yapammaram.

Eylədin bir qan, ay Şaban.

Çopur Əli qəlbim açdı,

Könlümə bir işıq saçdı,

Eşqim coşub aşdı-daşdı,

Verdi ruha can, ay Şaban.

Seyidnən Məşədi Əli,

Düşər yada, ollam dəli,

Barışaram, desən bəli,

Qonuşaram mən, ay Şaban.

Qanan kəslər qəlbə dəyməz,

Dəyib əlif qəddin əyməz,

Əzib ruhun bada verməz,

Qoymaz yana-yana, ay Şaban.

Mən sənə bir söz demədim,

Sinən üstə göz demədim,

Nə əyri, nə düz demədim,

Olmaz haqqı dan, ay Şaban.

Qaram deyər həqiqətdən,

Dərsin alıb təbiətdən,

Xoşum yoxdu bu adətdən,

Nədir karın, din, ay Şaban.

Şair Şaban xəyala dalmışdı. Sanki rəqibinin suallarına cavab axtarırdı. Qara Qərib sözlərini bitirdikdən sonra Şair Şabanın qəlbində xalası oğluna yenidən mehr hissi yarandı. Çöhrəsində mərhəmət duyulan Şair Şaban ona belə cavab verdi:

Döndərmə üzünü xalan oğlundan,

Xasımlar xasımı sənsən, Qaram, sən.

Eşidənlər bilir sinə dəftərsən,

Dövrünün Qasımı sənsən, Qaram, sən.

Nərlər meydanında yaşa dolmusan,

Şairlər çökdürüb, xərac almısan,

Ellərin dilində dastan olmusan,

Növbahar nəsimi sənsən, Qaram, sən.

Şabanam, dünyaya gələnlər qalmaz,

Görünməz yollara gedənlər gəlməz,

Ustadlar qəlbinin yanğısı sönməz,

Ötən sazlar simi sənsən, Qaram, sən.

Məclis əhlinin qəlbində razılıq hissi baş qaldırdı. Şairlər arasında yaranan əmin-amanlıq hamının qəlbindən oldu. Ağsaqqal, qarasaqqal stol arxasında əyləşdi. Pürrəngi çaylar süzüldü, şirin söz-söhbət başlandı. Şairlər halal-hümbət edib ayrıldılar.

Mənbə: Şair Şaban – "Payız çiçəyi", Bakı 1999.

Şair Şaban: "Payız çiçəyi" (şeirlər, deyişmələr)

Şair Şaban haqqında

Şair Şabanla Qara Qəribin "küsüşməsi"

Şair Şabanın şeirlərindən nümunələr

ÖN SÖZ (Səməndər Məmmədov)

Şair Şaban (Şaban Məmmədəli oğlu Qurbanov) Borçalıda yaşayıb-yaratmış el şairlərindən biridir. O, 1914-cü ildə Borçalının saz-söz beşiyi olan Faxralı kəndində anadan olub. Qəlbən el-obaya vurğun olan şair ömrünün sonuna kimi Faxralıda yaşayıb. Natamam orta təhsil almasına baxmayaraq dövrünün qabilliyyətli, məlumatlı və dünyagörüşlü adamlarından biri olan görkəmli el sənətkarı Şair Nəbini özünün müəllimi, ustadı hesab edib. Heç təsadüfi deyil ki, Nəbi onun qabiliyyətini şeirlərinin birində yüksək qiymətləndirmiş və ilhamına qol-qanad vermişdir:

Səxavət əhlidir Alıynan Şaban,

İnşallah, çatarlar bizə şairlər.

Şair Şabanın istedad və bacarığı deyişmələrində daha qabarıq üzə çıxır. Özünün müasiri olan xalası oğlu, bədahətən şeir demək bacarığına malik şair Qara Qəriblə, dağlar qızı Şövkət xanımla, Dünyamalı Əsgərovla deyişmələri bunu əyani şəkildə göstərir. Onların deyişmələri çox zaman bağlama şəklində olub, dərin mənalı və düşündürücülüyü ilə diqqəti cəlb edir:

Şövkət:

Sizdən xəbər alım, ay Şaban əmi,

İnsan bu dünyaya nə vaxt gəlibdir?

Dünya tar-mar olub, alt-üst olanda

Həvvanın göz yaşın kimlər silibdir?

Şaban:

Atamız Adəmdir, bəyan eyləyim,

İnsan bu dünyaya o vaxt gəlibdir.

Həvva ana qövr eyləyən zaman,

Gözünün yaşını övlad silibdir.

Yaxud Kərbalayı Qara Qəriblə deyişməsindən bir misal:

Qara Qərib:

Şaban, danışma daldada,

Meydan aç, mərdi-mərdana!

Kükrəyib dəryalar kimi,

Qayna, daş mərdi-mərdana!

Yer titrəsin, göy kişnəsin,

Nərə çəkib dayangınan,

Dağıt düşmən qalasını,

Qoyma daş, mərdi-mərdana!

Şair Şaban:

Qurmuşam nər meydanında,

Mən savaş, mərdi-mərdana.

Sallam düşmən qalasından,

Kərpic , daş, mərdi-mərdana.

Yaxan keçibdir əlimə,

Tufan qopsa buraxmaram,

Vurub salaram meydanda,

Bu gün baş, mərdi-mərdana.

Belə deyişmələrdə Şair Şabanın sözü məqamında demək qabiliyyəti özünü açıq şəkildə göstərir. Həm də sözlərin düzülüşü, deyişmənin aşıladığı məna, məzmun şairlərin geniş dünyagörüşə, zəngin eridusiyaya malik olmalarını bir daha sübut edir. Şair Şaban deyişmələrindəki məharət və ustalığa lirik şeirlərində də nail olur:

Həsrətinə dözəmmərəm,

Bircə gəl insafa, gözəl.

Bu dünyada gəzəmmərəm,

Etmə mənə cəfa, gözəl.

Şair Şaban həm də gözəl ailə başçısı olmuş, layiqli övladlar tərbiyə etmişdir. Onlardan Əli Qurbanov 1965-ci ildə Bakı Dövlət Universitetinin iqtisadiyyat fakultəsini fərqlənmə diölomu ilə bitirmiş, uzun müddət Sumqayıt şəhər ərzaq ticarət idarəsində məsul vəzifələrdə işləmişdir. elcanlı ata ocağı ilə nəfəs alan oğullarından olmuş, heyf dünyasını vaxtsız dəyişmişdir. Allah rəhmət eləsin.

Övladlarından Qurban, Məmmədəli, Mahal gənc nəslin təlim-tərbiyyəsi ilə məşğul olublar. Mahal həm də doktorluq elmi dərəcəsi də almışdır. Kamal isə ticarət sahəsində çalışır. Yeddi övladının hər biri şairin təmiz adını, xatirəsini uca tuturlar. Layiqli övladlar tərbiyyə edən, şərəflə yaşayan, nüfuz sahibi Şair Şabanla bağlı şirin xatirələr el arasında indi də böyük hörmətlə danışılır. Şair 1980-cı il, iyinin 2-də 66 yaşında vəfat edib.

Şair haqqında ilk dəfə 1997-ci ildə Bakı Dövlət Universitetinnin nəşriyyatında nəşr etdirdiyim “Faxralı tək ağır elim var mənim” kitabında qısa məlumat və yaradıcılığından nümunələr vermişəm. “Payız çiçəyi”ndə topladığım şeir və deyişmələr də Şair Şabanın yaradıcılığını tam əhatə etmir. Onu da bildirim ki, şairin xalqın yaddaşında qorunub saxlanılan şeirləri də az deyil. Ümid edirəm ki, saz-söz üstündə köklənmiş eloğlularımız belə şeirlərin itib batmasına yol verməyəcək, onların ümumxalq malına çevrilməsində bizə köməklərini əsirgəməyəcəklər. Kitabda gedən şeirlərin toplanmasına kömək etmiş Muxtar Allahverdi oğluna, Azərbaycan Respublikası “Aydınlıq” cəmiyyətinin sədri Şərif Qara Qərib oğluna, Məmmədəli Şaban oğluna və xeyirxah məsləhətlərinə görə Borçalının dəyərli ziyalısı şair-alim Miskəroğluna minnətdarlığımı bildirirəm.

Səməndər Məmmədov

Hüseynqulu Məmməd oğlu Məmmədli

Hüseynqulu Məmmədli barədə məlumat

KAMANDAR

Dizimdə taqət yox, gözümdə qara,

Gözləməkdən yollarını, Kamandar.

Günü-gündən dərdi-qəmim azalır,

Dilləndirsən tellərini, Kamandar.

“Urfanı”dan əhli-ürfan kam alar,

“Yanıq Kərəm” ürəklərə od salar,

Eşqə düşən, ərənlərdən cam alar,

Dinləyəndə xallarını, Kamandar.

“Mənsuru”nda Mənsur dara çəkilər,

“Zarıncı”da gözyaşları tökülər.

“Divanı”də xanimanlar sökülər,

Görmək olmaz əllərini, Kamandar.

Keçib gedir ömrümüzün karvanı,

“Misri”, “Cəngi” Koroğlunun fərmanı,

“Sarıtel”in xəstələrin dərmanı,

Çal, sevindir ellərini, Kamandar.

Hüseynqulu sazın-sözün vurğunu,

Eldən ayrı oldum elin yorğunu.

Zalım fələk belə qurub qurğunu,

Gəlib sorsan hallarımı, Kamandar.

DEYİL

Bu dünyanın etibarı

Heç kimsəyə qalan deyil.

Gələn gedər, gedən gəlməz,

Bu, bir haqdı, yalan deyil.

Başı qarlı uca dağlar,

Göy çəmənlər, barlı bağlar,

Nə yas saxlar, nə qan ağlar,

Bizi yada salan deyil.

Çox yalvarma gəl, namərdə,

O, nəşədə, sən kədərdə.

Namus, qeyrət itən yerdə

Haqq söyləsən, qanan deyil.

Uzaq dolan yekəbaşdan,

Şöhrətpərəst, qəlbi daşdan.

Hər fitnəsi yekə dastan,

Mərfət, hörmət qanan deyil.

***

Dəli Domrul, Əzrayılla güləşmə,

Arxasında Allahı var dağ kimi.

Min ev yıxır, yüz min qapı bağlayır,

Soruşan yox, işin gedir yağ kimi.

***

Duz-çörək kəsdiyim vəfasız dostun,

Əhdi-etibarı dilində imiş.

Fürsət ələ düşdü, arxadan vurdu,

Xəyanət xəncəri əlində imiş.

Məmmədəli Zəngin (Novruzov)

Məmmədəli Zəngin barədə məlumat

Olub

Ay həzərat, gəlin, məni dinləyin:

Sinəmin dağları, baxın, dörd olub.

Ürəyim köksümə, gör, sığışmayır,

Dünən xalqı çapan bu gün mərd olub.

Yaxşılıq deyilən daha heç oldu,

Səyriyən fərələr xoruz-beç oldu.

Quşların şahbaı bülbül necoldu?

Çəmənlər də bayquşlara yurd olub.

Dağların başına dumanlar çökür,

İllər həsrəti tək belini bükür.

Zənginin gözləri qanlı yaş tökür,

Özüm də bilmirəm, bu nə dərd olub.

Qismət eylə

Sənə qurban, ey Yaradan,

Pisi dara qismət eylə.

Müxənnət bağında açan

Gülü xara qismət eylə.

Görüm, qalsın yerdə yanı,

Od alsın, yansın peymanı.

Dostu dostdan ayıranı

Ahu-zara qismət eylə.

Məmmədəli istər bunu:

Tökülməsin insan qanı.

Ovçu tutsun ceyranını,

Yarı yara qismət eylə.

Qoşma (Şair Nəbiyə)

Qəflət yuxusundan oyanıb, indi

Bu gözəl günləri görəsən, Nəbi.

Bahar fəsli çöldə-düzdə açılan,

Ətirli güllərdən dərəsən, Nəbi.

Sözünün hər biri qızıldan baha,

Qoşurdun sözünü bu gün-sabaha.

Qəbrin üstə yalvarıram Allaha,

Təzədən dünyaya gələsən, Nəbi.

İçdin haqq əlindən sevgi badəsin,

Aşıqlar qorxurdu gələndə səsin.

Çağrılır məclisdə çox müxəmməsin,

Eşidib yaxından biləsən, Nəbi.

Məmmədəli, burda gülə bilmirəm,

Gözlərim yaşarır, silə bilmirəm.

Cavanam, çox şeyi bilə bilmirəm,

Mənə bir kamil dərs verəsən, Nəbi!

Mənimdi

Özündən dəm vuran ustad aşığam,

Geyərəm, yaşıllar-allar mənimdi.

Mərdin hərəsində namərd yatammaz,

Bəndləri tutaram, yollar mənimdi.

Mən bilirəm göyün yeddi qatını,

Çox namərdsən, tanıyıram zatını.

Sən yüz də eş ayağımın altını,

Xumar gözlü, ağzı ballar mənimdi.

Bir arif istərəm sözümü qana,

Tanıda Zəngini o, Gürcüstana.

Girmişəm meydana mərdi-mərdana,

Ataram şeşi-beş, xallar mənimdi.

Dünya

Əlindən Xudaya şikayətim var,

Kimini qaldırdın ucaya, dünya.

Kiminin gözündə gündüzə döndün,

Kiminin gözündə gecəyə, dünya.

Kiminin üstünə birdən çökürsən,

Kiminin gözündən qanlar tökürsən.

Hərdən qılıncını tərsə çəkirsən,

Baxmırsan düşgünə, qocaya, dünya.

Kimini yetirdin tükənməz vara,

Kimini namuraz qoydun məzara.

Kimini sail tək saldın avara,

Kimini döndərdin xocaya, dünya.

Kimini yarıtdın, eylədin xoşbəxt,

Kiminin üstünə atdın əziyyət.

Kimini ağlatdın, eylədin həsrət

Ataya, anaya, bacıya, dünya.

Kimini yurdundan tamam itirdin,

Kimini mətləbə, kama yetirdin.

Biçarə Zəngini cana gətirdin,

Dönübsən keçilməz bağçaya, dünya!

Məmmədəli Əlləzovun şeirləri

Məmmədəli Əlləzov haqqında

Yaylağa gəlin

Ətirli köynəyi əlvan yaxalı,

Lalənin bağrıdır üzündə xalı.

Deyirsən dağların döşü bir xalı,

Dolama yollar da naxışlardır.

Sinəsində çiçək, zirvəsində qar,

Sanki pəhləvandı dəbilqəsi var.

Əlində nizəsi-yalçın qayalar,

Döşündə qalxanı yoxuşlarıdır.

Güllərə qərq olub dərə, dağ, düzən,

Yamacda çobandır sürünü süzən.

Otların boynuna mirvari düzən,

Baharın inci tək yağışlarıdır.

Arandan qoynuna gələr qonaqlar.

Döşdə çiyələyə dönər yanaqlar.

Daşların dibindən sızan bulaqlar,

Talada ceyranın baxışlarıdır.

Doymaram

Ruhumdu “Ruhani”, saz havasında,

Kərəmi yandıran teldən doymaram.

Səngərin ətri var yaz havasında,

Çiçəkdən doymaram, güldən doymaram.

Eşqim qayaların şəlaləsidir,

Lalələr məhəbbət piyaləsidir.

Canım bu yerlərin pərvanəsidir,

Çəməndən doymaram, çöldən doymaram.

Ey könül, əzizdir eldə hər qarış,

Kül olub müqəddəs torpağa qarış.

Gəzərəm vətəni mən qarış-qarış,

Obadan doymaram, eldən doymaram!

Kəndimiz

Kəndimiz dağların qucağındadır,

Şirin laylasıdır həzin bulaqlar.

Yurdu babaların ocağındadır,

Bəlkə, babalardır elə bu dağlar.

Dərələr dərindir, zirvələr uca,

Şəlalə Koroğlu nərəsi kimi.

Göylərə yüksələn qayalar haça,

İgid babaların nərəsi kimi.

Kəhraba zəmilər, göy biçənəklər,

Dağların döşündə, yaxasındadır.

Qışında solsa da, güllər, çiçəklər,

Ətri nənələrin yuxasındadır.

Dağların ətəyi yaşıl bağça-bağ,

Laçınlar yetirir suyu, havası.

Zümrüdə bürünmüş yamaclara bax,

Çoban dəyələri – qartal yuvası.

Sırğalı tənəklər eyvanı bəzər,

Aynabənd binalar daşlı, dəmirli.

Burda cavanlar da vələsə bənzər,

Burda qocalar da palıd ömürlü.

Ələddin Dəmirçinin şeirləri

Ələddin Dəmirçi haqqında

Elimizin çox dəyərli oğlu, hədsiz dərəcədə elinə, yurduna, təbiətə vurğun olan və elimizin sevimli şairi Oruc Nikbinə Ələddin Dəmirçi tərəfindən yazılmış şeir:

QAYIT ÖZ YURDUNA, ELİNƏ QAYIT!

Qayıt öz yurduna, elinə qayıt

Kəs bu ayrılığı, unut həsrəti,

Bülbüllər heç zaman, sevməz qəfəsi,

Elin nəfəsidir, şair nəfəsi,

Qayıt öz yurduna, elinə qayıt!

Sənsiz bu təbiət darıxır vallah,

Qıy vuran qartallar karıxır, vallah,

Yam-yaşıl meşələr soluxur, vallah,

Qayıt öz yurduna, elinə qayıt!

Sən gəzən dərələr, dağlar burdadı,

Çörəyə duz sap ye, verər bal dadı,

Özün şəhərdəsən, meylin yurtdadı,

Qayıt öz yurduna, elinə qayıt!

Onsuz da qəribdir, sənsiz bu dağlar,

Geri dön, qoy olsun, qəmsiz bu dağlar,

Ucalmaz dumansız, çənsiz bu dağlar,

Qayıt öz yurduna, elinə qayıt!

Gəlmir qayalardan kəkliyin səsi,

Sükuta qərq olub, Ballı dərəşi,

Binəsində qatarlaşmır dəyəsı,

Qayıt öz yurduna, elinə qayıt!

Qoyma darıxmağa, təkdir Təpəkli,

Enmir bulağına, beli səhənglı,

Gəzmir at belində, bığı eşməklı,

Qayıt öz yurduna, elinə qayıt!

Vurğunmu doğuldun?, Vətənə, elə,

Bir az canına bax, özünü gözlə,

Fəxrsən, dayaqsan, zənginsən sözlə,

Qayıt öz yurduna, elinə qayıt!

Susmuş bulaqların sözünü aç gəl,

Batmış çeşmələrin, gözünü aç gəl,

Yarıb biçənəkdən, izini aç gəl,

Qayıt öz yurduna, elinə qayıt!

Payız, qış taxtından yıxılan zaman,

Təbiət yaz havası, qoxuyan zaman,

Quşlar yuvasını toxuyan zaman,

Qayıt öz yurduna, elinə qayıt!

Dolan el içində, üzünü görək,

Mehriban baxışlı gözünü görək,

Gələn baharını, yazını görək,

Qayıt öz yurduna, elinə qayıt!

Baxacam yollara Səngər dağından,

Alacam müjdəni Gözəl dağından,

İçək Tənəklinin gur bulağından,

Qayıt öz yurduna, elinə qayıt!

Aldı kitabını Alek Dəmirçi,

Oxudu, ağladı, göynədi içi,

Bütün el gözləyir Nikbin Orucu,

Qayıt öz yurduna, elmə qayıt!

Dəmirçi Alek

Hamlet Kazımoğlunun şeirləri

Hamlet Kazımoğlu haqqında

Hamlet Kazımoğlu demişdir:

* Səbrim ömrümdən uzundur.

* Məni sevgimdən tanıyacaqlar.

* Yaşamağın dadını gördüm, yolunu tapmadım.

* İçində yer saxla mənə, öləndə Vətəndə ölüm.

Yaman qəribsəmişəm

Yaman qəribsəmişəm,

Heç bilmirəm neyləyim?

Buludları yerə töküm

Yağışlar tərsinə yağsın

Ağaclar kökündən bar versin

Dünyanı baş-ayaq eyləyim.

Yaman qəribsəmişəm,

Heç bilmirəm neyləyim?

Bir həsrət çəkim

Bir vüsal var ona yetim,

Bir az dəlilik edim

Cavanlıq keçirim

Lap gözümü yumub evlənim.

Yaman qəribsəmişəm,

Heç bilmirəm neyləyim?

Bir siqaret yandırım

Fikrim dumanlansın,

Vaxtım keçsin

Bir az külqabıyla əylənim.

Yaman qəribsəmişəm,

Heç bilmirəm neyləyim?

Şeir yazmaqdan bir şey çıxmadı,

Bu şeiri heç kim oxumadı,

Gedim Allahın yanına

Bir əməlli sənət öyrənim.

(1995)

Mən azadlığam, sən -Bayraq

Gülüm, azadlıqdan məstəm,

Tut əlimdən ötüb gedək.

Uzundonlu bayraqların

Ətəyindən öpüb gedək.

Gözüm qanlı üfüqlərdə,

İçimdən sonsuzluq keçir.

Göz yaşı qurtuluş deyil,

İçimdən qansızlıq keçir.

Mən azadlığam sən – Bayraq,

Gülüm, dərdimiz tən qalsın.

Gəl, ikimiz qucaqlaşaq,

Vətən elə Vətən qalsın!..

Təcnis

Gözəlliyin ilandilli odunda,

Sən ki mənim ürəyimi əritdin.

Üz tutacaq qibləm, yönüm qalmadı,

İndən belə yandır iman, ərit din.

Məndən ötrü gəlin də sən, a qız da,

İkimizik gəzən dildə, ağızda.

İçdən qopan ahı tutmaz ağız da,

Onu qaynar dodağınla ərit, din.

Üzün açıb demə: bahar, yazıq ki,

Qaralarla bəxtim yazıq-yazıq ki.

Kazımoğlu, təkcə sənə yazıq ki,

Ər tapıldın, itəndə də ər itdin.

Məni tap

Orda mənim qəbrim… bunu bir haqq san,

Hamı gəlib-gedir, sən isə yoxsan.

Gəlib mən ölmüşə bir sən də baxsan,

Gözümü yummuşam, gəl asanca tap.

Ömürdü odunda çox üşümüsən,

Gündü – göy əsgili günə düşmüsən.

Ev-eşiyə necə isinişmisən? –

Tökülsün göz yaşın, gözlərini qırp.

Sağ olsam neynirəm sənə söz deyəm,

Bəlkə heç olmazdın belə gərəyim.

Daha torpaq olub mənim kürəyim,

Barmaqların uzun…kürəyimi çırp.

Əli Səngərli : Fanaram mən

(Hamlet Kazımoğlunun xatirəsinə)

Tüstülənən fanaram mən,

Gecə-gündüz yanaram mən.

Yaradanı qınaram mən,

Vaxtsız ölənlər görəndə.

Heyrət qorlanar canımda,

Əllərim qalar yanımda.

Yanar gözümdə qanım da,

Vaxtsız ölənlər görəndə.

Ağ saçımın teli sanı,

Qarğıyaram Yaradanı.

Özüm tək ağlayan hanı,

Vaxtsız ölənlər görəndə…

28.04.2001 .

c Nikbinin (Əlizadənin) şeirləri

Oruc Nikbin (Əlizadə) barədə məlumata və yazdığı kitablar haqqında buradan tanış ola bilərsiniz.

DÜNYA

Gözəllik eşqiylə dolanan insan,

Haxdan bəzədilmiş gəlindi dünya.

Yaradan nəqşini elə çəkib ki,

İncidi, gövhəri – ləlindi dünya.

Alim – üləmalar fani dedilər,

Yığmayıb zər – para nə var yedilər.

Acını kim istər, şirin dadılar,

Qismətin varsa da, balındı dünya.

Dünya möcüzəli – hanı fironlar?

Atilla, Teymurləng – ulu xaqanlar.

Məşriqdən Məğribə saldı talanlar,

Demə İsgəndərin, Zalındı dünya.

Fələk fürsət verir nadana, neylək,

Qartalın "postunu" qəsb edir leylək.

Kimə zirvə gərək, kiməsə çaylax,

Zənn etmə aslanın, filindi dünya.

Bir adam tapın ki, dünyadan doya,

Az-azdı şükr edən verilən paya.

Yetişdi axırın, yetən yox hoya,

"Gedər – gəlməz" olan yolundu dünya.

Nikbin, özün gözlə, canı saxla saz,

Ye, iç, kefini çək, qalma namuraz.

Necoldu Süleyman, sənə də qalmaz,

Sonu bil ölümdü itimdi dünya.

03. 01. 2008

FAXRALI

Əziz dostum elimizi soruşdu,

Hamı deyir, ağır eldi Faxralı.

Babulardan miras qalıb bizlərə.

Qonaqpərvər, əhli-haldır Faxralı.

Bir yanı Daşkəsən, bir yanı Ləlvər,

Ortada göylərə ucalır Səngər.

Gözəl dağı Ərafata bərabər,

Gözün doymaz bir mahaldı Faxralı.

Keçmişdə ad qoyub gedən kişilər,

Qalan qocaların da üzündə nur var.

İsmətli gözəllər, igid cavanlar,

Var zatında, əsli zaldır Faxralı.

Əmrah, aşıq Söyün, Kamandar özü,

Orada ehtiyatla çalıblar sazı.

Hələ itməyibdir Vurğunun izi,

Şenlik gəzən meşə, çöldü Faxralı.

Faxralı cənnətdi qışda, baharda,

Xəyal orda gəzir, olsam da harda.

Canım qurban olsun o gözəl yurda,

Deməyin Orucsuz qaldı Faxralı.

GÖRƏYDİM

Gözəldağı, gözlərinə qurbanam,

Yastanadan yal aşanı göyərdim.

Dərə yolu uğuruma yüyürə,

Göz bulağı dolaşanı görəydim.

Burda itdik toz-dumanm içində,

Ömür uman bir amanm içində.

Xəyal uçur yüz gümanın içində,

Könül istər, el-obam görəydim.

Uğuruna bir mətəris bil dağı,

Ha çırpınsın, üşüdəmməz yel dağı.

Qarabulaq, Kollu quzey, Til dağı,

Əl eləyir, yol çaşanı görəydim.

Qızılqaya – qaçaqların səngəri,

Qara dağdı yolçuların ləngəri.

Axşamüstü görər-görməz Səngəri,

Dilə gəlib söz qoşanı görəydim.

Zəmzəm sulu Qoşa bulaq de hanı,

Anam olub 0 da çalıb laylamı.

Şimşək çaxa, bulud tuta səmanı,

Dərələrdə sel daşanı görəydim.

Səhər tezdən mal çıxanda örüşə,

Göy üzündən bərəkətim sürüşə.

Xuruşdular balta çala göyrüşə,

Yaş axıdan kəhkəşanı görəydim.

Oruc, burda Vətən deyib ağlaram,

Bu həsrətlə ürəyimi dağlaram.

Ümidimi sabahlara bağlaram,

El adına şərəf-şanı görəydim!

Bakı, 01.02.1988

YURD YERİ (Dostum Qazaxlı Səmədə ithaf)

Faxralıda sinəmizi dağladın,

"Yurd yeri"ni yada salıb çağladın,

Dərdin, qəmin yollarını bağladın,
Qəhərlənmə, dostlar olar pərt, yeri,
Bu halımda “Yurd yeri” çal, “Yurd yeri”.
Mərd babalar qoyub təməl daşını,
Kəc baxanlar bada verib başını.
Şimşək çaxar, bulud tökər yaşını;
Faxralıdı əzəl-başdan mərd yeri,
Bu halımda “Yurd yeri” çal, “Yurd yeri”.
Demirsənmi gözü yolda qalan var,
Bulud kimi boşalan var, dolan var.
Hər yazbaşı bizi yada salan var;
Gəl dolaşaq Xəmməddini, Səngəri,
Bu halımda “Yurd yeri” çal, “Yurd yeri”.
Yastananı asta-asta aşarsan,
Təhməz kimi qaynarsan, coşarsan,
Palıddıda bir gəraylı qoşarsan;
Şenlik gəzib, biz də gəzək sərt yeri,
Bu halımda “Yurd yeri” çal, “Yurd yeri”.
Qoyma qəhər Tənəklini təkləsin,
Çəmənini qarış-qarış ləkləsin.
Ağrı-acı ömrümüzü yükləsin;
Gəl sovuşsun qada yeri, dərd yeri,
Bu halımda “Yurd yeri” çal, “Yurd yeri”.
Söykək olsun sözümüzə sözümüz,
Dayaq dursun közümüzə közümüz.

İşıq versin gözümüzə gözümüz;

Oruca da Faxralıdı and yeri,

Səməd qağa, “Yurd yeri” çal, “Yurd yeri”.

## SINANAN DOSTLARA

Dostluğa möhkəməm qanan çağımdan,

Hər kəsə meyl etdim dost sorağınnan.

Bir tikə çörəyi təkcə yemədim,

Dostumla bölüşdüm, heç yox demədim.

Deyirlər dar gündə dostunu sına,

Arxada durmasa sən onu qına.

Sınadıq… yalanmış dostluğun adı,

Dar gündə dostluqdan əsər qalmadı.

İllərlə duz-çörək kəsdiyim insan,

İndi acı yeltək keçir yanımdan.

Nə ki varım vardı məclislər qurdum,

Dostlar sağlığına badələr vurdum.

Sən demə harammış, o duz-çörək də,

Qurdlar oynaşırmış həmin ürəkdə.

Elimdə olsa da hörmət-izzətim,

Dostluqda yoxuymuş demək qismətim.

Dövrandı dəyişər heç belə getməz,

Alçaqlar bağında qanqal da bitməz.

Namərd dostdandısa mərd düşmən tanı,

Çağır köməyinə sirri xudam.

Daha gec də olsa, sən bel bağlama,

Hatəmsən, qəlbini bunca dağlama.

Cahanda çox olub bivəfa dostlar,

Haqq özü şahiddi, özü aralar.

Bivəfa dostlara etsən də nifrət,

Vəfalı olana eylə min hörmət.

Vəfasız kəslərdən gözləmə illac,

Bu göz də, o gözə olmasın möhtac.

Oruc: bu sinnində sınaqlar gördün,

Səbr eylə, sıxılma, artırma dərdin.

YAŞAMAQ İSTƏYİR, İNSAN YAŞAMAQ

Nə qədər zillətdə olsa da, inan,

Yaşamaq istəyir, insan yaşamaq.

Son nəfəs-huşsuzdu, o versə də can,

Yaşamaq istəyir, insan yaşamaq.

Adam var, illərdi yorğan döşəkdə,

Sanasan dili yox, qalıb bələkdə,

Nələri düşünür, yarəb ürəkdə?

Yaşamaq istəyir, insan yaşamaq.

Dəryada tək qayıq, tufan da qopar,

Fırtına, qasırğa qayığı yıxar,

Dalğalar qoynunda çarə axtarar,

Yaşamaq istəyir, insan yaşamaq.

Ümidsiz kəslərə saldıqca nəzər,

Nikbinə bədbinlik, eyləyir əsər

Son anda geməyin dünyadan küsər

Yaşamaq istəyir, insan yaşamaq ,

03. 02. 2013

TEYMURAZ

Tanındın layiqli bir loğman kimi,

Fəqət öz canına illacın hanı?,

Əzrayıl yolunu vaxtsız kəsdimi?

Qərq etdi torpağa gözəl insanı.

Şəfalı gözlərin bir baxış ilə,

Dinməz körpələrin dərdin bilərdi.

Yoxlardm cismini əllərin ilə,

Körpə gözün açıb üzə gülərdi.

Neçə kədər basmış analar gördün,

Balası qucaqda, ağlar qalmışdı,

Sağalmaz körpəyə sən həyat verdin,

Atası quş kimi qanad çalmışdı.

“El gözü tərəzi” – loğman dedilər,

“Peyğəmbər övladı” – ey nəcib insan,

Yaş töküb üstündə can-can dedilər,

Mümkünmü?, çıxalar yaxşılığından.

Qoynunda böyütdü Faxralı eli,

Sənintək övladı tapılar az-az,

Orucun güzünnən axır yaş seli,

Səni unudarmı, əziz Teymuraz?

10.05.2002

Səməndər Eyvaz oğlu Məmmədov

Səməndər Məmmədov barədə məlumat

Səməndər Məmmədov: “Səngərim…” şeiri

KİTAB TUTMAZ MİN DASTANIM, FAXRALI

Vurğun könlüm pərvanədir başında,

Canımdan da əziz canım, Faxralı.

Həyatım, varlığım, zövqüm, kamalım,

Səcdəgahım, din-imanım, Faxralı.

Qızılqaya, Böyükgüney, Qaradağ,

Səngərimdə əriməyən qara bax.

Dağlarında “Cəngi” çalır hər bulaq,

Ömrümdə mənalı anım, Faxralı.

Eşqinlə çırpınır könlümün səsi,

Oylağım, yuvamsan, Möylə dərəsi.

Səndədir, ceyranın, cüyürün dəsi,

Yerim, göyüm, asimanım, Faxralı.

Bu torpaqdı sazın, sözün mahalı,

Hər çəməni, hər talası bir xalı.

Dağları var yapıncılı, çalmalı,

Kitab tutmaz min dastanım, Faxralı.

Mirzə Rzam, Mirzə Həbim, Gül Pərim,

Hümmət, Musa kimi kəsərli ərim,

Telli sazda həm zilimsən, həm bəmim,

Nəbim kimi gövhər-kanım, Faxralı.

Məməşoğlu İsrafilin ər idi,

Əli Bayramoğlu eldə bir idi.

Məhəmmədin ocaq idi, pir idi,
Sədrəddinim, həm Aslanım, Faxralı.
Əli Xəlil el hörməti qazandı,
Bütöv oldu, uca tutdu düz andı.
El üçün yaşadı, el üçün yandı,
Adıbəlli şöhrət-şanım, Faxralı.
Hümbət oğlu Qara idi ziyalı,
Belə oğlu unudarmı Borçalı.
Canpoladın tökməbədən, arxalı,
Hüseynqulum, Şəmistanım, Faxralı.
Gözəllərin heç solmayan çiçəkdir,
Loğmanların milyonlara köməkdir.
Şamilin var, ölkələrə gərəkdir,
Ulusum, sultanım, xanım, Faxralı.
Övladların alnıaçıq, üzüağ,
Tarixində çox Namazlar qalacaq.
Vəzirlərin zaman-zaman olacaq,
İncim, dürrüm, zər-nişanım, Faxralı.
Qartalqonmaz dağlarını anıram,
Sönməmişəm, qucağında yanıram.
Səngərimdə duruş tapan mamıram,
Əzəl andım, son məkanım, Faxralı.
Ağır elsən, Borçalıda adın var,
Yananın var, yamanın var, yadın var.
Səməndərə həyat verən odun var,

Od tutub odunda yanım, Faxralı.

SƏNGƏRİM

Tarix yatır torpağında, daşında,

Ağsaçlı dağlardan qoca Səngərim.

Qoymaram tapdaya yad ellər səni,

Elimin, obamın tacı Səngərim.

Yüksəkdəsən qəm-qüssədən qəhərdən.

At üstəsən, düşməmisən yəhərdən.

Dosta dostsan, düşməninə zəhərdən

Daha da acısan, acı, Səngərim.

Faxralıda Səməndərə qalasan,

Sinən üstə nəyin varsa qala san,

Arzum budur qaldığıntək qalasan,

Möhtəşəm Səngərim, uca Səngərim.

ŞAMİLİM (Şamil Qurbanovun "Nəriman Nərimanov dünyası" kitabını oxuyarkən)

"Alimlik, insanlıq yüzdə birdədi",

Onların içində birdi Şamilim.

El bilir, o, elmin zirvəsindədi.

Ocaqdı Şamilim, pirdi Şamilim.

Girmədi heç zaman gündə bir dona,

Ömər, Cəmaləddin, Həmzət bəy, Sona,

Məmmədəmin şandı, şöhrətdi ona,

Nəriman incidi, dürdü, Şamilim.

Bəhrəsi hardadı, özü ordadı,

Söhbəti ordadı, sözü ordadı.

Odu içindədi, közü ordadı,

Hələ açılmamış sirdi Şamilim.

## GÖZƏL DAĞI

Doğma Faxralımın

Tacıdır Gözəl dağı.

Ağsaçlı Səngərimə

Bacıdır Gözəl dağı.

Yazda çən olar başı.

Çiçək bitirər daşı.

Bəlli deyildir yaşı,

Qocadır Gözəl dağı.

Cığırlar misra-misra,

Bənzəyir qırışlara.

Baş çəkir buludlara,

Ucadır Gözəl dağı.

## ALLAH SAXLASIN! (Nurlu kişinin işıqlı övladı Arif Aslanoğlu Alməmmədliyə)

Mayan halallıqdı, ay dayım oğlu,

Belə qazanıbsan hər bir uğuru.

Gedirsən açılan qollara doğru,

Mərhəmətin bulaq kimi çağlasın,

Allah səni pənahında saxlasın.

Ağır eldə oğullardan birisən,

Əzəmətsən, əyilməzlik sirrisən.

Söykökünün ocağısan, pirisən,

Mərhəmətin bulaq kimi çağlasın,

Allah səni pənahında saxlasın.

Ömrünün yaz çağı, bahar çağıdı,

İlqarın, vüqarın Gözəl dağıdı.

Qəlbin insanlara Hatəm bağıdı,

Mərhəmətin bulaq kimi çağlasın,

Allah səni pənahında saxlasın.

Adınla ucasan, adını qoru,

İçin də, çölün də durudu, duru.

Yaradan veribdi sənə bu nuru,

Mərhəmətin bulaq kimi çağlasın,

Allah səni pənahında saxlasın.

“Yaşamaq yanmaqdır” – yanan qalacaq,

Məhəbbət, sədaqət, ad-san qalacaq.

Səməndər, anılan, anan qalacaq.

Mərhəmətin bulaq kimi çağlasın,

Allah səni pənahında saxlasın.

DÖZƏ BİLMƏDİ (Uğurlu Hüseynovun əziz xatirəsinə)

Yarat, sən köçəndə ellər söyləsin:

Dünyadan nə gözəl bir insan gedir.

M.RAHİM

Rəhbər oldu, eldə hörmət qazandı,

Düz oldu ilraqı, düz oldu andı.

Heç incik salmadı bircə nəfəri,

El-oba yolunda şam kimi yandı.

Ömür yollarında boşaldı, doldu,

Həyatda amalı halallıq oldu.

Başıuca, alnıaçıq yaşadı,

Xalqın da gözündə daim ucaldı.

Fərmanın dağına dözə bilmədi,

Onsuz gen dünyada gəzə bilmədi.

Qardaş itkisi də əydi qəddini,

Dərd üzdü, o, dərdi üzə bilmədi.

GETDİ (Mahal Əliyevin xatirəsinə)

Xəbər gəldi, dəhşət bizi bürüdü:

Mahal getdi – artıq yoxdur həyatda.

El-oba ağlayıb yandı, yaxıldı,

Ağı deyib yaş axıtdı həyat da.

Vətənimin el oğlu, el balası,

Yaşadı hörmətli, yaşadı adlı.

Dünyanı həm görür, həm də bilirdi,

İnsanlıq həyatda ən böyük addı.

Saflığa tapınıb, nəcib yaşadı,

Elinə vurulub, elini andı.

Mərifət ucalıq, mərifət tacdı,

Tacı, ucalığı özü qazandı.

Nurlu simasını görməyən oğlu,

Sönməz ocağını yandıracaqdır.

Uca tutub atasının adını,

Soyuna, kökünə nur saçacaqdır.

ƏR OĞLU

CANPOLAD BUDAQOV! Bu ad artıq dünya idmançıları arasında qürur və şərəflə çəkilir. Müstəqil Azərbaycanımızın üçrəngli bayrağını ilk dəfə dalğalandıran idmançımızdır Canpolad Budaqov. Azərbaycandan uşu üzrə ilk Avropa çempionu və dünya çempionatının ilk gümüş medal mükafatçısı da Canpoladdır. Üçqat dünya Çempionu C.Budaqov doğulduğu ocağın, Faxralının, Borçalının, Azərbaycan və türk dünyasının fəxridir.

Uzaq Çində keçirilən bu çempionatda Canpoladın əsas rəqibi Aram Markaryana böyük üstünlüklə qalib gəlməsi azərbaycanlılarda, xüsusən, borcalılarda böyük qürur hissi doğurmuşdur.

Hər tərəfi ocaq, pirdi yurdumun,

Sözü bütöv, ağzı birdi yurdumun.

Oğulları bəbir, şirdi yurdumun,

Qarı düşmən, oğulu gör, nər oğlu,

Poladcanlı Canpoladı, ər oğlu.

Borçalıda Səngərimdən güc alıb,

Döyülməyib, döyə-döyə ucalıb.

Döyüşüylə uzaq Çinə səs salıb,

Qarı düşmən, oğulu gör, nər oğlu,

Poladcanlı Canpoladı, ər oğlu.

Dağ oğludu, dağtək durdu Pekində,

Qartal kimi bir qıy vurdu Pekində,

Qalib gəldi Uşu yurdu Pekində.

Qarı düşmən, oğulu gör, nər oğlu,

Poladcanlı Canpoladı, ər oğlu.

DİNDİR (Söhbəddin müəllimə)

Könül havadarım, qardaş, a qardaş,

Köklə telli sazı çək zilə, dindir.

Gəlsin oğuz oğlu tügyan eyləsin,

Car eyiə “Cəngi”ni sən elə, dindir.

Bu dağların ən ucası sazında,

Bəzirganı, həm xocası sazında.

Yurdumuzun lap qocası sazında,

Necə yaşayırsa bax, elə dindır.

Sazda gəzən barmaqların birdi, bir,

Barmaqların gəzişməsi sirdı, sirr.

Donmuşam yerimdə, olmuşam əsir,

Gətir Səməndəri sən dilə, dindir.

İMDAD (Aşıq İmdad Səmistan oğluna)

Köklə sazı, bir "Mansırı" çal görək,

Ünün yetsin dağa-daşa, ay İmdad.

Elnən durub, elnən nəfəs alırsan,

Tale verən paydı, yaşa, ay İmdad.

Faxralıtək ağır eldi dirəyin,

İçi-çölü durulardı köməyin.

Köksünə sığmayan böyük ürəyin

Hər zaman atdana, coşa, ay İmdad.

Səməndərəm, sazı ruhum bilmişəm,

Yurd-yuvamdı, ona könül vermişəm.

Tanıyandan səni belə görmüşəm,

Sözə bağlı, sazla qoşa, ay İmdad.

MÜRSƏL ƏMİ (Asıq Mürsəl Faxralıya)

Ağır-ağır toylar yola salardı,

Saz çalar, söz qoşar, nəmər alardı.

Saç-saqqalı bu yollarda ağardı,

Mürsəl əmi ipək kimı kişiyidi,

Xeyirxahlıq əməliydi, işiydi.

Dağlar onun oylağıydı-oylağı,

Addım-addım gəzərdi hər yaylağı,

Cənnət idi ona “Cənnət bulağı”.

Mürsəl əmi ipək kimi kişiyidi,

Xeyirxahlıq əməliydi, işiydi.

Yay oldumu, yaylaqlardan enməzdi,

Bir kimsənin toyğuna kiş deməzdi,

Ömrü boyu haram tikə yeməzdi,

Mürsəl əmi ipək kimi kişiydi,

Xeyirxahlıq əməliydi, işiydi.

SƏCDƏGAH OLDU (20 yanvarda şəhid olmuş Faxralı balası İLQAR HÜMBƏT oğluna)

Yenə matəm içindədir ağsaçlı Səngər,

Qoynuna ilqarlı İlqarı gəlir.

Şax dayan, a kəndim, bil ki, oğlunu

Bütün Azərbaycan öz oğlu bilir.

Doğma Bakımızda adı başdadır,

Adı da, andı da dillərdə əzbər.

Canını yurduna qurban eylədi,

Belə bir oğula varmı bərabər?

Möhtəşəm xalqımın qartal balası,

Ağılarda nalə oldu, ah oldu.

Uca tutdu Borçalının adını,

Torpağa qarışıb səcdəgah oldu.

DAĞLAR (Əmioğlu dəmirçi Ələddin Mıısa oğluna)

Axa-axa durulmuşam,

Qucağında özüm, dağlar.

Çeşmən üstə diz çökmüşəm,

Güc alıbdı dizim, dağlar.

Nur çiləyir gün düzünə,

Yaraşıqdı gül üzünə.

Yol salıbdı el düzünə,

Yolum dağlar, izim dağlar.

Ömür keçir bala-bala,

Ölüm baxmır vara-hala.

Səməndərə ocaq ola,

Odum dağlar, közüm dağlar.

ATADIR (Faxralı toponomik yer adlarının mahir bilicisi, el şairi, hörmətli müəllimim İsmayıl Güllərə məktub)

Zəhmində ildırım çaxarı vardır,

Qismətim, çörəyim, duzum atadır.

Odur əyilməyən sərt qayalartək,

Dönməz əqidəli, dözüm atadır.

Ömrümün sultanı, ömrümün xanı,

Təmizdi əməli, pakdı vicdanı.

Qeyrətdən yoğrulmuş canımın qanı,

Sinəmdə çağlayan sazım atadır.

Elin tarixidi, elin yaşıdı,

Ailə üzükdü, ata qaşıdı.

Qartaldı, oylağı dağlar başıdı,

Ləlvərdə açılan gözüm atadır.

Qurub-yaradandı, hesabı çəksən,

Çıxdaşdı, kim salsa onu nəzərdən.

Ərdilər, özləri törəyib ərdən

Ən şirin söhbətim, sözüm atadır.

Meydanında kim at sürər, söylə, kim,

Kərəmim, Xətaim, ulu Babəkim.

Kəpəzim, Murovum, dumanlı Ərkim,

Şahdağım, Səngərim, Bəzzim atadır.

Andımdı: yanında ağ olsun üzüm,

Yerişim, duruşum, nur alan gözüm.

Səməndər, yaylağım, çəmənim, düzüm,

Oduna yandığım közüm atadır.

BALA (Müəllimim İsmayıl Güllərin cavab məktubu)

Səməndər, belədir diləyim mənim,

Kişitək yaşasın, qocalsın bala.

Oğullar atanın gələcəyidi,

Atanın başında tac olsun bala.

Sən özün oğulsan, mən də bir ata,

Səni mən öyrədib atdım həyata.

Şükür ki, çatıbsan belə büsata,

Şair meydanında bac alsın bala.

Nəbinin nəvəsi, Faxralı eli,

Yaşasın, yaratsın, var olsun əli.

Kitablar bağlasın, sevinsin eli,

İstərəm hər yerdə ucalsın bala.

Oğullar atanın göz nurasıdı,

Oğullar atanın göz qarasıdı,

Oğullar atanın yurd-yuvasıdı,

Tacını verməsin, tac alsın bala.

Beş yüz əlli addan ilham almışam,

Səksən üç baharı yola salmışam,

İsmayıl Güllərəm, ta qocalmışam,

Özündən güclüdən güc alsın bala.

ÇƏRÇİ QIZI

Qızılqaya binələrdən başadı,

Büloylüklə, Armudluyla qoşadı.

Çərçi qızı sinəsində yaşadı.

Eymənib kimsəni salmadı saya,

Halal olsun belə igid anaya.

Vurğun idi obasına, elinə,

Yalan-palan heç gəlmədi dilinə.

Xəncər taxıb, tüfəng aldı əlinə,

Söz də qoşdu göydə uçan durnaya,

Halal olsun belə igid anaya.

Yonubəri, Böyükgünöy, Qaradağ,

Almalıxda almaya bax, nara bax.

Şadlanardı görcək onu hər budaq,

Bəzək idi hər məclisə, hər toya,

Halal olsun belə igid anaya.

Şalvar geydi, şinel geydi əyninə,
Qanad çaldı qardaşının yelinə,
Yağıları heç almadı eyninə.
Haylayanda tez gələrdi haraya,
Halal olsun belə igid anaya.
Unutmuşdu vahimənin daşını,
Hey kəsərdi gədiklərin başını,
Gözləyərdi Ortayalın qaşını.
Nigartək yaşadı, yetişdi hoya,
Halal olsun belə igid anaya.
Keçiqıran, Divsiz idi oylağı,
Asırğallı, Kürənyalı yaylağı.
Dirilik suyudu Cənnət bulağı,
İstərdi hər zaman coşa, qaynaya,
Halal olsun belə igid anaya.
Bəyənmişdi Xan Kərəmi, Lələni,
Aşdı at belində yüz dağ, dərəni,
Keçilməz yerlərdən keçdi köhləni.
Baxmaz idi nə sel-suya, nə çaya,
Halal olsun belə igid anaya.
Dağların sultanı, dağların bəyi
Dəllək İsmayılın qəlbi, dirəyi.
El-el danışıldı onun çörəyi,
Zəhməti heç zaman getmədi zaya,
Halal olsun belə igid anaya.

Həssas idi həm haraya, həm küyə,

Mat qaldılar onda olan ürəyə.

Kişi kimi at da sürdü sürəyə,

Kim vurulmaz bu hünərə, bu soya,

Halal olsun belə igid anaya.

Hər yaylaqda, hər bulaqda izi var,

Ürəklərdə söhbəti var, sözü var,

Ocağında heç sönməyən közü var.

Ona heykəl olub o Qızılqaya,

Halal olsun belə igid anaya.

Düz oldu binadan sözü, əməli,

Qeyrət idi bünövrəsi, təməli,

Düşmədi dilindən "Allah", "Ya Əli".

Analarımız kaş beləcə qarıya,

Halal olsun belə igid anaya.

Ay Səməndər! Nənən dillərə düşdü,

Adı zaman-zaman illərə düşdü.

Hünəri ellərdən-ellərə düşdü,

Yayıldı mahala, elə, obaya,

Halal olsun belə igid anaya.

GÜLƏNDAM (Aldandığı nadürüstü bağışlamayan, onun papağını, atını və tüfən¬gi-ni ata ocağına gətirən igid nənəm pəhləvan Güləndam Baytallıya ithaf olunur)

Şir ürəkli, şir biləkli gözəli,

Bir görün, aldadıb hara verdilər?

Kim qol qoydu bu sevdaya, görəsən?

Görməzə-bilməzə, vara verdilər.

Darılmadı, möhkəm durdu Güləndam,

Bu qurğuya zərbə vurdu, Güləndam.

“Başıma açılan işə bax”, – dedi,

Od qoy bu ocağa, yandır-yax dedi,

Gecənin birində “ya Allah” – dedi,

Xalqımızın pəhləvanı, ər qızı,

Faxralıtək ağır elin nər qızı.

Kişi kimi atlı gəldi Güləndam,

Qisas alıb, adlı gəldi Güləndam,

Əldə tüfəng, odlu gəldi Güləndam,

Xalqımızın pəhləvanı, ər qızı,

Faxralıtək ağır elin nər qızı.

Aldanışla banşmadı, öc oldu,

Qarşı tərəf qarşısında heç oldu,

Vətənində yenilməyən güc oldu,

Xalqımızın pəhləvanı, ər qızı,

Faxralıtək ağır elin nər qızı.

Minnət üçün gələnlər çox dirəndi,

Gördülər ki, igid nənəm ərəndi.

Şərt qoymuşdu, qoyduğu şərt ödəndi,

Xalqımızın pəhləvanı, ər qızı,

Faxralıtək ağır elin nər qızı.

FAXRALININ QARAGÖZLÜ QIZLARI (Güləndam pəhləvan, Matış qarı, Balaxanım Çərçi qızı, Nənni Babaş qızı, Əsli Əlləz qızı, Fatma Molla qızı, Yetər Bayram qızı, Balaxanım Məşədi Söyün qızı kimi adlı-sanlı və qəhrəman qadınlarımızın rəmzi nəvə-nəticələrinə)

Dəstə-dəstə gül bəsləyər gül əllər,

Qismət olmur hər yetənə gül əllər.

Ömrü boyu şadlanarlar, gülərlər,

Faxralının qaragözlü qızları,

Elimizin sazlı-sözlü qızları.

Gözlərindən dağ alışar, dağ yanar,

Gəzməsələr, bağça yanar, bağ yanar.

Namusuna, ismətinə sığınar

Faxralının qaragözlü qızları,

Elimizin sazlı-sözlü qızları.

Qoşabulaq dillərində bal dadır,

Barmaqları ilmə-ilmə şaldadır.

Çoxusunun gözü hələ yoldadır,

Faxralının qaragözlü qızları,

Elimizin sazlı-sözlü qızları.

Dolaşdılar söhbətimdə, sözümdə,

Adlarıyla fəxr elədim özüm də,

Hara getsəm, gedəcəklər gözümdə,

Faxralının qaragözlü qızları,

Elimizin sazlı-sözlü qızları.

Səməndərəm, yar yolunda yanaram,

Sanmayın ki, etibarı danaram.

Sizi eşqin qızıl tacı sanaram,

Faxralının qaragözlü qızları,

Elimizin sazlı-sözlü qızları.

YA QİSMƏT

Görüşünə Qızılqaya, Qaradağ,

Bir də gələm, ya gəlməyəm, ya qismət.

Sevincimi, Qoşa bulaq, səninlə,

Bir də böləm, ya bölməyəm, ya qismət?!

Dolaşmışam qarış-qarış hər düzü,

Aramışam addım-addım o üzü.

Gözəl dağdan bənövşəni, nərgizi,

Bir də üzəm, ya üzməyəm, ya qismət?!

Cənnət bulaq, Ördəkli göl, Yastana,

Tərifiniz sığışarmı dastana.

Çox içmişəm Qırxbulaqdan, ay sona,

Bir də içəm, ya içməyəm, ya qismət?!

Dəli könlüm, xeyirxah ol, kara çat,

Hicranı at, vüsala çat, yara çat.

Hacıxəlil ocağına köhlən at,

Bir də sürəm, ya sürməyəm, ya qismət?!

Çək yükünü, duman, kəsmə aranı,

Yaxşı görüm Qaraarxacı, Xramı.

Səməndər, Difsizi, Keçiqıranı,

Bir də gəzəm, ya gəzməyəm, ya qismət?!

ÖPÜRƏM, A DAĞLAR, ÖPÜRƏM SİZİ (İyirmi ildən sonra doğma dağlarımızı gəzdim və gözəlliyə meydan oxuyan göllərimiz Keçiqıranla Divsizdə əl-üzümü yuyub göz dolusu tamaşa elədim)

Qarşımda Difsizdi, Keçiqırandı,

Öpürəm, a dağlar, öpürəm sizi.

Ətəyi gül-çiçək, başı dumandı,

Öpürəm, a dağlar, öpürəm sizi.

Cənnətdə çağlayır Cənnət bulağı,

Damır damcı-damcı gülündən yağı.

Günəşdi ocağı, Aydı çırağı,

Öpürəm, a dağlar, öpürəm sizi.

Qucağında həniri var babamın,

Oğul olub, hünəri var babamın.

Cin deyiblər, çox sirri var babamın,

Öpürəm, a dağlar, öpürəm sizi.

Ulularım bu dağlarnan bir olub,

Dədələşib, Dədə olub, pir olub.

Yurd qoruyub, hər birisi şir olub,

Öpürəm, a dağlar, öpürəm sizi.

El deməkdən usanmadı Səməndər,

Can deyən dillərə candı Səməndər,

Alışdı odunda, yandı Səməndər.

Öpürəm, a dağlar, öpürəm sizi.

FAXRALI TOPONOMİK BAYATILARI

Haçaqayadı…

Yaşlı, qoca qayadı.

Türkün qeyrət rəmzidi,

Mərddi, uca qayadı.

Çal dağı,

Gül-çiçəyi bal dağı.

Başı ərşə çəkilib,

Baxça-bağdı ayağı.

Xurdacalar,

Sənətdi, xırda çalar.

Dağlar özü aşıqdı,

Sazını burda çalar.

Əli Xəlil bulağı,

Üstünə gəl yaz çağı.

Tamamlanmış kitabdı,

Tarixdi hər varağı.

Qara daşdı,

Həm tarixdi, həm yaşdı.

Oğulları mərd, mətin,

Qızları qara qaşdı.

Ocaq bulaq,

Qonağa qucaq bulaq.

Nur payla, nur gözlərə,

Qayna, bulaq, ax, bulaq.

Təhməz bulaq burdadır,

Büllur suyu bal dadır.

Qonağına qol açır,

Gözü hər vaxt yoldadır.

Qarabulaqdı,

Dərdə çara bulaqdı.

Gözəllərə seyrəngah,

İgidlərə oylaqdı.

Ballı dərədi,

Köhlən yallı dərədi.

Nələr görüb-götürüb,

Əhli-hallı dərədi.

Quru dərə,

Suları duru dərə.

Kəmər qayası inci,

Til yalın nuru dərə.

Kəmər qaya,

Qeyrət qaya, ər qaya.

Çən-dumandı çöhrəsi,

Buludu əmər qaya.

Qara qaya,

Baş çəkib hara qaya?

Qartallara yuvadı,

Düsməndi sara qaya.

Tənəkli bağça, bağdı,

Taledən günü ağdı.

Cah-cəlallı binədi,

Çicəyi baldı, yağdı.

Bu qaynayan Qarasu,

Qara bulaq, qara su.

Həsrətim quraqsıyıb,

Eylə dərdə çara, su.

Daşdı gəzdəkdi,

Pirdi, yaşdı gəzdəkdi.

Ərlər yola salıbdı,

Gözü yaşlı gəzdəkdi.

Qoşabulaq gurlayır,

Dodaqda buz bağlayır.

Yurduma “Cəngi” çalır,

Dil də deyib ağlayır.

Əzgillidi,

Moruqlu, əzgillidi.

Qayaları qalxandı,

Oxu alov dillidi.

Bu bulaq Möylə bulaq,

Harda var böylə bulaq?

Kimlər öpdü gözündən,

Gizlətmə, söylə, bulaq.

Asırğallıdı,

Yamaclıdı, yallıdı.

Qayaları eşmə bığ,

Çöl-çəməni xallıdı.

Bu bulaq Sarı bulaq,

Torpağın varı bulaq.

Dirilik paylayırsan,

Qızların yarı bulaq.

Gur bulaq,

Gözəllərə nur bulaq.

Qarşında diz cökənlər,

Dilər sənə sur, bulaq.

Nəzəroğlu bulağı,

Cənnətdi hər bucağı.

Gəl-gəl deyir uzaqdan,

Qiyamətdi qaymağı.

Keçiqıran buradı,

Üzü günə, nuradı.

Binə düşən sevinir,

Hasil olur muradı.

Dağ başında tüldü bu,

Çiçəkdi bu, güldü bu.

Adı Difsiz olsa da,

Mavi gözlü göldü bu.

Qaraarxacın yolu nur,

Sağı çəmən, solu nur.

Yamacınnan, yalınnan

Uşaqlığım boylanır.

Faxralıya hay düşüb,

Hay düşüb, haray düsüb.

Yaranışdan bu kəndə

Kişilikdən pay düşüb.

Gözəldağlı Faxralı,

Bağça-bağlı Faxralı.

Şöhrəti el-el gəzən,

Kefi çağlı Faxralı.

MİLLƏT SEVGİSİ

İçimdə boy verir bir çinar kimi,

Bir vətən sevgisi, millət sevgisi.

Əməli tarixdir, görənlər görür,

Bir vətən sevgisi, millət sevgisi.

Sığımayır qəlbinə odu, ocağı,

Müqəddəs, doğmadır vətən qucağı.

Yerindən oynadlr qalanı, dağı,

Bir vətən sevgisi, millət sevgisi,

Düzlərdən keçib, dağlardan aşır,

Tükənmək bilməyir, qaynayır daşır.

Nəğmətək beynində gəzib dolaşır,

Bir vətən sevgisi, millət sevgisi.

Canından çox sevir yurdu-yuvanı,

Qara torpaqdan alır ruhu, qidanı.

Onun həm qəlbidir, həm də ki, canı,

Bir vətən sevgisi, millət sevgisi.

Rəşid Faxralının seirləri

Rəşid Faxralı barədə məlumat

Bir qılıncdı bu Borçalı deyilən,

Bu qılıncın tiyəsidi Faxralı!

Söz meydanı bu obaya ad olub,

Keçmişini öyəsidi Faxralı.

İndilikdə – havam, suyum ölərsəm

Sümüyümün yiyəsidi Faxralı!..

Bu kənd – Faxralı

Uca dağdır, göy yaylaqdı,

Sıx meşədir, gur bulaqdı.

Odu sönməz bir ocaqdı,

Sehr dolu gözdür bu kənd.

Sığınıb söz çırağına,

Gəlməyib dost qınağına.

Tarixin çox sınağına,

Kişi kimi dözdü bu kənd.

Nifrəti gurdu bilənə,

Ocağı pirdi bilənə.

Hər sözünü zər bilənə,

Özü boyda sözdü bu kənd.

İlyas Namazovun seirləri

İlyas Namazov barədə məlumat

Faxralıdı

Harda olsam fəxr etmişəm, iftixarım Faxralıdı,

Alnıaçıq, başıuca – öz vüqarım Faxralıdı.

Eli atıb tutan bay olarmı bu dünyada,

Qəza gəlsə, dara düşsəm xilaskarım Faxralıdı.

Babam mənə miras verib bu laləzar torpaqları,

Qarş-qarış qismətimdi – dövlət-varım Faxralıdı.

Bahar gəlib, ətirlənib seyrəngahım bulaq üstə,

Kef məclisi qurulanda yoldaş, yarım Faxralıdı.

İlyasam, candan keçərəm yolunda bu gözəl yurdun,

Qeyrəti mən buran aldım, namus-arım Faxralıdı.

Həzi Həsənlinin şeirləri

Həzi Həsənli barədə məlumata baxış

Faxralım

Əgər sən olmasan məndə olmazdım,

A layla beşiyim – nənni Faxralım.

Mən səni heç zaman belə bilməzdim,

Dumanlı Faxralım, çənli Faxralım.

Mənə balam deyən anamsan vətən,

Mənə lalam deyən sonamsan vətən.

Obamsan, yuvamsan, binamsan vətən,

A mənsiz Faxralım, mənim Faxralım.

Gözəldağın gözəlliyin naxışıdır,

Qızıl qayan qartallann baxışıdır.

Toz-torpağın, palçığın da yaxşıdır,

Yağışlı–yağmurlu günlü Faxralım.

Dostunun dərdini dərdi bilənim,

Dostla tikəsini yarı bölənim.

Dost qardaş yolunda ölüb ölənim,

Düşməninə dəvə kinni Faxralım.

Güllə qabağına yeriyən ərlər,

Koroğlu igidlər, nər oğlu nərlər.

Dillərdə söylənir dastan əsərlər,

Təhməzqulum, həm imanlı Faxralım.

Yenə niskinlərim canda gəzindi,

Məni məndən alan sazım gəz indi.

Adına söz qoşan ozan Həzindi,

O sözü-söhbəti yönlü Faxralım.

Fatma Aslanın şeirləri

Fatma Aslan barədə məlumata baxış

Fatma Aslanın kitabları

Faxralı

Quru kəsəyim, daşına qurban.

Qayadan süzülən yaşına qurban.

Borçalı üzükdür – dedi sənətkar,

Faxralı adına, qaşına qurban.

Nəbi babam, "ağır elim var" dedi,

Türki yeyən imran dilin var dedi.

Sinəsində sonaları çırpınan,

"Keçi qiran , Divsiz" gölün var dedi.

Ağır elin eli keçməz, amandı,

Candan keçər, eldən keçməz, amandı.

Meydanında at oynatmaz yağılar,

Çeşməsindən yadlar içməz, amandı.

“Ana yurdum” payızın var, yazın var,

Tarix ilə pıçıldaşan sözün var.

Milyon milyon ürəklərə söz açan,

Dədəm Qorqud yadigarı sazım var.

Sən tarixin yaddaşından birisən,

Namus, qeyrət, pak ad çalır dünyada.

Dünənindən, bu gününə salam de,

Oğuz yurdu, ötənləri sal yada.

Məhsəti Əli qızı Məmmədova (Məhsəti Şeyda)

Məhsəti Şeyda barədə məlumat

ÜRƏK SƏHV EDƏNDƏ

Mənə ümid verən qara gözlərin,

İndi nağıl olub, nağıla dönüb.

Oğrun baxışların, şirin vədlərin,

Bir ovuc zəhərli noğula dönüb.

Ürək səhv edəndə nə olar, gülüm,

Çalış ki, bir daha yanılmayasan.

Sevənlər qəlbini ovlayıb, atıb,

Sonra dəllal kimi tanınmayasan.

HARDA QALDIN?

İlk sevgimi anan da mən,

Səni yada salan da mən,

Gözüyaşlı qalan da mən,

Harda qaldın, ay sevgilim?

Hər çiçəyə qonma, gülüm!

Hər sevdaya yanma, gülüm!

Məni naşı sanma, gülüm!

Harda qaldın, ay sevgilim?

Dağ başına qartal qondu,

Ürəyimə bir xal qondu.

Sənin qanın niyə dondu?

Harda qaldın, ay sevgilim?

Mirvair Əli qızı Məmmədova

Mirvair Məmmədova barədə məlumat

LALƏLƏR

Təzə-təzə göz açan,

Çəmənə ətir saçan,

Dodağı qan lalələr;

Yanar ulduzlar kimi,

O qızıl piyalələr.

Yel əssə, yellənərlər,

Axarlar, sellənərlər.

Ö çiçək dilləriylə

Astaca dillənərlər.

Külək çölü ətəklər,

Çəməndə güllər qalar.

Bir lalə yanağından

Neçə arı bal alar.

NƏNƏMİ

Boz-bulanıq gölə dönüb gözlərim,

Axtarıram burmabirçək nənəmi.

Oxşarında bir ağbirçək qalmayıb,

Hardan alım gözəl-göyçək nənəmi.

Xeyli vaxtdır asılmayır nəhrəsi,

Yas saxlayır düyünçəsi, cəhrəsi.

Laylasına həsrət qalıb pöhrəsi,

Kim kökündən üzdü çiçək nənəmi.

Mirvariyəm, ayaq bassam o bağa,

Canım yanar hər saralan yarpağa.

Deyirlər ki, çoxdan dönüb torpağa,

Torpağından necə seçək nənəmi.

Hüseyn Faxralının şeirləri

Hüseyn Faxralı barədə məlumat

Faxralı sevgili şeirlərdən nümunələr

Fəxr elə ki…

Yaddaşlarda tarix yatır, arxivlərdə keçmişin,

Qədim, köhnə başdaşları, məzar yeri, köçmüşün,

Zalım, zülümün əlindən baş götürüb, qaçmışın,

Yurd-yuvadan perikmişin, diyar-diyar uçmuşun,

Bu olmuşlar həqiqətdi, danılmazdı, Faxralım.

Mərd igidlər, ərənlərin ortalıqda at oynadan,

Şir ürəkli oğulların məskənisən, oylağısan.

Zaman-zaman olmuş, olur, olacaqdı çuğulların,

Yaxşının da, yamanın da yataq yeri, yaylağısan,

Fəxrim, fəxarətimsən, var ol səni, a Faxralım.

Oğlun, qızın gələcəyə, zəfərlərə inamla,

Addım – addım inkişafa imza atır uğurla,

Utanc verən, utanmalı nəyin vardı, Faxralım ?

Daşımısan, daşı daim sən bu adı qürurla,

Fəxr elə ki, Faxralısan, ay Hüseyin Faxralı !

~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~

18.04.2017 15:28

Adına nə qədər söz desəm azdı

Faxralımda fəsli bahar, a dostlar,

Bir gülün üstünə min arı qonar,

Şair söz cilalar, sərraf söz yonar,

Adına nə qədər söz desəm azdı.

Yadımdan çıxmışdı, ya indi yazdı ?

Yal-yamac, çöl–çəmən yaşıl libasdı,

Elə bil gəlindi, qəmzəli, nazdı,

Adına nə qədər söz desəm azdı.

Dağda – daşda sürünəndə duman da,

Göydə durna qatar – qatar uçanda,

Arxasınca qaqqıldaşan qu, qazdı,

Adına nə qədər söz desəm azdı.
~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~

Gözlərnə mən qurban, a Gözəldağı,

Gəl çəkmə sinəmə çal – çarpaz dağı,

Görüb, sevinməsin müxənnət yağı,

Adına nə qədər söz desəm azdı.

Ay şirin ləhcəli, ay xoş avazdı,

Qonaqlı – qaralı, qoltuğu sazdı,

Hüseyn də şəninə beşcə bənd yazdı,

Adına nə qədər söz desəm azdı.

18.04.2017 15:54

Gözəl Faxralım

Adın – sanın əzbər olub dillərdə,

Açılanda bahar fəsli güllər də,

Ay gözəlim, gəl – gəl deyir çöllər də,

Heyranam hüsnünə gözəl Faxralım !

Baxıram dağlara, o yanda Ləlvər,

Bir yanda Sərniyə, bir yanda Səngər,

Dəryadı, dənizdi, ümmandı göylər,

Heyranam hüsnünə gözəl Faxralım !

Dağ arası, Dələverin boyunca,

Ormanlar yamyaşıl, çəmənlər yonca,

Zillənir şəklinə gözlər doyunca,

Heyranam hüsnünə gözəl Faxralım !

Yazına söz olmaz, qışın bir ayrı,

Nəğməkar bülbülün, quşun bir ayrı,

Yal – yamac, yarğanın, qaşın bir ayrı,

Heyranam hüsnünə gözəl Faxralım !

Bağ yoxsa nübarı, barı neynirəm,

Dağ yoxsa tufanı, qarı neynirəm,

Yaxşı ki, sən varsan, varı neynirəm,

Heyranam hüsnünə gözəl Faxralım !

Mən zərgər, sən isə gözümdə zərsən,

Necə də təmizsən, təzəsən, tərsən,

Məclisləri sazla – sözlə bəzərsən,

Heyranam hüsnünə gözəl Faxralım !

Ay şirin ləhcəli, məzəlim səni,

Söz ilə bəzəyər öz əlim səni,

Sevməməy olarmı gözəlim səni ?

Heyranam hüsnünə gözəl Faxralım !

Vəsf elərəm camalını Ay kimi,

Bulaq kimi, çeşmə kimi, çay kimi,

Qoruyaram Tanrım verən pay kimi,

Heyranam hüsnünə gözəl Faxralım !

Borçalım üzükdü, sən də qaşısan,

Sanki yaşıllıqda zümrüd daşısan,

Hüseynin ürəynin göynər başısan,

Heyranam hüsnünə gözəl Faxralım !

~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~

28.08.2018 11:10
~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~

Görüşünə şair təbli oğlun gəlib, Faxralım !

Başın üstə açıq səma, o Aylı, ulduzludan,

Aylar, illər uzaq düşdüm bulaqları buzludan,

Neçə ildi çıxdaş olub, çıxmışam Şahbuzludan,

Görüşünə şair təbli oğlun gəlib, Faxralım !

Şagird kimi yola saldın, uçurdaraq qoynundan,

Şükür ki, üzüağ çıxdım imtahanın, – oynundan,

Qollarım salıb boynuna, qucaqlaram boynundan,

Görüşünə şair təbli oğlun gəlib, Faxralım !

Dağ vüqarlı ağır elsən, qar almışam dağlardan,

Sən bu bağın bağbanısan, bar almışam bağlardan,

Qələm çalıb, söz açmışam ötüb, keçən çağlardan,

Görüşünə şair təbli oğlun gəlib, Faxralım !

Bu dünyamız işıqlıdı, o dünyamız qaranlıq,

Bu dünyadan köçənləri yada salaq bir anlıq,

Quş kimi uçdu getdi gözlərimdə uşaqlıq,

Görüşünə şair təbli oğlun gəlib, Faxralım !

Gözlərimə görünməyir tanış üzlər, sifətlər,

Torpağ altda canlar yatır, ay camallı, afətlər,

Eldən ayrı yaşayanın ürəyində xiffətlər,

Görüşünə şair təbli oğlun gəlib, Faxralım !

Qadan alım, süfrən açıq, sən ki qonaqcanlısan,

Badələrə şərab süzdür, şərəflisən, şanlısan,

Mən qəribi qəbul eylə, sən ki istiqanlısan,

Görüşünə şair təbli oğlun gəlib, Faxralım !

Gendə durma Gözəldağım, gəl öpüm gözlərindən,

Sən üzümə gülümsə ki, gül dərim düzlərindən,

Söz sərrafı, söz acıyam, doymadım sözlərindən,

Görüşünə şair təbli oğlun gəlib, Faxralım !

Novruz adlı xor – xonçalı bu bayramın mübarək,

Bir xınalı qoç nədir ki, boğazına bıçaq çək,

Hüseyn deyir şad günündə yeyək, içək, kef çəkək,

Görüşünə şair təbli oğlun gəlib, Faxralım !

~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~

18.02.2018 20:03

Cənnətimsən Faxralım

Baharda bar verər barlı bağların,

Qışda qan ağlayar qarlı dağların,

Yaddan çıxmaz səndə ötən çağlarım,

Bu dünyamda cənnətimsən, Faxralım.

Göz oxşayan yaşıl çəmən, göy xalım,

Bir yan Ləlvər, bir yan Səngər arxalım.

O dünyanı görməmişəm, bilmirəm,

Bu dünyamda cənnətimsən, Faxralım.

Hüseynəm, aldığım nəfəsim də sən,

Malım da, mülküm də, dövlətim də sən,

Varım da, yoxum da, sərvətim də sən,

Bu dünyamda cənnətimsən, Faxralım.

~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~

16.05.2018 19:42

Poladın səsi

(Şeir Faxralımızın yetirməsi müğənni Polad Qocayevə həsr olunur)

Bir qatar durnadı, düzülüb gələn,

Bir ünlü ürəkdən üzülüb gələn,

Qaynayan qanından süzülüb gələn,

Çağlayan çeşmədi Poladın səsi.

Qalxan cingiltisi, qılınc zərbəsi,

İldırım çaxışı, şimşək nərəsi,

“Misiri”, “Cəngi”di hər zənguləsi,

Qaynayan bulaqdı Poladın səsi.

Uşaq yaşlarından vardı həvəsi,

Xoş idi avazı, şirindi səsi,

Faxralı bülbülü, el müğənnisi,

Sızlayan bir sazdı Poladın səsi.

Dağlarda şəlalə, çəməndə lalə,

Güllərin gözündə şeh, şəbnəm, jalə,

Hüseyn hüzünlüdü, ah – aman, nalə,

Həzin pıçıltıdı Poladın səsi.

~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~

30.05.2018 10:57

Baxtavarsan, a Faxralı balası !

Nə gözəldi o dağların talası,
~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~

Car-car axan sellər-sular, calası,

Qıpqırmızı, qız yanaqlı lalası,

Baxtavarsan, a Faxralı balası !

Gül-çiçəkdi yal-yamacın yaxası,

Göy çəmənlər xalçaların xam, xası,

Dağlar olub oğulların arxası,

Baxtavarsan, a Faxralı balası !

Yaşıl yarpaq kollarının koftası,

Məxmər güllər güləbətin baftası,

Zərif zanbaq zər-zibalı, atlası,

Baxtavarsan, a Faxralı balası !

Bulağı saf, çeşməsi saf, havası,

Başdan-başa seyrəngahdı, səfası,

Bəsləyirəm, bu canımda cəfası,

Baxtavarsan, a Faxralı balası !

Bülbülün cəh – cəhi ruhun qidası,

Quşların nəğməsi, kəklik nidası,

Sərçələrin səs – səmiri, sədası,

Baxtavarsan, a Faxralı balası !

Aydan arı, sudan duru səması,

Göz oxşayır göylərinin siması,

Təbiətlə kəsmə ülfət, təması,

Baxtavarsan, a Faxralı balası !

Borçalımda ay başımın bəlası,

Telli sazın xoş avazı, nəvası,

Meydi, mehdi dərdlərimin şəfası,

Baxtavarsan, a Faxralı balası !

Sonalar sonası odur, qadası,

Söz-söhbət, cümlənin inşa, imlası,

Dilinin xəbəri, həm mübtədası,

Baxtavarsan, a Faxralı balası !

Haqq üçün danışaq, Allah rizası,

Şair Nəbi, Gül İsmayıl, Qarası,

İmzalar içində var öz imzası,

Baxtavarsan, a Faxralı balası !

Ad çəkməsəm vallah çıxar xatası,

Güllər Pəri ol güllərin butası,

Əli Səngərli də sözün ustası,

Baxtavarsan, a Faxralı balası !

Yazda yaşıl, qışda bəyaz libası,

Gəzəldağlı gözəllərin vəfası,

Hüseynin də dürlü-dürlü dünyası,

Baxtavarsan, a Faxralı balası !

~~~~~~~~~~~~~~~~~~~~~~~~

05.05.2017 14:22

Közüm Faxralım

Dodağım səyriyib, gözüm dolanda,

Dolanım başına, özüm Faxralım !

Saçımı qəm yolub, qəmlər didəndə,
~~~~~~~~~~~~~~~~~~~~~~~~

Sən oldun kösöyüm, közüm Faxralım !

Adını fəxr ilə qoydum nişana,

Dərdimi birbəbir darasın şana,

Yandım Ay işığı, ay şana – şana,

Sən oldun kösöyüm, közüm Faxralım !

Mən də bir kösöyəm, yandım odunda,

Hüseynəm, kül oldum, saraldım, sonda,

Bu libasda,  bu ləyaqət, bu donda,

Sən oldun kösöyüm, közüm Faxralım !

~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~

07.05.2017 20:42

Faxralıdadı

Vətən Əslim mənim, mən də ki Kərəm,

Vətən canım, gözüm, gözmü çəkərəm,

Mən ocaq söndürüb, közmü çəkərəm,

Odum da, közüm də Faxralıdadı !

Nəfəsmi təngidən bu qızmar yayım,

Saraldan, solduran, solan payızım,

Soyuqlu – sazaqlı qışımla, yazım,

Sazım da, sözüm də Faxralıdadı !

Dağ başında topa – topa dumanlar,

Göz oxşayan, könül açan ormanlar,

Gözəlliyə gözlərini yumanlar,

Yurdum da, yuvam da Faxralıdadı !
~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~

Səkkizayaq mənimkidi, qadası,

Səngərimlə, Sərniyəmin sədası,

Nə gözəldi Gözəldağın ədası,

Ərənlər oylağı Faxralıdadı !

Çəmənli, çiçəkli, güllü talalar,

Çəməndə qızaran qanlı lalalar,

Car – car axan sellər, sular, calalar,

Bal dadan bulaqlar Faxralıdadı !

Bulaqlar başında qonaq – qaralar,

Xeyirə xərclənən pullar – paralar,

El yeriyən ağır – ağır yığnaqlar

Mənim ağır elim Faxralıdadı !

Qonağa, qonşuya qayğı, diqqət də,

Qanacaq, mərifət, xətir – hörmət də,

Yol – ərkan gözləmək, köhnə adət də,

Fəzilət, fərəh də Faxralıdadı !

Qürbətdə qələmlə qəbrimi qazsam,

Yoruldum demərəm nə qədər yazsam,

Çənində yol çaşıb, dumanda azsam,

Kəfənim, gorum da Faxralıdadı !

Adı bir ayrıdı, dadı bir ayrı,

Tamahı bir ayrı, tamı bir ayrı,

Yaxını bir ayrı, yadı bir ayrı,

Yaxşılar yaxşısı Faxralıdadı !

Qoy deyim qalmasın bir həqiqət də,

İnkişaf, intibah, həm təriqət də,

Din – iman, dirilik, de şəriət də

Hüseyin yaşayır, Faxralıdadı !

~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~

28.07.2017 15:30

Gözəl Səngərim

Ürəyim uçunar sənnən ötəri,

Dumannan, çiskinnən, çənnən ötəri,

Sünbülün, süsənin, dənnən ötəri,

Seyrəngah səfalı, gözəl Səngərim !

Başın üstə doğar Günəş, Ay yenə,

Ulduzları bircə – bircə say yenə,

Sinəm üstə yellərini yay yenə,

Seyrəngah səfalı, gözəl Səngərim !

Qorxusu yox, qış başına yağsa qar,

Bağ-bağçanda aşar-daşar onda bar,

Baş qaldırar bənövşələr hər bahar,

Seyrəngah səfalı, gözəl Səngərim !

Dərələrdə car – car axar sel – sular,

Suyundan içənlər şəfasın bular,

Viranə məkanda bayquşlar ular,

Seyrəngah səfalı, gözəl Səngərim !

Bir yan Ballıdərə, bir yan Tənəkli,

Gözə dəymir qızlar beli sənəkli,
~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~

A yaşıl talalı, göy biçənəkli,

Seyrəngah səfalı, gözəl Səngərim !

Faxralı Hüseynəm, saldım sənə zənd,

Şəninə söylədim, qoşdum beşcə bənd,

Heç yerdə görmədim mən belə bir kənd,

Seyrəngah səfalı, gözəl Səngərim !

30.09.2017 17:06

Uğur olsun, a Faxralım !

Ay maşallah, aşıb – daşır

Gənclərdə qurmaq həvəsi,

Saf mayası, sərmayəsi,

Uğur olsun, a Faxralım !

Alqışa layiq işdi bu,

Bünövrəsi möhkəm olsun,

Yar – yaraşıq, görkəm olsun,

Uğur olsun, a Faxralım !

Aç qapını dost üzünə,

Gələnlərə xoş gəldin de,

Gedənlərə yaxşı yollar,

Uğur olsun, a Faxralım !

Yaşasın yaradan, quran,

Beton töküb, him qazan da,

Mübarəkdi darvazan da,

Uğur olsun, a Faxralım !

Hüseyn gördü, cuşə gəldi,

Gözəl işdi, xoşa gəldi,

Zəhmət ilə başa gəldi,

Uğur olsun, a Faxralım !

~~~~~~~~~~~~~~~~~~~

09.06.2018 13:22

Alaqapı, darvazası gen kəndim

Aşan-daşan sünbülün, dənin olsun,

Açıq səman, dumanın, çənin olsun,

Toy, təntənə, xeyir iş sənin olsun

Alaqapı, darvazası gen kəndim.

Alıram sorağnı əsən yellərdən,

Ancaq coşan seldən-sudan, tellərdən,

Ağır elsən, eşitmişəm ellərdən,

Alaqapı, darvazası gen kəndim.

Abad olsun gündən-günə, şen kəndim,

Gül – çiçəkli, gülərüzlü, şən kəndim,

Oğul-qızna apar nişan, şan kəndim,

Alaqapı, darvazası gen kəndim.

Faxralı adını daşı dağ kimi,

Var – dövlətin qaynasın bulağ kimi,

Gəlim görüm çal – çağırlı, çağ kimi,

Alaqapı, darvazası gen kəndim.

Hüseynəm, adınla öyünmüşəm mən,
~~~~~~~~~~~~~~~~~~~

Bəzəyni – düzəyni bəyənmişəm mən,

Qur-yarat, zəfərnə sevinmişəm mən,

Alaqapı, darvazası gen kəndim.

~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~

12.07.2018 15:14

Dolanım başına, dönüm Faxralı !

Abırım, urvatım, arım da sənsən,

Dövlətim də sənsən, varım da sənsən,

Yazda yaşıl geymiş yarım da sənsən,

Dolanım başına, dönüm Faxralı !

Anam da sən, sonam da sən, vəfalı,

A dilbər guşəli, cənnət səfalı,

Bülbülü cəh – cəhli, gülü cəfalı,

Dolanım başına, dönüm Faxralı !

Daşını daş üstə qoyar oğullar,

Düşmənin bağrını oyar oğullar,

Doğmasan, doğmadan doymaqmı olar ?

Dolanım başına, dönüm Faxralı !

Hüseyn də səninlə əhd – ilqar bağlar,

Bilirəm, dostlara sədaqətin var,

Mətinsən, dözümün, dəyanətin var,

Dolanım başına, dönüm Faxralı !

~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~

13.06.2018 12:19

Qızılqaya, Qoşabulaq

Qaranquşla, qaz gələndə,

Qış ötüşüb, yaz gələndə,

Məclisimə saz gələndə

Sinəm kimi coşa bulaq !

Sərin – sərin əsə yel də,

Mizrab döyən sim də, tel də,

Oynaya su, axa sel də,

Çaylar kimi daşa bulaq !

İçdiyin su, saf hava da,

Yediyin cana nuş ola.

Xətirini əziz tuta,

Çəkə səni başa bulaq !

Durulmazmı kef – əhvalım,

Rəngim-ruhum, onda halım,

Cuşə gələr eşq, ilhamım,

Şair, gəlməz xoşa bulaq ?

Yurdum – yuvam Faxralıda

Qonaq – qaran aşa – daşa,

Qucaqlaşa, vidalaşa,

Var ol səni, yaşa bulaq !

Bənövşələr ətir saça,

Gül açıla, bülbül uça,

Hüseyinə qucağ aça,

Qızılqaya, Qoşabulaq !

~~~~~~~~~~~~~~~~~~~~

31.07.2018 14:40

Borçalım, Faxralım, Azərbaycanım !

Bu mənim qanımdı, bu mənim canım,

Borçalım, Faxralım, Azərbaycanım !

Bir ayrı aləmdi, dünyam, cahanım,

Borçalım, Faxralım, Azərbaycanım !

Alışıb odnuza, od tutan canım,

Həsrətim, həmdəmim, həmi həyanım,

Sizsiniz damarda qaynayan qanım,

Borçalım, Faxralım, Azərbaycanım !

Başım üstə dalğalanan bayrağım

Rəmzimdi, şərəfim, şöhrətim, şanım,

Tarixdən yadigar qalan nişanım,

Borçalım, Faxralım, Azərbaycanım !

Bunu təsdiq edər yəqin bozqurdum,

Ən ulu anamdı o, Odlar Yurdum,

Qoynunda ömrümü mən başa vurdum,

Borçalım, Faxralım, Azərbaycanım !

Daşı daş üstünə qoydu babalar,

Salındı kənd – kəsək, ellər, obalar,

Yağılar qovuldu, yandı sobalar,

Borçalım, Faxralım, Azərbaycanım !
~~~~~~~~~~~~~~~~~~~~

Bir tülək tərlandı Türküm – Turanım,

Boranım, çovğunum, qarım, tufanım,

Müqəddəs Mədinəm, Məkkəm, Quranım,

Borçalım, Faxralım, Azərbaycanım !

Al geyən gözəllər dodağı baldı,

Toylarda zurnası “Cəngi” də çaldı,

Səs – ünü, sədası göyə ucaldı,

Borçalım, Faxralım, Azərbaycanım !

Dünyada ad aldı Ələsgər, Alı,

Heç kimə qalmadı dünyanın malı,

Məzarda çürüdü ol Rüstəm Zalı,

Borçalım, Faxralım, Azərbaycanım !

Aşıq Veysəl, İslam, var hafizəmdə,

Sinəmədə yurd salıb Yunis Əmrəm də,

Qaynayan çeşmə də, coşan zəmzəm də

Borçalım, Faxralım, Azərbaycanım !

Zəmanə yetirər Kamandar az – az,

Çıxarmı heç yaddan Əmrah çalan saz,

Saraclı dastandı, Xındı xoşavaz,

Borçalım, Faxralım, Azərbaycanım !

Gülsüz nəyə gərək güldan, boş vaza ?

Nə ilmə, xal vurdu Ədalət saza,

Saz tuta, söz qoşa, Zəlimxan yaza,

Borçalım, Faxralım, Azərbaycanım ?!

Hanı Şair Nəbim, hanı Şəhriyar,

Hanı Şenlik babam, Vurğun, Bəxtiyar,

Şairlər ordusu yetirən diyar,

Borçalım, Faxralım, Azərbaycanım ?!

Biri sel, biri el, biri mahaldı,

Seyrəngah səfalı, cahi – cəlaldı,

Biri doğan Gün, biri nur, biri hilaldı,

Borçalım, Faxralım, Azərbaycanım !

Şair söz sərrafı, dəftərsinədi,

Tükənməz sərvəti, söz xəzinədi,

Tər sözün düzü nə, de tərsi nədi,

Borçalım, Faxralım, Azərbaycanım ?!

Hüseynəm, həyatda mən sizə vurğun,

Yaşayıb, yanıram, yanağı solğun,

Siz gedən yolları gedirəm yorğun,

Borçalım, Faxralım, Azərbaycanım !

~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~

30.11.2018 10:56

Faxralı elinin mərd oğulları

Ayağını tapdlayıb, basmasan,

Boş-boşuna bostanına daş atmaz,

Arxasınca daş atanı yaşatmaz

Faxralı elinin mərd oğulları.

Kişi kimi söz götürməz, söz udmaz,

Cəngavərlə cəngə girər, uduzmaz,
~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~

Tüpürdüsə, tüpürdüynü yalamaz
Faxralı elinin mərd oğulları.
Dədələrin düz yoluyla gedərlər,
Oddan keçər, köz yoluyla gedərlər,
Özgələr yox, öz yoluyla gedərlər
Faxralı elinin mərd oğulları.
Əyilməz başları, Səngər vüqarlı,
Yar-yoldaş, doğmaya, dosta vəfalı,
Sirdaşdı, sir saxlar, ən etibarlı,
Faxralı elinin mərd oğulları.
Saysan səni başı üstə qaldırar,
Çəkər gözü, qaşı üstə qaldırar,
Başından da lap yuxarı qaldırar
Faxralı elinin mərd oğulları.
Baş kəsib, göz oyub, qan da tökübdü,
Qonağna duz – çörək, nan da tökübdü,
Saymazın qabağna saman tökübdü
Faxralı elinin mərd oğulları.
El nəhəngdi, Şair Nəbi yurdudu,
Nəbim baş komandan, qalan ordudu,
Yurd-yuvanı qoruyanlar qurdudu,
Faxralı elinin mərd oğulları.
Ay Hüseyin, ər doğular dünyaya,
Fərasətli, fərd doğular dünyaya,
Düşməninə dərd doğular dünyaya

Faxralı elinin mərd oğulları.

~~~~~~~~~~~~~~~~~~~~~~~~~

17.08.2018 9:03

Bər – bəzəkli bir xonçadı Borçalı

Aranı, dağı var, parça – parçadı,

O Odlar Yurdunun bir parçasıdı,

Ehram çay sahili xalı, xalçadı,

Dilimlənmiş bir diyardı Borçalı !

Kür kəmər tək qurşanıbdı belinə,

Çiçəklərdən çələng hörrəm telinə,

Qurban ollam obasına, elinə,

Görən görüb nə məkandı Borçalı !

Toylarında "Cəngi"çalar zurnası,

Göylərində qaqqıldaşar durnası,

Bağlarında bol xırniyi, xurması,

Şirinlikdə şəkər, baldı Borçalı !

Al yanaqlı, qara xallı lalası,

Yaz ayları yaşıllaşar talası,

Talasında mələr cüyür balası,

Başdan–başa seyrangahdı Borçalı !

Bel bağlayıb başı qarlı dağlara,

O qaynar çeşmələr, buz bulaqlara,

Saz tutub, söz qoşub göy yaylaqlara,

Sazlı – sözlü bir mahaldı Borçalı !
~~~~~~~~~~~~~~~~~~~~~~~~~

Hüseyn də şəninə söz dedi, qoşdu,

Gözəlləri gülərüzlü, nə xoşdu,

Toyda-şanda xonçasında nə yoxdu ?

Bər – bəzəkli bir xonçadı Borçalı !

~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~

23.10.2018 9:48

Doğma elə bağlıyam

Ad qoyub, ad almışam, alnı açığ, üzağam,

Nə bugünkü bəbəyəm, nə dünənki uşağam,

Halal qazanmış, yemiş, haramdan da uzağam,

Mən Vətənə, torpağa, doğma elə bağlıyam !

Axarımı tapmışam, öz yolumu cızmışam,

Sızqı kimi torpaqdan, süxurlardan sızmışam,

Qaynamışam gur odda, kürə kimi qızmışam,

Mən Vətənə, torpağa, doğma elə bağlıyam !

Bir yanım Turan mənim, boranlı, tufanlıyam,

Dağları çən – çisəkli, çovğunlu, dumanlıyam,

Qaynar çeşmə, buz bulaq, qışda başı qarlıyam,

Mən Vətənə, torpağa, doğma elə bağlıyam !

Kükrəyəndə köpüklü aşan – daşan bir çayam,

Parlayan Günəş, ulduz, axşam doğan  o, Ayam,

Yaşıl donlu yazam mən, Yarəb yandıran yayam,

Mən Vətənə, torpağa, doğma elə bağlıyam !

Yamyaşıl yaylaqlıyam, aranlıyam, dağlıyam,
~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~

Bağ-bağçası bar verən, bostanlıyam, bağlıyam,
Bayatılı, nağıllı, hekayə, dastanlıyam,
Mən Vətənə, torpağa, doğma elə bağlıyam !
Dili şirin ləhcəli, şəkər, balam, ay balam,
Dilim – ağzım qıfıllı, elə bilmə ki, lalam,
Bir yanıqlı neyəm mən, kaman, sazam, susmaram,
Mən Vətənə, torpağa, doğma elə bağlıyam !
Qələm tutan əlim var, yazılmamış varağam,
Qəbzəsindən qan daman əldə qanlı yarağam,
Qolları qılınc çalan Babəkəm, Koroğluyam,
Mən Vətənə, torpağa, doğma elə bağlıyam !
Ləlvər, Löküm, Səngərim, gözəl Gözəldağlıyam,
Öz kököm, kömə ncim var, qol – budaqlı palıdam,
Gül, gülüstan hər yanım, gör nə xoş növrağlıyam,
Mən Vətənə, torpağa, doğma elə bağlıyam !
Çümbüzünə baş qoyub, xumarlanıb yatmışam,
Saf sulardan içmişəm, havasından udmuşam,
Namərd ollam onda ki, mən bunları unutsam,
Mən Vətənə, torpağa, doğma elə bağlıyam !
Dara çəkilmişəm, dardayam, dağ adamıyam,
Zamana dəyişdi, dövran özgə, başqa ayam,
Səhraya düşmüşəm, düzə enmişəm, ay qadam,
Mən Vətənə, torpağa, doğma elə bağlıyam !
Ah, köçəri quşam mən, yurd-yuvadan yazanam,
Xəzan gəlib ömrümə, eh, yaz ömrü xəzanam,

Çalmağa sazım da yox, elə bilmə ozanam,

Mən Vətənə, torpağa, doğma elə bağlıyam !

Sinəsi sazlı – sözlü, dosta qəlbi açığam,

Toyda – düyündə, şanda qonaqlı – qaralıyam,

Borçalı mahalımdı, Faxralı balasıyam,

Mən Vətənə, torpağa, doğma elə bağlıyam !

Mərd əkib, mərd də doğub dünyaya nənəm, babam,

Dünyaya mərd doğulmuş, mərd kişinin oğluyam,

Hüseyn olsa da adım, amma Aslanoğluyam,

Mən Vətənə, torpağa, doğma elə bağlıyam !

~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~

21.10.2018 11:49

“Borçalım dayanıb, öz yerindədi !..”

Sənəti yaşadan sənətkardı, şah,

Yaşadı, yaratdı, yandı Xan Əmrah,

Xındı da, Əhməd də, Məmməd də vallah,

Kamandar yaşayır, saz yerindədi !

Qaravəlli, bayatılar, nağıllar,

Qıfılbənd, hekayə, həm havacatlar,

Sinəsində salnaməydi dastanlar,

Saraclı ölməzdi, söz yerindədi !

Gülabı sənətdə nə xallar, güllər,

Hamamlı Vəkil də iz qoydu, getdi,

Zəlimxan min kitab söz qoydu, getdi,
~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~~

Oğulsan itkiyə döz, yerindədi.

Bu sənətə sinə gərməz hər sinə,

Saza – sözə ürək qoyub bir sinə,

Tərmeyxan təbində elə tər sinə,

Onu köç etsə də, yüz yerindədi !

Dayanıb yerində yurd-yuvam, dağım,

Hələ də bar verir meyvəli bağım,

Kim deyir sönübdü odum, ocağım,

Çırağım, kösöyüm, köz yerindədi !

Kənd-kəsəklər öz dərdində – sərində,

Əkir, biçir, el xeyrində, şərində,

Bünövrəsi dayaz deyil, dərində,

Dərə də, təpə də, düz yerindədi !

Binə, dəyə, hər alaçıq, hər çalı,

Kim deyir ki, boşalıbdı Borçalı ?

Çəmən, çəhlim gül – çiçəkli bir xalı,

O bir seyrangahdı, süz, yerindədi !

Ağbirçək analar, ahıl atalar,

İsmətli, həyalı gəlin, bacılar,

Şəkərdən, baldan da şirin balalar,

Abır da, həya da, üz yerindədi !

Köç etdi dünyadan Aslan Kosalı,

Çəkməsəm el qınar burda misalı,

Hüseyin, o nəhəng Nəbim timsalı,

Borçalım dayanıb, öz yerindədi !

30.07.2017

Dağlardan gəlmişəm

Mən saf, duru bir sızqıyam,

Sızlayıram sızım – sızım,

Yaz deyəndə yanır ağzım,

Sızıb dağlardan gəlmişəm.

Sıxıntıyam, sıxılcımam,

Xəyalı xıncım – xıncımam,

Od parçası, qığılcımam,

Qızıb dağlardan gəlmişəm.

Addım – addım yolu, izi,

Bərkitmişəm topuq, dizi,

Yada salıb dostlar sizi,

Cızıb dağlardan gəlmişəm.

Saz deyəndə sazlanıram,

Nəşələnir, nazlanıran,

Çiçək kimi tozlanıram,

Azıb dağlardan gəlmişəm.

Hüseyinəm, qərib eldə,

Qəm, qüssəylə, ələm ilə,

Qəbirimi qələm ilə

Qazıb, dağlardan gəlmişəm.

14.10.2016

Ay bənövşə

Niyə qaçıb rəngin, ruhun,

Ağrın alım, ay bənövşə ?

Sağa – sola tellərini

Dara yana, yay bənövşə.

O nə yaşdı yanağında ?

Sözmü donub dodağında ?

Özüm ölüm qabağında,

Yoxdu sənə tay bənövşə.

Bircə – bircə tellərini,

Saçlarını say bənövşə.

Yanağından bircə busə

Versən nolar pay bənövşə.

Saçlarımın çal vədəsi,

Ürəyimin xal, zədəsi,

Çağlayar çeşmələr kimi

Çeşmim yaşı çay bənövşə.

Sən baharda açan vaxtı,

Ənbər, ətir saçan vaxtı,

Mən dünyadan köçən vaxtı

Ömrüm olar zay bənövşə.

01.04.2017

Gül sinəm üstə

Açılıb məxməri, gül sinən üstə,

Nazikdi köynəyin, tül sinən üstə,

Yanağın yapışsın yanağım üstə,

Qoy yanım kül olum, kül sinən üstə.

İstər yandır məni, istərsən qovur,

İstərsən külümü lap göyə sovur,

Nə olar, ay canım, tək bircə hovur

Baş qoyum, dincəlim gəl sinən üstə.

Ləblərin yanında ləl də yalandı,

Könlüm evi tarmar olmuş, talandı,

Görsən, cismim od, atəşə qalandı,

Gəzsin gərdən boyu əl sinən üstə.

Arzular ülvidi, xəyallar şirin,

Ataydım daşını qəmin, kədərin,

Ay gülüm, qəlbini qırma şairin,

Eləcə gülümsə, gül sinəm üstə.

22.04.2017

Yana – yana qalmışam

Buz bulağ üstündə buzu yalardım,

Quzqulağ üstündə duzu yalardım,

Qaragöz, qıvrım tel quzu yalardım,

Yaş gözümdə, yana-yana qalmışam.

Yaddaşımdan yağlı, yavan aş keçir,

Boğazımdan çınqıl keçir, daş keçir,

Yavaş – yavaş ömür ötür, yaş keçir,

Yaylaq deyə, yana – yana qalmışam.

Bülbülün cəh – cəhi qulağımdadı,

Nəğməsi dilimdə, dodağımdadı,

Yadımdan çıxmayır iy, qoxu, dadı,

Yarpız deyə yana – yana qalmışam.

Göz oxşayan çəmən, çəhlim, örüşlər,

Tay-tuşlarla vaxtlı – vaxtsız görüşlər,

Çeşmələrlə şirin – şirin öpüşlər,

Yadırğanmaz, yana – yana qalmışam.

Ay işığı, gecə nurlu, su car – car,

Ulduzlar da yanıb – sönərdi, par – par,

Yadındamı, lil içində, a lilpar ?

Yada salma, yana – yana qalmışam.

Bulaqlar da yadırğamış busəni,

Qız tanımır bardaq, səhəng, kuzəni,

Hüseyn, bu dərd bitirəcək bil səni,

Yaxam əldə, yana – yana qalmışam.

21.05.2017

Yatıbdı

Hər məzar daşında min məna yatır,

Daş var ki, altında ilan yatıbdı.

Adam var ömrünü puç etdi, fəna,

Daş da var, altında insan yatıbdı.

Bəlalar beşikdən, bələkdən gələr,

Əcəlin fərmanı fələkdən gələr,

Sorğular, suallar mələkdən gələr,

Daş var altda firon, filman yatıbdı.

Adam var güldürüb, gülüb gedəcək,

Adam var, it kimi hürüb gedəcək,

Dövran öz dövrünü sürüb gedəcək,

Daş da var altında fidan yatıbdı.

Bir gün də görmədi o, Şəhriyarım,

Köç etdi dünyadan bu, Bəxtiyarım,

İndi qan ağlayır cənnət diyarım,

Daş da var altında Bəhman yatıbdı.

Məzarlar, qəbirlər cərgə – cərgədi,

Nə cəbbəxanadı, nə də cəbhədi,

Bir səssiz – səmirsiz, lal düşərgədi,

Daş da var, altında rəhman yatıbdı.

Adam adam gərək, olmasın qaban,

Ayağ yer tutanda qalxmasın daban,

Şahmar çalan baxmaz şahdı, ya çoban,

Daş da var, altında şaman1 yatıbdı.

Xeyirlə şər cüt doğulub, gəlibdi,

Eşq ucundan hicran çəkən həbibdi2,

Xəstənin dərmanın yazan təbibdi,

Daş da var, altında loğman yatıbdı.

Adam var həyatda dinsiz – imansız,

Özündən, özgədən müdam gümansız,

Hüseyn, adam da var qəddar, amansız,

Daş da var, altında qılman3 yatıbdı.

~~~

1- şaman – ruhlara, magiyaya inan sehrbaz, ovsunçu, cadugər mənasında;
~~~

2- həbib – sevgili, dost mənasında;

3- qılman – cənnət, behişt xidmətçiləri mənasında.

09.07.2017

Olmaz, olmaz

Qaraya mən qara, ala al dedim,

Zəhərə mən zəhər, bala bal dedim,

Tirməyə mən tirmə, şala şal dedim,

Görmədim, qaradan ağ olmaz, olmaz.

Çəkilsə qaymağı, alınsa üzü,

Ağaran, qatığı, süzməni, südü,

A qardaş, qoy deyim doğrunu, düzü,

Yüz dəfə çalxala, yağ olmaz, olmaz.

Bassa da hər yanı alaq, ot, çayır,

Oğulsan qanqalı gəl güldən ayır,

Sən öz saydığın say, fələk nə sayır ?

Hər çayır-çəməndən tağ olmaz, olmaz.

Götür bağ – bağçada ək qaratikan,

İstəyir moruğ ək, istər böyürtkən,

İynəsi qanadan, sökəndi tikan,

İnan ki, hər koldan bağ olmaz, olmaz.

Əlinə qazma al, bel, külüng götür,

Qaz qara torpağı, qalaqla, ötür,

Ah, nədir faydası, ay Aslanoğlu ?

Hər alçaq təpədən dağ olmaz, olmaz.

15.09.2017

Mən sənin adını başa yazaram !

Sən Odlar Yurdunun bir parçasısan,

Rəssamlar toxuyan xalça, xalısan,

Seyrəngah səfalı, xoş havalısan,

Dərdindən-sərindən lap ahu – zaram,

Çəkərəm göz üstə, qaşa yazaram !

Salnaməsən, salğarın, sanbalın var,

Kitaba, dəftərə, dərsliyə salar,

Mən sənin adını o, şiş zirvəli

Həkk edər qayaya, daşa yazaram,

Murovla, Qoşqarla qoşa yazaram !

Bir cənnətsən, gül-bülbüllü bağ kimi,

Çalması dumandan, uca dağ kimi,

Qoynunda qaynayan saf bulağ kimi,

Daşdan, qumdan sızqı kimi sızaram,

Mən sənin adını yaşa yazaram !

Vüqarlısan, vüqarına heyranam,

Qürurlusan, qüruruna heyranam,

Əhdi – peyman, ilqarına heyranam,

Adına yamağı yaraşdırmaram,

Səndən iraq deyib, haşa yazaram !

Göyçə mənimkidi, mənim ki deyil,

Dərbənd mənimkidi, mənim ki deyil,

Təbriz mənimkidi, mənim ki deyil,

Çatar qaşlarımı ah, aram – aram,

Mən necə keçmişim çaşa yazaram ?!

Hüseyn, sultanımdı, xanım Borçalım,

Şərəfim, şöhrətim, şanım Borçalım,

Mahallar içində canım Borçalım,

Düşmənin quyusun dərin qazaram,

Mən sənin adını başa yazaram !

26.09.2017

Dildi sözü cilalayan

Korş ağızlı kərki kimi

Dil var sözü yonur, tökür,

Əyrim – üyrüm, kələ – kötür

Sözdən baş aç, məna götür.

Yeyə var ki, adı törpü,

Dəmiri də yeyər, tökər.

Yeyə sözü yeyə bilməz,

Sözdən sözə yol var, -körpü.

Hər dil sözü cilalamaz,

Sığallamaz rəndə kimi.

Heca – heca, sətir – sətir,

Misra – misra, bəndə kimi.

Dildi sözü cilalayan,

Hamarlayan, tumarlayan,

Sığal çəkib, malalayan,

Dənə – dənə, dərkə kimi.

01.10.2017

Dağlar

Bu yol çəkən iki gözüm

Yollarında kökür dağlar.

Səngiməyir odum, közüm,

Hara baxır gözün dağlar ?

Nə dərdim var, nədi sərim?

Dərd sinəmdə dərya, dərin.

Nəyə büküm, hara sərim

Dərdi – səri düzüm dağlar ?

Qalmadı, səbrim tükəndi,

Qırılar, nazik tükdəndi,

Çəkdiyim fikir, yükdəndi,

Qalmayıbdı dözüm dağlar.

Baldırğanın bal, cökəndi,

Köz üstə kömbən, kökəndi,

Azar – bezar bel bükəndi,

Bükülübdü dizim dağlar.

Kəhərlərin nal tökəndi,

Gül – çiçəyin hal sökəndi,

Hüseyn sənə qul, nökərdi,

Budur axır sözüm dağlar.

19.10.2017

Durna

Qar – borandan, qasırğadan,

Qan – qadadan qaçan durna,

Mən məhzundan salam söylə,

Üzü Qərbə uçan durna…

Salam apar qucaq – qucaq,

Yurd – yuvama çatdır, qoncaq,

Qoy sönməsin o od – ocaq,

Qoşa qanad açan durna…

Gedir, gəlir qonağ kimi,

Qəbul edir qınağ kimi,

Qəddim olur yumağ kimi,

İldə bir yol, dayan durna…

Bənövşəsi, nərgizindən

Dər əlinlə, dəstə bağla,

Göndər öpüm güllərindən,

Qismət olsa, haçan durna…

Di qalx, uç, qalma dəstəndən,

Nigaranam mən Vətəndən,

Qırx bir il çıxdaşam kənddən,

Gülü ətir saçan, durna…

21.10.2017

Nə var ki

Dalğıcsansa, dəryalara baş vur sən,

Dayazlarda çırpınmağa nə var ki.

Dalın ilə daş atana daş at sən,

Qum atmaqla qırpınmağa nə var ki.

Bacarırsan zirvə, dağ ol, daşınma,

Təpə olub, aşınmağa nə var ki.

Bir barmaqla çətin olar qaşınmaq,

Beş barmaqla qaşınmağa nə var ki.

Bağbanlar becərən bağçada, bağda

Budaqda meyvənin bir nübarıyam,

Demə söz ustası, dil pərgarıyam,

Dil – dil ötüb, danışmağa nə var ki.

Sərrafsansa sözə zər çək, zinət ver,

Yaşamağa möhrünü bas, möhlət ver,

Sənlik deyil, nə əzab, nə möhnət ver,

Zağca kimi zarımağa nə var ki.

09.10.2017

Azərbaycan bayrağım !

Şəhid qanına boyandın,

Göylərə qalxdın, ucaldın,

Başım üstə dalğalandın,

Müqəddəsdi andın, andım,

Azərbaycan bayrağım !

Dan ulduzum, Ayım axan,

Günəş kimi parlaq doğan,

Kor olsun sənə xor baxan,

Yağını yandıran, yaxan

Azərbaycan bayrağım !

Ay batıbdı, dan sökülüb,

Yuxumuz ərşə çəkilib,

Nəzərlər sənə dikilib,

Uğrunda qanlar tökülüb,

Azərbaycan bayrağım !

Enmə, əymə qamətini,

Göstər qürur, qeyrətini,

Dünya görsün şöhrətini,

Məyus etmə millətimi,

Azərbaycan bayrağım !

Göyləri gözəl bəzəməz,

Qəlbi riqqətə gətirməz,

Başqa bayrama bənzəməz

Ab – havada bu bayram da,

Azərbaycan bayrağım !

Rəngin qanımın rəngidi,

Qanım coşduran "Cəngi"di,

Səhər açdı, sülh ləngidi,

Şəhidlik mərdlik rəmzidi,

Azərbaycan bayrağım !

Vətən, haylara qızıram,

Qələmlə qəbir qazıram,

Şəninə şeir yazıram,

Əmr et, döyüşə hazıram,

Azərbaycan bayrağım !

Al-qumaş gey ləldən-zərdən,

Allah qorusun, saxlasın

Səni xain, bəd nəzərdən,

Müjdə yetir xoş səhərdən,

Azərbaycan bayrağım !

09.11.2016

Qoy bir olsun ordumuz da

Qışımız bir, yazımız bir,

Canımız bir, qanımız bir,

Sözümüz bir, sazımız bir,

Çoxumuz bir, azımız bir,

Qoy bir olsun ordumuz da,

Azərbaycan – Türkiyə !

Sənin bayrağın mənimki,

Mənim bayrağım səninki,

Sənin oylağın mənimki,

Mənim oylağım səninki,

Qoy bir olsun ordumuz da,

Azərbaycan – Türkiyə !

Hay hay ilə həmrəy olar,

Zay zay ilə həmrəy olar,

Türk türk ilə həmrəy olsa

Dünya dağılmaz ki, nolar?

Qoy bir olsun ordumuz da,

Azərbaycan – Türkiyə !

Bulağımız, buzumuz da,

Duzlağımız, duzumuz da,

Quzumuz da, qurdumuz da,

Yuvamız da, yurdumuz da,

Qoy bir olsun ordumuz da,

Azərbaycan – Türkiyə !

Sən də türksən, mən də türkəm,

Sən yapıncı, mənsə kürkəm,

Sən ordasan, mənsə burda,

Baş əyməyək itə – qurda,

Qoy bir olsun ordumuz da,

Azərbaycan – Türkiyə !

17.11.2016

Ziyam "ZİRVƏ"

Günəş kimi parla göydə,

Şölə, nur saç üfüqlərdə,

İşıqlansın Yer də, Göy də,

Ey ziyalım, ziyam "ZİRVƏ" !

Gözün qırpma, bax şəhanə,

Misra – misra, xanə – xanə,

Sazı – sözü yay cahana,

Ey ziyalım, ziyam "ZİRVƏ" !

Kamal səndə, kəlam səndə,

Vurğun oldum sənə mən də,

Yüksəl, ucal pillə – pillə

Ey ziyalım, ziyam "ZİRVƏ" !

Mən pərvanə, sən də bir şam,

Söz mülkündə eylə qiyam,

Qoy çin olsun yuxum, röyam,

Ey ziyalım, ziyam “ZİRVƏ” !

Hüseyinə arxa, dayaq,

Elm, bilik, alim sayaq,

Yol göstərən, sən ol mayak,

Ey ziyalım, ziyam “ZİRVƏ” !

30.07.2018

Cavanşirin bulağında

Başkeçidi bəyənməyən

Xain, xoflu, müxənnətdi,

Sür səfanı, el cənnətdi,

Cavanşirin* bulağında.

~~~~

* – general Cavanşir Məmmədov

Bir yanda quşlar oxuyar,

Hər yan müşk-ənbər qoxuyar,

Gözəllikdən gözmü doyar

Şair, Şahmarlı dağında ?

Yaddaşında saxla anı,

Təravətli, tərdi yanı,

Doyunca doldur dolçanı,

İç, dərmandı suları da.

Daş, qayadan qaynar bulaq,

Bulaq başı dincdi qulaq,
~~~~

Müşfiq məllim, xoşhal olaq

Sərin bulaqlar başında.

21.08.2018

Mənbə: Şairin seçmə şeirlər toplusundan

Fikrət Ayvaz oğlu Məmmədov

Fikrət Məmmədov barədə məlumat

GÖZƏL DAĞI

Gözəl dağı, qollarını bircə aç,

Öz balan tək qucağına atılım.

Nə ki sağam, qoy asılım boynundan,

Öləndə də torpağına qatılım.

Arzum budur, uca, məğrur başından

Dünya varkən, qara yellər əsməsin.

Əl-ətəyin dolu olsun çiçəklə,

Səngərində bircə mərrmi bitməsin.

Gözəl dağım, ulu babam oylağı!

Fikrətəm, adına şeir yazıram.

Harda olsam, tərlan könlüm oyaqdı,

Lazım gəlsə, keşiyində hazıram.

OLA

İstəmirəm, məhəbbətin

Yollarında duman ola.

Ulduzumuz barışmağa

İstərəm ki, güman ola.

Möhnətini çəkə-çəkə,

Tay olmuşam pərğu-tükə.

Həsrətimə bircə tikə

Mərhəmətin dərman ola.

Suya gəlsən – bulağam mən,

Seyrə çıxsan – oylağam mən,

Yolunda göz-qulağam mən,

Kaş, işimiz sahman ola.

Fikrət Eyvaz gedər bada,

Sevgisini verməz yada.

Küpəgirən qarılarda

İnsaf ola, iman ola.

KAMANDAR (Aşıq Kamandar Əfəndiyevə)

Nəğməli könülsən Borçalımıza,

Ağdı el yanında üzün, Kamandar.

Nəfəsin, duyana həyat eşqidir,

Sənət məktəbisən özün, Kamandar.

Sazın hal əhlinə dindi, imandı,

Xalların, güllərin canlara candı.

Bizi özümüzdən alma, amandı,

Laylalı sonadı sazın, Kamandar.

Faxralıda söz sərrafı Nəbim var,

Tükənməyən, coşub-daşan təbim var,

Dindirdiyin hər havada həbim var,

Məlhəmdi dodaqda sözün, Kamandar.

OVÇU

Yenə qondu körpə bülbül,

Qızılgülün sinəsinə.

Zalım ovçu, gözəlliyi

Nişan alma sinəsinə.

Ay insafsız, bir az ləngi,

Dabanından sal tüfəngi.

Ovla belə döyüş cəngi

Yaraşarmı heç o sinnə?!

Cüyür gələr yorğun-yorğun,

Quşlar ötər oğrun-oğrun.

Fikrət ala göz vurğun,

Daşürəksən sən, əksinə.

SALAMAT QAL

Vurğunu olduğum, a Gözəl dağı,

Gülünü sinəmə tax, salamat qal.

Bağçadı bu yerlər, bağdı bu yerlər,

Bağça, salamat qal, bağ, salamat qal.

Gəzək binələri, lap əldən düşək,

Yağışda islanaq, gün altda bişək,

Dağların alovu, odu, a şimşək,

Gurulda, nərildə, çax, salamat qal.

Qızılqaya qızılquşlar oylağı,

Dərdlərə dərmandı Möylə bulağı.

Dələver, nə səsdi belə sübh çağı,

Çağla, salamat qal, ax, salamat qal.

Söhbəddin İlyas oğlu Məmmədov

Söhbəddin Məmmədov barədə məlumat

DÜNYADI

A dostlar, bilin ki, düz tutulmayıb

Mayası, yalandan yalan dünyadı.

Kimiyə səfadı, kimiyə cəfa,

İnsanı ucaldan, salan dünyadı.

Dinləyin sazımı, dinləyin bir az,

Dərdimi çəkəmməz nə Kür, nə Araz.

Nə ola, gözündə qalmaya muraz,

Əhdinə vəfasız olan dünyadı.

Sevinci dayazdı, kədəri dərin,

Söhbəddin, ağırdı qəza-qədərin.

Talayıb könlümü, bilmirəm sirrin –

Gətirən dünyadı, alan dünyadı.

BƏLKƏ

Dillən könül sazım, öt yavaş-yavaş,

Sinəmin dərdləri azala, bəlkə.

Haray sal simlərə, od sal simlərə,

Pozulmuş pərənim düzələ, bəlkə.

Qəm karvanı, qəm yüküdü "Urfanı",

Havalar sultanı, havalar xanı.

Dağıt bu boranı, qov bu tufanı,

Oxuya bülbüllər, yaz ola, bəlkə.

Bilmirəm, düşübmü ömrüm düyünə,

Çoxdandı həsrətəm toya-düyünə.

İstərəm ki, sazda gülüm güllənə,

Nəğməli dastanlar yazıla, bəlkə.

## AYAQ SAXLA

Etibarsız heç olmadın,

Getmə, dayan, ayaq saxla.

Kimsəni darda qoymadın,

Getmə, dayan, ayaq saxla.

Coşqun çayım, Kür, Arazım,

Nəğməm, sazım, xoş avazım.

Qoyma gözümdə murazım,

Getmə, dayan, ayaq saxla.

Süfrə salıb, məclis quran,

Dost-qohuma arxa duran.

Gədiklərdə köhlən yoran,

Getmə, dayan, ayaq saxla.

Hanı Arif, Xan Sultanım?

Yıxılıbdı xanimanım.

Ər Aydınım, ər Aslanım,

Getmə, dayan, ayaq saxla.

Söhbəddini darda qoyma,

Çovğun, boran, qarda qoyma.

Ərzurumda, darda qoyma,

Getmə, dayan, ayaq saxla.

## MƏNİM

Tale məndəm üz döndərib,

Heç sarımır bəxtim mənim.

Dərdi-qəmi yüz göndərib,

Yıxılıbdı taxtım mənim.

Mizrab vurdum telli saza,

Nəğmə qoşdum bahar, yaza.

Bürünmüşəm qar-ayaza,

Dağılıb imarətim mənim.

Sinəm yara dilim-dilim,

Zəhər dadır ağzım, dilim.

Qardaş dərdi qırdı belim,

Qalmadı taqətim mənim.

Söhbəddinəm, yandı canım,

Talandı dağım, aranım.

Kor eylədi qəm karvanım,

Əyildi qamətim mənim.

## NEYNİM

Sənsiz yurda, a qardaşım,

Ayaqlarım getmir, neynim.

Selə dönüb gözdə yaşəm,

Ər igidim səkmir, neynim.

Səyyad idin adlı-sanlı,

Hər dəfə də ovun qanlı.

Qohum canlı, istiqanlı,

Səğalımı çəkmir, neynim.

Sinəm dolu, kitab tutmaz,

Nağıla, dastana səğmaz.

Ötən günlər yaddan çıxmaz,

Xatirələr bitmir, neynim.

“Narın qala”m sökülübdü,

Yuxum ərşə çəkilibdi.

Gözüm yola tikilibdi,

Dərdli ürək yatmır, neynim.

Söhbəddin də yaralandı,

Sinəsindən paralandı.

Canı candan aralandı,

Qırıq könül bitmir, neynim.

Dünyamalı Gülməmməd oğlu Əsgərov

Dünyamalı Əsgərov barədə məlumat

BİR GÜN

Könül, havalanma bahar eşqinə,

Gələr zimistan, qar olar bir gün.

Əsər yellər, boran olar – sərt boran,

Gördüyün o günlər dar olar bir gün.

Qəvvas olub, dalma dərin dəryaya,

Etibar eyləmə bulanıq çaya.

Hərçənd sərindir kölgədə qaya,

Dincəlmə dibində, mar olar bir gün.

Dünyamalı öydünü söyləyər,

Anlayanlar qulaq verib dinləyər.

Vədə yetər, tarix tamam eyləyər,

Köçərsən, cahana car olar bir gün.

İSTƏMƏZMİ

Ay həzərat, niyə məni qınarsız,

Sevgidən ayrılan yar istəməzmi?!

Ayların xəstəsi, illər düşgünü,

Düşəndə yadına, nar istəməzmi?!

Düzülübdü əndamımın yarası,

Təbibdədi, loğmandadı çarası.

Alovlansa sinəmin bir parası,

Yansa ürək, söylə, qar istəməzmi?!

Dünyamalı köç eyləyər aradan,

Əcəl gəlsə, illac yoxdur paradan.

Bir kəsin ki, əli çıxsa mayadan,

Çəkəndə yerini, var istəməzmi?!

Şair Alı (Alı İbrahim oğlu Göyüşov)

Şair Ali barədə məlumat

QARDAŞ

Yazginən məktubu şahlar şahına,

Odur hər işlərin çarası, qardaş.

Dilimin əzbəri qibləgahıma,

Qoymaz dostu darda ağası, qardaş.

Söylə görüm, varıbsınız hayana,

Məhəmməd hümməti qərq olmaz qana.

Yetişdi, məktubun çatdı anama,

Sevinsin hamının anası, qardaş.

Kərəm sahibinin çoxdu qərarı,

Gün çıxar, hər yerdə əridər qarı.

Allah göstərməsin heç kəsə darı,

Dağılar düşmənin qalası, qardaş.

Eşitdim, gedibsən Urus şəhrinə,

Hamının işləri getsin təhrinə.

Saldın qardaşını qəmlər qəhrinə,

Alqışdı dilimin duası, qardaş.

Alı mənaları seçdi sözündən,

Sağlıq olsun, yenə öpər gözündən.

Bir az nigaranam sənin özündən,

Sağalsın könlümün yarası, qardaş.

1941-ci il.

Səkinə Məmmədalı qızı

Səkinə Məmmədalı qızı barədə məlumat

ALIM, HEY!

Heç bilmirəm, hardasan,

İgidim hey, Alım, hey!

Şər atıblar, dardasan,

İgidim hey, Alım, hey!

Adın gəzir dillərdə,

Baxmır bizə illər də.

Sərkərdanam ellərdə,

İgidim hey, Alım, hey!

Alməmmədli Səhnəyəm,

Bərəkətsiz təhnəyəm,

Sənsiz kiməm – heç nəyəm,

İgidim hey, Alım, hey!

***

Könlümdə yarımın şəkli qalıbdı,

Gözümdə qapqara kəkli qalıbdı,

İllər həsrətiyəm, üzülüb canım,

Boynum bənövşətək büklü qalıbdı.

***

Keçdi aylar-illər, Alım gəlmədi,

Noğulum, şəkərim, balım gəlmədi.

İstədim qəsd edim özüm öümə,

Bilmədim nə oldu, əlim gəlmədi.

llahverdi İbrahim oğlu

Allahverdi İbrahim oğlu barədə məlumat

YANDIRAR

Yaram qəm-qubarda, can intizarda,

Eşqinin atəşi məni yandırır.

Saxla qədəmini, gəlmə yaxına,

Od düşər üstünə, səni yandırar.

Yenə havalandı könlümün quşu,

Çoxdu qəm-qüssəsi, həm fikri-huşu.

Yığılıb yanına tayınnan-tuşu,

Xınalı dəstində şəmi yandırar.

Eşit Allahverdinin ah-fəryadını,

Ləbin şirin: bal da verməz dadını.

Gəlin sizə faş eyləyim adını:

Ağ üzündə üç nişanı yandırar.

QOCALAR

Bu fani dünyanın vəfası yoxdur,

Sinəsində neçə canlar qocalar.

Çox da qəm eyləmə, divanə könlüm,

Övliyalar, pəhləvanlar qocalar.

Yüz iyirmi dörd min Nəbim Yüllahdır,

Musam Tur dağında Kəlamüllahdır.

Məhəmmədim Meracda Salamüllahdır,

Onlar kimi din-imanlar qocalar.

Allahverdi deyər, bu sözüm haqdı,

Tut orucu, qıl namazı beş vaxtı.

Heç kimə qalmayır Süleyman taxtı,

Neçə belə Sülüymanlar qocalar.

Aşıq Polad

Aşıq Polad barədə məlumat

Olarmı

Ay ağalar, gəlin sizə söyləyim,

Pünhani işləri duymaq olarmı?

Bir ustad ki, şəyirdinə kəm baxa,

Onu ustad yerinə saymaq olarmı?

…Qalıbdı gözləri, getmir ayağı,

İstəyir belimdə ola bir yağı.

Tökülü əhəl atın yalı, quyruğu,

Onu ləyaq bilib minmək olarmı?

Polad cəhd eylədi, ala saznı,

Nə fayda, ustadsan, qıymaq olarmı?

axralıların şeir çələngi

İsmayıl Güllər : "Faxralının torpağıdır bu yerlər" (210 bənd)

Faxralı şairlərinin şeirlərindən nümunələr

1. Şair Nəbi
2. Güllər Pərisi
3. İsmayıl Güllər
4. Qara Qərib
5. Əli Faxralı
6. Əli Səngərli
7. Şair Şaban

8. Hüseynqulu Məmmədli
9. Məmmədəli Zəngin
10. Məmmədəli Əlləzov
11. Ələddin Dəmirçi
12. Hamlet Kazımoğlu
13. Oruc Nikbin (Əlizadə)
14. Səməndər Məmmədov
15. Rəşid Faxralı
16. İlyas Namazov
17. Həzi Həsənli
18. Fatma Aslan
19. Səyyarə Əlizadə
20. Məhsəti Şeyda
21. Mirvair Məmmədova
22. Hüseyn Faxralı
23. Fikrət Məmmədov
24. Söhbəddin Məmmədov
25. Dünyamalı Əsgərov
26. Şair Alı
27. Səkinə Məmmədalı qızı
28. Allahverdi İbrahim oğlu
29. Aşıq Polad

Faxralının aşıqları

Faxralı kəndinin tarixi çox uzaqlara getsə də, aşıq sənətinin qədim nümayəndələri barədə bizə gəlib çatan bilgi olmadığından, aşağıda yalnız məlumatları olan aşıqları təqdim edirik:

1. Aşıq Hasan (Aşıxhasanlılar)

2. Aşıq Oruc (Qasımlı)

3. Aşıq Sarvan Bayram (Sarvandan)

4. Aşıq Dəllək Dünnü (Baləmməddi)

5. Aşıq Hacı Nəsib (Aşıxhasanlar)

6. Aşıq Müsəllim Məmmədov

7. Aşıq Mürsəl (Kaxıların)

8. Aşıq Şəmistan(Güllərin)

9. Aşıq Alı Poladov

10. Aşıq Bəhram Əliyev

11. Aşıq İmdad Xəlilov

12. Aşıq Sahib Hüseynov

13. Aşıq Mətləb Telman oğlu

14. Aşıq Rəhim Alı oğlu

15. Aşıq Əhməd Bayram ougl u

16. Aşıq Rizvan Əhməd oglu

17. Aşıq Qabil Abdıyev və s.

Adlannı qeyd etdiyimiz bu aşıqlarımız toy məclisləri və digər şənliklərdə iştirak etdikləri kimi, həm də təşkil olunan gənc aşıqların yanşmalarında da iştirak edirlər. Bakıda təşkil olunan gənc aşıqlann yarışmasında aşıq Qabil Vaqif oğlu Abdıyev bu yarışmanın qalibi olmuşdur.

Şair Nəbi Miskin

Şair Nəbi Oruc oğlu (1873-1945) barədə məlumat (şeirlərindən qısa nümunələrə buradan tanış ola bilərsiniz)

Şair Nəbi 1873-cü ildə Faxralı kəndində yoxsul bir ailədə dünyaya göz açıb. Yeni doğulan körpənin ailəyə gətirdiyi sevinc, təəssüf ki, bir az sonra kədər və göz yaşları ilə əvəz olunub. Təsadüfən Nəbinin böyük qardaşı Hasanın əlindən xata çıxır: o, qonşu kəntdə yaşayan hörmətli

bir adamın yaxın qohumunu öldürdüyünə görə ömürlük sürgünə göndərilir. Böyük oğlu Hasanı ömürlük itirdiyini hiss edən Oruc kişi gələcək ümidini Nəbiyə bağlayırsa da onu öz istədiyi kimi böyüdə bilmir. Çətin və acınacaqlı günlər yaşayan Nəbi ehtiyac içində böyüyür.

Hələ Nəbinin 10-12 yaşı olanda ailənin bütün ağırlığı onun üzərinə düşür. Ağır zəhmətə qatlaşaraq, ailənin qayğısını çəkməli olur.

15 yaşına çatandan sonra isə bir neçə il İmir kəndində Məşədi Hüseyn adlı bir varlı şəxsə nökərçilik edir. Nəbinin ilk qoşqularının yaranması da həmin illərə təsadüf edir.

Şair Nəbi 1890-cı ildən 1910-cu ilədək müxtəlif yerlərdə nökər, çoban, varlıların malikanəsində qarovul, Allahverdi mis mədənlərində fəhlə işləmiş, savad almağa, yazı-pozu öyrənməyə heç bir imkanı olmamışdır.

20-25 yaşlarından peşəkar bir sənətkar kimi Borçalı kəndlərinin toy və yığıncaqlarında çıxışlar edib, el şairi kimi ad-san qazanmış, ömrünün axırına kimi anadan olduğu Faxralı kəndində yaşamışdır.

ikinci cahan savaşına dörd oğul yola salan və iki oğlunun qara kağızını alan, el-oba ilə birlikdə çox ağır günlər yaşayan şair Nəbi 1945-il ilin oktyabr ayında, 72 yaşında doğma Faxralı kəndində vəfat etmişdir.

Qeyrətli eloğlularımız, alimlərimiz, tədqiqatçı-folklorşünaslarımız Hüseynqulu Məmmədli, onun oğlu, Borçalı folklorunun yorulmaz və inamlı tədqiqatçısı Elxan Məmmədli şair Nəbinin şeirlərinin xeyli hissəsini toplayıb, nəşr etdirmişlər. "Borçalı Şair Nəbinin "Yazılanlar gəldi başa" və "Eləsi var…" kitabları üzdədir.

Aşıq şeirinin bütün formalarında əsərlər yazan şair Nəbi həm də gözəl dastanlar yaradan sənətkarlardan biri idi. Bu günün özündə də onun deyişmələri Borçalı məclislərində dastanlaşmış rəvayətlərlə cilvələnərək həmişəyaşarlıq vəsiqəsi alıb.

"Ağılla eşqin deyişməsi" , "Uzunbaşoğlunun toyunun tərifi", əmisi oğlu Hüseynlə, İbrahimlə, göyçəli Dost Pirməmmədlə, Təhlə Novruzla, oğlu Nadirlə, şagirdi Şabanla və s. deyişmələri bu gün də dastanlaşmış sənət incilərimiz sırasındadır.

Mənbə: Borçalı Aşıqları kitabından, 2005.

Şair Nəbi ilə Quşçi kəndindən olan Aşıq İsmayılın deyişməsi

Şair Nəbi haqqında yazırlar…

Səməndər Məmmədov Şair Nəbi haqqında

Əzəl andım, son məkanım – Faxralı

"Mən Nəbiyəm, aşıqların zəriyəm"

Ustadı sən idin pir ozanların,

Şeiri-sənəti anlayanların.

Alxas ağaların, Ağacanların

Öndər sırasında əbədi varsan,

Ay Nəbi baba, sən daim yaşarsan!

Dünyamalı Kərəm

Türk dünyasının böyük söz fatehi Zəlimxan Yaqubun bir müdrik kəlamı var: "Bizə, qalın kitablar yox, qalan ki¬tab¬¬¬lar lazımdır". Bu məna¬da, təkcə Bor¬-çalıda deyil, Azərbaycanda, Türki¬yə¬də və Cənubi Azər¬bay¬canda da sevilə-sevilə oxunan şair Nəbi Miskinin bütöv¬¬lük¬də ya¬radıcılığı başdan-başa qalan şeir nümunələri, ədəbi abidə-lərdir.

Elə bir təhsili olmasa da, şair Nəbi o qədər məzmunlu, mən¬¬tiqli şeir¬lər yazıb ki, istər-istəməz onun şeirlərini oxuyanda adamın ruhu qanad¬la¬nır. Xalq şairi Zəlimxan Yaqubun dediyi kimi, şair Nəbi Azərbaycan aşıq şeirinin bütün növlərində bir-birindən gözəl, qiymətli ədəbi nümunələr yaradıb. Onun şeir¬ləri bizim sümüyümüzə, iliyimizə işləyib. Onu bu gün hər yer¬də böyük bir el nəğməkarı kimi xatırlayırlar. Bu, ona verilən ən böyük qiymətdir.

Borçalının elə bir rayonu, elə bir kəndi olmaz ki, ən azın¬dan ağsaq¬qal¬lar şair Nəbinin şeirlərini əzbərdən bilməsinlər. Şair Nəbinin şeirlərini ən çox oxuyan, təbliğ edən və yayan¬la¬rın sıra¬sında başda unudulmaz ustad aşığımız Hüseyn Saraçlı dayanır.

Nəbi Oruc oğlu 1873-cü ildə Borçalı mahalının ağır ellə¬rin¬¬dən olan Faxralı kəndində yoxsul kəndli ailəsində anadan olub. Körpə Nəbinin dünyaya gəldiyi gündə bu kasıb ailə eyni zamanda bir kədərə də düçar olub: Nəbinin böyük qardaşı Hə¬sənin əlindən xəta çıxıb, yerli bəylərdən birinin yaxın adamını öldürdüyünə görə ömürlük sürgün edilib. Ehtiyac içində böyü-yən Nəbi erkən yaşlarından zəhmətə qatlaşmalı olub. Qonşu kənddə varlı bir şəxsə nökərçilik edib. İti hafizəsi, hazır¬cavab¬lığı ilə fərqlənən yeniyetmə Nəbi axşamlar kənd toylarına ge¬dib aşıqları maraqla dinləyirmiş. İlk qoşma, təcnis və müxəm¬məslərini yaradan gənc Nəbi toylardan birində öz dövrünün tanınmış sənətkarlarından olan Aşıq İsmayılla deyişməyə giri¬şib və ona qalib gəlibmiş…

Şair Nəbi 1890-cı ildən 1910-cu ilə kimi müxtəlif yerlərdə nökər, çoban, mülkədar malikanəsində gözətçi, Tiflisdə, Allah¬verdi mis mədən¬lərində fəhlə işləyib. Yazı-pozu öyrənməyə vaxtı və imkanı olma¬dığı və gürcü dilini yalnız güclü hafizəsi sayəsində mükəmməl mənim¬sədiyi bildirilsə də, dərin savada və geniş dünyagörüşünə malik olması onun yaradıcılığından aydınca görünür.

1910-cu ildən etibarən peşəkar bir sənətkar kimi toy və el şənlik¬lə¬rində xalqa mənəvi xidmət göstərən şair Nəbi ömrünün axırına kimi Faxralı kəndində yaşayıb-yaradıb. 1945-ci ilin ma-yında alman faşizmi üzə¬rində qələbənin qazanılması xəbəri isə onun üçün az təsəlli olub. Çün¬ki buna qədər o, cəbhəyə gön¬dərdiyi dörd oğlundan ikisinin qara kağızını almışdı. Yeri gəl¬mişkən qeyd edək ki, cəbhədən qayıtmayan oğlanların¬dan biri – Nadir də şeir qoşurdu. Hətta onun atası ilə deyişməsi də var.

Elə həmin ilin oktyabr ayında 72 yaşında dünyasını dəyişib Nəbi Miskin.

Şair Nəbinin poetik irsinə, ədəbi həyatına işıq tutulmasının əsas səbəbkarı böyük şairimiz Səməd Vurğun olub. Osman Sarıvəlli ilə birlikdə 1955-ci ilin oktyabr ayında Faxralı kən¬dinə təşrif buyuran Səməd Vurğun elimizdə müqəddəs sayılan Molla Qurban ocağında iki gün qonaq qalıb. Qonaqların şərə¬fi¬nə dü¬zən¬lənən məclisdə o vaxtlar Faxralı kənd orta məktəbində direktor vəzi¬fə¬sində çalışan ədəbiyyat müəllimi, sonralar Azər¬baycanda gör¬kəmli folklorşünas kimi tanınan, Dədə Qorqud haqqın¬da sanballı tədqiqat əsərləri yazan Hüseynqulu Məm¬mədli, Hacı Həsənov və digər ziyalılar iştirak edirdi. Həmin məclisə Aşıq Nəsib də dəvət edilib. Aşıq Nəsibin şair Nəbidən oxuduğu şeirlər Səməd Vur¬ğunun dərin marağına səbəb olub, xüsusən də bir beyt diqqətini çəkib:

…Qılıncın qınsızdı, qolun qüvvətli,

Baxmadın qocaya, cavana, dünya!

“Dünya” rədifli həmin qoşmanı bir daha oxutdurub dinlə¬dik¬dən sonra Səməd Vurğun həmin beyti “Kazbek” siqaret qutusunun üstünə yazır, üzünü hörmətli Hüseynqulu müəllimə tu¬tub: “Çox gözəl ədəbi nümunələrdi, – deyir, – yaradıb şair Nəbi Miskin. Özünüz ədəbiyyat mü¬əl¬-limisiniz, mən sizə tap¬şı¬rıram, şair Nəbinin şeirlərini toplayın. Bunların itib-batmasına yol vermək olmaz. Gözəl şeirlərdir, qoy ədəbi ictimaiy¬yətə təq¬dim olunsun. Siz toplayın, nəşrinə Osman müəllim kömək edər”.

Şair Nəbinin yaradıcılığı Azərbaycanın üç böyük xalq şa¬iri¬ni – Səməd Vurğunu, Osman Sarıvəlini və Zəlimxan Ya¬qubu heyrətə gətirmişdir. Azərbaycanın bu üç dahi şairinin heyrəti Şair Nəbinin yaradıcılığına verilən ən böyük qiymətdir. Bunla¬rın hər ücü  şair Nəbinin taleyinə işıq tutanlardır.

Elə o illərdən Hüseynqulu müəllim şair Nəbinin şeirlərini top¬lamağa başlamışdır. Həmin şeirlərin aqibəti barədə Hüseyn¬qulu müəllimin oğlu, AMEA Folklor İnstitutunun Aşıq ya¬ra¬dı-cılığı şöbəsinin müdiri, filologiya üzrə fəlsəfə doktoru, Əmək¬dar mədəniyyət işçisi Elxan Məmmədli belə yazıb: “Şair Nəbi¬nin irsinin müəyyən qismi hələ S.Vurğun vəfat etmə¬mişdən bir qədər əvvəl toplanmışdır. S.Vurğunun vəfatından sonra Hü¬seyn¬qulu Məm¬mədov tərəfindən toplanılan bu şeirlər bir qədər Azərbaycan SSR EA Ədəbiyyat İnstitutunun folklor şöbəsində, bir neçə il Ya¬zı¬çılar İttifaqının seyflərində, on ildən artıq “Yazıçı” nəşriy¬ya¬tında qaldıqdan sonra nəhayət, 1991-ci ildə nəşr olun¬muş¬dur. Kitabın nəşrinə qədər və ondan sonrakı illərdə  Hü¬seynqulu müəllimin bir sıra məqa¬lə¬ləri “Ədəbiyyat və in¬cə¬sənət” və “Sovet Gürcüstanı” qəzet¬lərində dərc olunmuşdur. Daha sonra şair Nəbinin “Bilmədi”, “Gözəl” rədifli şeirləri 1964-cü ildə Azərbaycan Dövlət Nəşriyyatı tərəfindən nəşr olunan, Əhliman Axun-dovun tərtib etdiyi “Telli saz ustadları” kitabına daxil edilmişdir”.

Hüseynqulu Məmmədlidən sonra Şair Nəbinin yaradıcılığı  folklor¬şünas alim Elxan Məmmədli tərəfindən daha geniş şəkil¬də tədqiqata cəlb edilib, eləcə də, mərhum akademik Valeh Hacılar, dosent Pənah Mah¬mudov, filologiya elmləri doktoru, professor Şurəddin Məmmədli, Arif Əmrahoğlu, professor Mahmud Kamaloğlu və tədqiqatçı-dissertant Arzu xanım Bayramlı və digər tədqiqatçılar da onun yaradıcılığına müraciət edibər.

Hüseynqulu Məmmədli tərəfindən toplanılmasına başla¬nı¬lan şeirləri Nəbi Miskinin anadan olmasının 130 illiyi ilə bağlı olaraq 2003-cü ildə AMEA Folklor Mərkəzinin Elmi Şurasının qərarı ilə nəfis tərtibatda  işıq üzü görmüşdür. Kitabın tərtibçisi və nəşrə hazırlayanı Elxan Məm¬mədlidir.

AMEA Folklor İnstitutunun Elmi Şurasının 29 yanvar 2013-cü il tarixli 1 saylı qərarı ilə nəşr olunan “Sığındım Möv¬laya” adlı kitab isə Nəbi Miskinin 140 illiyinə layiqli hə¬diyyədir. Bu kitabın araya-ərsəyə gəlməsində də Elxan Məm¬mədlinin zəhməti böyük¬dür. Burada qeyd etmək lazımdır ki, Hüsyenqulu Məm¬məd¬li Şair Nəbinin bütün külliy¬yatını toplasa da, 1991-ci ildə nəşr olunan “Yazılanlar gəldi başa” adlı kitab¬da şairin dini möv¬zu¬da olan şeirləri yer almamışdı. Bu kitabda isə həmin şeirlər də öz əksini tapıb.

Xalq şairi Zəlimxan Yaqubun dediyi kimi, şair Nəbinin şeirləri ara¬sında elə tutumlu, elə dolu nümunələr vardır ki, hər biri bir kitaba dəyər.

Səhərdən bəklədim mən yollarını,

Bir gəlib qarşımdan ötəsən, gözəl!

Sən özün bilmirsən öz murazını,

Mən yaxşı bilirəm, butasan, gözəl!

Yetmişə yetsən də, mən səni allam,

Dərgah-ilahiyə min dua qıllam.

Aylarnan xəstə düşsəm, sağallam,

Sən gəlib qolumdan tutasan, gözəl!

Mən Nəbiyəm, aşıqların zəriyəm,

Yanıram oduna, eşq əsəriyəm.

Gəlmişəm qapına, bil, müştəriyəm,

Ləbinin balından satasan, gözəl!

Bir başqa misal:

…Ləblərimlə ləblərindən gül üzəm,

Ac arıtək qonam, soram, bal çəkəm.

Yaxud:

…Günü-gündən bu gözəllik kəmələr,

Bar verib sinəndə bir cüt məmələr.

Lazım budu, tamarzılar əmələr,

Fəsildə qızarmış qönçə nar kimi.

Göründüyü kimi, nə qədər tutumlu, mənalı, məzmunlu beyt¬lə¬rdir.

Şair Nəbi bizim o vaxt yazıb-yaradan digər aşıqlara təkan, qol-qanad verib. Təsadüfi deyildir ki, şeirlərinin birində de¬yirdi: “Mən Nəbiyəm, aşıqların zəriyəm”. Deyilənlərə görə, şair Nəbi deyişmə zamanı bir dəfə də olsun məğlub olmamış, qalib gəldiyi rəqibinin də heç vaxt sazını əlindən almamışdır, əksinə, məğlub olanlara ürək-dirək vermiş, onları pərt olmağa qoymamışdır. O, cılız maraqlardan, paxıllıq hisslərindən yük¬səkdə dayanan bir şair olmuşdur. Şeirlərindən birində o dövrdə nisbətən cavan şairlər haqında belə deyib:

Səxavət əhlidi, Alıynan Şaban,

İnşallah, çatallar bizə şairlər.

Şeirdən də göründüyü kimi, Miskin Nəbi həmkarlarının hər ikisini şair kimi qiymətləndirir, eyni zamanda onların hələ cavan olduqlarını xə¬fif¬cə vurğulayır. Həmin gənclərdən biri – şair Alı II dünya mühari¬bə¬sində həlak olub – yaradıcılığının çıçəklənən vaxtında ömrü yarıda qırı-lıb. Şaban isə Allah verən ömrü tam yaşadı, gözəl şeirlər, deyiş¬mələr yaratdı.

Folklor İnstitutunun dissertantı Arzu Bayramlının araşdır¬ma¬sına görə, XIX əsrin sonu və XX əsrin ilk iki onilliyini əha¬tə edən dövrdə, yəni şair Nəbinin yaşayıb-yaratdığı dövrdə Borça¬lıda fəaliyyət göstərən 116 poeziya təmsilçisindən 36 nəfəri şair, 61 nəfəri el şairi, 19 nəfəri isə yaradıcı aşıq olub. A.Bayramlı “El şairi Nəbi Faxralının həyat və yara¬dıcılığına baxış” məqaləsində yazır: “Bu qədər söz adamının arasın¬dan şair Nəbinin ustad mə¬qa¬mına çatması, şöhrətlənməsi əlbəttə ki, yalnız böyük istedadın nəticəsi ola bilərdi. Əhəmiyyətli olan bir məqam da bu¬dur ki, şair Nəbi kimsəyə şəyirdlik etməmiş, kimsədən söz sənətinin sirlərini öyrənməmişdi, amma özünün bir neçə yetirməsi vardı ki, onlara Allah vergisi olan şairliyinin sirlərinə vaqif olmağa imkan vermişdir”.

Məhəbbət mövzulu qoşmaları şair Nəbinin yaradıcılığında mühüm yer tutur və bu şeirlərində ülvi duyğuların vəsfinə ge¬niş yer verilir. Filoloq-alim Elxan Məmmədli çox düzgün qeyd edir ki, şair Nəbi bu qəbil¬dən olan qoşmalarında lirik qəhrə¬manın zahiri və daxili gözəlliyinin vəhdətdə olmasını vacib sayır. Məhəbbətdə xəyanəti, vəfasızlığı, riyakarlığı pisləyir.

Nəbim deyər, nədən oldu yar ası,

Yaman olu yarın qəlbiqarası.

Könlümün sevdiyi, ömrüm çarası,

Sərin gizlər, gözüm qaldı bu dərdə.

Diqqətiçəkən bir məqam da şair Nəbi poeziyasının təbiətlə harmo¬niya təşkil etməsidir. Onun Aşıq Ələsgərin “Dağlar” şeirinə iqtibası bu nöqteyi-nəzərdən çox maraqlıdır:

…Səhər-səhər dan yelləri əsəndə,

Şərbət bulaqların tən edər qəndə,

Yığılar gözəllər, dövr edər səndə,

Çiçəkli, çəmənli gül olu, dağlar…

…Şair Nəbi səndə gəzdi bir zaman,

Çəkilməz sərindən çiskinli duman.

Çuxur, Günavarda bənövşə, reyhan,

“Süsənli, sünbüllü, lalalı dağlar”.

Şair Nəbi dövrünün haqsızlıqlarına, cəmiyyətdə gördüyü ədalətsiz¬liklərə qarşı da öz etiraz səsini ucaldıb.

Nəbi Miskinin şeirləri, cinaslı təcnisləri, divaniləri, mü¬xəm¬məsləri ilə yanaşı, rəvayət və deyişmələri, bir-birindən gö¬zəl dastanları da var. Ədəbiyyat uzmanları şair Nəbinin mən¬zum yaradıcılığında özünü az qala hər addımda büruzə verən ür¬fani mətləbləri, müəllifin təsəvvüf dün¬yagörüşünü xüsusi qeyd edirlər. Bu dünyanın faniliyi, axirət üçün rəhmət qazan¬mağın daha vacibliyi onun şeirlərinin əsas qayəsini təşkil edir:

Şair Nəbi, pür kamalı yaxşı bil,

Zikr eylə, sən gecə-gündüz, ilbəil.

Ədəb-ərkanına qayıtmayan qul,

Cəhənnəm hazırdı, cənnəti olmaz.

Şair Nəbi yaradıcılığını izləyəndə bir həqiqətin də təsdiqini tapırıq: mükafat layiq olduqda stimula çevrilir. Şairin qoşduğu məşhur “Mehdi bəyin dastanı”nın aqibəti məhz belə olmuşdur. Haqqında yazılmış kitablarda şair Nəbinin bir gecədə düzüb-qoşduğu həmin dastanın mü¬kəm-məlliyi barədə yüksək fikirlər, yaranma tarixçəsi barədə maraqlı əhvalatlar yer alıb. Daha ma-raq¬lısı budur ki, şair Nəbinin dastanları necə eşidilibsə, eləcə də şirin Borçalı ləhcəsi ilə yazıya alınıb.

Heç təsadüfi deyil ki, Müzəffər Şükür doğru olaraq Fax¬ralını yox, bütün Borçalını şair Nəbinin yurdu adlandırırdı:

Qayaları dönməz ordudur,

Dərələri duman udur,

Şair Nəbinin yurdudur,

Müqəddəsdir Borçalımız.

Şair Nəbinin Aşıq Ələsgərin qıfılbəndinə cavabı da onun zəngin biliyindən və həyat təcrübəsindən, geniş dünyagörü¬şündən xəbər verir:

Ələsgər:

Dünya altı gündə neçə don geydi,

Nə üstə əyləşdi, bərqərar oldu?

Əzəli kimiydi ərşin bənnası,

Ulduzlar nə təhər yerbəyer oldu?

Nəbi:

Dünya altı gündə dörd don geyindi,

Ab üstə əyləşdi, bərqərar oldu.

Xey-xalığım haxda ərşin bənnası,

Ulduzun yeddisi səyahətkar oldu.

Ələsgər:

Nə qədərdi müğərrəbin mələyi?

Onların içində kim idi bəyi?

Canlıdı, cansızdı ərşin dirəyi,

Nə ilə çalındı, mötəbər oldu?

Nəbi:

Pənc-yek ayədi müqərrəbin mələyi,

Onların içində Cəbrayıl bəyi.

İsmi-əzəm cansızdı, ərşin dirəyi,

Çaldı lövhü-qələm, mötəbər oldu.

Ələsgər:

Ələsgər əl üzməz etiqadından,

Yer də xəbər verir  göy büsatınnan.

Haqqınan peyğəmbər əhvalatınnan,

İslamam deyənə nə xəbər oldu?

Nəbi:

Nəbi də əl üzməz etiqadınnan,

Xilqəti hafizdi göy büsatınnan.

Haqqınan, peyğəmbər əhvalatınnan,

Mərifət İslama o xəbər oldu.

Nəzərdən keçirdiyimiz nümunə həm də onun göstəricisidir ki, şair Nəbi dindar, Allaha yaxın adam olmuşdur. O, mömin kimi ömür sürmüş, ömrünün sonunacan İslamın qanunlarına riayət et¬miş, orucundan-nama¬zın¬dan qalmamışdır. Xalq arasın¬da şair Nəbinin istedadı “Haqq vergisi”, “Allah vergisi” hesab olunurdu. Şa¬irin həyat yolunu öyrənən tədqiqatçı¬ların da qeyd etdiyi kimi, ruhanilərin Miskin Nəbi yaradıcılığına müna¬si¬bəti birmənalı ol¬ma¬mışdır. Onlardan bəziləri şair Nəbini sınaqdan keçir¬məyə cəhd göstərmiş, amma uğursuzluğa düçar olmuşdur. Bəli, yalnız qəlbi Tanrıya bağlı olan müsəlman və dərin iman sahibi olması dün¬yaya gəldiyi gündən (qardaşının əlindən xəta çıxması səbəbindən ailəsinin zil¬lətə düçar olduğu gündən) ölənədək (ömrünün son beş ili iki oğul itirdiyi Böyük Vətən müharibəsi dövrünə təsadüf edib) onu müşayiət edən ağrı-acıya sinə gərməsinə kömək etmişdir.

Zəmanəmizin böyük söz ustadı, Xalq şairi Zəlimxan Ya¬qub da istər yaradıcılığında, istər çıxış və məqalələrində şair Nə¬binin yaradıcılığını həmişə yüksək qiymətləndirib. “Bor¬çalıda qalan izlər” poemasında şair Nəbinin də adını əbədiləş¬dirməsi dediklə¬rimizə canlı sübutdur:

Deyəndə Nəbinin “Dünya” şeirini,

Aşıq lap Vurğunu sehirləmişdi,

“Tapar qiymətini, tapar yerini,

Elin sənətkarı ölməz”, – demişdi.

“Qılıncın qınsızdı, qolun qüvvətli,

Baxmadın qocaya, cavana dünya” –

Ay Osman, gör şair nə gözəl deyib,

Ağlının barıdır, qəlbinin səsi.

Çatdıraq ellərə, heyifdir, heyif,

İt-bata düşməsin bircə kəlməsi.

Nəbi Miskinin anadan olmasının 140 iliyini Xalq şairi Zəlimxan Yaqubun rəhbərliyi altında Azər¬baycan Aşıqlar Birliyi layiqincə qeyd etdi. Və elə buradaca özümün və və şair Nəbini yetirən Faxralı kəndinin – faxralıların bir arzusunu da dilə gətirmək istəyirəm: bu yubiley şairin adına layiq onun doğma yurdunda da qeyd olunsun. Onun ruhuna hörmət kimi adının əbədiləşdirilməsi, Faxralı kəndində ona abidə ucaldılması isə saza, sözə verilən qiymət kimi təkcə faxralıların yox, bütün borçalıların arzusudur. Nəbi Miskin bu ehtirama, bu diqqətə haqqı olan şairdir.

Bu yazını Borçalının ağsaqqal şairi Dünyamalı Kərəmin şair Nəbiyə həsr etdiyi şeirdən bir parça ilə tamalayıram:

Şenliklə dost kimi girişdin bəhsə,

Heylini bağlayıb saldın “qəfəsə”.

Sığal çəkdin divanəyə, təcnisə,

Lirik şeirlərin tacıdarıydın.

Şagirdlərin oldu dövlətin-varın,

Hüseyn Saraçlıydı əziz simsarın.

Aşıq Əmrahların, Kamandarların.

Ən böyük hünərvər kamandarıydın.

2014-cü il.

Mənbə : Səməndər Məmmədov – “Faxralılar”, Bakı – “Elm və təhsil” – 2017, I kitab

Rəşid Faxralı Şair Nəbi haqqında

Şair Nəbi 1890-1910-cu illərdə nökər, çoban, Tiflisdə, Allaferdidə fəhlə işləyib. Savad ala bilməyib. İti hafizəsi olub. İlk qoşmalarını 1884-85-ci illərdə yazıb. Borçalı ədəbi məktəbinin ən işıqlı nümayəndələrindan biri olub. H.Məmmədlinin tərtibatında “Yazılanlar gəldi başa” kitabı nəşr olunub (B.1981 ).

Şair Nəbi aşıq poeziyasının divani, təcnis, qoşma, müxəmməs və s. formalarından bacarıqla istifadə etmişdir. Onun qoşmalarında nəcib, təmiz, müqəddəs məhəbbətin tərənnümünə geniş yer verilir. Şair belə qoşmalarında lirik qəhrəmanın zahiri və daxili gözəlliyinin vəhdətdə olmasını vacib sayır. Məhəbbətdə xəyanəti, xainliyi pisləyən sənətkar gözələ müraciətlə deyir:

…Camaldan göyçəksən, qəlbindən xain,

Naşı düşdüm, gəl eyləmə naz, gözəl.

Başqa bir qoşmasında

Nəbim deyər, nədən oldu yar ası,

Yaman olur yarın qəlbiqarası.

Könlümün sevdiyi, ömrün çırası,

Sərin gizlər, gözüm qaldı bu dərdə.

Və yaxud

Naz satırsan özgələrə, bizə nə,

Məni saldı min xəyala zülflərin.

Şair Nəbi şeirlərinin əsas xüsusiyyətlərindən biri də bu şeirlər də insanın mənəvi aləminin, onun nəcib hisslərinin, təmiz və xeyirxah arzularının sənətkarlıqla tərənnüm olunmasıdır. Belə şeirlərdə sevinc də var, kədər də. Bu kədər oxucunu sarsıdır, sevinc isə onu yaşamağa, sevinməyə ruhlandırır:

Səhərin günəşi, tərlan havası,

Elə pərvaz eylər, qaşda dayanmaz.

Yandırdı cismimi, döndərdi közə,

Pünhanı ağlaram, yaş da dayanmaz.

Nəbi yaradıcılığında təbiətin bütün gözəllikləri insanın mənəvi aləmi ilə müqayisədə canlandırılır. Şair lirik qəhrəmanın daxili dünyasını, onun əhvalını təbiətlə qarşılaşdırmağı bacarır:

Al-yaşıl bəzənib hənalı dəsti,

Havalı telləri yel vurdu, əsdi.

Qabaqdan boranı səbrimi kəsdi,

Dumanlı-çiskinli qar gəldi, keçdi.

Şair Nəbinin məhəbbəti təbiətlə, torpaqla qırılmaz tellərlə bağ lıdır. Onun sevdiyi real gözəllərdir. Bulaq başında, bağlarda, tarlalarda, toy-nişan məclislərində, bir sözlə, el gözəlləri Şair Nəbi lirikasının əsas qəhrəmanlarıdır. “Güllü” rədifli qoşmaya nəzər yetirək:

Mən Nəbiyəm, eşidəsən ünümü,

Hiss edəsən, sən biləsən günümü.

Müxtəsər, nə deyim, şirin canımı,

Cəlladsız, fərmansız alıbdı Güllü.

Yaradıcılığında məhəbbət mövzusu üstünlük təşkil edən şair, tərbiyəvi-didaktik mövzulara da biganə qalmamışdır. O, “Qiyməti olmaz”, “Faydası nə”, “Könül”, “Olmamış”… rədifli ustadnamələrində insanlarda ağıl, kamal, dünya malına tamahsızlıq, doğruçuluq və s. kimi keyfiyyətləri yüksək qiymətləndirir.

Şair Nəbi zəmanəmizin açıq gözlü sənətkarı idi. Həyatın bir sıra ziddiyyətləri, ictimai toqquşmaları ilə şəxsən üz-üzə gəlmiş şair, ictimai-siyasi məsələləri şeirlərində bu və ya başqa dərəcədə əks etdirmişdir.

Bəy və mülkədarların hökm sürdüyü bir dövrdə zamanın ağır qanunlarından, insanların dözülməz həyatından şikayətlənən şair,

Fələk, gəldik biz əlindən amana,

Dil verirsən aralıqda yamana,

– deyə ictimai quruluşa münasibətini bildirir ("Yazılanlar gəldi başa" kitabına Elxan Məmmədlinin yazdığı ön söz (ixtisarla)).

OLMAMIŞ

Könül, dolan bu dağları zimistan qar olmamış,

Gər dolansan əfsanədi sevgili yar olmamış.

Axtarsan bəlli olar, əsli-zatı bəlləni,

Bivəfaya bel bağlama, əhdi-ilqar olmamış.

Ziynət verib zülflərinə tökülüb soldan-sağa,

Göz yaşım qətrələnə, buluddan leysan yağa.

Üz qoyub üzərinə vədəsiz girsən bağa,

Agah ol ki, nəf etməzsən şəcərdə bar olmamış.

Şair Nəbi, aç matahın, sal vəsfini bəyana,

Rəftar elə, salam yetir hər gördüyün insana.

Dəftər elə sözlərini adın düşsün cahana,

Haçan bülbül səda verər fəsli-bahar olmamış?

DÜNYA

Doğrudan, yalandan dərs verdin bizə,

Çıxmadı işlərin bir yana, dünya.

Nə mənzilin bəlli, nə də məkanın,

Cadalar düşübdü hər yana, dünya.

Xudam ziynət verib dağınan daşa,
Nə sultan tanıdın, nə xan, nə paşa.
Çoxları cəhd etdi, çıxmadı başa,
Gəlibdi əlindən amana, dünya.
Ruzidə bəllidi fəsildə yaylar,
Keçir ömrümüzdən həftələr, aylar.
Keçir xəyalımdan əlvan saraylar,
Dönübsən qızıla, mərcana, dünya.
Dağların dayaqdı, ləngərdi düzə,
Kimsənin eybini vurmadm üzə.
Şərbətin şəfaət veribdi bizə,
Axır həsrət qoydun cahana, dünya.
Əzəli görəndə eylədin rəftar,
Münasib olmadı yapdığın divar.
De görüm nejoldu verdiyin ilqar,
Qalmadı onlardan nişana, dünya?
Gələnlər gəlincə bir səni bildi,
Çoxunda ağladı, azında güldü.
Nə gedənlər gəldi, nə gələn qaldı,
Budur etibarın insana, dünya.
Murazı-mətləbdə diliboz atdı,
Axırda körpülər qıldan siratdı.
Qılıncın qınsızdı, qolun quvvatdı,
Baxmırsan qocaya, cavana, dünya.
Ağır səltənətdi taxtı-divanlar,

Övliya, ənbiyə, dini-imanlar.

Turaba qarışdı neçə min canlar,

Xaka bülənd oldu yeksana, dünya.

Şair Nəbi cəhd elədi cəfana,

Ömür keçdi, sığınmadı səfana.

İnnən belə inanmaram vəfana,

Sıtqınan sığındım sübhana, dünya.

ƏL ÇƏKƏM

Gedən gözəl, ayaq saxla bir saat,

Arzum budur ağ üzünə xal çəkəm.

Altun kəmər incə belin libası,

Zərgər olam, sırğalara ləl çekəm.

Bülbül olam, qonmaq üçün dal gəzəm,

Mast edəsən, danışmayam, lal gəzəm.

Ləblərimlə ləblərində gül gəzəm,

Ac arı tək çəkəm, soram, bal çəkəm.

Sinən üstə eşq odunu qalayam,

Göz yaşını şərbət bilib yalayam.

Həsrətimi həsrətinə calayam,

Ta sübhədək saçlarına əl çəkəm.

Sevən çəkər sevgisinin ahını,

Müjganların bu sinəmə toxunu.

Mən Nəbiyəm, gördüm hüsnün şoxunu,

Az qaldım ki, bu dünyadan əl çəkəm.

DAGLAR

Getdim gördüm bir səfalı yurd olub,
Əməli, aqbəti düz olan dağlar.
Hər şeyə bərabər gülab suları,
Qaynar bulaqları göz olan dağlar.
Sanasan bağçada saynşır güllər,
Bir ayna qabaqlı səbbikar söylər.
Tələsmə, nazənin, tez olar ruzgar,
Gün çıxar buluddan, yaz olan dağlar.
Yaxşı bildim növrağını, işini,
Vaxt olanda yurddan yurda daşını.
Duman-çiskin bürümüşdü başını,
Açılmaz qabağı, naz olan dağlar.
Mən Nəbiyəm, gəlib burda yaylaram,
Səyyad olsam bina salıb oylaram.
Bu cah-cəlalını tərif eylərəm,
Düşərsən dillərə söz olan dağlar.

Rəşid Faxralı Şair Nəbiyə
Borçalı nur içindədi,
Çıraq- Nəbimin sözləri.
Duyğumuza sığal çəkən
Daraq – Nəbimin sözləri.
Oyan, dəli sevdam oyan,
Oyan, al qanına boyan.
Ərən əlində parlayan

Yaraq– Nəbimin sözləri.

Qıyma, ömrüm-günüm itə,

Ömür gəlib başa yetə.

Tut əlimdən, axirətə

Varaq, Nəbimin sözləri!

Mənbə : Rəşid Faxralı – "Oğuz eli Faxralı"

Çingiz Haley oğlu Qasımov Şair Nəbi haqqında

Saz,söz sərrafı – şair Nəbi

Azərbaycan aşıq sənətinin uzaq keçmişlərdən soraq verən qədim tarixi vardır. Lakin uzun zaman bu sənətin öyrənilmə və öyrətmə metodu öz məhvərindən uzaq olmuşdur. Xalq ədəbiyyatında və folklorşünaslıq elmində aşığın müxtəlif önəmli xarakteri təhlil edilib sürəkli şəkildə təqdim olunma mexanizminin mövcudluğu bu və digər alimlərin araşdırmalarında qeyd olunmuşdur. Azərbaycan aşıq sənətinin tam şəkildə öyrənilməsi üçün ayrı-ayrı mühitlərin araşdırılması və tədqiqata cəlb olunması məqsədə uyğundur.

Şifahi xalq ədəbiyyatının janr özünəməxsusluğunu, milli adət-ənənələrini bu gün də qoruyub saxlayan, xalq sənətini zaman-zaman yaşadan, formalaşdıran mühitlərdən biri də Borçalıdır. Bu mühitin tarixən müəyyən ənənələrə malik olması, ustad və ifaçı aşıqları ilə seçilməsi Borçalı aşıq mühitindən kifayət qədər söz açmağa imkan verir. Ulu müdriklərimiz demişkən, torpağın müqəddəsliyi, gözəlliyi onun yetirdiyi barında, bərəkətindədir. Barın təamı qüvvətli, yararlı olanda ondan dadıb – tamsınanlar da güclü, qüvvətli, namuslu, qeyrətli, istedadlı və müdrik olurlar. Belə müdriklər, istedadlar o torpağın başını ucaldır, şöhrətini el – obalarda yayır – yaşadır və müqəddəsləşdirir. Bu baxımdan, Borçalı da müqəddəs torpaqdır. Onun əzəmətli dağları, loğman laylaqları kimi, saz – söz sənətkarları da vüqarlıdır. Borçalı aşıqları xalqın şad günündə (el bayramları, toy məclisləri), həmişə xalq arasında olmuş, xoş avazları, şən havaları ilə elin-obanın ruhunu oxşamış, xeyir-dualarını xalqdan əsirgəməmişlər. Belə ki, bu sənət formalaşdığı dövrdən, insan aləmini, onun istək və arzularını, ağrısını, acısını, sevincini, kədərini, sevgi və iztirablarını tərənnüm edir.

Azərbaycan aşıq sənətində bir çox məktəb mövcuddur. Hər bir məktəbə məxsus aşığın da ifa tərzi, bölgə xüsusiyyətləri ilə bağlıdır. Qeyd edim ki, bu bölgələrin arasında Borçalı aşıq məktəbi öz üslubu ilə çox fərqlənir. Belə ki, Borçalı aşıqları ancaq təklikdə ifaya üstünlük verirlər. Borçalı mahalında, eləcə də digər bölgələrdə aşıq yaradıcılığının inkişafında el şairlərinin də xidməti az deyil. Belə üslubda şeir yazan şairlərə bəzən haqlı olaraq "saz şairləri" də deyirlər.

Borçalı ədəbi mühitində Aşıq Oruc, Aşıq İsmayıl, Aşıq Həsən, Dost Pirməmməd, Alxasağa, Güllər Pəri, Aşıq Şenlik, Aşıq İbrahim, Qul Allahqulu, Şair Ağacan, Aşıq Sadıq, Sarvan Bayram, Xındı Məmməd kimi saz-söz ustaları olub.

XIX əsrin sonu, XX əsrin əvvəllərində özünün “qızıl dövrü” nü yaşamış Azərbaycan aşıq poeziyasının görkəmli nümayəndələrindən biri də el şairi Nəbi Orucoğlu-Faxralıdır (1873-1945). Şair Nəbi yaradıcılığı ilə kökü minillərin dərinlikliklərinə gedən qədim ozan-aşıq sənətinin əsrlər boyu formalaşmış ənənələrinə, aşıq poeziyasının Qurbani, Qaracaoğlan, Abbas Tufarqanlı, Dadaloğlu, Xəstə Qasım, Aşıq Valeh, Aşıq Ələsgər kimi qüdrətli nümayəndələrinin yaradıcılığına, Vaqif ədəbi məktəbinin poetik imkanlarına söykənir. Şairin əlimizə gəlib çatan 250-yə yaxın şeiri, eləcə də deyişmələri və yaratdığı “Mehdi bəyin dastanı” onun məhz aşıq poeziyası üzərində yüksəldiyini, öz əsərləri ilə aşıq poeziyası xəzinəsini zənginləşdirdiyini, özündən sonrakı el şairlərinin yaradıcılığına əhəmiyyətli təsir göstərdiyini təsdiqləyir.

1873-cü ildə Borçalı Mahalının Faxralı kəndində kasıb kəndli ailəsində anadan olan şair Nəbi savad almağa imkan tapmasa da, fitri istedadı sayəsində 14-15 yaşlarından aşıq poeziyasının müxtəlif formalarında bir-birindən gözəl şeirlər yaratmışdır. Buna görə də şair Nəbi elə həmin illərdən el şairi kimi şöhrət qazanmış, gəraylı, qoşma, divani, müxəmməsləri… dildə-ağızda dolaşmış, dövrünün saz-söz xiridarlarının diqqətini cəlb etmişdir. Borçalıda və ətraf bölgələrdə keçirilən toy məclislərinə dəvət alan, güclü poetik nəfəsi, mükəmməl şeirləri ilə könülləri rövnəqləndirən, bədahətən qoşqular söyləyən Şair Nəbi dövrünün ən müqtədir el sənətkarları arasında özünə-məxsus yer tutmuşdur. Onun Aşıq Ələsgərin bağlamasını açması, Çıldırlı Aşıq Şenlik, Göyçəli Dost Pirməmməd, Təhləli Şair Novruz və başqa sənətkarlarla deyiş-mələri, “Mehdi bəyin dastanı” kimi gözəl dastan yaratması, zəmanəsinin Şair Ağacan, Qaraçöplü Aşıq Musa, Aşıq Sadıq Sultanov, Miskinoğlu Allahverdi, kimi saz-söz ustaları ilə dostluq və yaradıcılıq münasibətlərində olması təkcə Borçalı ədəbi və aşıq mühitində yox, həm də XIX əsrin sonu-XX əsrin əvvəllərində klassik aşıq poeziyasında özünəməxsus yer tutduğunu göstərir.

Xöşbəxtlikdən Borçalı Şair Nəbinin yaradıcılığının bir hissəsi özünün sağlığında yazıya köçürülmüşdür. Bununla belə, Borçalının digər el şairləri kimi, Şair Nəbinin yaradıcılığı da uzun illər tədqiqatçıların diqqətindən kənarda qalmışdır. Deyilənlərə görə, Şair Nəbinin çox zəngin ədəbi irsi olmuşdur. Onun bu irsinin əhəmiyyətli hissəsi hələ də hafizələrdə və arxivlərdə yaşayır. Şair Nəbi oxumaq-yazmaq bilmədiyindən bədahətən dediyi şeirləri yazıya köçürə biməmiş, həmin əsərlər ağızdan-ağıza keçərək başqalrı tərəfindən qələmə alınmışdır. Beləliklə, şairin ədəbi irsinin bir hissəsi itib-batmış, müəyyən hissəsi isə bugünümüzə gəlib çatmışdır.

Poeziya bir aləmdir, əsl şair isə onun nurlu günəşi. Şair qəlbi nurlu olur. Həqiqi şair dünyanı işıq selində, işıq içində görür – şair Nəbi kimi. Şair Nəbi qəlblərdə məskən salan, könüllərə işıq saçan əbədi bir xatirədir. Şar Nəbi poeziyasının xüsusi bir rəngi, boyası var. Bu boyanı onun şeirindən ayırmaq olmaz. Ayırmaq mümkün olsa, şeir bütün ifadəlik məziyyətlərini itirər. Onun şeirlərini oxuduqca misralar sanki ana südü kimi, bulaq suyu kimi içilir, mənəviyyatımız nurla, şəfqətlə qidalanır.

Şair Nəbi öz şeirlərində vətənin ucsuz-bucaqsız düzlərindən, başı göyləri dələn dağlarından, dibi gün görməyən meşələrindən, lilparlı buz bulaqlarından söz açır, xınalı qayaları, naxışlı daşları, yalçın qayaları, laləli, nərgizli çəmənləri böyük iftixar hissi ilə vəsf edir.

Getdim gördüm bir səfalı yurd olub,

Əməli, ağbəti düz olan dağlar.

Hər şeyə bərabər gülab suları,

Qaynaq bulaqları göz olan dağlar.

Və ya,

Şair Nəbi səndə gəzdi bir zaman,

Çəkilməz sərindən çiskinli duman.

Çuxur, günavarda bənövşə, reyhan,

Süsənli, sünbüllü, laləli dağlar.

Şair Nəbi yaradıcılığında klassik aşıq şeirinin bütün formalarından istifadə etməklə qiymətli ədəbi nümunələr yaratmışdır. Onun divani, təcnis, gəraylı, qoşma, müxəmməs və s. biçimli şeirləri mükəmməlliyi, ifadə və təsvir vasitələrinin təzəliyi ilə seçilir. O, incə aşiqanə vəsfləriylə məhəbbət lirikasının gözəl nümunələrini yaradıb:

Gizlincə dərdinə düçür olmuşam,

Etmərəm sirrini bəyan gözəlin.

Canımı oxlara qoydum nişana,

Gözü cəllad, qaşı kaman gözəlin.

Şair Nəbinin yaradıcılığında gözəllərin aşiqə etdikləri işvəsi-nazı, qəmzəsi də bədii ifadəsini sadə, aydın şəkildə tapıb:

Sallanıb gedişin od salır cana,

Zülfün havalanıb düşür hər yana.

Layiqdi dəstində olaydım şana,

Yapışaydım ətir-ənbər telindən.

Şair Nəbi haqq, dilək adamı, din, təriqət yolçusudur. Qəlbindən Allah eşqi, dilindən haqq duası əskilmir. Hər an ulu yaradana sitayiş, dərin etiqad, haqqa inam, insanlığa mərhəmət, halallıq, xeyirxahlıq şeirlərinin ana xəttini təşkil edir. Yaradıcılığının çoxunu dərin, hikmətli ustadnamələr, dini səpgili şeirlər, bağlamalar, təcnislər, təxmislər təşkil edən şair Nəbinin şeirləri məna və məzmununa görə insanlığı kamilliyə səsləyən, hikmət dərslərini andıran həyat həqiqətləridir.

Yazılanlar gəldi başa, qələminə çox şükür,

Cümləmizə muraz verən, kəraminə çox şükür.

Göydən dörd baş kitab endi, əzəl başdan İncili,

Biz götürdük ol Quranı, kəlamına çox şükür.

Şair Nəbi dövrünün ustad sənətkarlarından idi. Onun görüb-eşitdiklərini fitri istedadla mənimsəməsi, məclis aparmaq qabiliyyəti, natiqliyi, şairliyi, hazırcavablığı, dastan danışmaq və yaratmaq bacarığı xüsusilə qeyd edilmişdir. Borçalı el şairlərinin aşıqla bərabər məclis aparması yalnız bu aşıq mühitində müşahidə olunur. Şair Nəbi də ozan-aşıq ənənəsində özünəməxsus yeri olan bu keyfiyyəti çox uğurla davam etdirən ustadlardan olmuşdur.

İkinci məqamsa Şair Nəbinin saz çala bilməməsi ilə bağlıdır. Elə bilirik ki, bu, sırf texniki ifaçılıqla bağlıdır. Çünki, şair havacatlara vaqif idi. Havaları sinəsindəki deyil, könlündəki sazda çalırdı. Görünür, sözə qarşı həddən artıq həssaslığı onu ifanın texniki tərəfləri ilə bağlanmağa qoymurdu. Buna görə də həmişə Şair Nəbinin yanında müşaiyətçilər- “saz tutanlar” olmuşdur ki, onlar sözlə havanın vəhdətini yaratmağa xidmət etmişlər. Görkəmli sənətkarımız Aşıq Hüseyn Saraclı da 3-4 il Şair Nəbinin yanında “saz tutmuşdur.”

Şair Nəbi özündən əvvəlki xələflərinin söz-sənət səltənətini özünəməxsus mükəmməl şeirləri, söz sınağından üzüağ çıxan deyişmələri, yaratdığı əhvalatları və dastanı ilə zənginləşdirmiş, dövrünün qüdrətli sənətkarı, bənzərsiz söz ustadı kimi tanınmışdır. Şair Nəbinin gəraylı, qoşma, müxəmməs və s. şeirlərində dərin hikmət, həyat həqiqətləri, sabaha inam vardır. Elə buna görə də onu söz sərrafı sanırıq. Şeirləri dillər əzbəri, öyüd-nəsihətləri qulaqlardan getməyən Şair Nəbinin həyat və yaradıcılığı hələ çox araşdırılacaq, haqqında çox yazılacaq və onunla bağlı xatirələr heç vaxt unudulmayacaqdır.

Mənbə: Çingiz Haley oğlu Qasımov

Müşfiq BORÇALI Şair Nəbi haqqında

“ZİM.AZ” saytından : ŞAİR NƏBİ FAXRALI (1873-1945)

Şair Nəbi Oruc oğlu – 1873-cü ildə qədim Borçalı mahalının saz-söz beşiklərindən sayı¬lan, el şairliyi, aşıq sənəti ənə¬nələrinin zənginliyi və yaşarlığıyla seçilən Bolusun (indiki Gürcüstanın Bolnisi rayonunun) məşhur Faxralı kəndində yoxsul bir ailədə dünyaya göz açıb.

Bu kənd aşıq-söz sənəti ənənələrini tarixən yaşa¬dan ocaqlardan¬dır. Burada Borçalı saz-söz mühitində çox məşhur olmuş sənətkarlar yetişib.

Şair Nəbi isə özündən əvvəlki xələf¬lərinin söz-sənət səltənətini özünəməxsus qüdrətli şerləri, deyişmələri, yarat¬dığı dastanları ilə daha da zənginləşdirib. Bu¬nunla da o, öz dövrünün ən qüdrətli sənətkarı, böyük söz xiridarı kimi tanı¬nıb.

Yeni doğulmuş və Nəbi adlandırılmış körpənin ailəyə gətirdiyi se¬vinc, təəssüf ki, bir az sonra kədər və göz yaşları ilə əvəz olunub. Tə¬sadüfən Nə¬binin böyük qardaşı Hə¬sənin əlindən xəta çıxıb: o, qonşu kəndin nüfuzlu şəxs¬lərindən bi¬ri¬nin yaxın qohumunu öldürdüyünə görə ömürlük sürgünə məhkum edilib. Böyük oğlu Hə¬səni əbədi itirdiyini hiss edən Oruc kişi gə-ləcək ümidini Nəbiyə bağ¬la¬yırsa da, onu öz istədiyi kimi böyüdə bil¬mə¬yib. Ağır günlər yaşayan Nəbi eh¬tiyac içində böyüyüb…

11-12 yaşa çatandan sonra Nəbi ailədə illərdən bəri hökm sürən ehti¬ya¬cın bütün müsibətlərinə şərik olub.

Ağır zəhmətə qatlaşıb, ailə, ata-ana qay¬¬ğısı çəkməyə başlayıb.

15 yaşa çatandan sonra isə bir neçə il İmir kəndində Məşədi Hüseyn ad¬¬¬lı bir varlı şəxsə nökərçilik edib.

Həmin illər nökərçilik etməklə yanaşı, o, ilk qoşma, təcnis və müxəmməslərini yaradıb.

Şair Nəbi 1890-cı ildən 1910-cu ilədək müxtəlif yerlərdə nökər, ço¬ban, mülkə¬dar malika¬nə-sində gözətçi, Allahverdi mis mədənlərində fəhlə işlə¬miş, savad almağa, yazı-pozu öyrənməyə heç bir imkanı olma¬mışdır. Ancaq hafizəsinin itiliyi sayəsində saz çalmağı və gürcü dilini mükəmməl öyrən¬mişdir.

1910-cu ildən etibarən peşəkar bir sənətkar kimi Borçalı kəndlərinin toy və yığıncaq¬larında çıxışlar edib, el şairi kimi ad-san qazanıb, öm¬rünün axı¬rına kimi anadan olduğu Faxralı kəndində yaşamışdır.

Özü saz çala bilməsə də, çox gö¬zəl, məlahətli səsi, avazı olan Şair Nəbinin yanında həmişə bir neçə sazçalanı olub. Ömründə əlinə saz almayan Nəbi hələ yeniyetmə yaşlarında olarkən təbi gəlib şeir dediyi zaman əlinə bir ağac alıb ona toxunaraq ilhamını kökləyirmiş. Ancaq il¬lər ötüb Şair Nəbi sözü, sənə¬tilə şöhrət tapandan, tanınandan sonra belinə xən¬cər asıb və şeir deyəndə xən¬cərini saza çevirirmiş, saz kimi istifadə eləməyə başlayırmış. O səbəbdən də, xəncər heç vaxt şairin belindən əskik olmazmış.

Əli Faxralının söylədiyinə görə, şair Nəbinin ilk saz tutanı Aşıq Həsən olub. Son¬ralar Aşıq Dünyamalı, Aşıq Mü¬səllim, Sarvan Bayram, Xındı Məmməd, Hü¬seyn Saraclı onun yanında saz çalıblar. Ona ən yaxın dost olan və uzun illər məclislərdə yanında saz çalan isə Aşıq Mürsəl olub. Fitri istedadı və danışığı ilə könülləri ovsunlayan Şair Nəbi yazmaq, oxumaq bilməsə də, ancaq çox gözəl və iti hafizəsi olub. Şair Nəbi heç bir ustada şəyirdlik etməyib. Özünün isə bir neçə yetirməsi olub. Onlardan şair Şaban, şair Alı, Bəkir oğlu Əlləzi gös-tərmək olar. Bu yetirmələri şair Nəbiyə hədsiz hörmət və ehtiramla ya¬na¬şardılar. Onun adını hər məclisdə uca tutardılar. Şair Nəbi də bu yetirmə¬lə¬rinə qayğı ilə yana¬şar, on¬ların yazdıqlarını yüksək qiymətləndirərdi. Özünü Şair Nəbinin son şagirdi hesab edən Əli Faxralının söylədiyinə görə, Şair Nəbinin ömrünün son illərində saz-söz məclislərinə birlikdə qatılıblar. Əli Faxralının yaddaş dünyasında Şair Nəbiylə bağlı çoxlu xatirə ya¬şayır. Sözə, sənətə xidmət edən müəllim-şagird arasında deyilenə görə bir deyişmə də olub və o deyişmə ancaq Əli Fax-ralının yaradıcılıq arxivində qorunmaq¬da¬dır.

Şair Nəbinin ən önəmli xüsusiyyətlərindən biri də odur ki, o, özündən əv¬vəl¬ki xələflərilə sələfləri arasında güclü bir körpü rolunu oynayıb. O, şeirlərini “Mis¬kin” təxəllüsüylə yazıb.

Xalq arasında Şair Nəbinin istedadı “haqq vergisi” hesab edilirmiş. Ona görə də ruhanilərin Şair Nəbinin yaradıcılığına münasibəti birmənalı olmamışdır. Bu sə¬bəb¬¬dən bəzi din xadimləri Şair Nəbini sınaqdan keçirməyə cəhd göstər¬miş¬di¬lər.

İkinci dünya müharibəsinə dörd oğul yola salan və iki oğulunun ölüm ka¬ğı¬zını alan, el-oba ilə birlikdə ağır günlər yaşayan şair qələbədən sonra, 1945-ci ilin oktyabr ayında, 72 yaşında doğma Faxralı kəndində vəfat et¬miş¬dir.

Allah rəhmət eləsin.

Təəssüflə qeyd etməliyik ki, Borçalının digər el şairləri kimi, Şair Həbinin yaradıcılığı da uzun illər tədqiqatçıların nəzərlərindən yayınmış, diq¬qətindən kənarda qalmışdır. Ancaq xoşbətçilikdən, Azərbaycan poe¬ziya¬sının ustadı, qüd¬rətli söz sərrafı, xalq şairi Səməd Vurğunun 1955-ci ilin okt¬yabrında Fax¬ralı kəndinə gəlişi Şair Nəbinin ədəbi taleyində yeni bir mər¬hələnin baş¬lan¬ğıcı olub. O, Şair Nəbinin şeirlərini aşıqlardan eşidib, şəxsiyyəti, yaradıcılı-ğıy¬la maraqlanıb. Şair Nəbinin yaradıcılığı ilə yaxından tanışlıq onu heyran qo¬yub, xüsusən də "Dünya" şeiri şairdə xüsusi bir ovqat yaradıb. Elə oradaca onun əsərlərinin top¬lanması, nəşri və yayılması üçün kənd ziyalılarına, xüsusən də, o vaxt kənddəkiorta məktəbin direktoru və dil-ədə¬biyyat müəllimi işləyən Hüseynqulu Məmməd¬liyə bu işi görmək üçün məsləhət və töv¬si¬yələrini verib.

Elə o illərdən başlayaraq Qorqudşünas alim Hüseynqulu Məmmədli Şair Nə¬binin yaradıcılıq nümunələrini toplayıb.

Eyni zamanda, alimin oğlu, folk¬lor¬şünas alim Elxan Məm¬mədli də bu xeyirxah işdə öz xidmətlərini əsir¬gəməyib. Beləcə, bu təəssüb¬keş alimlərin zəhməti, gərgin əmə¬yi sayəsində Şair Nəbinin şeirlərinin toplan¬dığı "Yazılanlar gəldi başa" (Bakı, "Yazıçı", 1991) və "Elə¬si var…" (Bakı, "Ağrıdağ", 2003)adlı şeirlər kitabları işıq üzü görərək oxucuların, şeirsevərlərin ix¬tiyarına verilib.

Son illərdə Şair Nəbinin həyat və yaradıcılığı daha ətraflı şə¬kildə öyrənilməyə baş¬lanılıb.

Onun yara¬dıcılığıyla bağlı Valeh Hacıyev, Şuraddin Məm¬mədli, Razim Məmmədli, Müşfiq Mədədoğlu, Şahbaz Şamıoğlu, Tinatin İsa¬balıqızı, Arzu Bayramova və başqa tədqiqatçılar məqalə¬lərində, monoqrafi¬yala¬¬rında fikirlər söyləyib, onu Borçalının böyük şairlərindən biri kimi də¬yərlən¬diriblər.

"Yazılanlar gəldi başa" adlanan birinci kitaba "Borçalı nəğmə¬karı" sər¬lövhəli ön söz yazmış Elxan Məmmədli Şair Nə¬binin şeirlərindən bir qis¬mini vaxtilə öz dəftərlərinə köçürmüş Faxralı kən¬dinin maarifpərvər sakini Qurban Həsən oğlunun, şairin Böyük Vətən mü¬haribəsində həlak olmuş oğ¬lu Nadirin, vaxtilə Faxralı kənd orta mək¬tə¬bin¬də müəllim işləmiş, Qazax ra¬yonunun Kəmərli kənd sakini Vəli Ləzgi¬yevin, Şair Nəbi şeirlərini illərcə hafizələrində yaşatmış rəhmətlik Məmməd Hüseynqulu oğlunun, Aşıq Mü¬səllimin, Sarvan Bayramın, Aşıq Nəsibin, us¬tad Aşıq Hüseyn Saraclının və b. adlarını böyük minnətdarlıqla xatırlayır, ruh¬ları qarşısında baş əyir, onlara "rəhmət olsun" deyir. Biz də öz növbə¬miz¬də çoxsaylı oxucular adından El¬xan Məmmədliyə bu xeyirxah iş üçün "çox sağ olun!" – deyirik!

Aşıq poeziyasının divani, təcnis, gəraylı, qoşma, müxəmməs və s. for¬ma¬larından bacarıqla istifadə etmiş Şair Nəbinin yaradıcılı özünə¬məx¬sus¬lu¬ğu, poetik zənginliyi ilə diqqəti cəlb edir. Şairin əldə olan 200-dən çox müx¬təlif məzmunlu şeirlərinə nəzər sal¬dıq¬da görürük ki, onlar içərisində qoşma və divanilər xü¬susi yer tutur. Qoşmaların bir qismi məhəbbət möv¬¬zusuna həsr olun¬¬muşdur. Həmin qoşmalarda nəcib, təmiz, müqəddəs duy¬ğuların tərənnü¬münə geniş yer verilmişdir. Şair belə qoşmalarında lirik qəh¬rəmanın zahiri və daxili gözəlli¬yinin vəhdətdə olmasını vacib sayır. Mə¬həb¬bətdə xəyanəti, vəfasızlığı, xain¬liyi pisləyən sənətkar gözələ müraciətlə deyir:

…Camaldan göyçəksən, qəlbindən xayın,

Naşı düşdüm, gəl eyləmə naz, gözəl.

Və yaxud:

…Naz satırsan özgələrə, bizə nə,

Məni saldı min xəyala zülflərin.

Gözəldən sədaqət, mərhəmət, eşqdə vəfalılıq tələb edən şair, özü də ilqarına düz olmağa söz verir:

Əgər dönsəm ilqarımdan, el məni qınar, gözəl,

Sən gəc olma xəyalında, xatirim sınar, gözəl!

Bulaq başında, bağlarda, tarlalarda, toy-nişan məclislərində şairə rast gələn gözəllər, bir sözlə, el gözəlləri Şair Nəbi lirikasının qəhrəman¬larıdır. Bu şeirlərdə Zöhrə, Güllü, Leyli, Sənəm və b. kimi qızlar sadə kənd qız¬ları¬dır. “Güllü” rədifli qoşmaya diqqət yetirək:

Mən Nəbiyəm, eşidəsən ünümü,

Hiss edəsən, sən biləsən günümü,

Müxtəsər, nə deyim, şirin canımı

Cəlladsız, fərmansız alıbdı Güllü.

Məhəbbəti təbiətə, torpağa qırılmaz tellərlə bağlı olan Şair Nəbi ya¬ra¬dıcılığında ana təbiətin bütün gözəllikləri insanın mənəvi aləmi ilə mü¬qa¬yisədə canlandırılır. Şair lirik qəhrəmanının daxili dünyasını, onun əhva¬lını təbiətlə qarşılaşdırmağı bacarır:

Al-yaşıl bəzənib, hənalı dəsti,

Havalı telləri yel vurdu, əsdi.

Qabaqdan boranı səbrimi kəsdi,

Dumanlı, çiskinli qar gəldi, keçdi!

Göründüyü kimi, Şair Nəbi şeirlərinin əsas xüsusiyyətlərindən biri də bu şeirlərdə insanın mənəvi aləminin, onun nəcib hisslərinin, təmiz və xe¬yirxah arzularının sənətkarlıqla tərənnüm olunmasıdır. Belə şeir¬lərdə sevinc də var, kədər də. Bu şeirlərdəki kədər oxucunu sarsıdır, sevinc isə onu ya¬şa¬mağa, sevinməyə ruhlandırır:

Səhərin günəşi tərlan havalı,

Elə pərvaz eylər, qış da dayanmaz.

Yandırdı cismimi, döndərdi közə,

Elə pərvaz eylər, qaş da dayanmaz.

Yaradıcılığında məhəbbət mövzusu üstünlük təşkil edən şair tərbiyəvi-didaktik mövzulara da biganə qalmamışdır. O, “Dünya”, “Könül”, “Eləsi var”, “Faydası nə”, “Qiyməti olmaz”, “Olmamış”, “Əv¬vəli insanda gərəkdi bir sov” və s. rədifli ustadnamələrində insanlarda ağıl, kamal, dünya malına tamah¬sızlıq, doğruçuluq və s. kimi keyfiy¬yətləri yüksək qiymətləndirir. ”Dünya” rədifli ustadnaməsində:

Şair Nəbi cəhd eylədi çafana,

Ömür keçdi, sığınmadım safana.

İnnən belə inanmaram vəfana,

Sıtqınan sığındım sübhana, dünya.

-deyən sənətkar, “Eləsi var” rədifli, 26 bəndlik ustadnaməsində isə in¬sanı, insanlığı 77 cür xarakterizə edir:

…Eləsi var, güvənər öz qoluna,

Eləsi var, qalar qonşu halına.

Eləsi var, gedər haram yoluna,

Axır günü yurdu viran çöl olu…

…Eləsi var, yüz üzünün asdanı,

Eləsi var, işə getməz, pastanı.

Şair Nəbi tamam etdi dastanı,

Görüm insanlıqda neçə yol olu.

Şair Nəbi “Faydası nə?” rədifli nəsihətnaməsində aşağıdakı key¬fiy¬yət¬ləri insan oğluna irad tutur:

Mənasız, münasibsiz sözü bilmənin faydası nə?

İzinsiz, təklifsiz yerə gəlmənin faydası nə?

Uzaq dolan hərcayidən, düşmə qəm girdabına,

Əql ucundan sonra peşman olmanın faydası nə?

Ustad şeirlərinin bir qismində mərdlik, igidlik və dostluq şə¬rəfini tə¬rənnüm etmişdir. Bu şeirlərdə gəncliyimizə babalardan yadigar qalan gözəl sifətləri qoruyub saxlamaq tövsiyə olunur…

Şair Nəbi açıqgözlü sənətkar idi. Öz mənalı ömrünün ağrılı-acılı gün¬lərini ağır güzəran içərisində yaşayan şair dövrün, zamanın ey¬bəcərliklərinə göz yuma bilmir, haqsızlıq və

ədalətsizlikdən, xalqa edilən ağır zülmlərdən şikayətlənir, kimdənsə, nədənsə imdad istəyir, bəzən “fələk”dən, “pərvər¬di¬gar”dan rəhm gözləyir. Bəy və mülkədarların hökm sürdüyü bir dövrdə za¬manın ağır qanunlarından, insanların dözülməz həyatından şikayət edən şair:

Fələk, gəldik biz əlindən amana,

Dil verirsən aralıqda yalana.

və s. kimi ictimai quruluşa qarşı münasibətini bildirir.

Həyatın bir sıra ziddiyyətləri, ictimai toqquşmaları ilə şəxsən üz-üzə gəl¬¬miş şair bu və ya digər şeirlərində ictimai-siyasi məsələləri bu və ya başqa dərəcədə əks etdirmişdir.

Şair Nəbi həm də gözəl dastanlar və bir-birindən maraqlı dastan-rəva¬yətlər yaradan sənətkarlarımızdandır. Bu günün özündə də onun deyişmələri Borçalı məclislərində dastan-laşmış rəvayətlərlə cilvələnərək həmişəyaşarlıq vəsiqəsi alıb. Həmin dastan-rəvfyətlər Borçalı dastan yaradıcılığının spe¬si¬fik¬liyini özündə əks etdirir və Azərbaycan dastan¬çılığının maraqlı səhi¬fələridir. “Ağılla eşqin de¬yiş¬məsi”, “Uzunbaşoğlunun toyunun tərifi”,Şair Nə¬¬¬binin əmisi oğlu Hü¬seyn¬lə, İbra¬himlə, Aşıq Şenniklə, Göyçəli dostu Pir¬məmmədlə, şair Təhlə Novruzla, oğlu Nadirlə, şagirdi Şabanla, Ağstafa sə¬fərində Abdulla ilə, Aşıq İsmayılla, Cənubi Azərbaycan aşığı Heyli ilə deyiş¬mələri bu gün də dastanlaşmış sənət incilərimiz sırasındadır.

Mənbə:  Müşfiq BORÇALI

UZUNBAŞOĞLUNUN TOYUNA ŞAİR NƏBİNİN TƏRİFİ

(Bu toyun səs-sorağı, şan-şöhrəti bu gün də hələ danışılır, köhnə kişilərin heç dilindən düşmür)

Keçmişdə Arıxlıda iki toydamı vardı. Onlardan biri Şərfillər məhləsində, digəri isə kəndin əks tərəfində yerləşirdi. Birinci Haqverdiyə, ikinci isə Mollahasanlara (Mollahasanlar) məxsus idi. O vaxtlar toyun ilk günü oğlan evinə aşıqlar dəvət olunardı. Bəzən aşıqlar el şairlərini müşayiət edərdilər. El şairləri toyun tərifini söylər, toyda iştirak edənləri tərifləyər, bəyin-gəlinin ünvanına xoş sözlər söyləyər, bir sözlə, tərifi əskik etməzdilər. Aşıqlar isə ustadnamə, divani və təcnisdən sonra dastanlara başlardı. Hansı dastanların nəql edilməsi isə məclisdəki ağsaqqalların hamısının rəyi nəzərə alınaraq müəyyənləşdirilərdi. Aşıqlar dastanları bəzən səhər açılanadək danışardılar. Bəzən bir neçə gün davam edən məclisdə dastan diqqətlə dinlənərdi.

Uzunbaşoğlu Məhəmmədin qardaşı Nəsibə etdiyi toy uzun illər Borçalıda danışılıb. Bu toyda Borçalının bir çox məşhur adamları iştirak ediblər. Bu toy haqqında məlumat mərhum Aşıq Hüseyn Saraçlının dilindən yazılıb.

“Hər zamanın özünün adlı-sanlı qəhrəmanları, vurub-tutan, haqqı-nahaqqa verməyən igidləri olub. Belə igid kişilərdən biri də həmişə süfrəsi dost üzünə açıq olan, ürəyi ilə əməli düz gələn Uzunbaşoğlu Məhəmməd idi. Uzunbaşoğlu özü bizim bu aşağı Arıxlı kəndindən idi. Həmin kənd Bolnisi rayonunun ərazisində yerləşir, eyniadlı kənd Dmanisi rayonunun (keçmiş Başkeçid r-nu) ərazisində də var. Onu deyim ki, Uzunbaşoğlu Məhəmmədin ad-sanı, hörməti,

izzəti bir yanı Gəncəbasar, Tovuz, Qazax, bir yanı Göyçə, Ağbaba, Cəlaloğluna kimi yayılmışdı. Günlərin bir günü bu Uzunbaşoğlu Məhəmməd öz qardaşı Nəsibə (Nəsiv) toy eləyir. Bu toyun səs-sorağı, şan-şöhrəti bu gün də hələ danışılır, köhnə kişilərin heç dilindən düşmür.

Məclisi idarə edən Şair Nəbiynən Faxralı aşığı Hasan (Həsən) olur. Bu toy haqqında da çox eşitmişəm, rəhmətlik Şair Nəbi də danışıb mənə. Çünki mən ona 3 – 4 il saz tutmuşam, həmişə hər bir məclisdən sonra ondan bir dəyərli şey öyrənməmiş ayrılmazdım. Uzunbaşoğlunun toy əhvalatını da məclislərdə söyləyəndə yadımda saxlamışam. İndi həmin toy necə keçib, bu toyda kimlər iştirak elib, Şair Nəbi toya necə tərif qoşub – mən nağıl eləyim siz də halı olun:

– Niqolay vaxtıymış, hələ bu təzə hökmət (sovet) qurulmayıbmış. Uzunbaşoğlu kiçik qardaşı Nəsibə toy eləyir: mağarlar qurulur, erkəklər, tuncular kəsilir, aşpaz qazanları işə düşür. Deyərlər, bu həndəvərdə belə bir toy heç dastanlarda da görünməyib. Məclis yeddi gün – yeddi gecə çəkir. Məclisin yeddinci günü Aşıq Hasan Şair Nəbidən soruşur ki:

– Aya, a Nəbi, sən-sənin Allahın, ömründə belə cəlallı toy görmüşdünmü?

Şair Nəbi cavab verir ki:

– Aşıq Hasan, düzü, görməmişəm.

Aşıq Hasan deyir:

– Bə Allah götürərmi, belə bir toya, heç olmasa, bir tərif qoşmuyasan?

Şair Nəbi qayıdır ki:

– Düzü, bu toyun cah-cəlalı məni elə oysunlayıb ki, ha fikrimi cəmləyirəm ki, bir yaxşı tərif qoşum, bir şey hasil olmur ki, olmur. Necə çətinliyə düşsəm də, gərək Allahın köməyinnən bu məclisə yaraşan bir duvaqqapma ərsiyə gətirəm. Aşıq Hasan deyir:

– Mən bilmirəm, sən ki bu məclisə bir layiqli tərif qoşmasan, mənimlə səninki tutmayacaq. Özün bil, ya mən deyəni yaradacaqsan, ya da bu gündən sənin şairliyinə də inamım itəcək. Bundan sonra get özünə ayrı saz tutan tap.

Aşıq Hasanın sözü Şair Nəbiyə yer eləyir. Rəhmətlik bu haqda belə danışardı:

– Həmən gecə hamı yatdı, mən yata bilmədin. Ha əlləşdim, ha vuruşdum, heç yerə bir şey çıxara bilmədim. Fikirləşdim ki, bə nə qayırım? Gördüm sübhün açılmasına az qalır, camaat yuxudan durmamış tez yerimdən qalxdım, iki rükət ayat namazı qıldım. Genə geyincəkli yerimə uzandım. Öz-özümə fikirləşdim: “Aya, ortaya bir şey çıxmadı, bə Aşıq Həsənə nə cavab verəcəm?”

Beləcə fikirləşə-fikirləşə gözümə yuxu getdi… Təzəcə gözümə yuxu getmişdi ki, bir də gördüm, özüdü, uşaqlıqda yuxuma gəlib mənə üç bənd söz öyrədən dərvişdi, gənə də gəldi, durdu başımın üstündə. Sözün birini qoyub o birinə keçim: Şair Nəbiyə uşaq vaxtı vergi verilmişdi. Bir dəfə özü danışırdı, deyirdi ki:

– Mənə vergi verilməyi belə olub, oğul: bir dəfə payız vaxtı cüt ulağını alaflayırdım. Özüm də çox uşağıydım. Gecə xoruz manına az qalmışdı. Mal damında bir vəlimiz varıydı. Vəlin üstünə yıxılıb uzandım, gözümə yuxu getdi. Yuxuda gördüm ki, bir dərviş qarşımda durdu, məni yerimnən qaldırdı, saçıma sığal çəkdi. Dedi:

"Sana üç bənd söz öyrədəjəm" – öyrətdi. Həmən o üç bənd sözün indi də nə əvvəli tükənir, nə də sonu. Bu dəfə də köməyimə gəlmişdi həmən dərviş. Əlini çiynimə qoydu, dedi:

– Oğul, işin nə yaman çətinə düşüb, niyə belə darılırsan, bala? Toyun tərifini bu sözlərlə başla, qorxma, dalı gələcək.

Dərviş bu sözü dedi də gözdən itdi. Birdən ayıldım: bu, yuxu da deyil, gerçək də deyil, bə bu hancarı şeydi? Başdadım o deyən sözləri öz-özümə zümzümə eləməyə. Bir də onda gördüm düz yeddi bənd müxəmməs yarandı. Amma bu müxəmməs əvvəllər qoşduqlarıma oxşamırdı. Bu müxəmməsin birinci bəndi on altı, o biriləri gah on səkkiz, gah iyirmi, gah da iyirmi dörd alınmışdı. Fikirləşdim ki, həlvət bu da dərvişin hökmündən belə olub. Bəli, sabah tamam açıldı. Aşıq Hasan da, o birilər də qalxdılar.

Aşıq Hasan məni qırağa çəkib dedi:

– Dadaş, de görüm, bir şey hasil elədinmi, yoxsa üzümüzü qaramı edəcəksən? Dedim:

Dadaş başıma belə bir iş gəldi….Necə olmuşdu ona da eləcə danışdım. Bir azdan samavarlar qaynara düşdü, beçələr qırıldı: balnan kərə bir yanda, əmlik kababı bir yanda, bir söznən, elə bil cənnət guşəsindəsən. Qonaqlar hərə bir tərəfdə oturdular, "pismillah" eliyib süfrəyə əl uzatdılar. Bu vaxt Aşıq Hasan üzünü Uzunbaşoğluna tutub dedi:

– Bəyim, Şair Nəbi sizin bu cəlallı toyunuza layiq bir tərif qoşub, izin verin, oxusun. Uzunbaşoğli əlini qoltuq cibinə apardı, cibinnən Niqolayın bir qızıl yüzdüyünü çıxartdı. Şair Nəbinin çuxasının vəznəsinə sancdı. Dedi:

– İndi söz sənindi, Şair. Bəli, Aşıq Hasan sazı "Müxəmməs"ə gahladı, Şair Nəbi götürdü görək Uzunbaşoğlunun toyunu necə tərif elədi, onlara rəhmət, sizlərə cansağlığı, inşallah.

Məhəmməd bir od yandırıb,

Sədası hər yana düşər

Səltənəti başdan-başa,

Tərifi dastana düşər.

Gecə-gündüz açıq süfrə,

Tamamən ehsana düşər.

Gündə gəlsə yüz qonağı,

Çəkinməz, mərdanə düşər.

Zililər zinyət verir,

Naxşı Bədəxşana düşər.

Dillərdə dastan olub,

Rəsmi “Bustan”a düşər.

Deyilən söz yerdə qalmaz,

Güllü Dağıstana düşər.

Dağıstanı dövr eliyib,

Bəlkə Hindastana düşər.

Min tümən tutub otağı.

Sidqini haqqa bağlayıb,

Qışda bar verir budağı.

Gecə-gündüz əysiy olmur

Hər yandan gəlir qonağı.

Hər çeşiddən nizam gəlir,

Döşənir qumaş yatağı.

Nökərlər bəhsə düşür,

Pişvaz edəndə qonağı.

Mehtərlər dəstə tutur,

Nizamdı gümüş yarağı.

Düyüsünü biləmmədim,

Özündən işləndi yağı.

Bir həftə erkək qırıldı,

Sönmədi aşbaz ocağı.

Qırmızı çay axar kimi,

Məclisdə gəzirdi aşığı.

Səhrada görməmişəm,

Şəhri-İsvahana düşər.

Sözünə yaxşı baxır,

Sağ olsun qardaşları.

Bənzəyirlər bəyzadəyə,

Hər babatdan hünərləri.

Baxçanın qızıl gülü,

Mustafadı dil əzbəri.

Dəstəni tamam edib,

Üstündə var haqq nəzəri.

Xərcindən qorxusu yox,

Aşıb-daşır xəznələri.

Hərəsi bir tərəfdən,

Artırırlar dövlət-varı.

Halal olsun bu dolanmaq,

Qismət olsun mülkü-malı.

Səxavətdə Hatəm taydı,

Əsirgəmir kəsbi-karı.

Beş min manat pul yığıldı,

Xoşhal etdi sənətkarı.

Mən bir desəm, siz beş deyin,

Belə ad cahana düşər.

**

Bu toya yığıldılar,

Arıxlının cümlətanı.

Duz-çörəkdə şöhrət var,

Bəllədim, yoxdu duşmanı.

Dilicanın sanı yoxdu,

On gün dolandı obanı.

İki firqon cehiz gəldi,

Yüklədilər zər-zibanı.

Qız evindən oğlan evinə,

Kəsdilər yeddi qurbanı.

Sandım ki, beş yüz manat,

Əldə dağıtdı ehsanı.

Pəhləvanlar güləş tutdu,

Gen açdılar o meydanı.

**

Yolçu kişiyə mən bələdəm,

İyitlikdə tayı hanı?

Paşa ağaynan Molla Qara,

Onlar kəsirdi divanı.

Sözünə yaxşı baxır,

Arıxlının cəhəl-cavanı.

Məmmədəli bəy, Qurban ağa,

Onlarda var xan nişanı.

Hər tərəfə əmir verir,

Tüfəngi nişana düşər.

Hər şenlikdən adam gəldi,

Kəpənəkçiynən, Faxralıdan.

Molla Hacı əvvəlindən,

Dolanıbdı qeyrət yolu.

Dəli Nəsib, Molla İsə,

Rəyis idi Təhməzqulu.

Hətəmi dövran verdilər,

Xəzələ saydılar pulu.

Haqverdiynən, Saraçlı Qurban,

Ayvaznan İsmayılı.

Mahmudnan Molla Namaz,

Münasibdi İmirzalı.

İsə kişiynən Rüstəm ağa,

Astannan, Bayramalı.

Hansı məclisə girəndə

Ciblərinə düşməndi əli.

Hər şair bir söz deyər,

Tərifi dastana düşər.

Qızılhacılı Almaz ağa,

Yanında Cöyüroğlu Qara.

Haqq özü kərəmindən

Xoş nəzər salıb onlara.

Aslan ağa sərrafıdı,

Qiymət qoyur ləl-gövhərə.

İsrafil ağanın murazı,

Qılınc ağası Heydərə.

Süleyman ağanı sevmişəm,

Təhlədən məşədi Əsgər,

Nişan saldı bu diyara.

Diləmişəm o kimsədən,

Məhşərdə yanmasın nara.

O vergidə insan olmaz,

Qulaq verir mahallara,

Səxavətdə qəhrəmandı,

Cənnəti-Rizvana düşər.

Uzunbaşoğlu bir toy elədi,

Siz bilin xublar əlası.

Görənlər məətəl qaldılar,

Verildi xeyir-duvası.

Doğruluqda belə xərcə,

Dayanmaz Qarsın qalası.

Yağılcada yatağı var,

Sürüdaşda mal binəsi.

Yaxınlara vəsf elədim,

Uzaxlara çatsın səsi.

İstanbula xəbər getsin,

Eşitsin İran ölkəsi.

Məclisin mətanəti,

Moyroy Quludu yeznəsi.

Bəylərdə Səməd ağa,

Onun var açıq süfrəsi.

Sədrəddin layiq olub,

Bir mahalın qlavası.

Çəkisində ağır gəldi,

Muğanlı Hüseyn kirvəsi.

Şair Nəvi yaxşı deyir,

Aşıx Hasan müxəmməsi.

Sığalda naxışkardı,

O gövhəri kana düşər.

Söz tamama yetdi, hərə bir tərəfdən “Əhsən”, “Afərin” dedilər. Uzunbaşoğlu uşaqlara (nökərlər) əmr elədi, dedi:

– Gedin töylədən atlarımın yaxşısından dördünü seçin gətirin.

Nökərlər gedib töylədən dörd yaxşı at gətirdilər. Uzunbaşoğlu dedi:

– Şair, tək bir at çıxarsaydım, fikirləşərdin ki, bəlkə pisini çıxartmışam. İndi bu dörd atdan ürəyinə yatanın birini seç, sənin xələtindi.

Atın ürəyimə yatanını, bir ceyran kimi kəhəri seçdim. Uzunbaşoğlu gənə də göstəriş verdi, bir qafqay yəhər, bir də bir qafqay yüyən gətirib atı yəhərləyib-yüyənləyib bir səmtə bağladılar. Dalınnan da iki dənə tuncu cöngələr gətirib onları da bir səmtə qısnıyıf boyunlarından bağladılar. Uzunbaşoğlu dedi:

– Şair, bu cöngələrin də hərənizə biridi, aparın, halal xoşunuz olsun, kəsin yeyin.

Dedim:

– Ay Məhəmməd, bizə çox böyük xəcalət verdin. Mən də cöngənin o birini də Aşıq Hasana verirəm. Bu toyun tərifini məndən o tələb etmişdi.

Bəli, Uzunbaşoğlunun toyu belə bir cah-calalnan başa çatdı. Uzunbaşoğlundan, Arıxlı camaatından, hamıynan halallaşıb ayrıldıq.

Toydan beş-on gün keçmişdi. Uzunbaşoğlu Şair Nəbinin qapısına həmən bu tərifə görə təzədən əlli baş qoyun, nə qədər də pul göndərir.

Mənbə : Məqalə Punhan Əfəndiyevin Facebook səhifəsindən götürülmüşdür

Güllər Pərisi

Güllər Pərisi – 1790-cı ildə Faxralıda anadan olub.

Saz-söz vurğunu olan Güllər Pərisi 135 il ömür sürüb. Haqsızlığa dözməyən Güllər Pərisi zəmanədən şikayət edib və bu, şeirlərində açıq-aşkar öz əksini tapıb.

O, 1925-ci ildə Faxralıda dünyasını dəyişib.

Dağların

Boz dumanlar dağdan dağa dağılır,

Görünür arabir xalı dağların.

Qoyun gəlif hərəsində sağılır,

Uzanır hər yana qolu dağların.

Səhər-səhər dan yuxusu yatasan,

Gün çıxanda çadır yanın atasan.

Buynuzdu qoç, tuncu cöngə satasan,

Ondadı qazancı, karı dağların.

Pərı gedir qız-gəlinlə bulağa,

Bir canı var, bu yerlərə sadağa.

Qorxur aza, çox gedəmmir uzağa,

Duyarsa pozular halı dağların.

Mənbə: Rəşid Faxralının “Oğuz eli Faxralı” kitabından

Şair Kərbəlayi Qara Qərib

El şairi Qara QƏRİB (1902-1978). Şairə Güllər Pərisi onun ana nənəsi, şair Nəbi isə ustadıdır.

Onun şeirləri barədə buradan tanış olmaq olar.

El arasında Kablayı Qara kimi tanınıb. Güclü hafizəsi olub. Fitri istedadı ilə fərqlənib. Güclü hafizəsi və bədahətən şeir söyləmək qabiliyyəti olub. Öz yaradıcılığını tam əzbər bilib. Fərdi

təhsil alıb. 30-cu illərdə Faxralı kənd məktəbində müəllim işləyib. Borçalının əksər şair və aşığı ilə deyişib. Yaradıcılığı, əsasən, şifahi şəkildə yayılıb.

Qara Qərib klassik aşıq ədəbiyyatının bütün janrlarında şeirlər yazmış söz sərraflarındandır. Onun yaradıcılığında təbiətin əsrarəngiz gözəliyi də, insanın yüksək əxlaqi keyfiyyətləri də eyni sevgilərlə tərənnüm edilir.

Bülbülləri uçmuş budaqlar kimi,

Hicran dəryasına dalıb yurd yeri.

("Yurd yeri")

kimi mənəvi ağrı-acılar yaşayan şair təbiətin ecazkarlığından təsəlli tapır. Bu yerlərdən qürur duyur. Ürəyi "bənövşələrin üzə çıxması", "ahuların dağdan enməsi" ("Döndü") ilə açıldığından, düyğularının oylağı olan Qaraxaçı xatırlayır, bu cənnət məkanı xəyalən "ariş-arğac" eləyir, Qaraxaçın poetik təsvrini verir:

Qayaları qatar-qatar düzülən,

Daşlarından abi-kövsər süzülən,

Çiçəkləri dərman üçün gəzilən

Loğmanlara çatan yetdi Qaraxaç.

Qara Qərib oxucusunu xeyirxahlığa, xeyir əməllərə çağırır, dünyadan köçəndə yaxşı ad qoyub getməyin fəzilətlərini xatırladır. Ümumiyyətlə, Q.Qəribin yaradıcılığı insanın daxili aləminin – duyğularının, duyumlarının poetik güzgüsü hesab edilə bilər.Burda giley də var, üsyan da, sevgi də var, hicran da, təəsüf də var, qürur, qürrə də.

Dünyaya xitabən,

Məm az atəşə, qala qoyma gəl,

Olma cana zülmət, qala, qoyma gəl, –

deyən şair adıbəlli Faxralının igid kişilərinin, ər oğullarının sorağındadır:

Çəkə xancalını, kəsə aranı,

Duşmənın bağrını yaranım ola.

("Dalımda duranım ola")

Q.Qəribin sevgi şeirlərinin əksəriyyəti ünvanlıdır. Gördüyu gözəllərin gözəllyinə biganə qala bilməyən şair onlardan "müjgan oxu ilə aşiqin qanını tökməməyi", "könül sarayını sökməməyi" xahiş edir, görümünü, duyğularını şeirləşdirir. "Qızyetər", "Bu yandadır" və s. bu qəbildəndir.

Rəşid Faxralı – Dardı ( Qara Qəribə)

Sonulayıb seçdiyim,

Dağdan, düzdən biçdiyim,

Birnəfəsə keçdiyim

Yol gözümü daradı.

Əsdi, təzə-ter əsdi,

Vermədi xətər, əsdi.

Dərdimdən betər əsdi

Yel, közümü daradı.

Hələ qövr edir yaram.

Varam, bu dərdnən varam!

Səni oxudum, Qaram.

Söz, sözümü daradı.

Mənbə: Rəşid Faxralının "Oğuz eli Faxralı" kitabından

Hüseynqulu Məmməd oğlu Məmmədli

QISA MƏLUMAT

Hüseynqulu Məmməd oğlu Məmmədli – 1919-cu ildə Faxralı kəndində anadan olub, Azərbaycan Dövlət Pedaqoji Universitetinin Dil-ədəbiyyat fakultəsini bitirib. Doğma kəndində müəllim, məktəb direktoru və 1963-cü ildən Azərbaycan Maarif Nazirliyində məktəblər üzrə inspektor işləyib. İşlə yanaşı ədəbi yaradıcılıqla da məşğul olub. "Deyilənlər gəldi başa" kitabının tərtibatçısı, "Dədə Qorqud gəzən yerdi bu yerlər" və "Görüm Faxralının biri olsun beş" kitablarının, Qorqudşünaslığa dair mükəmmək bioqfafik kitabın müəllifidir. "Oğuz eli", "Xalq qəzeti" və "Ana vətən" qəzetlərində silsilə məqalələri dərc olunub.

Mənbə : Allahverdi Kərimov – "Faxralı kəndinin tarixi haqqında yaddaş kitabçası", Bakı-2015.

ÖYRƏDƏNİN VƏ ÖYRƏNƏNİN HAQQ SƏSI

Hər bir fərdin sırf özü¬¬nəməxsus ömür payı var. İn¬san həmin ömür yo¬lunu elə keçməlidir ki, baxanlar ora¬da qoyulan izlərin xeyir¬xahlıq və qüdsiyyət çəkisini görə bilsinlər. Görüb

qiy¬mət¬¬-lən¬dirsinlər. Qiymətlən¬di¬rib onu gələcək nəsillərə ər¬məğan ver¬sin¬lər. Bu ya¬zıda elə bir insan haq¬qında söz açıram ki, özü¬nə¬məx¬sus ömür payını təkcə özu üçün yaşamayıb. Həmin şəxs ömür yolunu elə keçib ki, onun izlərinin xeyirxah¬lıq çəki¬sinin ağırlığı heç bir tərəziyə sığan deyildir. Onu qiy¬mət¬lən¬dirməyə cəhd edib¬lər və gələcək nəsillərə ərməğan qo¬yublar. Bu ərməğan "Özü üçün yaşamayan insan" adlı kitabdır. O insanın adı isə Hüseynqulu Məmməd oğlu Məmmədlidir.

2008-ci ildə Bakıda "Nurlan" nəşriyyatında nəşr olunan həmin kitab ömrünün yarısından çoxunu Gürcüstan və Azərbaycan res¬pub¬li¬ka¬larında xalqın maariflənməsinə, təhsilin inkişafına və keçən əsrin 80-ci illərindən həyatının sonuna kimi Dədə Qor¬qud boy¬la¬rı¬nın araşdırılmasına həsr etmiş Hüseynqulu Məm¬mədov haq¬qında Azərbavcanın görkəmli alimlərinin, iş yol¬daş¬-larının, tələ¬bə¬lərinin və onu yaxından tanıyan insanların xa¬ti¬rələrindən ibarətdir. Kitaba həm də H.Məmmədlinin yaradı¬cı¬lı¬ğından nü¬mu¬nə¬lər və onun kitabları haqqında mətbuatda dərc olunmuş məqalələr və s. daxil edilmişdir.

Fəxr edirəm ki, bu kitabda mənim də "El adamı" sərlövhəli xatirə məqaləm yer almışdır. Sevinirəm ki, onun haqqında söz demiş müqtədir ziyalıların arasında mənim də adım vardır. Qürur duyuram ki, Hüseynqulu muəllim müəllifi olduğum "Faxralıtək ağır elim var mənim" adlı kitabıma yazılmış ön sözün müəllifidir.

Hüseynqulu Məmmədli 1919-cu ilin bahar bayramında Gür¬¬¬¬¬cüs¬¬tanın Borçalı mahalının Faxralı kəndində anadan olub. 1941-1962-ci illərdə Gürcüstanın təlim Azərbaycan dilində olan orta məktəblərində direktor müavini, direktor vəzifə¬lə¬rin¬də çalışıb. 1962-ci ildə Bakıya köçüb. 1963-1980-ci illərdə Azər¬baycan SSR Maarif Nazirliyində məktəb inspektoru vəzi¬fə¬sində çalışıb. Qalan ömrünü Dədə Qorqud boylarının tədqi¬qi¬nə həsr edib. Faxralı orta məktəbinin məzunları arasından çıx¬mış yüzdən çox alimin yetişməsində onun müstəsna xidmətləri ol-muşdur. Professor, Azərbaycan Respublikası Milli Məcli¬si¬nin birinci və ikinci çağırış deputatı seçilmiş Şamil Qurbanov, ipəkçilik üzrə respublikada ilk elmlər doktoru olmuş Namaz Bədəlov, fizika-riyaziyyat elmləri doktoru Tahir Pənahov, şair Abbas Abdulla və başqaları məhz Hüseynqulu Məmmədlinin yetirmələridir.

Zəmanəmizin Dədə Qorqudu

Fransız bəstəkarı və dirijoru Şarl Quno (1818-1893) yazıb: "Bizi özümüzdə saxladığımızdan daha çox başqasına ver¬di¬yi¬miz zənginləşdirir". Hüseynqulu müəllimin xarakterinin bütöv¬lü-yünü və zənginliyini ümumiləşdirmək üçün onun gördüyü əzəmətli işlər sırasından yalnız Qorqudşünaslığa verdiyi töh¬fə¬ləri sadalamaq yetər: "Kitabi-Dədə Qorqud" eposunun 1300 illik yubileyi ərəfəsində işıq üzü görmuş "Dədə Qorqud" en¬sik¬lo¬pediyasının ərsəyə gəlməsində Hüseynqulu müəllimin mə¬¬sul ka¬tib kimi böyük zəhməti olmuşdur. H.Məmmədli müx¬təlif vaxt-larda eposla bağlı nəşr etdirdiyi məqalələri bir yerə toplayaraq "Dədəm Qorqud gəzən yerdi bu yerlər…" kitabını ara¬ya gətirmişdir. O, "Dünyanı düşündürən Dədə Qorqud" adlı təd¬qiqat əsərini çapa hazırlamışdı. "Kitabi-Dədə Qorqud"un təd¬qiq tarixi, coğrafiyası, "Kitabi-Dədə Qorqud"un qədim yu¬nan mifologiyası ilə, həmçinin türk xalqlarının digər eposları ilə süjet bağlılığı və digər problemlər onun əsas tədqiqat möv¬zu¬ları olmuşdur.

Akademik Bəkir Nəbiyev Hüseynqulu müəllimin "Dədəm Qorqud gəzən yerdi bu yerlər" monoqrafiyasına münasibət bildirərkən bu əsərə bütövlükdə müəllifin verdiyi ad üstündə dayanmışdır: "Dədəm Qorqud gəzən yerdi bu yerlər". Bunun özü elə əslində çox gözəl bir estetik folklor nümunəsidir. Mən ina¬nıram ki, bu məqalənin başlığından götürülüb dönə-dönə

şe¬irlər yazılacaq, mətləblər izhar olunacaq, aşkar ediləcək. On¬da hamı Hüseynqulu müəllimi məmnun-məmnun xatırla¬ya¬caq¬dır".

Gürcüstan Respublikasının Əməkdar jurnalisti, Azərbaycan Yazıçılar Birliyinin üzvü Dunyamalı Kərəm (Əliyev) isə Hüseynqulu Məmmədlini "Zəmanəmizin Dədə Qorqudu" adlandırır.

Dövrünü 50 il qabaqlayan müəllim

Biologiya elmləri namizədi Nadir Qurbanov Huseynqulu müəllim haqqında xatirə məqaləsində yazır: "Yadımdadır, o, bizə dərs deyəndə mövzuya aid suallar verilərdi və hər bir şa¬gird ona paylanmış vərəqdə başa düşdüyu kimi sualı cavab¬lan¬dırardı. Sonra şagirdlərin düşünmə qabiliyyətini yoxlamaq məqsədilə, fikirləşmə sərbəstliyini müəyyən etmək üçün şifahi suallar verilərdi. Hal-hazırda bu metod "interaktiv metod – beyin həmləsi" adlanır. Hüseynqulu müəllim belə dərs meto¬dun¬dan hələ 50-60 il bundan əvvəl istifadə etmişdir və müəl¬lim¬lərdən də bunu tələb etmişdir. Odur ki, Faxralı orta mək¬tə¬binin müəllimləri öz məzunları ilə fəxr edirlər".

Mərhum filologiya elmləri doktoru, professor Şamil Qur¬ba¬nov "Mənim ilk ədəbiyyat müəllimim" xatirə məqa¬lə¬sin¬də ya¬zır: "…Şahbuzlu ibtidai məktəbində oxuyurdum. Həmin mək¬təbi bitirib orta məktəbə keçəndə Hüseynqulu müəllim yuxarı siniflərdə dərs deməyə başladı. Cox aydın və sirin diksiyası var¬dı, ədəbiyyatı da çox gözəl bilirdi. Konkret əsərlərin təhlili gə¬ləndə hər şeyi unuduruq, bütün fikrimiz-zikrimiz obrazlarda olurdu. Mən onda Hüseynqulu müəllimə və onun dərslərinə vurul¬dum".

Stereotiplərə qarşı çıxan ziyalı

"Mənəviyyatın əsası ləyaqətlə düşünməkdir". Bu fəlsəfi qə¬na¬ət fransız riyaziyyatçısı və filosofu Blez Paskalın (1623-1662) müdrik fikirlərindən biridir. Hüseynqulu müəllim mil¬lə¬tin işıqlı sabahı naminə ləyaqətlə düşünməyi bacarırdı. Ba¬car¬dı¬ğını inam və qətiyyətlə reallaşdırırdı. O hətta milli men¬ta¬li¬te¬ti¬mizdəki köhnə stereotiplərə də cəsarətlə qarşı çıxırdı. H.Məm¬¬¬mədlinin cəsurluğu təfəkkür dərinliyinə, cəsarəti hü¬nər¬vər zirəkliyə söykənir. Bu hünərvərliyə misal olaraq, Azər¬bay¬can Respublikası Milli Məclisinin iqtisadi qanunvericilik şö-bə¬sinin baş məsləhətçisi, dövlət qulluğunun baş müşaviri, iqtisad elmləri namizədi, baş elmi işçi Əmirxan Babaşovun xatirə yazısından bəzi sətirlərin altını cızmaq istəyirəm: "XX əsrin əvvəllərində azərbaycanlı qızların tez nişanlanıb ərə getməsi bir ənənə halını almışdı. Bu, bizim Faxralı kəndində də özünü göstərirdi. Məktəbli qızlar məktəbdən yayınırdılar. Hüseynqulu müəllim məktəb direktoru işlədiyi vaxtlar bu meylə son qoyul¬du. O illərdə bir nəfər də olsa məktəb yaşlı qız məktəbdən ya¬yın¬¬mırdı. Elə bu səbəbdən də orta məktəbi qurtaran qızlar ali təhsil almaq üçün Bakıya və digər şəhərlərə oxumağa gedib, ali məktəblərə daxil olurdular.

Bu gün Faxralı orta məktəbini bitirən qızlar arasında on¬lar¬ca elmlər namizədi və müxtəlif sahələr üzrə yetərincə kadrlar vardır". Hüseynqulu müəllim hətta bu stereotipi tənqid edən "Kitabxanaçı qız" məqaləsini də yazıb Bolnisi rayonunun "Al bayraq" qəzetinin 1961-ci il mart buraxılışında dərc etdirmişdi.

Yurdunun dəyərini birə-beş artıran insan

Hüseynqulu Məmmədli haqqında xatirələr toplusunun adı orada yer alan məqalələrdən birinin adına uyğundur: "Təkcə özü üçün yaşamayan insan". Həmin məqalənin müəllifi gör¬kəmli pedaqoq, şair Əli Səngərlidir. Ə.Səngərli məqalədə əsas vurğunu Hüseynqulu Məmmədlinin müəllifi olduğu "Gö¬rüm Faxralının biri olsun beş…" adlı kitabının üstünə salır. "Kitabın adı bir kəndə aid olsa da, bəhrəsi bir millət üçün faydalıdı". Qeyd edim ki, H.Məmmədli həmin kitabda Faxralı kəndindən, orda olan tayfalardan, xalqının məişətindən, o cümlədən də dağ¬lı, aranlı, binəli keçmiş həyat tərzindən və onun maraqlı mə¬¬qam¬¬larından söhbət açır. Cahil və savadsız komsomol¬çu¬la¬rın və firqəçilərin, kolxoz quruculuğunun ilk illərində yol ver¬dik¬ləri zorakılığı, özbaşınalığı, xalqın başına gətirilən müsi¬bət¬ləri xatırlayır, 1937-ci il repressiyalarının günahsız qurbanlarını yada salır. "Görüm Faxralının biri olsun beş…" kitabında həmçinin XX əsrin sonunda keçmiş SSRİ ərazisində yaşayan türk soylu xalqlara qarşı millətçilik ruhunu qızışdıran xoşa¬gəl¬məz hallar da qeyd olunmuşdur. Kitabın məzmunu təkcə Fax¬ra¬lını deyil, butövlükdə Borçalı mahalını, Tiflis şəhərinin Saburtala məhəlləsindən başlamış Sarvan, Bolnis, Başkeçid rayonundan tutmuş Ermənistan ərazisinə daxil olan Amasiyaya qədər böyük bir coğrafi ərazini əhatə edir.

Keçən əsrin əvvəllərində bu yerlərdə baş verən qanlı-qadalı hadisələr kitabda öz əksini tapmışdır. Kamil tarixçi zəhmətinin məhsulu olan bu kitab barədə kitabın sərlövhəsinə çıxarılmış sözlər də Aşıq Şenliyin Faxralıya həsr etdiyi məşhur şei¬rin¬dən¬dir. "Görüm Faxralının biri olsun beş…" kitabı Hüseynqulu Məmmədlinin el-oba qarşısında mənəvi borcunu yerinə yetir¬mə¬sinin tarixi təsdiqidir. Görün, akademik Bəkir Nəbiyev Hüseynqulu Məmmədlinin "Görüm Faxralının biri olsun beş…" kitabı haqda nə yazır: "Bu (kitabın adı nəzərdə tutulur), türkiyəli aşıq Şenliyin bir misrasıdır. Belə misralar Borçalıda da, Azərbaycanın butün folklorunda da minlərlədir. Amma Hü¬seyn¬qulu müəllimin həm birinci, həm də bu kitabında misranı monoqrafiya, fundamental kitabın başlığına çıxarması ona əbədiyyət verdi".

Əbədiyyəti qazanmış Hüseynqulu Məmmədlinin əsərləri haqqında mətbuatda çoxsaylı məqalələr dərc olunmuşdur. Həmin məqalələrin, rəylərin səhih ünvanı "Özu uçün yaşa¬ma¬yan insan" xatirələr kitabında göstərilmişdir. Həmin kitaba ön sözu filologiya elmləri namizədi Şərəf Cəlilli yazmışdır. Ön söz müəllifi Hüseynqulu müəllimin məmur kimi təmənnasız¬lı¬ğı¬nın, heç zaman şöhrət dalınca qaçmamasının altını cızır: "Ma¬arif Nazirliyində tutduğu vəzifənin adı mufəttiş olsa da, elə Müəllim olaraq qaldı! Öyrədənin, öyrənənin haqq səsinə döndü. Qubadan ağ almanı, Göyçaydan narı, Gəncədən xur¬manı, Lənkərandan limonu, Salyandan, Ağdaşdan heyvanı, Şu¬şa¬dan xarıbülbülü, Gədəbəydən tər bənövşəni onun eşqinə də¬rib xonça tutdular. Ayağının altında qoç kəsdilər. Çırağa çıraq kimi baxdılar. Səbəb bir idi: Bu müfəttiş o birilərdən deyildi. Elin-dilin, öyrədənin və öyrənənin Adamı idi! Haqqın tərəzisinə pərsəng vurmazdı. Düzü əyri, əyrini düz yazmazdı…"

Vətəndən nigaran gedən dahi

Ş.Cəlilli yazır ki, bütün dahilər, istedadlı insanlar kimi Hüseynqulu müəllim də Vətəndən, Qarabağdan nigaran getdi: "Təbrizi, Dərbəndi, Borçalını, İrəvanı, Göyçəni, Zəngəzuru, Dərələyəzi, Dərəçiçəyi gavur qabağında qolubağlı görmək onun onsuz da yuxa könlündən qəmli bayatılar cücərtdi…"

Ancaq onu da qeyd etmək yerinə duşər ki, Hüseynqulu Məmmədliyə adi bir insan kimi həyatdan nigaran köçdü demək olmaz. Yenə də Ş.Cəlillinin təbirincə desək, bütün olmuşlara, olanlara baxmayaraq Tanrı ona hər şey nəsib etmişdi. Oğul-qız, nəvə-nəticə payı vermişdi. Oğlu evli, qızı göylü olmuşdu. Elçi gedib gəlin gətirmişdi. Qız köçürüb "taxtını mən verdim, baxtını

Tanrı versin" söyləmişdi. Xalq şairi Zəlimxan Yaqub yazır ki, Hüseynqulu müəllimin yaşı 80-i keçib, 90-nı haqlasa da, həmişə sərrast qalmışdır: "Adətən həmişə görmüşük ki, insan yaşlandıqca danışığını itirir, Hüseynqulu muəllimdə isə Allahın vergisi ilə bir yerdə o məktəbdən, müəllimdən gələn nizam-intizam, səliqə-sahman var di…

El ağsaqqalı

Zəlimxan Yaqub Hüseynqulu Məmmədlinin bir ağsaqqal kimi örnək olduğunu vurğulayır: "Bizim anlamımızda, mən Zəlim¬xan Yaqubun şəxsində, Borçalıda yetişən ziyalıların anlamında ağsaqqal sözünün çəkisi çox böyükdü, cox şərəflidi. Elə bu gün bizi bu mərtəbələrə gətirib çatdıran, bəlkə də ağılkəsməz mərtəbələrə gətirib çatdıran bax həmin o ağsaqqallara ehtiramı¬mız idi ki, biz onlardan öyrənə-öyrənə özümüz cavan yaşında ağsaqqal olduq. Yəni Hüseynqulu muəllimin bir xidməti də on¬dan ibarətdir ki, özünün rəftarı ilə, ünsiyyət mədəniyyəti ilə, in¬sani dəyərləri ilə, əxlaqi keyfiyyətləri ilə bir ağsaqqal kimi bizə örnək oldu. Və biz həmişə fikirləşirdik ki, bax, ağsaqqal belə olar, alim belə olar, ziyalı belə olar. Adam öz elini-obasını belə sevər, müəllimini belə sevər, tələbəsi ilə belə fəxr eləyər. Bax bu mənada biz şadıq, xoşbəxtik ki, Hüseynqulu müəllimin şəxsində Borçalı mahalının Azərbaycana, türk dünyasına bəxş etdiyi böyük şəxsiyyətlər, böyük ziyalılar var və onlar tükən¬mir, davam eləyir, getdikcə də davam eləyəcək. Mən çox bö¬yük ehtiram hissi ilə hörmətli ağsaqqalımızın bizim üçun adı da, yaradıcılığı da, övladları da, yetirmələri də, torpağı da, kəndi də həmişə əziz olan, unudulmaz olan Hüseynqulu müəllimin ruhu qarşısında bir şair olaraq baş əyirəm və fəxr edirəm ki, bizim torpağın belə ağsaqqalı olub".

Qayğıkeş ata

Hüseynqulu müəllim böyük və gözəl bir ailəyə başçılıq edib. Üç qızı və üç oğlu var. Övladlarının hamısı ali təhsil alıb. Böyük oğlu tanınmış folklorşünas alim Elxan Məmmədli Azər¬¬baycan MEA-nın Folklor İnstitutunda şöbə müdiri, Azərbaycan Əməkdar mədəniyyət işçisidir. Eldar iqtisad elmləri namizə¬di¬dir, Əmək və Əhalinin Sosial Müdafiəsi nazirliyində çalışır. Ramiz "Ozon" zavodunun işçisidir. Ulduz bağçada tərbiyəçi mü¬əllim, Firuzə fransız dili müəlliməsi, Firəngiz isə sənətşü¬nas¬dır. Həmin ailənin özəllikləri barədə iqtisad elmləri na-mi¬zə¬di Hətəm Həsənov 2002-ci ildə belə yazırdı: "Maraqlı faktdır ki, nəvələrinin körpə vaxtı hamısının tərbiyəsi ilə özü və xa¬nı¬mı məşğul olurlar. Odur ki, nəvələrinin əksəriyyəti babalarına ox¬şamağa çalışırlar. Ailədə hər kəsin öz kitabxanası var. 5 otaq¬lı mənzilin 3 oatğı kitabxanadır. Uşaqlar ailə qurub get¬dik¬cə ata payı kimi onlara böyük bir kitabxana bağışlanır. Göz gör-düyünü götürər deyiblər. Övladlar atalarını daima oxuyan, yazan görmüşlər. Odur ki, ailə tamamilə ziyalılar ailəsidir".

İngilislərdə belə bir müdrik deyim var: Bir cavan yaxınlaşıb aqil qocadan soruşur ki, kamil insan olmaq üçün nə etmək la¬zım¬dır. Pirani qoca cavab verir ki, üç kollec qurtarmaq lazım¬dır. Gənc təəccüblənir və sual verir: – Nə üçün məhz üç? Mü¬tə¬fək¬kir gülümsəyib deyir: – Kollecin birini baban, birini atan, birini də sən qurtarmalısan.

Bu nöqteyi-nəzərdən Hüseynqulu muəllimin nəvələri də ba¬ba¬larından, ata-analarından əxz etdikləri ziya işığı ilə kamilliyə yetişiblər. Onlar bu borcun əvəzini qismən də olsa çıxmağa ça¬lı-şıblar. Belə ki, "Özü üçün yaşamayan insan" kitabı Hüseyn¬qulu müəllimin nəvəsi Toğrul Bayramlının vəsaiti ilə nəşr olu¬nub. Toplayanı və tərtib edəni isə Eldar Hüseynqulu oğludur. Beləliklə, Hüseynqulu müəllimin övladlarının, nəvələrinin kitabxanalarına bir qiymətli kitab da əlavə olunmuşdur.

Əlavə ştrixlər

Hüseynqulu Məmmədlinin şəxsiyyətini səciyyələndirən üstün məziyyətlər barədə söylənilən gözəl fikirlər kitabda yer alan xatirə məqalələrin sərlövhələrində öz əksini tapmışdır. Onların sırasından bəzilərinə bir yerdə göz ataq: “Əməli ilə özünə heykəl qoyan kişi” (B.Nəbiyev), “Cəfakeş, təmənnasız və unudulmaz insan” (H.İsmayılov), “Faxralı elinə ilahi tərə¬findən göndərilən insan” (V.İsmayılov), “Dədə Qorqud kimi bir kişi” (K.Əliyev), “Hüseynqulu müəllim həm də həyat müəl¬li¬mi idi” (G.Yoloğlu), “Abidə insan” (H.Həsənov), “Onu Dədə Qorqud ruhu yaşadırdı” (İ.Kərimov), “Qəmlərə Sarvan” (Ş.Cə¬lil¬li), “El üçün yaşayanlar ölməz olur” (G.Əliyeva), “Şa¬gird¬¬lə¬ri¬ni doğma balaları kimi sevirdi” (K.Nuriyev), “Qorqud¬şü¬nas¬lıq karvanın cəfakeş yolçusu”.

Topluda Hüseynqulu Məmmədliyə bağışlanan kitabların av¬toqrafları da yer almışdır. Həmişə avtoqrafların müəllifləri Hü¬seynqulu Məmmədliyə bəslədikləri dərin hörməti “Əzizim”, “köhnə dostum”, “Hörmətli müəllimim”, “böyük qardaşım”, “Ata əvəzi Hüseynqulu müəllim”, “elimizin, obamızın ağsaq¬qal ziyalısı”, “əziz ağsaqqalımız”, “ustadımız” deyərək izhar edir¬lər. Avtoqraflar arasında orijinallığı ilə seçilənləri də var¬dır.

Əbədiyyətə qovuşan insan

Bu sətirlərin müəllifi də Hüseynqulu müəllimin yüz illər ya¬¬şamasını, yaratmasını istəmişdi. Ancaq Abdulla Bədəlov de¬miş¬kən, neyləyəsən, çox təəssüflər olsun ki, ömrün yaşanma meydanı məhdud, arzuların at oynatdığı meydan isə hüdud¬suz¬dur. Elmi-tədqiqatlar aparıb onlardan özündən sonra gələnlərin bəhrələnməsi üçün var gücü ilə çalışan Hüseynqulu müəllim ömrünün son gününədək, yəni 2005-ci il sentyabr ayının 21-də həyata əbədi göz yumanadək xoş arzuları yoluna parlaq işıq saçan şamtək yanmaqdan nəinki qorxmur, əksinə, tükənməz arzuların gerçəkləşməsi – həyati ifadəsini tapması naminə Ulu Tanrıdan möhlət diləyirdi.

Hüseynqulu müəllimin oğlu Elxan Məmmədli “Son söz və ya atama sonsuz məhəbbətim” adlı xatirə məqaləsində yazır: “Atamız şərəfli bir ömür yaşadı, mərd yaşadı. Heç vaxt nə əli¬nin, nə də sözünün arxasını yerə vurdu. Bildiyi işə girişdi. Bil¬mədiyi işdən yapışmadı. Obyektiv oldu, həmişə haqqın tərə¬fində durdu. Haqqı qorudu, haqq da onu qorudu”.

Həmin xatirələrdən məlum olur ki, H.Məmmədli həm də çox haqsızlıqlar görmüşdü. Onun Dədə Qorquddakı fəaliyyəti vaxtında layiqincə qiymətləndirilməmişdir.

Ancaq Huseynqulu müəllimin əsl qiymətini tərbiyə üsulu, danəndəliyi, alicənablığı, qayğıkeşliyi, yuksək mədəniyyəti və savadı ilə nümunə göstərdiyi ardıcılları verdilər. Ərsəyə gətir¬dik¬ləri “Özu üçün yaşamayan insan” kitabı ilə. Bu kitabın ər¬səyə gəlməsində zəhməti olan, işıq üzü görməsində xidməti olan hər bir kəsə dərin minnətdarlığımı bildirirəm. Əsl qədir¬şü¬nas-lıq nümunəsi kimi dəyərləndirilməyə layiq olan bu kitab oxuculara həm də Hüseynqulu müəllimin müəllifi olduğu ki¬tab¬ların, elmi və məktəbşünaslığa aid məqalələrinin, oçerk¬lə¬ri¬nin, xatirələrinin və şeirlərinin də adını və ünvanını göstərə¬cək¬dir. Fikrimcə, “Özü üçün yaşamayan insan” haqqında kitab tək¬cə Hüseynqulu Məmmədlinin övladlarından, qohumlarından, dostlarından, ellilərindən, həmkarlarından ibarət dar çərçivədə deyil, bütün Azərbaycan və Türk dünyasında maraqla qarşı¬la¬na¬caqdır.

Mənbə : Səməndər Məmmədov – “Ağır elsən, Borçalıda adın var…”, Bakı – “Nurlan” – 2009, I kitab.

Şair Əli Qurban oğlu Məmmədov (Əli Faxralı)

Əli Faxralının şeirlərindən nümunələrə buradan tanış ola bilərsiniz.

ELİN ŞAİRİ

(“Ellər var olsun” deyən, ellə birgə var olan Borçalı şairi Əli Faxralının 85 illik yubileyi qarşısında)

Borçalı elinin ağsaqqal ziyalısı, xalq dilində yazan şairi Əli Faxralının qoşmaları, gəraylıları, gözəlləmələri, ustadnamələri, müxəmməsləri, divaniləri Azərbaycan oxucusuna tanışdır. O qədər ürəyə yatımlıdır ki, onları ilk dəfə oxuyan adam sanki çoxdankı tanışına rast gəldiyini zən edir. Amma tezliklə anlamaq olur ki, onların bənzəri yoxdur…..

Əli Qurban oğlu Məmmədov (Əli Faxralı) 1926-cı ildə Borçalının adlı-sanlı qədim kəndlərindən olan, mən deyərdim ki, Borçalının tacı sayılan, şair Nəbinin yurdu, çox böyük ziyalılar yetirmiş Faxralıda anadan olmuşdur. Özü uzun müd¬dət Marneuli rayonunun Böyük Muğanlı (Qaş Muğanlı) kəndində yaşamışdır. Ancaq Əli Faxralının harada doğulmasından, harada yaşamasından asılı olmayaraq, fərqi yoxdur, Borçalının hər bir nöqtəsi onun üçün əzizdir, müqəddəsdir. Bu, Əli müəllimin şeirlərində öz geniş poetik əksini tapıb. Məsələn, şair “Borçalı” adlı şeirində yazır:

Göz açıb dünyaya gələnnən bəri,

Anamı – mən səni gördüm, Borçalım.

Laylalı beşiyim dillər əzbəri,

Yapışdım ayağa durdum, Borçalım.

Can demişəm, hər cəfana dözmüşəm,

Demirəm ki, oynamışam, bezmişəm.

Qarış-qarış sinən üsdə gəzmişəm,

Köhlənnər oynadıb yordum, Borçalım.

Əli Faxralı əsasən el şairidi, ömrünü elin içində keçirib. Elin xeyrindən-şərindən qalmaz, toylarda həmişə yeri başdadır. Hara gedirsə, ona yuxarı başda yer göstərir, hörmətlə yana¬şırlar. Bütün bunlar ona xalqın təkcə bir şairi kimi deyil, həm də çox müsbət xüsusiyyətlərə malik bir insan kimi böyük qiy¬mət verdiyini göstərir.

Əli Faxralı Allah adamıdır. Onun müəllifi olduğu, 2000-ci ildə işıq üzü görən “ Ellər var olsun” şeirlər kitabı “ Bismillah” “Allah”, “Məhəmməd”, “Ya Əli!” şeirləri ilə başlayır.

Əli Faxralı şair-rəssamdır. Ona görə də onun yaradıcılığında təbiətə həsr olunmuş şeirlər xüsusi yer tutur. “ Boyanıbdı”, “Dağlarım”, “ Ölməz” kimi şeirləri bu qəbildəndir:

Hər məclisdə söyləmişəm,

Muğanlıdan keçən ölməz.

Mən də niyyət eyləmişəm,

Faxralıya köçən ölməz.

Yolum düşə Til dağınnan,

Cüyür, ceyran oylağınnan,

Aşıx Hasan bulağınnan,

"Nəzik su" dan içən ölməz.

Məhəbbət lirikası Əli Faxralının  yaradıcılığında əsas istiqa¬mət¬lərdən birini təşkil edir. Söz yox ki, sevgi motivli şeirləri əsasən gənclik dövrünə təsadüf edir. 1948-ci ildə Süxumi şəhə¬rində hərbi xidmətdə olarkən yazdığı şeirlər bu sıradandır. Məsələn:

Nə qədər qocalsa, şairin yaşı,

Xəyalı sevginin sorağındadı.

Yüz yerdən oxlansa bağrımın başı,

Əzbəri sinəmin varağındadı…..

Faxralı Əli, çəkmə ahu-zar nədi,

Yar yolunda boran nədi, qar nədi,

Kama yetdin, dövlət nədi, var nədi,

Ləzzəti dilində, dodağındadı.

Aşıq poeziyasının yaxşı bilicisidir, sazımızın-sözümüzün fanatıdır Əli Faxralı.

Həmişə xalqın arasında olduğundan xalq adət-ənənəsini gö¬zəl bilir. Şeirlərində elə sözlər işlədir ki, oxuyan adama ləzzət eləyir. O, bütün yaradıcılığı ilə sübut edir ki, söz sənətində aparıcı xətt xəlqilikdir, xalqın təfəkkürüdür. Yaradıcılığındakı bu xüsusiyyət Azərbaycanın və Gürcüstanın görkəmli ziyalıları tə¬rə¬findən qeyd edilmişdir. Filologiya elmləri namizədi, İ.Ca-va¬xaşvili adına TDU-nun Marneuli şöbəsinin prorektoru Mahmud Hacıxəlilov qeyd edir. "Bu yurdu qarış-qarış gəzən, onu sevə-sevə tərənnüm edən Əli Faxralı əsl el şairidir…. Eldə də özünün sadəliyi, şirinliyi, eyni zamanda, müdrikliyi ilə seçilən ağsaqqallardandır". S.S.Orbeliani adına TDPİ-nin kafedra müdiri, professor Valeh Hacıyev isə Əli Faxralını Miskin Nəbidən sonra Borçalının ən böyük el şairi adlandırmışdır. Gürcüstan Aşıqlar Birliyinin sədri, şair Osman Əhmədoğlu Əli Faxralının təhsili olmasa da, "anadan  şair doğulduğunu", Gürcüstanın əməkdar jurnalisti, şair Dünyamalı Kərəm Əli Faxralının "öz qələmindən çıxmış bütün şeirləri əzbər bilməsini" vurğulayırlar və bunu Allah vergisi, onun fitri istedada malik

olması ilə əlaqələndirirlər. Bakıdakı 271 saylı məktəbin müəllimi, şairə Qönçə Qəribi Əli Faxralı barədə çox yüksək fikirdədir. “Borçalı mahalının müdrik ağsaqqalı, el şairi Əli Faxralının aşıq şeiri tərzində poeziyası ilə tanışam. Onun qələmindən çıxan hər bir şeiri mənim üçün çox əzizdir. Öz elinin ruhunda, sadə bir dildə yazılan qoşmaları, gəraylıları, gözəlləmələri insana hədsiz könül xoşluğu, qəlb rahatlığı verir. Əli Faxralı çox həssas, səmimi bir insandır. Bu səmimiyyət onun bütün yaradıcılğında qabarıq şəkildə özünü göstərir. Öz hiss və duyğularını bədii boyalarla əks etdirən Əli Faxralı obasından-elindən aldığı zövqlə qəlbinin lirik notlarını duyub yaşadığı dünyaya kökləmək istəyir. Bəli, bu, belədir. O, fitri, anadangəlmə istedada malik əsl sənətkar, şeirləri incə duyğular üstündə köklənmiş, el-obaya bağlı sinədəftər bir adamdır”.

Əli Faxralınını özünün də ayrı-ayrı tarixi şəxsiyyətlər, Azər¬baycanın, o cümlədən Borçalının görkəmli ziyalıları haqqında yazdığı şeirləri var. Onun Faxralılı şair Qara Qəribə, qorqud¬şünas alim Hüseynqulu Məmmədliyə, Elxan Məmmədliyə, aşıq Qəhrəmana, şair Osman Əhmədoğluna, Xalq şairi Zəlimxan Yaquba, Faxralı aşıq Şəmistana, aşıq Kamandara və başqa görkəmli şəxsiyyətlərə yazdığı şeirlər onun dostluqda mehri¬ban, həm də qədirşünas bir insan olduğunu göstərir. Sevinirəm ki, Əli Faxralının diqqətinə layiq olanlardan, onun şerlərinin qəhrəmanlarından biri də mən olmuşam.

Bir məqamın üstündə dayanmağa da dəyər ki, Əli əmi mənim atam Eyvaz Məmmədovla möhkəm dost olublar. Atam haqq dünyasına qovuşandan sonra da Əli Faxralı həmin dostluğa sadiqliyini mənimlə münasibətlərində davam etdirir. Əli Faxralının oğlu Binnət Borçalıda çıxan “Region press” qəzetinin redaktorudur, gözəl ziyalıdır, yaxşı publisistdir, Borçalı mövzusunda çox gözəl yazıların müəllifidir. Həm də atasına layiq gözəl övladdır.

Bu yaxınlarada Əli əminin 85 yaşı tamam olacaq. Mən Əli əmiyə cansağlığı, uzun ömür arzulayıram. İndiyə qədər sağ olub, bir yeri ağrımayıb, qoy, bundan sonra da ağrı-acı ondan uzaq olsun. Ona dadından doyulmayan ulu Oğuz ömrü arzu¬layıram. İnşallah, səksən beş yaşını da yüksək səviyyədə qeyd edərik, “doxsanı”nı, “yüzünü” də.

Mənbə : Səməndər Məmmədov – “Ağır elsən, Borçalıda adın var…”, Bakı – “Nurlan” – 2010, II kitab.

Şair İsmayıl Güllər

EL ŞAİRİ, EL ADAMI

İşmayıl Güllərin şeirlərindən nümunələrə buradan tanış ola bilərsiniz.

Dünyada heç də hər insanın ürəyi təmiz və böyük olmur. O in¬san¬ların ürəyi təmiz və böyük¬dür ki, Allah-Təala onlara öz sevgisini, məhəb¬bə¬tini heç vaxt əsirgəməyib. Daha doğ¬rusu, insanın ürəyi böyük olanda onun dün¬yaya sevgisi də, istə¬yi də, arzusu da tükənməz olur. Ürəyin böyüklüyü insanın ən böyük xoşbəxtliyi, sadəliyi və səmi¬miy¬¬yə¬ti deməkdir. İnsanlar kim-liyindən asılı olmayaraq, o adamla ünsiyyət yaradır, dil tapır və az bir vaxtda həmin insanın ürəyinə yol açır. Belə insanlar az olsa da, həmişə var olub və olacaq.

Böyük ürək sahibi olan İsmayıl Güllər 1914-cü ildə Borçalı mahalının Faxralı kəndində dünyaya göz açıb. Təbii ki, bu el-obada elmə, təhsilə və bədii yaradıcılığa həmişə böyük maraq

olub. Başqa sözlə demiş olsaq, Allah bu yurda əsrarəngiz gözəllik bəxş etməklə yanaşı, çox istədiyi insan¬larına da qeyri-adi istedad verib. Həmin insanlardan biri olan İsma¬yıl Güllər 16 yaşında gecə kursuna gedir. Bir müddətdən sonra onu 5-ci sinifə qəbul eləyirlər. 7 illik məktəbi Faxralıda bitirir. Amma sonra daha böyük arzular arxasınca getmək istəyir və daha doğrusu, gedir. Və bu məqsədlə Lüksemburqdakı (indiki Bolnisidəki) xalçaçılıq kursuna gedir və oranı uğurla bitirir. Bir müddət xalçaçılıq idarəsində işləyir. Sonra yenidən təhsilini davam etdirmək üçün Borçalı Pedaqoji Texnikumuna daxil olur və oranı da uğurla bitirir, Faxralıya qayıdaraq Şahbuzlu ibtidai məktəbində müəllim işləyir.

Böyük filosof Nitşenin çox gözəl bir fikri var. O deyir: "İnsan qəlbinin ən yüksək qabilliyəti, məziyyəti xeyirxahlıq¬dır." İsmayıl Güllər də harda işləməsindən, fəaliyyət göstərmə¬sindən asılı olmayaraq, həmişə insanlara qayğı, məhəbbət gös¬tərib. Elə bu nəvazişləri, istiqanlılığı da onu çoxlarına sevdirib.

Böyük Vətən Müharibəsi başlayanda o da vətənin müdafi¬əsi¬nə çağı¬rılır və əlinə silah alıb cəbhəyə gedir, orda ağır dö¬yüş¬lərdə, ölüm-dirim mübarizəsində iştirak eləyir. Düzdür, müharibə böyük fəlakətlər gətirir, şəhərlər, kəndlər yerlə-yeksan olur, milyonlarla insanlar bu müharibənin qurbanına çev¬rilir. Müharibənin odlu-alovlu səngərlərində İsmayıl Güllər qanlı döyüşlərdə iştirak eləyir və qələbə gününü səbirsizliklə gözləyir. O günü görür və yenidən vətəninə qayıdır.

Təbii ki, oxumaq, öyrənmək və elm sahibi olmaq həmişə onun əsas məsləki və əqidəsi olur. Elə bu əqidə ilə də Tiflisdə A.S.Puşkin adına ikiillik Müəllimlər İnstitutunun Azərbaycan dili bölməsinə daxil olur. Ömrünün son anına kimi doğulub boya-başa çatdığı Faxralı kənd orta məktəbində müəllim işləyir.

İsmayıl Güllərin "şinelindən" çıxan ziyalılar çox olub. On¬lardan biri də mənəm. Onun mənə xüsusi diqqəti və qayğısı olub. Sinif müəllimim olub. Qohumluqdan əlavə, həm də qonşu olmuşuq. Hər xırda uğuruma sevindiyinin dəfələrlə şahidi ol¬mu¬şam. Faxralı toponomik adlarının mahir bilicisi, el nəğ¬mə¬karı İsmayıl Gülləri həmişə minnətdarlıqla xatır¬la¬yıram. Sək-sən üç yaşında mənə şeir yazmasını isə şagirdinin uğuru hesab edirəm. Ruhun şad olsun, hörmətli müəllimim. Çalışıram hə¬mişə etimadını doğruldum. Oxucular üçün maraqlı olduğunu nəzər alıb səksən üç yaşında mənə yazdığı şeiri bu yazıya əlavə edirəm.

Səməndər, belədir diləyim mənim,

Kişitək yaşasın, qocalsın bala.

Oğullar atanın gələcəyidi,

Atanın başında tac olsun bala.

Sən özün oğulsan, mən də bir ata,

Səni mən öyrədib atdım həyata.

Şükür ki, çatıbsan belə büsata,

Şair meydanında bac alsın bala.

Nəbinin nəvəsi, Faxralı eli,

Yaşasın, yaratsın, var olsun əli,

Kitablar bağlasın; sevinsin eli,

İstərəm hər yerdə ucalsın bala.

Oğullar atanın göz nurasıdı,

Oğullar atanın göz qarasıdı,

Oğullar atanın yurd-yuvasıdı,

Tacını verməsin, tac alsın bala.

Beş yüz əlli addan ilham almışam,

Səksən üç baharı yola salmışam.

İsmayıl Güllərəm, ta qocalmışam,

Özündən güclüdən güc alsın bala.

İsmayıl Güllər kimi insanlar həmişə həyatda qeyri-adiliyi, qabilliyyəti və istedadı ilə seçiliblər.

A.Bakıxanov yazır: “Əsl adam o adamdır ki, o şəxsi qüsur¬larını özgədən yaxşı görür və öz qabiliyyətini əhəmiyyətsiz hesab edir”. İsmayıl Güllər kimi insanlar hər şeyi yaxşı görür, səhvlərini bilir, istedadı və zəkası ilə heç vaxt öyünmür. Bax, belə insanlar uzun müddət söz-söhbətlərdə, xeyir-şərdə yada düşür, xatırlanır.

İsmayıl Güllər həm də 5 övlad sahibi olub. İndi onların hər biri onun adına şərəf gətirir, əməlləri ilə onun ruhunu şad edirlər.

Görkəmli folklorşunas alimimiz Hüseynqulu Məmmədli 1993-cü il 14 oktyabr tarixdə “Oğuz eli” qəzetində “İsmayıl Güllər (Hüseynoğlu)” adlı məqaləsi ilə çıxış edərək, onun yaradıcılığından ətraflı söz açmışdır. Və ilk olaraq İsmayıl Gülləri respublika ədəbi ictimaiyyətinə geniş təqdim etmişdir. 1998-ci ildə isə mən “Faxralı tək ağır elim var mənim” kitabıma İsmayıl Güllərin də şeirlərinin bir hissəsini daxil etdim. İsmayıl Güllərin 1998-ci ildə “Faxralının torpağıdır bu yerlər” adlı şeirlər kitabı işıq üzü görüb. (Tərtibçi gözəl ziyalı alimimiz İbrahim Əlizadədir)

İsmayıl Güllər 2003-cü ilin may ayında rəhmətə gedir.

Mənbə : Səməndər Məmmədov – “Faxralılar”, Bakı – “Elm və təhsil” – 2017, I kitab.

Rəşid Faxralının “Oğuz eli Faxralı” kitabından

İsmayıl GÜLLƏR (1914-2002).

1939-cu ildə Borçalı Pedaqoji Texnikumunu, 1956-cı ildə Tiflis Pedaqoji İnstitutunun dil-ədəbiyyai fakültəsini bitirib. 1940-cı ildən 1990-cı ilə kimi Gürcüstanın Kaspi rayonunda, sonra Faxralı orta məktəbində müəllim işləyib. “Faxralının torpağıdır bu yerlər” kitabının (B. 1998) müəllifidir.

Şeir duyğudur, duyumdur. Hər şeir duyğuya, duyuma dönüb ürəklərə yol tapa bilmir. İsmayıl Güllər oxucu ürəyini misra-misra tellləndirən şairlərdəndir. O, el ağsaqqalı kimi öyüdlərini, məsləhətlərini söz qədri bilənlərə poetik şəkildə elə kövrəkliklə aşılayır ki, istər-istəməz sözün ilahi gücünə bir daha inanırsan, şair kəlamını şəbnəm əvəzi duyğularına çiləyirsən.

İ.Güllər xalq ruhunda yazıb-yaradan şairdir. Onun qoşmaları, gəraylıları ata öyüdü, ağsaqqal məsləhəti kimi oxucunun (saz üstündə oxunanda dinləyənin) qanına hopur.

Onun özünəməxsus təşbehləri heyrətamizdir: “Gözlər məşəl kimi yanır”, “Görünəndə ocaq köz-köz gülsün”, “Göz yaşını yellər quruda bilməz” və s. Yaradıcılığının əsas aparıcı xətti torpaqsevərlikdir, yurdsevərlikdir. Bu sevgi özünü “A dağlar”, “Bizim dağlar”, “Bu yerdə” və başqa qoşmalarında, gəraylılarında daha qabarıq şəkildə göstərir. Bu nümunələr, özünün dediyi kimi, tərlan xislətlidir. Onlar həqiqətən də ürəkdən-ürəyə köçür:

Payızda yarpaqlar saralıb gedər,

Durnalar məkana yol alıb gedər.

Qışda yer üzünü qar alıb gedər,

Baharda ətrini saçar, dayanmaz.

İ.Güllər sevgidən yazanda cavanlığını, nəsihət eləyəndə ağsaqqallığını təsdiqləyən sairdir. 0, dünyanın işləkləri görəndə qəzəbini, nifrətini də poetikləşdirə bilir:

Xam atlarım yad ellərə qovuldu,

Baş açmadım təhərindən dünyanın…

İsmayıl Güllərin şeirlərinin ünvanı duyan ürəklərdir. Onun gəraylıları, qoşmaları oxucu duyğularına sığal çəkir, oxucu ürəyini kövrəldir, düşündürür – ən azı yurda bağlılığı ilə, hər misrasında el-oba sevgisi duyulduğuna görə.

Mənbə: Rəşid Faxralının “Oğuz eli Faxralı” kitabından

Şair Əli Səngərli

Əli Səngərlinin şeirlərində nümunələrə buradan tanış ola bilərsiniz.

HƏR QƏDİRBİLƏNDƏ SƏNGƏRLİ YAŞAR

Əli Səngərli… Özümü biləndən, hə¬¬yatı dərk edəndən bu ad mənim üçün həmişə doğma olub, əziz olub. Ona qarşı həmişə bir doğmalıq, ya¬xınlıq hiss etmişəm. O da mənə qarşı heç za¬man biganə olmayıb. Mən onu bir müəllim kimi sevmişəm, o məni şa¬girdi, yetir¬məsi kimi. Əli müəllimi doğ¬ma Faxralımın və bütövlükdə Bor¬¬¬çalının hörmətli, sözübütöv bir ki¬şisi, məqamında öz mövqeyini bildir¬mə¬yi bacaran əsl ziyalı kimi sevmişəm, har zaman xətri mənim üçün əziz olub.

Mən onu təkcə müəllim kimi yox, həm də bir şair kimi sev¬mi¬şəm, qəzetlərdə işıq üzü görən hər yeni şeirini böyük se¬vinc¬lə qarşılamışam. Yeri gəlmişkən qeyd edim ki, Əli müəllimi bir şair kimi Borçalıda tanımayan yoxdur. Yaxşı yadımdadır, ötən əsrin 60-70-ci illərində kitab çap etdirməyin, elə qəzetlərdə çap olunmağın o qədər da asan məsələ olmadığı bir vaxtda Gürcüstandakı Azərbaycan dilli mətbuatda imzası ən çox rast gəlinən və oxucu rəğbəti qazanan bir neçə qələm əhlindan biri məhz Əli Səngərli idi. Onu da qeyd edim ki, Əli müəllim elə o vaxtlardan Azərbaycanda ədəbi ictimaiyyət arasında da yaxşı tanınırdı. Onun rus va dünya ədəbiyyatından etdiyi tərcümələr ali məktəblər üçün tərtib olunmuş ədəbiyyat müntəxabatı kitablarına daxil edilmişdi.

Şeirlərinin kitab halında nəşr olunmasına o qədər da həvəs göstərməsə də (vaxtında bu işə biganə olmasaydı, indi bəlkə də onlarla kitabı işıq üzü görmüşdü) Əli müəllim şair kimi çox məhsuldar işləyib. İlk kitabı 2006-cı ilda Bakıda "Nurlan" nəşriyyatında işıq üzü görüb. "Şair ürəyi" adlı 34 çap vərəqi həcmində olan bu kitab Əli müəllimin öz oxucularına ilk sanballı hədiyyəsi idi.

Əli Səngərli bir ömürdə iki ömür yaşayıb: şair va müəllim ömrü. Bunların hansında daha çox uğur qazanıb, demək çə¬tin¬dir. Əslində bu nöqteyi-nəzərdən yanaşmanın özü bəlkə yan¬lış¬dır. Çünki Əli müəllimin hayatında şairliklə müəllimlik bir-birini üzvi şəkildə tamamlayır. Və onu yaxından tanıyanlarda haqlı olaraq belə bir fikir formalaşır ki, şair olmasaydı müəl¬limliyi, müəllim olmasaydı şairliyi bəlkə də bunca uğurlu alın¬maz, natamam olardı. Əli müəllimin özü bu barədə belə deyir:

Şair tək doğuldum, lakin həmişə

Bir müəllim kimi qol-budaq atdım.

Duygu ovçu oldu, döndüm hədəfə,

İlham kürəsinə təsəlli atdım.

Demirəm, papağı yandırdım günə,

Demirəm, bulandım, içilməz oldum.

Körpələr axışdı çeşməm üstünə,

Mən də körpələrdən seçilməz oldum.

Bəli, Əli müəllim, özünün də dediyi kimi, papağı günə yandıran kişilərdən deyildi. O, məktəbi dəniz, sinif otaqlarını isə li¬man bilib, məhz bu limandan dənizə çıxaraq işıqlı sabahlara doğru səfərə başlayıb. Və bu səfərdə heç zaman bədgüman, ümid¬siz olmayıb, lə¬pələr qoynunda ilhamı həmişə üzünə gül¬dü¬yün¬dən sabaha daha coşqun inamla baxıb. İlham pərisi və pedaqoji fəaliyyətinə qarşı sonsuz sevgisi onu heç zaman yal¬nız qoymayıb. Yazıb-yaradıb, uşaqlara elm, bilik verib, baş¬lı¬ca¬sı isə onlara həyat dərsini öyrədib. Sinif otağında deyə bil¬mə¬diklərini şeirləri ilə deyib. Dərs dediyi şagirdlərin yaxşı mü¬tə¬xəs¬sis olmaqdan öncə, yaxşı insan olmalarına çalışıb. Və buna nail olub. İstər pedaqoji sahədə, istərsə də bədii yaradıcılıqda uğurlarının başlıca səbəbi isə o olub ki, Əli müəllim söz xətrinə söz deməyib, sözü urvatdan salmayıb, onun qədir-qiymətini bilib. Yaradıcılığı ilə şəxsi keyfiyyətləri bir-birini üzvi şəkildə tamamladığından gənclər üçün bir nümunə, örnək olub.

Yetirmələrinin hər xoş sorağına sevinib, qürur hissi duyub. Bu, onun yaradıcılığında da öz əksini tapıb:

Şagirdlər yetirdim, uçub getdilər,

Getdilər Bakıya, təhsil almağa.

Şagirdlər yetirdim, gözdən itdülər,

Getdilər Amura körpü salmağa…

Şagirdlər yetirdim, bağban oldular,

Şagirdlər yetirdim, çoban oldular.

Şagirdlər yetirdim, hara getdilər,

Hörmət qazandılar, insan oldular…

Əli müəllim düz sözü deməkdən heç vaxt çəkinməyib, haq¬sızlıqla üzləşəndə susmayıb. Bu keyfiyyət onun yaradıcılığında da öz əksini tapıb. Hələ Sovetlər ittifaqının qılıncının hər iki tə-rə¬finin kəsdiyi vaxtda çoxları partiyaya mədhiyyələr yazanda Əli müəllim bir vətəndaş yanğısı ilə görün nə yazırdı:

Bizim çörəyimizlə neçə yad ölkə toxdu,

Niyə öz süfrəmizdə bir çürük qoz da yoxdu?

Körpələrin ahını gəlin selə döndərək,

Nifrətimizə qataq, Nikitaya göndərək.

O dövrü görmüş adamlar hökumətə qarşı belə sərt itti¬hamlar irəli sürməyin nə demək olduğunu yaxşı bilirlər.

Yaddaşım yazılı kitaba dönüb,

Varaqlar tərpənər dodaqlar kimi.

– deyən Əli müəllim canlı salnamədir desək, yanılmarıq. Canından əziz bildiyi doğma Borçalının dünəni və bu günü haq¬qında zəngin məlumata malikdir ki, bunlar eyni zamanda onun yaradıcılığında əksini tapır.

Xalqımızın bu gün üzləşdiyi problemlər onun şair qəlbini də narahat edir:

Əlimdə sazım ağlar,

Kövrək avazım ağlar,

Yaxam yaman əlində,

Baharım, yazım ağlar.

“Sıyrıl qılınc kimi birdəfəlik sən, a mənim millətim, tərpən yerindən”, – deyərək haray qoparır şair:

Ey odlar yurdunun ər oğulları,

İgid kişilərin nər oğulları,

Ayılın çağrışdan, oyanın səsdən,

Qızmış pələng kimi çıxın qəfəsdən.

Qalxın, əsir düşən dağlar başına,

Son qoyun Şuşanın qarlı qışına.

Əli müəllim sabaha, millətimizin işıqlı gələcəyinə inamla baxır, böyük ümidlər bəsləyir. Çünki özü demiş:

Bir solmaz gülüm var  güllər içində,

Bir şirin dilim var dillər içində,

Bir halal əlim var əllər içində,

Vətənim Borçalı, milliyətim türk,

Xoşbəxtdir ellərim ellər içində.

Əli müəllimin yaradıcılığı və şəxsiyyəti haqqında çox da¬nış¬maq olar. Və mən inanıram ki, hələ bundan sonra onun barə¬sində çox danışılacaq, çox yazılacaq. Artıq cismən ara¬mız¬da olmayan Əli müəllimə – şair Əli Səngərliyə Allahdan rəh¬mət diləyərək hələlik bu yazını elə onun öz sözləri ilə tamam¬layıram:

Bir qədirbiləndə müəllim Əli,

Bir qədirbiləndə Səngərli yaşar.

Ümmana qovuşar məhəbbət seli,

Xatirəm tarixi aşrımlar aşar…

Mənbə : Səməndər Məmmədov – "Ağır elsən, Borçalıda adın var…", Bakı – "Nurlan" – 2009, I kitab.

Rəşid Faxralının "Oğuz eli Faxralı" kitabından

Əli SƏNGƏRLİ (1930).

ADU-nun filologiya fakültəsini bitirib (1957). Tələbə ikən antik yunan ədəbiyyatından etdiyi tərcümələrdən nümunələr (L.A.Senekanın "Fedra" dramı, R.Verqlinin "Melibey-Titir" dramı) "Xarici ölkələr ədəbiyyatı" dərsliyinə salınıb. Q.Qulamın, A.Seretelinin, L.Ukrainskayamn silsilə şeirlərinin də tərcüməçisidir. Faxralı orta məktəbində müəllim işləyib.

Əli Səngərlinin poeziyasının lirik, ictimai-siyasi, fəlsəfi olmaqla üç qanadı bütöv, vahid bir yaradıcılıqdır və bu üç qanadın hər biri ayrılıqda da bitkin poeziyadır; əksər misraların fikir yükü sadəlikdə poetik tapıntıdır, poetik tapıntının səmimiliyidir. Daha, doğrusu, Əli Səngərlinin yaradıcılığını şərtləndirən başlıca amillərdən biri sadəliklə poetik idrakın vəhdətidir.

Əli Səngərlinin lirik şeirlərində Vətən torpağının, bu anlamda Faxralının gözdoyduran gözəllikləri tərənnüm olunursa, ictimai-siyasi şeirlərində xalqımızın mübarizələrdə mətinləşmiş tarixi, bu tarixə şair ehtiramı – milli-xəlqi heysiyyət güclüdür. Lirik şeirlərində insanın, bu mənada təmsil elədiyi xalqın mənəviyyatına çöysüyən qara niyyətlərə üsyan edən xalqın səsinin ifadəçisi olan, "Sellərin-suların şivən etməsi"ndən heyrətlənən şair, haqqı tapdanan, azadlığı əlindən alınan bir xalqın bunca dözümünə təəssüflənir, heyrət edir:

Dəyişibdi salnamələr,

Babam yazan yazı hanı? ("Bağçasaray ")

Bu və qəbil şeirlərin 70-ci illərdə yazıldığını nəzərə alsaq, Ə.Səngərlinin poeziyasının mübariz, çılğın poeziya olduğuna inam gətirirsən:

Dodağım – dişimi çeynədi,

Ürəyim – dərdimin göynəyi.

Göz yaşım – gözümün eynəyi,

Qollarım yurdumun boynunda. ("İmperiya")

"Kirkirə" şeiri də şairin insanlara biganə münasibətinə – dövrün idarəçilik sisteminə, bu anlamda süründürməçiliyə qarşı harayıdır. Nə qədər ki işlək idi – qədir-qiyməti vardı, elə ki, gücü zəiflədi, yaşı ötdü kirkirə gözdən düşdü; Əli Səngərlinin şeirləri, kirkirənin prototipi olan insanın yaşantılarına heysiyyət sayğılarıdı, vətəndaş ağrısıdı. Əli Səngərlinin

Əli bir də oda yanmaz,

Hər gözəli gözəl sanmaz.

Çirkin sevsə də aldanmaz,

Sən çəkərsən haray, Dilbər! –

deyən bədii "mən"i həsrətin nə olduğunu canında-qanında duyur, hicran ağrılarını yana-yana yaşayır.

Əli Səngərli hər sözü öz poetik məqamında işlədən şairdir. Məhz buna görə də onun şeirlərində misraların fikir yükü ilə poetika, məzmunla dərin lirizm bir-birini qibtəediləcək dərəcədə tamamlay1r, onsuz da oxunaqlı, düşündürücü, yaddaqalan olan şeirin poetik məqamında dayanır, oxucunun fikir dünyasının poetik ülkərinə çevrilir…

Əkrəm Cəfər – "Əli Səngərlinin "Şair ürəyi" adlanan şeiri adına layiq süjet ilə gözəl və mənalıdır. Kiçik bir şeirdə böyük mənalar!"

Rəşid Faxralı – "Əli Səngərlinin yaradıcılığı sadəliklə poetik idrakın vəhdətidir".

Rəşid Faxralı – Ruhum canımda sıxılır (Əli Səngərliyə)

Canımda sıxılan ruhum,

Ulduza, Aya qovuşar.

"Qıpçaq Məlik"dən* bac alıb

"Bağçasaray"a* qovuşar.

"Qoca vələs"in* yuxusu,

Kipriklərimi yandırar.

"Bülbül"ün* ahı, naləsi,

Yetim sevgimi yandırar.

Göylər gözümdə dincələr,

Sözümün yalqız gecəsi.

Qələm ömrümə toy tutar,

Sevdamın "Payız gecə"si*.

* Əli Səngərlinin şeirləridir.

Mənbə: Rəşid Faxralının "Oğuz eli Faxralı" kitabından

Şair Şaban Məmmədəli oğlu Qurbanov

ELİMİN ŞAİR OĞLU – ŞAİR ŞABAN

Şair Şabanın şeirlərindən nümunələrə buradan tanış ola bilərsiniz.

Azərbaycan elminə 100-dən artıq alim və tanınmış ictimai-siyasi xadimlər bəxş etmiş Fax¬ralı kəndi təkcə Borçalıda yox, Azər¬baycanda da həm də saz-söz ustadları – məşhur aşıq və şairləri ilə tanınır. Təkcə XX əs¬rin ortalarında öz şeirləri ilə xalq şairləri Səməd Vurğun və Osman Sarıvəllinin diqqə¬tini çəkmiş şair Nəbinin adını çəkmək kifa¬yətdir ki, burda necə qüdrətli qələm sahib¬lərinin yetişdiyi haqda oxucuda təsəvvür yaransın. XVIII-XIX əsrlərdə də bu kənddə neçə-neçə el şairi olub ki, onların çoxunun şeirlərini yaddaşlardan toplayıb vaxtilə kitab halında nəşr etdir¬mişəm. Bu yazıda isə XX əsrdə yaşayıb yaratmış daha bir şair – Şair Şaban haqqında söhbət açmaq istəyirəm.

Şair Şaban – Şaban Məmmədəli oğlu Qurbanov 1914-cü ildə Borçalıda sazın-sözün beşiyi kimi tanınan Faxralı kəndində ana¬dan olub və ömrünün sonuna kimi də bu kənddə yaşayıb. 7-illik fəhlə-kəndli gənc¬lər məktəbini bitirib. Nümunəvi ailə başçısı kimi ləyaqətli övladlar böyüdüb. Oğlanlarından Əli 1965-ci ildə Bakı Dövlət Universitetinin iqtisadiyyat fakültəsini bitirib və uzun müd¬dət Sumqayıt şəhər ticarət idarəsində məsul vəzifədə çalışıb. Kamal el-obaya bağlılığı, yurdsevər¬liyi, vətənpərvərliyi və xeyirxahlığı ilə seçilib hər zaman. Digər oğlanları Qurban, Məmmədəli və Mahal isə gənc nəslin təlim-tərbiyəsi ilə məşğul olub¬lar. Yeri gəlmişkən, Mahal Qur¬banov həm də professordur. Bir söz¬lə, övladlarının hamısı onun adına layiq olub, cəmiyyətdə layiqli mövqe tutublar.

Şaban Qurbanov 1980-ci il iyunun 2-də 66 yaşında vəfat edib.

1932-ci ildən şeir yazmağa başlayan və Borçalıda Şair Şaban kimi tanınan bu el şairi görkəmli el sənətkarı Şair Nəbini özünün us¬tadı hesab edib. Şair Nəbi də onun istedadını yüksək qiymətləndirib, ilhamına qol-qanad verib. Şeirlərinin birində dedikləri də bunu sübut edir:

Səxavət əhlidir Alıynan Şaban,

İnşallah, çatarlar bizə şairlər.

Bu yazı mənim Şair Şaban haqqında ilk yazım deyil. 1997-ci ildə Bakı Dövlət Universitetinin nəşriyyatında çap etdirdiyim "Faxralı tək ağır elim var mənim" adlı kitabımda onun haqqında qısa məlumat və şeirlərindən nümunələr vermişəm. İki il sonra – 1999-cu ildə isə şairin şeirlərini, deyişmələrini toplayıb Bakıda "Hərbi nəşriyyat"da "Payız çiçəyi" adlı kitabını nəşr etdirmişəm. Bu kitabın nəşrindən 15 ildən artıq vaxt keçməsinə baxmayaraq bu gün də hesab edirəm ki, Şair Şabanın heç də bütün şeirlərini əldə edə bilmədik, xalqın yaddaşında yaşayan neçə-neçə şeirini toplayıb daha mükəmməl bir kitabının nəşrinə ehtiyac var.

Şair Şabanın yaradıcılığından danışanda öncə onun deyişmə¬lərini, bə¬dahətən şeir demə qabiliyyətini qeyd etmək lazımdır. Onun Qara Qə¬riblə, dağlar qızı Şövkət xanımla, Dünyamalı Əsgərovla deyişmələri bu gün də dillər əzbəridir. Yeri gəlmişkən onu da qeyd edək ki, bu

deyiş¬mə¬lər çox zaman bağlama, qıfıl¬bənd şəklində olub, özündə dərin məna daşı¬ması və düşündü¬rücülüyü ilə fərqlənib. Fikrimin təsdiqi kimi, belə deyiş¬mələrdən bir neçə numunə gətirmək istəyirəm:

Şövkət:

Sizdən xəbər alım, ay Şaban əmi,

İnsan bu dünyaya nə vaxt gəlibdir?

Dünya tar-mar olub, alt-üst olanda,

Həvvanın gözyaşın kimlər silibdir?

Şaban:

Atamız Adəmdir, bəyan eyləyim,

İnsan bu dünyaya o vaxt gəlibdir.

Həvva ana qövr eyləyən zamanı

Gözünün yaşını övlad silibdir.

Kərbalayı Qara Qəriblə deyişməsindən bir nümunə:

Qara Qərib

Şaban, danışma daldada,

Meydan aç mərdi-mərdana!

Kükrəyib dəryalar kimi,

Qayna, daş mərdi-mərdana.

Yer titrəsin, göy kişnəsin,

Nərə çəkib dayangınan.

Dağıt düşmən qalasını,

Qoyma daş, mərdi-mərdana!

Şaban

Qurmuşam nər meydanında

Mən savaş, mərdi-mərdana.

Sallam düşmən qalasından

Kərpic, daş mərdi-mərdana.

Yaxan keçibdir əlimə,

Tufan qopsa buraxmaram.

Vurub salaram meydana,

Bu gün baş, mərdi-mərdana.

Göründüyü kimi, bu cür deyişmələrdə Şair Şabanın hazır¬cavablığı, geniş dünyagörüşü, sözü məqamında demək qabiliyyəti özünü göstərir. Deyişmənin daşıdığı məzmun və məna, şeirdə istifadə olunan sözlərin yerli-yerində işlədilməsi müəllifin zəngin erudisiyasını bir daha sübut edir.

Şair Şabanın deyişmələrdəki ustalığı özünü lirik şeirlərində də göstərir:

Həsrətinə dözəmmərəm,

Bircə gəl insafa, gözəl.

Bu dünyada gəzəmmərəm,

Etmə mənə cəfa, gözəl.

Yuxarıda da qeyd etdiyim kimi, Şair Şabanın şeirlərinin heç də hamısını əldə edib nəşr etdirmək mümkün olmayıb. Əldə etdiyimiz şeirlər əsasən yaddaşlardan götürülərək yazıya alınıb. Bu işin nə qədər çətinliyini isə bu sahə ilə məşğul olanlar daha yaxşı bilirlər. “Payız çiçəyi” kitabına yazdığı ön sözdə diqqəti bu məsələyə yönəldən hörmətli alimimiz İsa Musayev yazır: “Səməndər müəllim Şair Şabanın şeirlərini misra-misra, zərrə-zər¬rə toplamış, xeyirxah bir iş görmüşdür. Sinədəftər yurddaşların yaddaşlarından toplanan yaradıcılıq nümunələri təbii olaraq mü¬əyyən təhriflərə uğramışdır. Çünki bu şeirləri Səməndər müəllimə təqdim edənlərin, demək olar, əksəriyyəti azsavadlı, yaşlı adam¬lardır”.

Bəli, Şair Şabanın yaddaşlardan yazıya köçürüləsi şeirləri hələ çoxdur. İnanıram ki, xeyirxah eloğlularımızın sayəsində onun bütün şeirlərini toplayıb yeni bir kitabını nəşr edirə biləcəyik.

Mənbə : Səməndər Məmmədov – “Faxralılar”, Bakı – “Elm və təhsil” – 2017, I kitab.

Rəşid Faxralının “Oğuz eli Faxralı” kitabından

Şair ŞABAN (Qurbanov) (1914-1980).

Natamam orta təhsil alıb. Böyük Vətən Müharibəsi iştirakçısıdır. Uzun müddət rayon mərkəzində iaşə sistemində işləyib. Borçalının bəzi şair və aşıqları ilə deyişib. “Ömrün payızı” adlı kitabı (B. 2000) nəşr olunub (tərtibçisi Səməndər Məmmədovdur).

Klassik xalq yaradıcılığı üslubunda yazıb-yaradan Şair Şabanın divanilərinin, qoşmalarının, gəraylılarının poetik yükü də təsdiqləyir ki, o, öz sələflərininin yaradıcılığından novatorluqla bəhrələnmişdir. Buna baxmayaraq, Şair Şaban təzə poetik söz də deyə bilmişdir. Bir həqiqətdir ki, qafiyə uyğunluğu (oxşarlığı, bəzi məqamlarda eyniliyi) şeirin poetik dəyərinə xələl gətirmir; təb, ilham, təbin, ilhamın cığırdaşı olan duyum həmişə təzə söz deməyə imkan verir.

Şair Nəbi ədəbi məktəbinin layiqli davamçılarından biri olan Şair Şaban ustadının yaradıcılığını özünə əsl örnək, əsl mizan bilmişdir. Bu qənaətimi onun “Şairlər” qoşması da təsdiqləyir:

Sərrafsan, seçərsən yaxşı-yamanı,

Ustadlar ustadı, gövhərlər kanı…

Şair Şabanın qoşmalarındakı sətiraltı mənaları çözələyəndə oxucuya elə gəlir ki, onun yaradıcılığı gileydən yoğrulub, poeziyası gileyli poeziyadır. Əslində isə belə deyil. Bu poetik gileyin özündə də bir həyat eşqi, yaşamaq həvəsi var…

“Uca göylərin mehrabı olan eşq” (N.Gəncəvi) özlüyündə intizardlr, həsrətdir, narahatlıqdır. Buna baxmayaraq, o, aşiqin yaşantılarına üzərrikdir. Şair Şabanın “eşqə dözə-dözə ala gözə qurban olmaq” istəyən bədii “mən”inin sevgisi kimi. Bu eşq poetik odu, poetik közüylə Qeysi çöllərə salan, Abbası zillətlərə düçar eləyən, Kərəmi külə döndərən… eşqın analogiyasıdır.

Yarsız bu dünyada gəzmək əbəsdi… (“Yara”)

həsrəti

İlqar verdi ilqarına kəc oldu,

Gözlədim yolları ay çəkə-çəkə. (“Çəkə-çəkə”)

təəssüfünun məntıqı davamı, poetik təzahürüdür…

Rəşid Faxralı: Sevgisinə çatan yoxdu (Şair Şabana)

Bazardan baş açammıram,

Alanmı var, satanm1 var?

Kasıblıq kəsib qapını,

Yağı bala qatanmı var?

Gümanlarım dağlar aşdı,

Sevgim – kürdü, gözüm yaşdı.

Daş-balıncdı, balınc daşdı,

Adam kimi yatanmı var?

Xeyirlə şər davasıdı,

Bir gün tufan qopasıdı.

Dünya küllük topasıdı,

Sevgisinə çatanmı var?..

Mənbə: Rəşid Faxralının "Oğuz eli Faxralı" kitabından

Elxan Hüseynqulu oğlu Məmmədli (elmlər namizədi)

QISA MƏLUMAT

Elxan Hüseynqulu oğlu Məmmədli 1946-cı il yanvar ayının 1-də Bolnisi rayonunun Faxralı kəndində anadan olmuşdur. 1963-cü ildə Bakının 23 saylı orta məktəbini bitirmişdir. 1965-ci ildə ADU-nun (indiki BDU-nun) filologiya fakültəsinə daxil olmuş, 1971-ci ildə ali təhsilini uğurla başa vurmuşdur . Elmi fəaliyyətə "Şair Nəbinin həyat və yaradıcılığı"na həsr etdiyi diplom işi ilə başlamışdır. 1969-cu ildən folklorumuzun toplanması və təbliği ilə bağlı geniş fəaliyyət göstərir. Həmin ildən e'tibarən Azərbaycan radiosunda fəaliyyət göstərən "Bulaq" verlişinin aparıcı müəlliflərindən biri kimi tanınmışdır. Yaradıcı ömrünün on ildən çoxunu "Bulağ"a həsr edən Elxan Məmmədli 80-ci illərin əvvəlindən başlayaraq Azərbaycan televiziyasında saz-söz sənətkarlarına həsr etdiyi bir sıra verilişləri ilə də yadda qalmışdır.1979-cu ildən öz taleyini Nizami adına Ədəbiyyat İnstitutunun folklor şöbəsi ilə bağlayan tədqiqatçı-alim bu illər ərzində bir sıra folklor kitablarının işıq üzü görməsində əlindən gələni əsirgəməmişdir. Belə ki, iki cilddən ibarət "Azərbaycan aşıqları və el şairləri" (1984-cü il), "Azərbaycan bayatıları" (1984-cü il), "Cinaslar" (1985-ci il), "Bayatı, qoşma, təcnis" (1988-ci il), "Borçalı şair Nəbi" (1991-ci il) kimi kitabların tərtib və toplanması məhz Elxan Məmmədlinin yorulmaz əməyinin məhsuludur. Filologiya elmləri namizədi elmi dərəcəsi almaq üçün yazdığı "Təcnis sənətkarlığı" dissertasiyası nəzəri baxımdan kamil poetika əsəri kimi mütəxəssislər tərəfindən yüksək qiymətləndirilmişdir. 50-dən çox elmi məqalənin və bir sıra monoqrafiyanın müəllifidir. 1992-ci ildən bu günə kimi Azərbaycan radiosunda "Sarıtel" və "Gözəlləmə" həftəlik musiqili verilişlərin aparıcısı kimi sazın-sözün təbliği işində əvəzsiz xidmət göstərir. Elxan Məmmədov üç cildlik "Borçalı folkloru" kitabının müəllifidir.

Mənbə : REDAKTORDAN

"EL ÜÇÜN YARADAN, EL ÜÇÜN YANAN, DİRİDİR HƏMİŞƏ, SAĞDIR HƏMİŞƏ"

Bəzən gündəlik qayğılar başımızı elə qatır ki, ömrün-günün ne¬cə keçdiyindən də xəbərimiz olmur. Bir də gözümüzü onda açırıq ki, nağıllarda deyildiyi kimi, ömür yarı, gün yarıdır.

Neçə il əvvəl  əmioğlu Elxanın altmış yaşının tamam ol¬ma¬sını eşidəndə də ilk növbədə bu hissləri yaşamışdım. Aylar, il¬lər necə də sürətlə bir-birini əvəz edirmiş. Bir anlığa xəyal mə¬ni uzaqlara, bir neçə onilliyin o üzündə qalmış qayğısız illərə apardı. Gözəl dağı, Qaraarxac yaylağı gözlərim önünə gəldi. Qay¬ğısız uşaqlıq illərimizi xatırladım. İndi tarixə dönmüş şirin xatirələr məni yenidən qoynuna aldı.

Elxan məndən bir neçə yaş böyük idi. Məktəbdə yaxşı oxu¬yurdu və onun ali məktəbə daxil olacağına kimsədə şübhə yox idi. Təhsildə olduğu kimi, fiziki cəhətdən də yaşıdlarından seçilirdi. Yaxşı güləşirdi. Tay-tuşları arasında böyük hörməti vardı. Mən ona həmişə “əmioğlu” deyə müraciət edərdim. Elə bu gün də belə müraciət edirəm. Yaş fərqimizə baxmayaraq aramızda olduqca səmimi münasibət vardı. Çox vaxt bir yerdə olurduq. Həmişə mənə böyük qayğı və diqqətlə yanaşırdı.

1962-ci ildə onlar ailəlikcə Bakıya köçdülər. O, ADU-nun (indiki BDU) filologiya fakültəsində təhsil aldı. Bir müddət bir-birimizlə müntəzəm əlaqə saxlaya bilməsək də o, mənim üçün doğma bir insan olaraq qalırdı. Nəhayət, mən də orta mək¬təbi bitirib ali təhsil almaq üçün Bakıya gəldim. Təbii ki, mənim üçün hələlik yad olan bu böyük şəhərdə mütləq onu gör¬mək istəyirdim. Ancaq bir tərəfdən şəhəri tanımamağım, di¬gər tərəfdən də imtahan qayğıları bu istəyimi reallaşdırmağa imkan vermirdi. Sənədlərimi Elxan əmioğlunun təhsil aldığı fa¬kül¬təyə – universitetin filologiya fakültəsinə vermişdim. Yəqin ki, burada da mənim hələ uşaqlıqdan Elxanla olan isti müna¬sibətimin, ruhən yaxınlığımızın və bir də o vaxtlar təkcə Fax¬ra¬lıda yox, bütünlükdə Borçalıda dəyərli ziyalı kimi tanınıb böyük hörmət və nüfuz qazanmış rəhmətlik Hüseynqulu müəl¬limin də təsiri olmuşdu. Mən də onun kimi ədəbiyyatçı olmaq istəyirdim. O vaxtlar ali məktəblərə qəbul indiki kimi testlə yox, ixtisasa uyğun olaraq ayrı-ayrı fənlərdən imtahan götür¬mək¬lə keçirilirdi. Universitetin həyəti əsl bilik yarışı meydanına çevrilirdi. Müəllimlərdən öncə abituryentlər özləri bir-birlərini sınağa çəkərək suallaşırdılar. Təbii ki, bu sual-ca¬vab yarışmasından kənarda qalmırdım. Növbəti imtahan ərəfəsində yenə yığışıb suallaşırdıq. Bir də gördüm Elxan əmioğlu mənə yaxınlaşdı. Görüşüb hal-əhval tutduq. Onun kimi filologiya fakültəsini seçdiyimi dedim. Təsadüfən rastlaşmağımız onu da, məni də hədsiz sevindirmişdi. Qəbul imtahanlarını uğurla verib universitetə daxil oldum. Elə o vaxtdan da Elxan müəllimlə əv¬vəlki isti münasibətlərimiz yenidən öz təbii axarı ilə davam et¬məyə başladı. Tez-tez mənimlə görüşür, hər hansı bir çətinli¬yimin olub-olmamasını soruşurdu. Universitetdə mənə dərs deyən müəllimlərin vaxtilə ona da dərs deməsi və ondan razı¬lıq¬¬la danışmaları çox zaman köməyimə çatırdı. Artıq bizim mü¬¬na¬sibətimiz sadəcə qohum, dost münasibətləri ilə məhdud¬laşmırdı. Biz həm də elmi mövzularda fikir mübadiləsi edirdik. Mənim şeir yazdığımı bilir, folklorumuzla, elimizin saz-söz adamları ilə bağlı araşdırmalarımı yüksək qiymətləndirirdi. Fax¬ralının neçə-neçə el şairinin irsini araşdırıb nəşr etdirərkən mən həmişə folklorumuzun bilicisi və yorulmaz tədqiqatçısı ki¬mi onun və saçlarını bu yolda ağartmış müdrik ağsaqqal Hü¬seyn¬qulu müəllimin dəyərli məsləhətlərini əsas tutmuşam. Bu səbəbdəndir ki, bu gün Elxan müəllim mənim üçün uşaqlıq dünyamızın şirin xatirələrinin canlı tarixi, səmimi dost və qo¬hum olmaqla yanaşı, həm də istedadlı bir filoloq alim,  folklo¬ru¬muzun cəfakeş tədqiqatçısı, bilicisidir. O, Azərbaycanımızın hər guşəsinin folklorunun özünəməxsusluğunu, incəliklərini o qədər dərindən bilir ki, bu sahədə onun arqumentlərini qəbul etməmək sadəcə mümkün deyildir. Onun keçirdiyi tədbirlərin, apardığı tədqiqat işlərinin, yazdığı kitab və məqalələrin hesa¬bını aparsaq həqiqətən böyük bir siyahı alınar. Elə təkcə neçə il¬lərdir ki, efirdə səslənən və hər buraxılışı səbirsizliklə gözlə¬ni¬lərək

böyük rəğbətlə qarşılanan “Sarıtel” verlişinin adını çək¬mək kifayətdir ki, Elxan Məmmədli haqqında hər kəsdə təsəvvür yaransın.

Onu da qeyd edim ki, Elxan müəllimin folklorumuza bunca bağlılığında Borçalının qadın şairləri arasında özünəməxsus yeri olna nənələrimiz Səhnə Alməmmədlinin və Yetər Bayram qızının da rolu böyükdür… Yetər nənə olduqca hazırcavab, sö¬zü məqamında deməyi bacaran və sinədəftər bir qadın idi. Filo¬logiya elmləri doktoru, professor, folklormuzun gözəl bilicisi Şurəddin Məmmədlinin “Azərbaycan ədəbiyyatının Borçalı qolu” əsərində yazdığı kimi, Yetər nənəyə də bu keyfiyyətlər anası Səhnə Alməmmədlidən keçmişdi.

Heç yadımdan çıxmaz, bir dəfə Elxan əmioğlu ilə birlikdə Faxralıya getmişdik. Bizi doqqazda qarşılayan Yetər nənə üzü¬nü Elxana tutub dedi:

Yalqız ağac yaldadı,

Dağlar ona daldadı.

Demirsənmi, ay zalım,

Gözlərimiz yoldadı.

Sonra da əlavə etdi:

-Hardasınız ay qırılmışlar, niyə tez-tez gəlmirsiniz?

…Tale verən ömrü elə yaşamalısan ki, bir anlığa nəfəs dərib arxada qoyduğun illərə boylanmağa, bir növ özün-özünə he¬sabat verməyə haqqın olsun. Vay o adamın halına ki, bu mə¬qam¬da geriyə boylanmağa üzü olmasın. Elxan əmioğlu bu mə¬nada bəxti gətirənlərdən, el yanında üzüağ olanlardandır. Bəli, onun həm elmdə, həm də eldə üzüağdır. İnanıram ki, ömrünün yetkinlik yaşını yaşayan alim qardaşım Elxan Məmmədli – Elxan əmioğlu hələ bundan sonra çox işlər görəcək, onun gərgin elmi axtarışları çox qaranlıqlara işıq salacaqdır.

Sevimli şairimiz Hüseyn Arif şeirlərinin birində yazmışdır:

Çəkilmədim otaqların küncünə,

Düzlər keçib, dağlar aşan şairəm.

Mən nə deyim, görürsünüz özünüz,

Qocaldıqca cavanlaşam şairəm.

Qocalmaq sözü sənə yaraşmır, əmioğlu. Arzu edirəm ki, bun¬dan sonra da gənclik eşqi ilə yaşayıb yaradasan. Biz sənin gü¬cünü dizindən çox ürəyində və biləklərində görmüşük. Qoy bu güc heç vaxt azalmasın.

Çoxlarının da etiraf etdiyi kimi, adam həmişə öz yaxınları, doğmaları haqqında nəsə yazmaqda çətinlik çəkir. Bilmirsən nədən başlayıb, nədə qurtarasan. Elxan əmioğlu haqqında yaz¬maq istəyəndə mən də eyni hissləri yaşadım. Bizi bir-birimizə bağlayan tellər birmi, beşmi? Hansından söhbət açasan… Elə bu səbəbdən də deyirəm: “Hər cür yasarın at oynada bilmədiyi

Faxralıda" ər oğlu ərlər çoxdur. Onlardan biri də folklormuzun yorulmaz araşdırıcısı, gözəl alimimiz, istiqanlı qohumumuz, Respublikamızın Əməkdar mədəniyyət işçisi Elxan Məmmədlidir. O Elxan Məmmədli ki, diridir həmişə. Gözəl şairimiz Rasim Kərimlinin vəsf etdiyi kimi:

Durnaya kəm baxmaz tel üçün yanan,

Seldən ayrı düşməz sel üçün yanan,

El üçün yaradan, el üçün yanan

Diridir həmişə, sağdır həmişə.

Mənbə : Səməndər Məmmədov – "Ağır elsən, Borçalıda adın var…", Bakı – "Nurlan" – 2010, II kitab.

SAZ ÖMÜR VƏ DADINDAN DOYULMAYAN SAZ ÖMRÜ YAŞA, ƏMİOĞLU!

2016-cı ilin yeni nəşrlərindən bi¬ri də tanın¬mış folklorşünas alim Elxan Məm¬məd¬linin anadan olma¬sının 70 illiyi münasibətilə hazır¬lan¬mış, onu yaxından tanıyan ziya¬lı¬la-rın, mütə¬xəs¬sislərin, aşıq və sənət¬çi¬lərin, tə¬lə¬bə yoldaş¬la¬rının, yaxın qo¬hum¬larının ürək sözləri ilə ya¬naşı, yu¬bilyarın poetik yara¬dıcı¬lığından nü¬mu¬nə¬¬lərin də daxil edildiyi "El¬xan ömrü, saz ömrü" kita¬bı¬dır. Kitabın re¬dak¬¬toru filologiya üzrə elmlər doktoru, professor Mahmud Allah¬man¬lı, tərtib edəni Vüsal Abi¬yev, sponsoru t.e.f.d, dosent Hüseyn Artıkoğludur. Kitab AMEA Folk¬lor İnstitutunun xətti ilə Bakıda "Ağrıdağ" nəşriyyatında işıq üzü görüb.

Elxan Hüseynqulu oğlu Məmmədli 1 yanvar 1946-cı ildə Borçalı mahalının Bolnisi rayonunun Faxralı kəndində anadan olub. 1971-ci ildə Azərbaycan Dövlət Universitetinin filologiya fakültəsini bitirib. Əmək fəaliyyətinə fəhləlikdən başlayan Elxan Məmmədli bir müddət pedaqoji fəaliyyətlə məşğul ol¬duq¬dan son¬ra, 1976-1979-cu illərdə Pedaqoji Elmlər İnsti¬tutunda elmi işçi işləyib.

1979-cu ildən etibarən müsabiqə yolu ilə Nizami adına Ədəbiyyat İnstitutunun Folklor şöbəsinə kiçik elmi işçi vəzifə¬sinə qəbul edilib.

1994-cü ilə kimi Ədəbiyyat İnstitutunun Folklor şöbəsində çalışan E.Məmmədli böyük elmi işçi kimi həmin ildən Folklor Elmi-Mədəni Mərkəzinə köçürülüb.

1998-ci ildə "Azərbaycan aşıq yaradıcılığında təcnis" möv¬zu¬sunda namizədlik dissertasiyası müdafiə edərək filolo¬gi¬ya elmləri namizədi alimlik dərəcəsi alıb. 1999-cu ildən AMEA-nın Folklor İnsitutunda Aşıq yaradıcılığı şöbəsinin müdiridir.

1969-2009-cu illər ərzində Azərbaycan radio və televizi¬ya¬sında "Bulaq", "Ustadnamə", "Sazın-sözün sehrində", "Gözəl¬lə¬mə" və "Sarıtel" verlişlərinin müəllifi və aparıcısı olub.

O, bir monoqrafiya, 10-dan çox toplama-tərtib kitabını nəşr etdirib, 30-dan çox kitabın redaktoru, rəyçisi olub.

2008-ci ildə “Əməkdar mədəniyyət işçisi” fəxri adına layiq görülüb.

Azərbaycan Aşıqlar Birliyi İdarə heyətinin və Azərbaycan Jurna¬listlər Birliyinin üzvüdür.

Elxan Məmmədlinin rəhbərlik etdiyi Aşıq yaradıcılığı şö¬bə¬¬sində Azər¬baycan aşıq yaradıcılığı araşdırılır, nümunələri top¬la¬nı¬lır, sis¬tem¬ləşdirilir və nəşrə hazırlanır. Aşıq sənətinin poetik xü¬su¬siy¬yətlərinin, ideya-məzmun məsələlərinin tədqiqi, ayrı-ayrı aşıqların bədii irsinin top¬lan¬ması və nəşri, onlar haq¬qında mono¬qra¬fik tədqiqatlar aparılması, “Azər¬baycan aşıqları” çoxcild¬li¬yi¬nin tərtib və nəşr edilməsi də bu şöbə¬nin əsas vəzi¬fələrindəndir. Şöbə Azərbaycan folklorunun toplanması, təd¬qiqi və nəşri isti¬qa¬mətində folklorumuzun tarixi və nəzəri problemləri ilə məş¬ğul¬dur. Şöbədə 21 nəfər elmi əməkdaş fəaliyyət göstərir. Onlardan 1 nəfəri AMEA-nın həqiqi üzvü, 1nəfəri elmlər doktoru, professor, 5 nəfəri elmlər namizədi, qalanları isə laborant, kiçik elmi işçi və böyük elmi işçilərdir.

Aşıq sənətinin kökləri qədim dövrə gedib çıxsa da, Elxan Məmmədli aşıq sənətinin əsasının XV əsrin sonu XVI əsrin əv¬vəl¬lərində qoyulduğu qənaətindədir. Mətbuata verdiyi müsa¬hibə¬lə¬rin birində Elxan müəllim deyir ki, xalqın tarixi dəyəri və mənəvi inkişaf səviyyəsi həmin xalqa mənsub yaradıcılıq fəaliy¬yət¬lərinin nəticələri ilə müəyyən olunur: “Təbii ki, Azər¬baycan xalqının yaradıcılıq istiqamətlərindən biri də çoxəsrlik aşıq musi¬qisində təzahür olunur. Bu, xalqın fəlsəfi mədəniy¬yətinin for¬ma-laş¬dığı xüsusi bədii təfəkkür sahəsidir. Bu incə¬sənət növündə poezi¬ya, musiqi, rəqs, ifaçılıq sintezi özünü gös¬tərir. Aşıq musi¬qisi, aşıq insanın mənəvi dəyərlərini, əməllərini tərənnüm edir və bundan ilham alır. Aşıq sənətinin əsas möv¬zuları məhəbbət və təbiət gözəlliyi, insan və onun əməl¬ləridir. Özü də bu yaradıcılıq prosesi sintez, yeni teatrlaş¬dırılmış şəkil¬də improvizator aşıq tərəfindən sazda ifa kimi tərənnüm olunur”.

Elxan Məmmədli əmindir ki, Azərbaycan, aşıq sənəti, saz yalnız Azərbaycan xalqına məxsusdur: “Televiziya kanal¬la¬rın¬da, etdiyimiz sə¬fər¬lərdə görürük ki, Türkiyədə, Mərkəzi Asiya ölkə¬lərində saza bənzər musiqi alətləri var. Ancaq bizim saz sənətimiz bizə məxsusdur. İstər qərb bölgəsi, itərsə də Şirvan bölgəsi olsun, bu sənət sırf Azərbaycana məxsusdur. Arzu¬olunan oldu ki, dövlətin dəstək və qayğısı nəticəsində 2009-cu ildə Azərbaycan aşıq sənəti UNESCO-nun qeyri-maddi mədəni irs siyahısına daxil edildi. Bir var, şəhər musiqisi, şəhər ədə¬biyyatı, biri də var elat musiqisi. Elat musiqisinə aşıq yara¬dıcılığı daxildir. Şəhər musi¬qi¬sinə isə muğam daxildir. Son za¬manlar şəhər və elat mədəniyyəti qovuşmaq üzrədir. XIX əsrdə Sadıqcan tarı dizdən sinəyə qal¬dır¬dı, tarın texniki imkanlarını artırdı. Eyni zamanda Azər¬baycan xalqının istedadı mu¬ğama öz töhfəsini verdi, muğamın məzmu¬nuna təsir göstərdi. Nəti¬cə¬də muğam hazırda əlçatmaz möv¬qe¬də¬dir. Demək istəyirəm ki, aşıq sənəti doğmamızdır, muğam sənə¬ti¬ni isə doğmalaşdır¬mı¬şıq. Hər iki sənə¬ti¬miz böyük sənətdir. Bəd¬nam qonşularımız muğam sənətimizə, aşıq sə¬nə¬tinə, mətbə¬xi-mizə əl atırlar, mənəvi-maddi irsimizi özlərininki kimi dün¬yaya təqdim etmə¬yə çalışırlar, can atırlar. Azərbaycan xalqı nə qədər zən¬gindir ki, onun süfrəsinin tör-töküntüləri başqalarını da dolandırır, yaşadır”.

Elxan müəllim uzun illərdən bəri respublika televiziya və radiosu vasitəsilə aşıq sənətinə dair silsilə verlişlər hazırlayıb, aşıqsevərlərə ər¬mə¬ğan edib. Bu verlişlər demək olar ki, bütün Azərbaycan aşıqlarının, ha¬belə Gürcüstan, Türkiyə və İran İslam Respublikasının saz-söz usta¬larının həyat və yaradıcı¬lı¬ğını özündə əks etdirən qiymətli audio-video sənədləridir. Hörmətli alim əsl milli qeyrət göstərərək təmənnasız olaraq bu qiymətli sənət nü¬mu¬¬nələrini Azərbaycan Respublikası Dövlət Səs Yazıları Arxi¬vi¬nə təqdim edib. Sonradan həmin

materiallar elmi-texniki cəhət¬dən işlənərək rəqəmsal formata keçirilmişdir. Arxiv rəhbərliyi Elxan müəllimin bu addımını “əsl milli qeyrət nümunəsi” adlandırıb.

Professor M.Allahmanlının redaktoru olduğu “Elxan ömrü, saz ömrü” kitabına müqəddimədə yazdığı kimi, Elxan Məm¬məd¬liyə olan rəğbət və sevgidən yoğrulan bu kitabda folk¬lor¬şü¬nas alimin həyat və fəaliyyətinin müxtəlif tərəfləri təfərrüatlı şəkildə özünün ifadəsini tapmış, onun Azərbaycan folklor¬şü¬nas¬lığı, mə¬dəni mühiti, sazımızın, sözümüzün təbliği üçün gör¬düyü işlər boy göstərir, sonsuz, daha doğrusu, ilahi sevgi ilə milli mədəniyyətin qorunub saxlanılması və gələcəyə ötürül-məsi yo¬lun¬da apardığı mücadilə təqdim olunur. Şadam ki, kitab¬da Elxan Məm¬mədli haqda yüksək fikirləri paylaşılan müqtədir söz sahiblərinin qələm məhsullarının sirasında mənim də müəllifi olduğum, daha əvvəl “Ağır elsən, Borçalıda adın var” kitabımın II cildində getmiş “El üçün yaradan, el üçün yanan, diridir həmişə, sağdır həmişə” başlıqlı oçerkim yer al¬mış¬dır. Yaxın adamım, doğmam, əmim oğlu olduğundan, onun barəsində yazmağa çətinlik çəkirəm. Orta məktəb illərində də, ali məktəbdə oxu¬du¬ğum dövrdə də məndən bir neçə yaş böyük, seçdiyim Bakı Dövlət Uni¬ver¬sitetinin filologiya fakültəsinin məzunu olan əmim oğlundan gör¬dü¬yüm diqqət və qayğı ölçü¬yəgəlməzdir desəm, yanılmaram. O vaxt yaz¬dığımın indi də üstündə dururam ki, Elxan əmioğlu bəxti gətirən insanlar¬dan¬dır. Belə ki, o tale verən ömrü elə yaşayıb ki, hər an nəfəs dərib arxaya boylanmağa, bir növ özü özünə hesabat verməyə haqqı var. Vay o adamın halına ki, bu məqamda geriyə boylanmağa üzü olmasın.

Elxan Məmmədli ilə birgə 1986-cı ilin yayına təsadüf edən Göyçay səfərindən yazan AMEA Folklor İnstitutunun direk¬toru, AMEA-nın müx¬bir üzvü Muxtar İmanov yubilyarın port¬ret cizgi¬lərini təsvir edərkən, ilk növbədə təvazökarlığının, təmənna¬sız-lı¬ğının altını cızır: “…Aşıq ədəbiyyatına aid neçə-neçə elmi yazının müəllifi olan bu adam biz yol¬daş¬larından fərqli olaraq, elmlər namizədi olmağa o qədər də həvəs göstər¬mirdi. Bu barədə yol¬daş¬lar arasında söz düşəndə mən zarafatla deyirdim ki, savadsız namizədlərin günü-gündən artmağı mü¬da¬fiə məsə¬ləsini Elxanın gözündən salıb. Zarafat zarafat yerin¬də, amma namizəd¬lik məsə¬ləsinə E.Məmmədlinin adi bir şey kimi baxmağında, bəl¬kə, aşıq şeirinin özündən gələn bir fəlsəfə var¬dı. Hadi¬sələrə yumorla yanaşan E.Məmmədli hər xırda şeyi özünə dərd eləmək istəmir, hər xırda uğurla qürrələnməyi uşaq işi  sayırdı”.

Filologiya üzrə elmlər doktoru, Dövlət Mükafatı laureatı, Əməkdar elm xadimi Məhərrəm Qasımlı çağdaş Azərbaycan folklorçuları içəri¬sin¬də onun qədər xalqa yaxın ünsiyyətdə olan ikinci bir araşdırmaçının olmadığını təxmin edir: “Saz-sözdən söhbət gedən elə bir məclis olmaz ki, orada Elxan Məmmədli xatırlanmasın. Bu sahənin ən mübahisəli, qa¬ran¬lıq problem¬lə¬ri¬nin aydınlaşmasında onun faktoloji biliyi hər zaman həlledici olur. Elxan sazı və bütövlükdə aşıqlığı ustad aşıqların özü səviy¬yəsində bilir. Mən dəfələrlə müşahidə etmişəm ki, onun olduğu saz-söz məclislərində aşıqlar öz çalğı və oxumalarına xüsusi həssaslıqla diqqət yetirirlər”.

Filologiya elmlər doktoru, professor Mədəd Çobanov isə qə¬na¬ətini be¬lə bölüşür ki, Elxan Məmmədli hər bir ədəbi-bədii məc¬¬lis¬lərdə çıxış edə¬rkən sanki dinləyiciləri ovsunlayır, filolo¬gi¬ya üzrə fəlsəfə doktoru adını harada olmasından asılı olma¬yaraq lə¬ya¬qətlə doğrulda bilir: “O, ziya¬lı¬larımız arasında, de¬mək olar ki, özünün azərbaycançılığı, vətən¬pər¬vərliyi, milli ru¬hu, milli ide¬ya¬sı, alicənablığı, insanpərvərliyi, əxlaqi-etik gö¬¬rüşlərinə və ümumi dünyagörüşünə görə hamımızın sevimlisinə çevri¬lən ən yaxşı eloğlulardan və həmkarlardan biridir, bəlkə də, birin-cisi¬dir…”

Rəhmətlik şair, böyük müəllimimiz Əli Səngərlinin qarda¬şı oğlu Elxan Məmmədliyə yazdığı şeir də kitabda yer alıb:

Qocalıq gözümdən yaman alıbdır,

Daha köç üstəyəm, a qardaş oğlu.

Qaçqını, köçkünü görəndən bəri,

Sağlamaz xəstəyəm, a qardaş oğlu.

Dolu divan tutub, tağım quruyub,

Bostanım soğulub, bağım quruyub,

Çəmənli, çiçəkli çağım quruyub,

Sanki qəfəsdəyəm, a qardaş oğlu.

Ağrımı, acımı biləmim yoxdu,

Könlümün pasını siləmim yoxdu,

Gözlərim yoldadı, gələnim yoxdu,

Qulağım səsdədi, a qardaş oğlu.

Şair Osman Əh¬məd¬oğlu (Dərviş) Elxana hər zaman bir dastan kimi baxdığını yazıb: “Duruşunda, yerişində, cah-cəlallı söz-söhbətində bir das¬tan tamlığı, bütövlük və yetkinlik urvatı görmüşəm. Özünün sambalı sözünün sambalıyla tən gəlib hər zaman. Sərrast düşün¬cə¬ləri, hədəfə de¬yən fikirləri onu köklü-köməcli bir tamlıq sim-gəsi kimi tanıdıb əhli-ürfan aləmində. “Zər qədrini zərgər bilər” demiş atalar. Onun duruş gətirə bil¬mə¬diyi söz oyununa rast gəl¬mədim onu tanıyanı və biləni. Əslində çox uzun zamana ehtiyacı var onu başdan-ayağa oxumağın. Çünki bir dəfəyə oxunan və ya bir tənliklə həll olunan məsələyə bənzəyən döyül Elxam Məmmədli”.

Dosent, dövlət qulluğunun müşaviri Eldar Hüseynquluoğlu böyük qardaşını folklora gətirən yoldan yazır və onun xətrini Azər¬baycanın hər yerində əziz olduğunu sübuta yetirən bir əhva¬lat nəql edir: “Mən Əmək və Əhalinin Sosial Müdafiəsi Nazir¬li¬yində işləyəndə iş yoldaşlarımla (Onlardan biri Tovuz, digəri isə Gədəbəy rayonundan idi) söhbət edirdik. Söz aşıqlardan, “Sarı¬tel” verlişlərindən və Elxandan düşdü. Yoldaş-larım bir-biri ilə mübahisə etməyə başladı, biri deyir Elxan Tovuzludur, digəri isə Gədəbəydən olmasını israr edirdi. Mən isə bunlara baxıb gülür¬düm. Mənə dedilər ki, Eldar müəllim, nəyə gülürsüz? Mən dedim ki, mənim böyük qardaşımın üs¬tündə bir-birinizin “qırmağınıza” gülürəm. İksi də bir ağızdan “Elxana yiyə çıxanın biri də artdı” dedilər. Nə isə, mən səhəri gün rəhmətlik atam Hüseynqulu müəllimin “Görüm Faxralının biri olsun beş”… kitabını gətirib bunlara verdim və onlar bizim ailəvi şəkilmizi kitabda gördükdən sonra Elxanın Borçalıdan olmasına inandılar və hər iksi qeyd etdi ki, Elxanı bizim rayon¬da bütün xeyir və şərdə iştirak edən və aşıqlarımızın yubiley¬lərini aparan görmüşük, ona görə də elə bilirdik ki, bizim rayondandır”.

Azərbaycan Aşıqlar Birliyinin katibi, Əməkdar Mədəniyyət İşçisi, "Ozan dünyası" jurnalının baş redaktoru Musa Nəbioğlu Elxan Məmmədli haqda yazısının əvvəlini Çingiz Aytmatovun ibrətamiz fikri ilə başlayıb: "İnsanın başqaları üçün görə bilə¬cəyi ən yaxşı iş öz ailəsində ləyaqətli uşaqlar tərbiyə etməkdir". Musa müəllim bu fikri ona görə xatırladır ki, Hüseynqulu müəllim tək¬cə öz elmi-pedaqoji fəaliyyəti, bir el ağsaqqalı kimi dəyərli məs¬ləhətləri ilə yox, həm də böyük yazıçının dediyi kimi, ailəsində ləyaqətli övladlar böyütməklə cəmiyyətə öz töh¬fəsini vermişdir və elə bu səbəbdən də bu gün onun ruhu şad¬dır: "Onun ruhu bir də ona görə şaddır ki, övladlarından biri həm də onun elmi fə¬aliy¬¬yət sahəsindəki işinin layıqli davam¬çısıdır. Elxan müəllimin bir folklorşünas kimi yetişməsində, tanınmasında təkcə bir ata kimi yox, həm də tanınmış bir pedaqoq kimi Hüseynqulu Məmmədlinin böyük rolu olub".

Filologiya üzrə fəlsəfə doktoru, şair-publisist Qiymət Məhər¬rəmli də Elxan müəllim haqqında qiymətli fikirlərini qələmə alıb: "Elxan Məmmədli o qisim kimsələrdəndi ki, ağır-ağayana yerişi-du¬ruşu, salğarlı-səbatlı danışığı, doğruluğu-dürüstlüyü ilə hər kə¬sə nümunə, örnək ola biləcək halaldan halal bir ömür yaşayıb. 15-20 il qabaq onu necə görmüş, necə tanımışamsa, bu gün də həmin xislətdə, həmin sanbalda, həmin insanlıq pilləsində qərar¬laşıb. Yolunu həmişə düz gedib: hər cür pislik¬lərdən, xəbis¬lik¬lər¬dən uzaq, müdrik, nurani-pirani bir dərviş ömrünü da¬vam etdir¬məkdədir. Yorulub-usandığını gör¬mə¬dim əsla! Yaxşılıqdan, halal¬lıqdan usanılarmı heç?! Çünki bu cür Tanrı övladları yalnız xeyirxahlıq missiyasını həyata keçir¬¬mək üçün göndəriliblər Yer üzünə. Həmişə… kimə görəsə narahat, nigaran, sevgili, sayğılı… – belə bir missiyanın daşıyıcısıdır bizim Elxan Məmmədli!"

Kitabda Elxan Məmmədlinin haqqında yer alan yazıların əksə¬riyyətinin elə sərlövhələri yubilyarın barəsində çox şey deyir. Məsə¬lən, "Aşıq sənətinin yorulmaz yolçusu" (İsrafil Ab¬baslı), "Folklorlaşan folk¬lorşünas" (Mahmud Allahmanlı), "Şa-man Elxan" (Mürsəl Həki¬mov), "Aşıq sənətini Elxandan soruş" (Səadət Buta), "Dostluğun fövqündə dayanan insan" (Ta¬riyel Abbaslı), "Elin xanı" (Miraslan Bəkirli), "Güney aşıqlarının sevimlisi" (Böyükbəy Ələkbəroğlu), "Ozan kimi" (Həzi Həsənli), "Bir ömürdə iki həyat yaşayan alim" (Elbəyi Cəlaloğlu), "Aşıq sənətinin məcnunu" (Şöhlət Əfşar), "Folk¬lo¬rumuzun cəfakeşi" (Maşallah Xudubəyli), "Dədə Elxan" (Aşıq Altay Məmmədov), "Sazın bəstəsində yaşayan ömür" (İsmayıl İlməzli) və s.

Hələ Xalq şairi, Türk dünyasının böyük söz fatehi Zəlim¬xan Yaqub sağlığında Elxan Məmmədlinin 60 illik yubiley gecə¬sindəki çıxışında demişdi: "Elxan öz səsini elə səslərə qoş¬du ki, ona nə ayrılıq, nə də zaman sədd, sərhəd şəkə bilmədi. Tür¬küs-tanda da, Qafqazda da, İranda da, Türkiyədə də, Şərq aləmində də, Türk dünyasında da, bütövlükdə Şərqi, Qərbi qucaqlayan bö¬yük dünyada da dalğalara qoşuldu Elxan səsi, şa¬irlərimizin, alim¬lə¬rimizin, aşıqlarımızın, ozanlarımızın, ustad¬¬larımızın, övli¬ya¬la-rı¬mızın, dədələrimizin təbliğatı ilə məşğul ola-ola özü də nura¬ni¬ləş¬di, piraniləşdi, gözəlləşdi, duruldu, saflaşdı, oldu saz, oldu aşıq, oldu şair, oldu folklor¬şünas. Bax, bu mənada, bunun bir səbəbi də onu yetirən, onun doğulduğu ailədi. O ailədi ki, Borçalı ziya¬lı¬ları¬nın hamısının ocağı olub Hüseynqulu müəllimə görə. Və saçları qar kimi dümağ olan qibləgahımız, anamız Fatma xanım bu gün bu məclisdə iştirak edirsə, o deməkdir ki, bu əsərin baş qəh¬rəmanı Fatma xanımdır. Ən böyük folklorşünas alim odur. Bu¬na görə, əzizim, iki gözlüm, Fatma ana, Səməd Vurğun deyirdi ki:

Dünya binasını qurandan bəri,

De, hansı dahinin xəyal şahpəri,

Ucala bilmişdi barı bir kərə,

Ana qəlbindəki sonsuz göylərə".

Saz ömür və dadından doyulmayan, saz ömrü yaşa, əmioğlu!

Mərhumə ananız və hamımızın anası Fatma xala hər söhbətimizdə mənə deyərdi: "Atan Eyvaz Məmmədov Hüseyn¬qulu əminin sıxıntılı günlərində həmişə tərəzinin Hüseynqulu müəllim olan gözündə olardı". Hörmətli bükülməz biləkli pələng əmioğlu! Bu fikrə şərh vermək çətindi. Özümüzü biləndən bu fikrin üstündə köklənmişik, bir-birimizə arxa-dayaq olmuşuq. Bundan belə də Allah verən ömrü beləcə, şərəflə və şərəfimizi qoruya-qoruya yaşamalıyıq.

Mənbə : Səməndər Məmmədov – "Faxralılar", Bakı – "Elm və təhsil" – 2017, I kitab.

Fatma Aslan qızı Əliyeva (Aslan)

BORÇALIMIZIN ASLAN QIZI

Fatma Aslanın müəllifi olduğu kitablar və yazdığı şeirləri barədə məlumatlara müvaiq linklərdən baxmaq olar.

Artıq tarixə çevrilən 2010-cu ilin ədə¬bi həyatında baş verən yaddaqalan ha¬disələrdən biri də Fatma Aslanın "Göy üzündə gəzən bulud" adlı ilk şe¬ir¬lər kita¬bı¬nın işıq üzü görməsi oldu. Çağ¬daş Azər¬baycan poeziyasının Gür¬cüs¬tanda yaşayıb-yaradan iste¬dad¬lı nüma¬yən¬dələrindən biri sayılan Fatma Aslanın kita¬bının Tiflisdəki "Universal" nəşriyyatında çap olun¬ması faktı öz-özlüyündə sevindiricidir. Vaxt var idi, Gürcüstanda Azər¬baycan türkcəsində nəşrlər müm-künsüz gö¬rü¬nürdü. Nəşrin rəhbəri və redaktoru Azərbaycan Yazıçılar Bir¬liyinin Gürcüstan bölməsinin sədri, Tiflisdəki "Varlıq" Mə¬də¬niyyət Mərkəzinin direktoru Rafiq Hümmətdir.

Öncə Vətən

"Göy üzündə gəzən bulud" kitabı müəllifin toplu halında oxucularla ilk görüşü olsa da, indiyədək onun bir çox şeirləri, müxtəlif səpkili ədəbi-bədii yazıları çeşidli mətbu orqanlarda çap olunub. Amma yalnız toplu halında nəzərdən keçiriləndə aydın olur ki, Fatma Aslanın poeziyasında vətənpər¬vərlik mo¬tiv¬ləri üstünlük təşkil edir. Vətən isə doğma evin divar-la¬rın-dan, doğma yurddan başlayır. Fatma Aslanın doğma yurda münasibəti isə onun "Faxralı" adlı şeirində ifadə olunub:

Quru kəsəyinə, daşına qurban,

Qayadan süzülən yaşına qurban,

"Borçalı üzükdür", – dedi sənətkar,

Faxralı adında qaşına qurban…

Fatma xanımın düşmən tapdağı al¬tında olan Qarabağa, Xocalıya həsr et¬di¬yi şeirləri göz yaşları ilə yazılsa da, onların sətirlərində nikbinlik, qələbəyə inam, torpaqlarımızın gec-tez işğaldan azad ediləcəyinə ümid ehtiva olunub:

Qızıl qanla yazıldın,

Yaddaşıma, yadıma,

Qarabağım, dayan, dur,

Vətən çatar dadına…..

(“Qarabağ – qan yaddaşım”)

Fatma xanımın “Vətən məni çağırsa….” adlı şeiri belə bir bənd¬lə sonuclanır:

Aslan elə aslandır,

Erkək, dişisi olmaz,

Vətən keşikçisinin,

Qadın, kişisi olmaz.

Təbii ki, burada müəllifin yeganə məqsədi məlum atalar sözünü bir daha xatırlatmaq olmayıb. Mənə elə gəlir ki, şairə Fatma Əliyeva nəyə görə “Aslan” təxəllüsü daşıdığını məhz bu sətirlərdə açıqlayıb. Bildirib ki, vətənpərvər bir kişinin, Aslan kişinin qızıdır.

Ümumiyyətlə, vətənpərvərlik Fatma Aslanın xarakterində, dü¬şüncəsində elə bir üstünlük təşkil edən cəhətdir ki, onun baş¬qa mövzuda yazdığı şeirlərdə belə sətirlərin altından boy¬lanır.

Ana dili – layla dili

Dil və ədəbiyyat müəlliminin ya şair, ya da yazıçı olduğunu  təxmin edənlər çox vaxt yanılmırlar. Deyərdim, hətta belə bir rəy də mövcuddur ki, dil və ədəbiyyat müəlliminin poeziya ilə, nəsrlə əlaqəsi yoxdursa, demək, onun pedaqoji fəaliyyəti də sə¬¬mi¬mi deyildir. Əlbəttə, istisnalar da az deyildir. Ancaq mənə elə gəlir ki, bu stereotip əbəs yerə yaranmayıb. Uman yerdən küsərlər, – deyib atalarımız. Ədəbiyyatı öyrədənlər elə ədəbiyyatı yaratmağı da bacarmalıdırlar. Fatma xanım həm dərslə¬rin¬də, həm çalışdığı təhsil ocağında keçirilən tədbirlərdə və əlbəttə ki, şeirlərində ana dilimizə olan sonsuz məhəbbətini dərin məna yüklü sözləri ilə çox təbii şəkildə çatdırır. Millətin həyatında və taleyində ana dilinin misilsiz rolunu prin¬si¬pi¬al filoloq, geniş dünyagörüşlü ziyalı və təcrübəli maarifçi ki¬mi qiymət¬ləndirən Fatma Aslan “Ana dilim” adlı şeirində yazır:

Ana dilim – mənim adım,

Şəxsiyyətim, vəsiqəmdir.

Anamın həzin laylası,

Ürəyimdə dinən simdir.

O, mənim var olmağımdır,

Tarixlərdə qalmağımdır.

Dünənimə körpü salıb,

Sabah yol açmağımdır…

Müəyyən şəraitlərin təsirilə hərdən-hərdən hansısa qatqılara uğrasa da, əsasən saf, təmiz, musiqili, cazibədar qalan, möhtə¬şəm Azərbaycan türkcəsində yazıb-yaradan Fatma Aslan da bu dilə xidmət edir.

Nikbinlik dolu misralar

Ola bilməzdi ki, Lermontovun "Aşıq Qərib"ini oxuyaraq, Qliyerin "Şahsənəm" operasını dinləyərək ilhama gələn şairə Fatma Aslan Aşıq Qurbaninin "Bənövşə"sinə biganə qalsın. Xeyr, biganə qalmayıb, həm də bənövşənin abı rənginə nikbin çalarlar əlavə edib:

Şax tut zərif boynunu,

Ellərə bahar gəlir.

Ürəklərə həyəcan,

Çöllərə vüqar gəlir…

Ümumiyyətlə, Fatma Aslanın təbiətə həsr etdiyi şeirlərinin az qala hamı¬sından bahar təravəti duyulur, xeyir-bərəkətlə sonuclanır. Məsələn, "Göy üzündə gəzən bulud" şeirində Fatma xanım yazır:

Göy üzündə gəzən bulud,

Qırp gözünü, ağla bir az,

Ümid bircə sənə qalıb,

Dağ seli ol, çağla bir az.

Ruzi-bərəkət bollaşsın,

Çayan-çəmən yaşıllaşsın,

Quru çaylar aşıb-daşsın,

Bənd-bərəni bağla bir az…

Nikbinlik Fatma xanımın az qala bütün şeirlərinin əsas, özü də üstün xüsusiyyətidir. Bu nikbinliyin ən böyük təsdiqi, opti-mizmin apogeyə çatdığı “Dünya, hələ səndən köçən deyiləm…” şeirdir:

Dünya, hələ səndən köçən deyiləm,

Hələ görülməmiş işim var, nələr.

Qopmayıb qəlbimin dərinliyindən,

Hələ neçə-neçə həzin nəğmələr.

Görürsən, nə qədər şirindir həyat,

Hər günü bayramdı, hər an toy-büsat.

Bizimçün yaranıb qoca kainat,

Dünya, hələ səndən köçən deyiləm.

Ot kökü üstə bitər

Fatma xanımın şəxsiyyətinə, yaradıcılığına münasibət bildirərkən, qeyd etməyi özümə borc bilirəm ki, nəcibliyi, zi¬ya¬lılığı ona nəsildən, qandan keçib. Fatma xanım çox gözəl, məclislərdə yeri başda olan, sifətindən nur, bərəkət yağan ziyalı kişinin – Aslan Əliyevin qızıdır. O Aslan kişinin ki, həmişə eldə-obada nüfuz sahibi olub, hörmətli olub, maarifpərvər bir ki¬şi olub. Həmişə təhsilin qeydinə qalıb. Çalışıb ki, elində-oba¬sında nə qədər gözəl insanlar var, hamısı ali təhsil alsın, savad¬sızlıq ləğv olunsun. Ağsaqqallarımızın təhsilə olan belə qayğılı mü-nasibətinin nəticəsidir ki, Faxralıda ziyalı nəsillər yetiş¬miş¬dir. Belə ziyalı nəsillərdən biri də Faxralıda Koxallı nəslidir. Bu nəslin Mirzə Rza Əlizadədən başlanmış Mirzə Seyfulla Həbi¬bul-laya qədər bir çox tanınmış təmsilçiləri barədə müəllifi oldu¬ğum “Ağır elsən, Borçalıda adın var” kitabında məlumat ver¬mi¬şəm. Məhz həmin nəslin gəlini, Faxralının, eləcə də, ümumiy¬yət-lə, Borçalının ilk ziyalı qadınlarından olan Roza xanım Nu¬ri¬yeva kənddə ali təhsil alan ilk qadın olduğuna görə, bir çoxları onun yolu ilə getmək istəyirdilər. O vaxta qədər kənddə qız xey¬lağının ali məktəbdə oxumasına yaxşı baxmırdılar. Sanki Ro¬¬za Nuriyevanın ali məktəbi qurtarıb gəlməsi bu kənddə qız¬lar arasında ali təhsilə böyük oyatmışdı. Yəni digər qızlar da onun kimi ali məktəbdə təhsil almağa can atırdılar. Məhz bu ərəfədə kəndin bir neçə ziyalısı öz qızlarının ali məktəbdə oxumasına şərait yaratdılar. Aslan Əliyev də məhz belə bir ziyalılardan idi. Maarifpərvər, geniş dünyagörüşlü, qızların da oxumasında böyük prespektiv duyan, savadsızlığın tamamilə ləğv olunmasını təbliğ edən kişilərdən olan Aslan Əliyev uzun müddət Borçalıda müxtəlif vəzifələrdə işləyib, gözəl övladlar böyüdüb, hamısına ali təhsil verib. Aslan Əliyevin layiqli və¬tən¬daş kimi yetişdirdiyi, indi hərəsi bir sahədə mütəxəssis kimi çalışan həmin övladların arasında Fatma xanımın məxsusi yeri var. Borça¬lı¬nın görkəmli ziyalılarından, mənim də müəllimim olmuş Əli Səngərli az sayda tələbələrinin ünvanına gözəl sözlər deyərdi. Sevinirəm ki, mən də o siyahıda vardım. Dəfələrlə Əli müəllimdən Fatma Əliyeva barəsində də yüksək fikirlər eşitmi¬şəm. Əli müəllim həmişə mötəbər məclislərdə Fatma xanımın savadından, səviyyəsindən ağızdolusu danışardı. Çünki Əli Sən¬gərli bu ailəyə yaxşı bələd idi, onun hörmət bəslədiyi Faxralı ziyalılarından biri də Fatma xanımın atası Aslan Əliyev idi. Onun ailəsindən çıxan, onun tər¬bi¬yəsini alan hər bir övladı, Əli müəllim ayrı cür – vətənin ləyaqətli vətəndaşı

kimi qəbul edər, onlarla fəxr edərdi. Onu fərəhləndirənlərin arasında Fatma Əliyeva ayrıca bir yer tuturdu. Əli müəllimin, – Allah rəhmət eləsin, – ən yaxşı yetirmələrindəndir Fatma Əliyeva.

“Mütaliənin acı”

Fatma xanım çox prinsipial, inadkar, savadlı, səviyyəli bir zi¬yalıdır. Heç təsadüfi deyil ki, ali məktəbə qəbul olmaq yo¬lun¬da ilk cəhdində müsa¬bi¬qə¬dən keçə bilməsə də, qarşısına məqsəd qoydu ki, mütləq Bakı Dövlət Uni¬versitetinin filologiya fakül¬tə¬sinə daxil olacaq. Onun bu prinsipiallığı öz bəh¬rəsini verdi, inadkarlığı, zəhmətsevərliyi sayəsində həmin fakültəyə qə¬bul olundu. Və çox yaxşı oxudu, yaxşı müəllimlərdən dərs aldı, Azərbaycan və dünya miqyasında tanınmış görkəmli alimlərimizdən bilik öyrəndi. Hə¬min alimlərdən biri də türk dünyasının çox böyük ziyalısı, iki çağırış Azər¬baycan Milli Məclisinə deputat seçilmiş mərhum professor Şamil Qur¬ba¬nov idi. Həmişə Şamil müəllim Fatma xanımın arıq cüssəsinə işarə edib de¬yərdi:

“Bax, Fatma oxumaqdan, mütaliə etməkdən quruyub”. Yəni mütaliə Fatma xanımın həyat tərzinin mühüm tərkib hissəsi olub.

Qədirşünaslıq nümunəsi

Müdriklərdən biri deyib, o adam böyük ürək sahibidir ki, xal¬qının sevin¬ci¬nə sevinir, kədərinə acıyır. Fatma Aslan da məhz belə böyük ürək sahibi olan ziyalılardandır. Onun şeir-lərini oxuduqca, baxırsan ki, nə qədər hə¬yatdan nakam gedən-lərin valideynlərinə təsəlliverici söz deyir, ürək-dirək verir. Şahidi olursan ki, görkəmli şəxsiyyətlər barədə onların möv-qeyi haq¬da söz deyir, onları tərənnüm edir. Çoxdu Fatma Aslanın belə şeirləri. On¬lar¬dan biri də yuxarıda xatırladığım görkəmli ziyalı, hamımızın dərin hörmət bəslədiyimiz müəllim, şair Əli Səngərlinin xatirəsinə həsr etdiyi şeiridir:

Ulu Səngərimdən ad alan şair,

Əzəmət, ucalıq, od alan şair,

Elində ucalan, qocalan şair,

Heç zaman demərəm getdi Səngərli,

Sənət gülzarında bitdi Səngərli.

Son bəndini təqdim etdiyim bu şeir həm də öyrənənin öy¬rə¬dənə, şagirdin müəllimə olan minnətdarlığının, qədirşünaslığı¬nın ifadəsi kimi qəbul olun¬malıdır. Fatma Aslan öz müəllim¬lə-rinə olan minnətdarlığının əvəzinə həm də onlardan öyrəndik¬lə¬rini öz şagirdlərinə ötürmək yolu ilə ödəməyə çalışır. Onun dərs de¬diyi şagirdlərin sorağı indi nəinki Azərbaycanın və Gürcüs¬ta¬nın, eləcə də MDB üzvü olan digər dövlətlərin, dünyanın başqa ölkələrinin nüfuzlu ali məktəblərindən gəlir. Fatma xanım da onlarla fəxr edir, fikirləşir ki, ömür hədər getməyib, çəkdiyi zəhmət boş yerə sərf olunmayıb. Onların uğurlarının şahidi olduqca Fatma müəllimə vaxtilə müəl¬limlərinin keçirdiyi qurur hisslərini keçirir, sanki onların da ömrünü yaşayır.

“Qızım, sənə deyirəm…”

Fatma Aslanını öz əzizlərinə – atasına, anasına və onların timsalında bütün valideynlərə, qardaşlarına, övladlarına, qohum¬¬¬larına, gənclik dostlarına, tələbə yoldaşlarına həsr etdiyi şeirlər də kitabda xüsusi çəkiyə malikdir. İlk baxışda bu qəbildən olan şeirlər subyektiv görünsə də, Fatma Aslanın istedadı özünü onda göstərir ki, toxunduğu mövzuya ictimai vüsət ver¬məyi bacarır. Tələbəlik dostu Sona Abbasovaya yazdığı şeirdən parçaları nəzərdən keçirək:

Doyunca gül, Sonası,

Gülmək yaraşır sənə.

Necə ki, qızıl lalə

Yaraşırdı çəmənə.

Yadındamı, Sonası,

Əkbər müəllim qəzəblə:

“Gülün, – deyərdi bizə,

Zaçotda, imtahanda

Gülərəm gününüzə”.

Müşahidə etmək çətin deyil ki, bu misralarla Fatma Aslan daha əvvəl söz sərrafları, müqtədir qələm adamları tərəfindən deyilmiş və həyati müşahidələrdən doğan “Nə gözəl yaraşır insana gülmək” və “əsl gülən son güləndir” ehkamlarını növbə-ti dəfə təsdiq edir, xatırladır.

Bu qəbildən olan “Bir az duyarlı ol…” şeirini nəzərdən ke¬çi¬rək:

Bir az duyarlı ol, ay masabəyi,

Məclisin ruhuna bir nəzər yetir.

Bir qəlbi sınıqdı məclisin bəyi,

Özgə sevgilərdən məsəllər gətir.

Ata sağlığına içmə, amandı,

Atasız bala var, yaman ağlayar.

Atasız balanın halı yamandı,

Ürəyə od salar, sinə dağlayar.

Bir az duyarlı ol, ay masabəyi,

Məclisin ruhuna bir nəzər yetir.

Sevdası yarımçıq bir yazıq bəyi

Anaraq, ruhuna salavat gətir.

Sonrakı sətirlərdə müəllif məclisin bəyinin adını çəkir. Am¬ma bu xüsu¬siyyətinə görə həmin şeirə “bir nəfərə ünvanlanmış şeir” qəlibi vermək doğru deyildir. Bu şeir əslində işi-gücü baş-qalarının sağlığına tost demək olan masabəylərinin, çörəyi tərif söyləməkdən çıxan sərpayıların timsalında bütün basmaqəlib söz¬bazlara ünvanlanmışdır. Bu yerdə istər-istəməz adamın ya¬dı¬na böyük yazıçımız Anarın “Evləri köndələn yar” tamaşa¬sın¬dan tamada Surxayzadə düşür. Yalançının hafizəsi olmaz, deyib atalar. Surxayzadənin da tamadalıq etdiyi məclislərin sahib¬lə-rinə münasibətin kökündə səmimiyyət deyil, pul durduğundan, onların adlarını tez-tez unudur, dəyişik salır. Nadir əvəzinə “Nodar”, Rəfiqə əvəzinə “Rasimə” deyir.

Fatma Aslanın öz qızı Rayihə xanıma yazdığı şeir isə bütün qızlara, gəlinlərə tövsiyə – “qulaq sırğası” ilə sonuclanır.

Atana üzağlığı,

Anana qol-qanad ol.

Bir igidin nigarı,

Bir körpəyə həyat ol.

Yenə də bayatı…

Əsrlərin qaranlığından gur işıq seli kimi axaraq mənəviyyatımızı ay¬dın¬ladan, dilimizin, xalqımızın tarixini özündə yaşa¬dan şifahi xalq ədəbiy¬ya¬tı¬mızla öyünməyə haqqımız var. Bu hikmət xəzinəsinin hər bir incisi xalq ruhunun dərinliklərindən boy qaldırır, xalqın bağrından qoparaq onun mə¬nəvi zəngin¬li¬yini, düşüncə tərzini, yurd sevgisini, qəriblik həsrətini, şair təbi-ətini, lakonizmini, gah nikbin, gah da bədbin ovqatını, zaman-zaman sınaq¬lardan çıxmış öyüd-nəsihətlərini, aydın məntiqini bizlərə çatdırır. Şifahi xalq ədəbiyyatımızın gözəl nümunələri olan bayatılarda qorunub saxlanan tari¬xizmlər, arxaizmlər həm dilimizin, həm də xalqımızın uzaq-uzaq keçmişə, ulu bir tarixə malik olduğunu bir daha təsdiq edir. Bayatı janrının gözəlliyi ondadır ki, bu janra müraciət edənlər təkcə dili tədqiq edən, onun müxtəlif zaman kəsimlərində uğradığı leksik-semantik, qrammatik və üslubi dəyişik¬likləri araşdıran filoloq-tədqiqat¬çı¬lar deyil, həm də şairlərdir. Bəli, bayatılar dövrümüzdə də ya¬zılır. Fatma Aslanın da gözəl bayatıları vardır. Bu baya¬tı¬lar adamı doğma yurda – Borçalıya, nənəli-babalı, atalı-analı, laylalı-bayatılı çağlara qayıtmağa sövq edir. Bayatılarda parçalanmış Vətəndən söhbət gedir:

Eləmi, göy çəmənə,

Şeh düşüb göy çəmənə.

Bir qan verən yaradı

Qarabağ, Göyçə mənə.

Eləmi, göy çəməni,

Şeh tutub göy çəməni.

Hayqırır, haray çəkir,

Çağırır Göyçə məni.

Bayatılarda Fatma Aslanın həm də bir qadın kimi üstün tutduğu deyərlər üzə çıxır. Məsələn:

Eləmi, atdı gözəl,

Kamına çatdı gözəl.

Özünü namus üçün

Qayadan atdı gözəl.

Və yaxud:

Əzizim, Vətən daşı,

Yurd daşı, Vətən daşı,

Öləndə qoy arxamca

Atılsın Vətən daşı.

Hələ deyilməmiş neçə sözü var…

Borçalıda Fatma Aslanın “Göy üzündə gəzən bulud” kita¬bı¬nın çox gözəl təqdimatı keçirildi. Bu kitabı Borçalı ədəbi mü¬hitində mühüm hadisə kimi qiymətləndirən hər kəs öz ürək sö¬zünü dedi. Doğrudur, sırf tənqidçi gözü ilə baxanlar bu ki¬tabda hansısa “yerinə düşməyən ifadələr” tapa bilərlər. Bu “qüsurlu yerləri” bütün şair və yazıçıların yaradıcılığında tapmaq olar. Amma, əlbəttə ki, Fatma Aslanın yaradıcılığında tərəzinin sağ gözü, yəni təqdirəlayiq cəhətlər vəzndə də, qiymətdə də ağır gələcək.

Hesab edirəm ki:

“Hələ deyilməmiş neçə sözüm var,

Hələ ürəyimdə odum-közüm var”

– deyən Fatma xanım bundan sonra da sanballı şeirlər yazıb-yaradacaq, kitablarının sayını artıracaq, oxucularını dəfələrlə sevindirəcəkdir. Kitabın ilk oxucularından olmağıma görə mən də sevindim. Ona əzizlərinin əhatəsində uzun ömür, cansağlığı, yaradıcılıq uğurları arzulayıram. Ümid edirik ki, Fatma Aslan öz qələmi ilə bizim inamımızı, gümanımızı gələcəkdə də doğruldacaq, İnşallah!

Mənbə : Səməndər Məmmədov – “Faxralılar”, Bakı – “Elm və təhsil” – 2017, I kitab.

Ələddin Musa oğlu (Dəmirçi)

Ələddin Dəmirçinin şeirlərindən nümunələr

GETMƏZ SİNƏMİZDƏN BU DAĞIN, FƏLƏK

Düzü, əvvəllər onun şeir yaz¬dı¬ğını bilmir¬dim. Amma bilir¬dim ki, özü¬nün sadə və halal zəhməti ilə dola¬nan ləyaqətli eloğ¬lularımdan biri¬dir. Onu da bilirdim ki, bu gün az-az rast gəlinən bir sənətin sahibidir – də¬mirçidir. Bu yaxınlarda isə öy¬rəndim ki, sən demə, böyük fiziki güc, iradə və mətanət tələb edən bir sənətin sahibi olan Ələddin dəmiri döyüb müx¬təlif for¬ma¬lara sal¬dığı, ondan cür¬bəcür əşyalar düzəltdiyi kimi, sözlə işləməyi də bacarı¬r¬mış. Bəlkə də çoxlarına qəribə gələcək ki, dəmirçi kürəsində bişmək hara, həm də duyğulu könül, incəlik, zəriflik tələb edən şairlik hara? He¬¬sab edirəm ki, bu yaxınlarda Bakıda “Elm və təhsil” nəşriy-ya¬tın¬da nəfis tərtibatla işıq üzü görmüş “Sən kövrəlmə, mən köv¬rəlim” adlı şeirlər kitabı bu sualla baş-başa qalanlara tutarlı ca¬vab¬¬dır, yar¬dımçıdır. Elə kita¬bın adı da çox mətləb¬lər¬dən xəbər verir. Sən demə, indiyədək həmyerlilərinin öz işini yaxşı bilən bir dəmirçi kimi tanıdıqları Ələddin həm də kövrək qəlbli bir şair imiş…

Ələddinin mənsub olduğu Alməmmədli nəsli çox böyük dühalar yetirmişdir. Onlardan Borçalının Ələsgəri olan Şair Nəbinin vəsf elədiyi Alməmmədoğlu Möylə, Aşıq Senliyin qəh¬-rəmanı Alməmmədoğlu Hüm¬bət, Axund Alı, Borçalının ayrı-ayrı kəndlərində təsərrüfat rəhbərləri olmuş İsrafil Məm¬mədov, Əli Xəlilov, Aslan Əliyev, türk dünyasının böyük alimi Şamil Qurbanov, elmlər doktoru, professor Namaz Bədəlov, tarixçi-alim, respublikanın Əməkdar jurnalisti Məmməd Məm¬mədov, Qara Hümbətov, İsa Məmmədov, Yasin Xəlilov və bütün Borçalının fəxri olan Arif Əliyevin adlarını çəkə bilərik. Ələddin də o nəslin sinəsində yanar ürək gəzdirən oğullarından biri idi.

…Ələddin Musa oğlu – bu gün hamımızın həm də şair kimi tanı¬dı¬ğımız Ələddin Dəmirçi 1948-ci ildə Borçalının Faxralı kəndində anadan olub. Hələ uşaq ikən o illərin repressiya acı¬sını dadıb. Belə ki, Ələddin təxminən 2 yaşında olarkən onun valideynləri Qazaxıstana sürgün olunub. Yalnız Stalinin ölü¬mündən sonra – 1954-cü ildə doğma yurda – Faxralıya qayıda biliblər. Valideynləri yenidən özlərinə gün-güzəran qurub, öv¬lad¬lar böyüdüblər. Ələddin də böyüdükdən sonra atasının sə¬nətinə yiyələnib, eldə-obada dəmirçi kimi tanınıb.

O, eyni zamanda qəlbinin incə duyğularını sözün ecazkar qüdrə¬tindən istifadə edərək ipə-sapa düzüb. Bir-birindən gözəl şeirlər yazsa da, təvazökarlıqdanmı, yoxsa nədənsə, yazdıq¬la¬rını üzərə çıxartmayıb, onların nəşri barədə düşünməyib.

Yuxarıda adını qeyd etdiyim “Sən kövrəlmə, mən köv¬rə¬lim” adlı ilk və hələlik son kitabı da onun ölümündən sonra işıq üzü görüb. Tanınmış fölklorşünas alim, Əmək¬dar Mədəniyyət işçisi, elimizin ləyaqətli oğlu, Ələddinin qohu¬mu və uşaqlıq dostu Elxan Məmmədlinin redaktorluğu ilə çapa hazırlanan kitabın sponsoru da digər xeyirxah əmioğ¬lumuz İb¬ra¬him Alməm¬mədlidir. Kitaba geniş və səmimi, ürək¬dən gələn bir ön söz yazan Elxan Məmmədli Ələddinin şeir yazmasıyla bağlı həmin yazıda belə deyir:

“Ələddinin ali təhsili olmasa da, zəngin mütaliəsi vardı. Daha çox poeziyanı sevərdi. Çox sonralar bildim ki, “Dəmirçi” təxəllüsü ilə şeirlər yazır. Bunu mənə bir neçə il öncə mərhum əmim şair Əli Səngərli demişdi.

Əläddin Dəmirçi təvazökar insan idi. Bu illər ərzində onun şeir yazdığını özündən eşitməmişdim. Hər dəfə əmim onun şeirlərini təriflısə də, Əläddin məndən gizlədirdi.”

Elxan müəllim yazır ki, onun öz dilindən şeirini ölümün¬dən iki həftə əvvəl – dostu Aydın müəllimin dəfnində iştirak etmək üçün Faxralıya gedəndə eşidib: “Kənddə böyük izdiham var idi, bütün kənd bu hörmətli müəllimi haqq dünyasına yola salmağa gəlmişdi. Dəfn mərasimindən sonra Əläddin Dəmirçi məni adamlardan aralayıb bir kənara çəkdi. Dedi, “əmioğlu”, Əkrəm Əylisliyə bir şeir yazmışam, gəl sənə oxuyum”.

O zaman Elxan müəllim hardan biləydi ki, aradan 20 gün keçməmiş onun öz dəfninə gələcək. Amma bu gün bir onda təsəlli tapır ki, həmin görüşdə Əläddinin oxuduğu həmin şeiri onun öz səsiylə (özündən xəbərsiz) diktofona yazıb və bu gün Əläddinli günlərin şirin xatirələriylə baş-başa qalanda dikto¬fonun düyməsini basıb o həzin səsi dinləyir.

Yuxarıda da qeyd etdiyimiz kimi, Əläddinin uşaqlığı Qa¬zaxıstan çöllərində sürgündə keçib. Onun valideynlərinin sür¬gün olunmasını öz gözləri ilə görən və yaddaşında bu gün də ya¬şadan Elxan müəllim yazdığı ön sözdə bir az da o illərə qa¬yı¬dır. Qayıdır ki: “Bunları hamı bilməlidi. Musa kişinin ailə¬sinin başına gələn bu müsibətlər təkcə onların faciəsi deyildi, bu, həm də xalqımızın faciəsi idi”.

Bəli, hələ körpə ikən həyatın sərt sınaqlarına tuş gəlib Əläd¬din. E.Məmmədli bu haqda belə yazır: “Ömrü yağ-bal içində keçmədi, həyatı boyu çoxlu əzab-əziyyətlər gördü. Zəh¬mətə bağlandı, cavan yaşlarından əməyi sevdi, çalışdı, vuruşdu. Körüyü, zindanı, çəkici özünə çörək ağacı elədi. Od¬dan, qığıl¬cımdan özünə çörək çıxartdı. Gözəl balalar böyütdü. Baba oldu, nəvə sevinci daddı. Və heç kimin gözləmədiyi halda, bir gün belə yorğan-döşəyə düşmədən 31.03.2013-cü il tarixində quş kimi uçub getdi, əzizlərini tərk etdi”.

Bəli, düz bir il əvvəl ana yurdumuz Faxralı daha bir şair oğlunu itirdi. Sağlığında şair kimi tanınmasa da, ölümündən sonra işıq üzü görən kitabı onu poeziyasevərlərə daha yaxından tanıtdı, yaradıcılığı haqqında yüksək fikirlər söyləndi. Filo¬lo¬giya üzrə fəlsəfə doktoru, dosent Ağasən Bədəlzadə onun kitabıyla bağlı “Təhsil problemləri” qəzetində böyük məqalə ilə çıxış edib. Əläddin Dəmirçinin poetik yaradıcılığını yüksək qiymətləndirən A.Bədəlzadə yazır: “Əläddin Dəmirçinin şeir¬lərini oxu¬duq¬dan sonra məndə təbii bir təəssürat yarandı. Bu şairin sevimli peşəsi olan dəmirçiliklə poeziya arasında qəri¬bə assosiasiya olduğuna inandım. Təəssürat ruhən məni elə tər¬pətdi ki, bu şeirlər haqqında ürəkdən gələn sözləri demək ehtiyacı duydum”.

A.Bədəlzadə daha sonra yazır: “Əläddin Dəmirçinin hətta zəif şeir¬lərinin özü də odlu dəmirçi kürəsindən çıxan şeirlərdir. Dəmirçi zindan üstündə xam dəmir parçasını döyüb istədiyi şəklə, formaya sala bildiyi kimi, Əläddin də öz ürəyinin odlu kürəsindən çıxanı bizə təqdim edir”.

Elimizin qeyrətli oğlu, əmi¬sioğlu Arif Əliyevə yazdığı şeiri insan gözyaşları ilə oxuyur:

Kökümü qurutdun, kökün qurusun,

Heç puçur açmasın budağın, fələk.

Bir oğul apardın Gözəl dağından,

Getməz sinəmizdən bu dağın, fələk.

Əläddinin şeirləri haqqında çox danışmaq olar. İnanıram ki, hələ bun¬dan sonra barəsində çox danışılacaq, çox yazılacaq. Nə qədər ki, qədir¬bilən faxralılar var, onun sadiq dostları və doğmaları var, o, ürəklərdə yaşayacaq.

Şeirləri şəxsiyyətini, şəxsiyyəti şeirlərini tamamlayan Əläd¬¬din Dəmirçi ləyaqətli eloğlu, sadiq dost, istedadlı şair ömrü yaşayıb haqqa qovuşdu. Allah rəhmət eləsin! Əläddin ha¬mımızın əzizi idi! Biz hamımız ona əmioğlu deyə müraciət edirdik. O da bizə əmioğlu deyirdi. Həqiqətdə də belə idi. Tə¬bi¬ətin qoynuna tez-tez səfərimiz olardı. Yemək hazırlanıb süfrəyə gələnə qədər onun əl-ayağını görmək olmurdu. Əläddin o qədər ayağına yüngül idi. Əmioğluları bir yerə yığışanda (İbrahim, Tofiq, Eldar, Sərdar, Cavanşir və digərləri) sevin¬ci¬nin həddi-hüdudu olmazdı. Bir gün dedi, əmioğlu, səndən bir xahişim var. Dedim buyur, mənim gözüm üstə. İstəyirəm bir şe¬ir yazasan, orda "Mən insan ömrünü bahar istərəm" kəlamı öz əksini tapsın. Çox çəkmədi mən həmin şeiri yazdım və belə tamamladım:

Həyatın min cürə fəndi-feli var,

Taledən işıqlı səhər istərəm.

Səməndər, dünyanın nuru insandır,

Mən insan ömrünü bahar istərəm.

Heyif, işıqlı səhərin və baharın zövqü-səfasını az sürə bildi. Ö.Xəyyam rubailərinin birində yazır:

Bir ucsuz-bucaqsız dairədə sən,

İki cür insanı xoşbəxt görərsən:

Bir qismi, hər şeyi bilən, o biri

Xəbərsiz yaşayar dünya işindən.

Əläddin hər şeyi bilirdi, hətta ölümü də ona əyan olmuşdu. Cənnəti-məkan ol, Əläddin. Elin-oban var olsun, balaların, qohumların var olsun. Bir də sənin hər kəlmənə işıq tutanlar – Elxanlar, İbrahimlər və Səməndərlər var olsun.

Mənbə : Səməndər Məmmədov – "Faxralılar", Bakı – "Elm və təhsil" – 2017, I kitab.

Məmmədəli Zəngin (Novruzov)

GÖYLƏRİ SEYR ETSİN ŞEİR VƏ SƏNƏT

Məmmədəli Zəngin (Novruzov) – 1940-cı ildə Ulu Borçalının saz söz oylağı Faxralı kəndində anadan olmuşdur.

Məmmədəli Zənginin şeirləri tərəfi¬miz¬dən toplanıb, 1997-ci ildən bəri dəfələrlə haqqında məlumat verilib, şeirləri dərc edi¬lib. Məmmədəli özünə Zəngin ləqəbi seç¬miş¬dir. Zəngin ləqəbi onun yaradıcılığını po¬etik şəkildə əks etdirir və yazdığı bütün şeir¬lərdə özünü doğruldub. Yazdığı və bu gün əlimidə olan şeirlərinin zənginliyi həm də yaza bilməyib, özü ilə sinəsində haqqa apardığı sənət incilərinin rəngarəng və zənginliyindən soraq verir. Qısa vaxt kəsiyində yazdığı əsərlərində poeziyanı, sənəti uca tutub, yüksək qiymətləndirir:

Ucalaq, boy ataq ağaclar kimi,

Qoy şən olsun, abad olsun təbiət.

Gərib qanadını turaclar kimi,

Göyləri seyr etsin şeir və sənət.

Məmmədəli Zəngin gəlimli-gedimli dünyanın ağrı-acısından tutmuş məhəbbətin ucalığına və əbədiliyinə qədər bütün sahələrdən yazıb. Özü də yana-yana yazıb, ürəkdən yazıb:

Əlindən xudaya şikayətim var,

Kimini qaldırdın ucaya, dünya.

Kiminin gözündə gündüzə döndün,

Kiminin gözündə gecəyə, dünya.

Müdriklərimizdən biri, “məhəbbət sevdiyini yüksəkdə görmək arzusu¬dur”, – deyib. Zənginin bütün sevgi şeirlərinin cövhərində də bu fikir görünür. Və bu görüntüləri ilə insanları saflığa çağırır:

Sevgilim, əfsanə deyil məhəbbət,

Onun da özünün bir şöləsi var.

Sanki ondan almış öz işığını,

Gecəyə nur verən ulduzlar, aylar.

Zəngin cəmiyyətin tör-töküntülərini, talançı və gəmirçilərini görəndə də şair qəzəbini saxlaya bilmir. “Dünən xalqı çapan bu gün mərd olub”, “çəmənlərdə bəyquşlara yurd olub”, – deyərək ittiham edir.

Məmmədəli Zəngin heç bir ali təhsil almamasına baxmayaraq sözləri yerli-yerində, çox böyük ustalıqla işlədir. Onun poetik deyimlər¬indən görünür ki, şair Azərbaycan şifahi xalq ədəbiyyatını dərindən öyrən¬miş, aşıq şeir uslubunu mənimsəmiş, çağdaş ədəbiyyata yaxından bələd olmuşdur.

Şeirlərində dahi şairimiz Səməd Vurğunun güclü təsiri də duyul¬maq¬dadır. Lakin Məmmədəli heç də təkrarçılığa yol vermir, orjinal deyimlər və ümumiləşdirmələr onun təcrübəli qələm

sahibi olduğunu bir daha sübut edir. Adama elə gəlir ki, bu şeir, beyt yox, müdrik kəlam, yaxud atalar sözüdür:

Nə qədər gizlinə çəksəm canımı,

Yenə hər atılan yaya tuş gəlir.

Yaxud:

Görüm, qalsın yerdə yanı,

Od alsın, yansın peymanı.

Dostu dostdan ayıranı

Ahu-zara qismət eylə .

Və ya:

Gəlməyir özümə daha gümanım,

Loğman tapılsa da, dərman tapılmaz.

Məmmədəli Zənginin həyatı və taleyi barədə fikirləşəndə yadıma M.Rahimin aşağıdakı şeiri düşür:

Ömür dedikləri çoşqun çay kimi,

Kükləyib-köpürüb hər zaman gedir.

Ona bel bağlama o qədər də sən,

Bəzən açılmamış gül, bağban gedir.

Əfsus, min əfsus, yaradıçılığı coşqun çaya bənzəyən sinəsi söz dolu Məmmədəli Zəngin açılmamış şeir-sənət bağbanı tək həyatdan nakam getdi. Amma təzə-tər şeirləri ilə əbədilik qazandı Məmmədəli Zəngin.

Mənbə : Səməndər Məmmədov – “Faxralılar”, Bakı – “Elm və təhsil” – 2017, I kitab.

Rəşid Faxralının “Oğuz eli Faxralı” kitabından

Məmmədəli ZƏNGİN (1940–1968).

Orta təhsil aldıqdan sonra hərbi xidmətə çağırılıb. Silahlı Qüvvələrin tərkibfnafə zabit kimi xidmət edib. Ömür yolu hərbı xıdmətdə qırılıb. Şair Nəbi ədəbi məktəbindən bəhrilənib. “Coşqun çay kimi” (B. 2000 kitabı nəşr olunub (tərtibçisi Səməndər Məmmədovdur).

Məmmədəli Zənginin yaradıcılığının əsas xüsusiyyətlərindən biri onun şifahi xalq yaradıcılığı üslubunda olmasıdır. M.Zənginin lirik obraz kimi qəhrəmanının – bədii “mən”inin istər Vətən, el-oba, yurd məhəbbəti, istərsə də sevgisi, həsrəti, bunların təzahürü olan daxili həyəcanları özünəməxsusluğu ilə səciyyəvidir. Bu baxımdan “Dünya” qoşması diqqəti çəkir. Məmmədəli dünyanın işləklərini poetik təhlilə cəlb edir, qarşılaşdırır, xatırlayır, təzadlar biçimində xatırladır, “kimini xoşbəxt eləyib kimini əziyyətlərə, məhrumiyyətlərə düçar eləyən” dünyanın suçunu üzünə vurur:

Kimini yetirdin tükənməz vara,

Kimini namuraz qoydun məzara.

Bu qoşmanın məntiqi davamı təsiri bağışlayan “Dad fələyin əlindən” qoşmasında da eyni ovqat, eyni duyğu, eyni duyum vardır. Qoşmada “bəxti gözündə qalanların” “qap-qara qəbirə aparılanların” taleyinə canıyananlıq duyulur və poetik baxımdan ümumiləşdirilir. Bu, Məmmədəlinin poetik etirazı, poetik üsyanıdır.

Faxralının əsrarəngiz təbiəti, könüloxşayan gözəlliyi öz əksini, poetik inikasını Məmmədəli Zənginin yaradıcılığında da tapmışdır. Fikrimizi onun

Dəvə qoruğunda açan gülləri,

Döşümə taxdığım yadıma düşdü. (“Yadıma düşdü”)

Laləli düzündə, yaşıl çölündə,

Yaşılbaş sonalı göllər gözəldi. (“Gözəldı’”)

misraları da təsdiqləyir.

El deyimlərindən də yaradıcılıqla bəhrələnən (“burnumun ucu göynədi”, “nıxdını kəsdi”, “arsızın çörəyini əlinə alma”  və s.) M.Zənginin sevgi şeirləri də poetık çalarları ilə seçılır.

Mənbə: Rəşid Faxralının “Oğuz eli Faxralı” kitabından

let KAZIMOÖLU (Kazımov) (1970–2001)

Texniki Univesiteti bitirib (1989). AVP Mərkəzi aparatında işləyib. Azərbaycan poeziyasının yeni nəslinin ümidverici gənclərindən olub. Gənc şairlər arasında keçirilən şe’r müsabiqəsinin qalibi olub (1997). “Ağ çadır” şe’rlər kitabı nəşr 0114′ nub (B. 1997).

BAYRAQmVƏTƏN

Allahın izni ilə şahidlik edə bilərəm ki, sonuncu nəfəsin ava. Zlyanda uzun donlu bir bayrağın ətəyindən öpüb gedə bilmədin, sən istəyən bayraqların bu dünyada nə rəngini tapmaq olar, nə də onu sancmağa bir qarış torpaq tapılar. Sən öz bayrağını azadlığa sancmaq istəyirdin. Məxmər baldırlarını düzə qoymuş xanımlar kimi abnm yuxarı dartışdırmış bayraqların ətəyindən öpməyi isə Tanrı sənin mübarək ruhuna qıymazdı. Şükürlər olsun ki, qıymadı da. Amma mən Tanrının mərhəmətlilərin ən böyüyü olduğuna şahidlik edərəm ki, o sənə doğulduğun, yaşadığın və son nəfəsini tapşırdığın bu üç qürbət ölkədən də üstün bir ağ çadır vermiş– di. Yadındamı ağ çadır? Uca bir bayrağın başında durmuşdun. Sonra sənin bir oğlun da oldu. O ağ çadırın eşqinə doğmuşdular sənə. Kürəkləri bayraq sancılmalı oğul idi. Yox! Yox! Deyəsən sən'ə oğul doğulmadı… Sənin heç ağ çadırın olmamışdı axı!

Mən azadlığam dedin, sən bayraq! Bir gecə küçənin ortasında qəfıl vurdular səni, içində öldürdün onu da. İçinə alıb apardığın I o bayrağın qüruruna və namusuna and olsun ki, sənin o ağzı süd qoxulu bayrağının Tann dərgahında şərəfli və imanlı bir yeri mütləq olacaq. Çünki bu dünyadan bayrağına tamarzı gedənlərə 0 mərhəmət və can yiyəsi öz ətəklərini bayraq kimi səcdə qılmağaı hələ heç bir mübarək üzlüyə qızırğanmayıb.

308

Sənin cütbaşh qartal caynağından güclə qoparıb qaldırdığın o özəlin bayrağının önündən sürüldüyünü mən Tanrı dərgahında ınütləq dilimə gətirəcəm. Uc–uca calaq vurulmuş ipək parçaların altmda sümüksüz koramal kimi sürünməkdən torpaq olmuş kürək• lərini çırpdırıb, üzünü qürbətə səsləyirdin hələ şərəfinin ve qüru• rumın ağası ola bilənləri… Amma o gözəlim Allah sənə uzunbarmaqh bir dost vermədi ki, sənin torpaq kürəklərini çırpsın. Çünki ayaqlarına yox, sürünməkdən kürəklərində damğa kimi qalmış Ata torpağını bütün qürbət boyu üzqarası kimi gəzdirməyi Tanrı sənin açıq alnına bir cəza yazmışdı. Amma sən o yolu da getmədin, gedə bilmədin, geri döndün Vətənin qırağından. Özü də yammlza qayltmadm, ruhunu Tanrmm nurlu və işıqlı məkanında əbədi dincə qoydun. Sənin Vətən deyib səcdə qıldığın bəlkə elə bu imiş. Yoxsa sən də mənim kimi Tanrı ne'mətlərinin üstündə bir-birinin gözünü tökən bu insan yığnağının daraşdığı torpaq böl– güsünə deyirdin Vətən? Burda torpağa atılan buğda dənələrində məzlumların nəfəsi qaldığından bir damla yaş düşmür zəmilərə. Yox! Sən buna Vətən deməzsən. Çünki bütün ruhların nəfəsini doyum bilən Tanrı ruhunun dolaşdığı əbədi bir VƏTƏNdə yaşa– yırsan…*

Hamlet KAZIM! ÖLU

MƏN AZADLIÖAM, SƏN •BAYRAQ

Gülüm, azadlıqdan məstəm, T ut əlimdən ötüb gedək. Uzundonlu bayraqların Ətəyindən öpüb gedək.

Gözüm qanlı üüiqlərdə, İçimdən sonsuzluq keçir. Göz yaşı qurtuluş deyil, içimdən qansızlıq keçir.

,

*"Ulduz" jurnalı. N98, 2001. Məqalənin müəllifi İlqar İlkindı'r.

Mən azadlığam, sən-Bayraq, Gülum, dərdimiz tən qalsın.

Gəl, ikimiz qucaqlaşaq, Vətən elə Vətən qalsın!..

TƏCNİS

Gözəlliyin ilandilli odunda,

Sən ki mənim ürəyimi əritdı’n.

Üz tutacaq qibləm, yönüm qalmadı, İndən belə yandır iman, ərit din.

Məndən ötrü gəlin də sən, a qız da, İkimizik gəzən dildə, ağızda.

içdən qopan ahı tutmaz ağız da,

Onu qaynar dodağınla ərit, din.

Üzün açıb demə: bahar, yazıq ki, Qaralarla bəxtim yazıq-yazıq ki. Kazımoğlu, təkcə sənə yazıq ki, Ər tapıldın, itəndə də ər itdin.

MƏNİ TAP

Orda mənim qəbrim… bunu bir haqq san, Hamı gəlib-gedir, sən isə yoxsan.

Gəlib mən ölmüşə bir sən də baxsan, Gözümü yummuşam, gəl asanca tap.

Ömürdü •odunda çox üşümüsən, Gündü •göy əsgili günə düşmüsən. Ev-eşiyə necə isinişmisən? •Tökülsün göz yaşın, gözlərini qırp.

Sağ olsam neynirəm sənə söz deyəm, Bəlkə heç olmazdm belə gərəyim.

u • ••• _ •••–…..

Daha torpaq olub mənim kürəyim, Barmaqların uzun…kürəyimi çırp.

Əli SƏNGƏRLİ

FANARAM MƏN

(Hamlet Kazımoğlunun xatirəsinə)

Tüstülənən fanaram mən, Gecə-gündüz yanaram mən. Yaradanı qınaram mən, Vaxtsız ölənlər görəndə.

Heyrət qorlanar canımda, Əllən’m qalar yanımda. Yanar gözümdə qanım da, Vaxtsız ölənlər görəndə.

Ağ saçımın teli sanı, Qarğıyaram Yaradanı. Özüm tək ağlayan ham,

Vaxtsız ölənlər görəndə… 28.04.2001 .

Hamlet Kazımoğlu: * Səbrim ömrümdən uzundur.

* Məni sevgimdən tanıyacaqlar. * Yaşamağın dadını gördüm, yolunu tapmadım. * Içində yer saxla mənə,

Öləndə Vətəndə ölüm.

Şair Hamlet Kazımoğlu

Hamlet Kazımoğlu 1970-ci ildə Faxralıda anadan olmuş və ürək çatışmazlığı nəticəsində 2001-ci ildə rəhmətə getmişdir.

Texniki Univesitetı bitirib (1989). AVP Mərkəzi aparatında işləyib. Azərbaycan poezıyasınm yeni nəslinin ümidverici gənçlərindən olub. Gənc şairlər arasında keçirilən şeir müsabiqəsinin qalibi olub (1997). “Ağ çadır” şeirlər kitabı nəşr olunub (B. 1997).

Hamlet Kazımoğlunun şeirlərindən nümunələrə buradan tanış olmaq olar.

İlqar İlkin : “Ulduz” jurnalı, No8, 2001.

BAYRAQ…VƏTƏN

Allahın izni ilə şahidlik edə bilərəm ki, sonuncu nəfəsin avazıyanda uzun donlu bir bayrağın ətəyindən öpüb gedə bilmədin, sən istəyən bayraqların bu dünyada nə rəngini tapmaq olar, nə də onu sancmağa bir qarış torpaq tapılar. Sən öz bayrağını azadlığa sancmaq istəyirdin. Məxmər baldırlarını düzə qoymuş xanımlar kimi abrını yuxarı dartışdırmış bayraqların ətəyindən öpməyi isə Tanrı sənin mübarək ruhuna qıymazdı. Şükürlər olsun ki, qıymadı da. Amma mən Tanrının mərhəmətlilərin ən böyüyü olduğuna şahidlik edərəm ki, o sənə doğulduğun, yaşadığın və son nəfəsini tapşırdığın bu üç qürbət ölkədən də üstün bir ağ çadır vermişdi. Yadındamı ağ çadır? Uca bir bayrağın başında durmuşdun. Sonra sənin bir oğlun da oldu. O ağ çadırın eşqinə doğmuşdular sənə. Kürəkləri bayraq sancılmalı oğul idi. Yox! Yox! Deyəsən sənə oğul doğulmadı… Sənin heç ağ çadırın olmamışdı axı!

Mən azadlığam dedin, sən bayraq! Bir gecə küçənin ortasında qəfil vurdular səni, içində öldürdün onu da. İçinə alıb apardığın o bayrağın qüruruna və namusuna and olsun ki, sənin o ağzı süd qoxulu bayrağının Tanrı dərgahında şərəfli və imanlı bir yeri mütləq olacaq. Çünki bu dünyadan bayrağına tamarzı gedənlərə o mərhəmət və can yiyəsi öz ətəklərini bayraq kimi səcdə qılmağa hələ heç bir mübarək üzlüyə qızırğanmayıb.

Sənin cütbaşlı qartal caynağından güclə qoparıb qaldırdığın o gözəlin bayrağının önündən sürüldüyünü mən Tanrı dərgahında mütləq dilimə gətirəcəm. Uc-uca calaq vurulmuş ipək parçaların altında sümüksüz koramal kimi sürünməkdən torpaq olmuş kürəklərini çırpdırıb, üzünü qürbətə səsləyirdin hələ şərəfinin və qürurunun ağası ola bilənləri… Amma o gözəlim Allah sənə uzunbarmaqlı bir dost vermədi ki, sənin torpaq kürəklərini çırpsın. Çünki ayaqlarına

yox, sürünməkdən kürəklərində damğa kimi qalmış Ata torpağını bütün qürbət boyu üzqarası kimi gəzdirməyi Tanrı sənin açıq alnına bir cəza yazmışdı. Amma sən o yolu da getmədin, gedə bilmədin, geri döndün Vətənin qırağından. Özü də yanımıza qayıtmadın, ruhunu Tanrının nurlu və işıqlı məkanında əbədi dincə qoydun. Sənin Vətən deyib səcdə qıldığın bəlkə elə bu imiş. Yoxsa sən də mənim kimi Tanrı nemətlərinin üstündə bir-birinin gözünü tökən bu insan yığnağının daraşdığı torpaq bölgüsünə deyirdin Vətən? Burda torpağa atılan buğda dənələrində məzlumların nəfəsi qaldığından bir damla yaş düşmür zəmilərə. Yox! Sən buna Vətən deməzsən. Çünki bütün ruhların nəfəsini doyura bilən Tanrı ruhunun dolaşdığı əbədi bir VƏTƏNdə yaşay1rsan…*

*  “ Ulduz” jurnalı. No8, 2001. Məqalənin müəllifi İlqar İlkindir.

Onun barəsində aşağıdakı saytlardan tanış ola bilərsiniz:

Sayt 1

Sayt 2

Yazar Əkbər Qoşalının Hamlet Kazımoğlu barədə xatirələrindən:

SƏBRİ ÖMRÜNDƏN UZUN (nakam şair Hamlet Kazımoğlu)

“Olum, ya ölüm” dilemması yoxdur, “olum, ya ölüm” hökmü var əslində! Çünki

“Tanrı ölüm hökmü kəsib,

doğulmaq günahımıza” (Salam).

Zatən

“Ömrümüzdə iki dəfə gözümüzə işıq gəldi: anamızdan olmuşuq bir, bir də ki, ruh çıxıb getdi”.

“Olum”, “ölüm” …və bu iki məqam (qapı) arasındakı yol –“Ömür” bir gerçəklik və yaşam məhkumluğudur. O Ömür ki, “duayla göz yaşı arası”dır. Ömür ki, Hamlet onu yazılı bir kitab bilib, üzünü köçürmək istəyirdi. O Hamlet ki, 31 illik ömründən 31 şeirlik “Ağ çadır” və “Ağ çadır” eşqi bəxş etdi onsuz qalanlara. “Ağ çadır” Dədəm Qorquddan Hamletədək bu qədər təsirli mövzu olmamışdı elə bil… Əli qaşının üstə günəşə sarı boylanan şair təkcə “üstünə gün düşən çadır”ı – “Ağ çadır”ı axtarmırdı, o sanki Oğuzun öləziyən mənəvi energetikasını bərpa etmək, ruhumzu dirçəltmək istəyirdi.

***

Mənim dostluq dünyamın ən əziz həqiqətiydi Hamlet Kazımoğlu! Yaşasaydı bu kitab onun özünün iştirakı ilə keçirəcəyimiz 40 illik yubileyi münasibəti ilə hazırlanmış olacaqdı və də “Nakam şairin şeirlər kitabı” adlanmayacaqdı… (Görəsən şair ikinci kitabına nə ad verəcəkdi?)

“Dörd yanım, dörd yanım adamla dolu.

İlahi, nə varmış adam olmağa” (Səhər)

pıçıldayıb, “qara çadırın adamlarına qarışmışıq” yazan Hamlet, yenə öz təbirincə desək, köhnəlib getdiyini düşünür, təzələnmək istəyirdi. Həm də necə? – “Sizə gəlmək istəyirəm” şeirini mənə ilk oxuduğunda olduğu kimi “qayıdıb bir qız bətninə” təzə gəlmək isəmirdi. – O elə bil alın yazısına düzəliş edirmiş kimi, kitabını çapa verərkən

Geriyə dönüb bu ömrü

Təzə gəlmək istəyirəm

diləyini dilə gətirdi. Bəlkə ona görə ki, şairin

“Mənə halallıq ver, sevirəm səni,

daha bu sevgini götürüb gedim.

Adam sevdiyinə borclu qalırmış

Bəs bu borcu nəylə bitirib gedim?”

sualı və o suala özü tərəfindən verilmiş cavabı vardı:

Nə bilim könlümü şum kimi əkdim,

gördüm həsrətimin boyu dik çıxdı.

Düşündüm yolunu sənə çatmağın

ağlımın içindən dəlilik çıxdı.

***

Hamlet “Səbrim ömrümdən uzundu” deyirdi. Deyirdi “Yaşamağın dadını gördüm, yolunu tapmadım”

1997-ci ildən Rusiyada yaşayan Hamletlə sonuncu telefon söhbətimizdə o başa düşülməmək dərdindən danışdı. Dərdi nə qədər ürəyinə salsa da mənə də pay saxlayırdı. Bilirdim onun üçün çətindi Rusiyada yaşamaq, bilirdim, amma bu onun taleyi idi.

Onunla sonuncu dəfə telefon danışığımız gecədən xeyli keçmiş baş tutdu. “İlahi, İlahi, Tanrım” (V.B.Önər) bir də mənə saatın həmin məqamında zəng qismət eləmə. Çünki “aldada bilmirəm özümü daha” (V.İsaqoğlu) və bilirəm, o daha zəng etməyəcək, heç bir zəng edən o olmayacaq.

Hamleti bir də nə vaxt YETİRƏRSƏN, İlahi?! Ona xitabən “Sən gəlmişdin keçmiş adlı nağıldan” (H.Şəmi) deyən də düz deyir. O özü etiraf etmirdimi:

…Bir dəfə yaşamışam, gör yaddaşınmda nələr var,

Çəkir məni o ilk yuvam – qaranlıq daş mağaralar

İstərəm dönüb ən qədim insanlar olaq,

Qədimdə yaşamağın mən bilirəm dadını,

yar…

***

…Borçalı. Faxralı köyü. İbrət bağçası qəbirstanlıq. Hələ “il”i tamam olmamış atasının tək qalmasına qıymayan Hamlet uyuyur orda. “Tanrım, Tanım, İlahi” ona niyə hələ 4-5 il öncədən orda mənim qəbrim bunu bir haqq san dedirtmişdin?!.

Orda danışmaqdan çox düşünməyi xoşlayan, ürəyi sirr yuvası cavan – məni bir dost kimi bəlkə də hamıdan çox istəyən, mənim isə “bəlkə”siz hamıdan çox istədiyim şair Hamlet dəfn olunub. Mən onun gözünü yumulu gördüm, dostlar. Onun “Gəlib mən ölmüşə bir sən də baxsan” sözünü tutmaq yazılıbmış alnıma…

O məni tək qoydu, – “qara çadırın adamları” içində. Özü isə “yenidən ağ çadırda yaşamaq ümidi ilə” getdi.

Hamlet KAZIMOĞLU

Gəzəndə sahili bir qürub çağı

Qanıydı Günəşin üfüq yatağı,

Pıçıldadı birdən, əsdi dodağı

Sevgilim anamtək yalvardı mənə.*

Bu görüş anında həsrət olmadı,

Ayrı söz olmadı, söhbət olmadı,

Mənə yalvarmaqdan heç o doymadı

Sevgilim anamtək yalvardı mənə.

Mənə yalvarmağa gəlmişdi, nədi,

Doğacaq oğlumu bilmişdi, nədi?

Yoxsa daha anam ölmüşdü, nədi, –

Sevgilim anamtək yalvardı mənə.

…Mənmi tələsmişdim tez doğulmağa,

Omu gecikmişdi ana olmağa?

Qayıtdım bir bətnə mən yığılmağa

Sevgilim anamtək yalvardı mənə

* burada: sevgilim məni anamtək oxşadı, boyumu sevdi, nəvaziş göstərdi, dil tökdü anlamında

ÜZÜNDƏ GÖZƏLLİK QAYMAQLAYACAQ

Könlümüzdə dilə gəlməz sevgi var

Susacağıq illər boyu, deyəsən.

Nə vaxtsa dünyada ikimiz qalsaq,

Bir axşam qapımı gəlib döyəsən.

Döyəsən qapımı… açıb görəm ki,

Yüz illər qabaqca gördüyüm sənsən.

Bütün sevdiklərim arada qalsın,

İlk dəfə, son dəfə sevdiyim sənsən.

Ötən illər səni dəyişməyəcək,

Nəyin varsa elə, elə qalacaq.

Uzağı, uzağı, ey gözəl, sənin

Üzündə gözəllik qaymaqlayacaq.

BAKI

***

T.üçün

Uzun ayrılıqdan sonra

Sehr dolu uzaq bir gecənin zülmətindən

Bu zülmətdə boğulurmuş kimi

Səsləsən məni sənin arxanca qaçaram, sənin arxanca uçaram

Qorumaq istərəm səni şərlərdən

Aparmaq istərəm şəhərlərdən

Uzaq kəndlərə…

***

…O yatıb içinə girdiyin yuxu,

ömründə əksidir bir heçin, qadın.

Sənə düşməyəcək gördüyün yuxu,

görə bilmədiyin yuxun çin, qadın.

Üzükdən qapım var, barmağın dəyər,

döyüb bu qapını yormağın dəyər,

Uçmaq sevincinə qonmağın dəyər,

əllərin əlimdə göyərçin, qadın.

Getsən də həsrətin bir sərt dayaqdı,

ölməyib qalaram, şərt – yaşamaqdı.

Sevgim göyə çıxıb, dedilər, haqdı,

söylə qalarsanmı mənimçün, qadın?!.

Oruc Nikbin (Oruc Riza oglu Əlizadə)

Oruc Nikbin (Oruc Riza oglu Əlizadə).

Onun şeirlərindən nümunələrə və yazdığı kitablar barədə bu linklərdən tanış ola bilərsiniz.

İstedalı şair Oruc Nikbin 1939-cu ildə Bolnisi rayonunun Faxralı kəndində anadan olmuşdur. 1962-ci ildə Azərbaycan Dövlət Universitetinin İqtisad fakultəsini bitirmişdir. Həmin ildən vəfat etdiyi günədək (2016-cı il) müxtəlif vəzifələrdə işləmişdir.

Xalq şairi Zəlimxan Yaqubun Oruc Nikbinin "Faxralıdan güc almışam" şeirlər kitabına yazdığı "Ön söz":

Ağsaqqalın sözü

Əziz ağsaqqalımız, gözəl dostumuz, əsl el adamı, ağır taxtalı "köhnə kişi" Oruc Əlizadə ilə mənim dostluğumun 40 illik tarixi var. Bu illər ərzində çox görüşlərimiz, çox söhbətlərimiz, çox səfərlərimiz olub. Məclislərdə bir yerdə çox olmuşuq. Mən Oruc Əlizadəni həmişə təmkinli, ağır oturub batman gələn, sözünün yerini və çəkisini bilən bir gözəl insan kimi tanımışam.

Oruc müəllim saz-söz adamıdır. Şairləri, aşıqları çox sevir. Borçalı mahal1,Faxralı kəndi onun qibləsi, qibləgahıdır Aşıq Şenliyi, şair Nəbini, Şair Ağacanı, Təhlə Novruzu çox sevir. Ümumən aşıqları, xüsusən Borçalı aşıqlarını çox sevir. Oruc müəllimin Coratda bir bağı var idi. O bağ bizim üçün cənnət idi. Təkcə gülünə, çiçəyinə görə yox, həm də gələn qonaqlarına, ziyalılarına görə sevir və aşıqlarına görə o bağda kimlər olmamışdı. Aşıq Əmrah, Aşıq Kamandar, aşıq Hüseyn Saraclı, Əhməd Sadaxlı, Məhəmməd Sadaxlı, Ədalət Nəsiboğlu, Aşıq Əkbər, Azaflı Mikayıl, şairlərdən Hüseyn Arif, Məmməd Aslan, Rəfiq Zəka, Abbas Abdulla, Eyvaz Borçalı, Fərman Eyvazlı, daha kimlər, kimlər….Saz-söz vurğunlan həmişə bu bağda Oruc müəllimin qonağı olar, ən şirin söhbətlər edərdilər. Hamımızın ağsaqqalı, Camal müəllim həmişə məclislərin başında olardı. Ən çox dinlədiyimiz, qulaq asdığımız aşıq Kamandar olardı. O Kamandar ki, nə sazından, nə sözündən, nə də nazından doymaq olmurdu. Bu illər ərzində mən bilmirdim ki, Oruc müəllim şeir yazır. Bir dəfə də olsun bizim yanımızda şeir oxumadı. Sən demə bala-bala yazırmış. O yazmaq, bu yazmaq indi Oruc müəllim ikinci kitabının nəşrinə hazırlaşır.

Şairin şeirləri qədim Borçalı mahalı, onun zəngin aranı, yaylağı, dağı, binəsi ilə, xüsusən yoldaşları, dostları ilə yaşadığı yerlərlə bağlıdır. Onun şeirlərində çox sevdiyi doğma kəndi Faxralının meşələri, bulaqları, dağları, düzləri, təbiəti doğma və isti duyğularla təsvir olunur. Bu şeirlərdə bir təbii deyim tərzi var. Bu deyim tərzi Borçalı, xüsusən Faxralı ləhcəsində gözəl səslənir.

Oruc müəllim necə danışırsa, eləcə də yazır. Təbii və şirin, təbiətin özü kimi rəngarəng, axar-baxarh Oruc müəllimin insanlığı başdan-başa şeiriyyətdi, sazdı, sözdü. Rəhmətlik böyük ustadımız aşıq Kamandarın Oruc müəllimə həsr olunmuş gözəl şeirləri var. Onların içində

Ay ağalar, bu dövranın üzündə,

Ayrıca bir dövranı var Orucun.

beyti ilə başlanan bir şeir var. O şeir Oruc Əlizadənin xarakterini, dünyagörüşünü, insanpərvərliyini, qonaqpərvərliyini çox yaxşı təsvir edir. Doğurdan da Oruc müəllimin ayrıca bir dövranı var ki, ondan nə qədər yazırsan yaz, nə qədər danışırsan danış insan doymur. Oruc müəllim özü mənim üçün başdan-başa şeiriyyət deməkdir. Onun varlığında Borçalının, Faxralının kişiliyi, qədimliyi, böyüklüyü yaşayır. Bu böyüklük el-oba tərbiyəsindən gəlir.

Onun sözlərində təbiət təsvirləri ilə yanaşı onu narahat edən cəmiyyətdəki neqativ, xoşagəlməz hallarla bağlı məsələlərdən də söhbət açılır. Bir vətəndaş və insan kimi o yaşadığı cəmiyyəti də xoşbəxt və fıravan görmək istəyi ilə yaşayır. Bu duyğular onun şeirlərində yeri gəldikcə səslənir, ruha və dilə, ictimai baxışa bir gözəllik gətirir. Təbiətə bağlılığına görə doğulduğu torpağa, daşa, ağaca, dağa, dərəyə, nəhayətsiz çöllərə, düzlərə vurğun olduğuna görə mən Oruc müəllimi onun vurulduğu təbiət qədər sevir, ürəyindən keçənləri dilə, qələmə gətirmək üçün ona uğurlar arzulayıram. Hörmətli ağsaqqala və onun şeirlərinə Zəlimxan Yaqubdan salamlar olsun!

Xalq şairi Zəlimxan Yaqub

Səməndər Eyvaz oğlu Məmmədov

Səməndər Məmmədovun şeirlərindən nümunələrə və kitabları haqqında məlumatlara bu linklərdən tanış ola bilərsiniz.

Səməndər Eyvaz oğlu Məmmədov 1954-cü il fevralın 8-də Borçalıda – Bolnisi rayonunun Faxralı kəndində anadan olub. 1971-ci ildə Faxralı orta məktəbini bitirib, 1973-cü ildə isə Azərbaycan Dövlət Universitetinin (indiki BDU-nun) filologiya fakültəsinə daxil olub.

1978-ci ildə universiteti bitirən Səməndər Eyvaz oğlu təyinatla Lerik rayonunun Vistən kəndində pedaqoji fəaliyyətə başlayıb. Dörd il burada çalışdıqdan sonra 1982-ci ildə Bakıya gələrək Azərbaycan DİN-nin tərbiyə müəssisəsindəki orta məktəbdə pedaqoji fəaliyyətini davam etdirib. Pedaqoji ustalığını, yüksək peşəkarlığını və təşkilatçılıq qabiliyyətini görən rəhbərlik 1987-ci ildə ona böyük etimad göstərərək həmin məktəbin direktoru vəzifəsinə irəli çəkib.

Burada çalışdığı 15 il müddətində özünü bacarıqlı maarif təşkilatçısı və yüksək pedaqoji ustalığa malik bir müəllim kimi tanıdan Səməndər Məmmədov bir sıra mükafatlara layiq görülüb, Azərbaycan Respublikası Ədliyyə Nazirliyinin Fəxri Fərmanı ilə təltif olunub.

2002-ci ilin yanvar ayında isə S.Məmmədova daha böyük etimad göstərilərək paytaxtımızın ən böyük məktəblərindən birinə – Sabunçu rayonundakı 271 saylı orta məktəbə direktor vəzifəsinə təyin olunub və hazırda da bu vəzifədə çalışır.

Pedaqoji fəaliyyətlə yanaşı bədii yaradıcılıqla da məşğul olan Səməndər Məmmədov bu gün həm də istedadlı publisist, folklor araşdırıcısı, şair, tərbiyə mövzusunda bir çox aktual yazıların müəllifi kimi də tanınır. Məhz Səməndər müəllimin böyük zəhməti hesabına Faxralıda yaşayıb-yaratmış neçə-neçə el şairinin yaradıcılığı üzə çıxarılaraq tədqiq olunmuş, toplu və ya ayrıca kitab şəklində nəşr etdirilmişdir. İlk şeiri hələ orta məktəbdə oxuyarkən Gürcüstanda nəşr olunan "Qələbə bayrağı" və " Sovet Gürcüstanı" (indiki "Gürcüstan") qəzetlərində işıq üzü görən S.Məmmədov bu gün on beş kitabın müəllifidir. "Bir duran ayrıldı öz qatarından" (Fikrət Məmmədovla birlikdə), "Faxralı", "Faxralıtək ağır elim var mənim", "Payız çiçəyi", "Coşqun çay kimi", "Ümid qapısı", "Bir gəncin taleyi alt-üst olursa", "Nur çiləyənlər", "Ləkəsiz bir vicdan, böyük bir ürək" (Musa Nəbioğlu ilə birlikdə), "Pedaqoji düşüncələr" (Şahpəri Hüseynqızı ilə birlikdə), doğma kəndi – Borçalının ağır ellərindən olan Faxralı və onun tanınmış şəxsiyyətlərindən bəhs edən üçcildlik "Ağır elsən, Borçalıda adın var", "İşıq ömrü yaşadı" və dördcildlik "El sevəni aləm sevər" kitabları oxucuların böyük rəğbətini qazanmışdır.

Musa Nəbioğlunun 2009-cu ildə işıq üzü görmüş "Alışmaqdı Səməndərin peşəsi" kitabı isə Səməndər Məmmədova həsr olunub.

Səməndər Məmmədov Azərbaycan Yazıçılar Birliyinin və Azərbaycan Aşıqlar Birliyinin üzvü, "Abdulla Şaiq", "Qızıl qələm", "Vətən" fəxri media və "Araz" ali ədəbi mükafatları laureatı, "Qabaqcıl təhsil işçisi"dir. Səmərəli pedaqoji fəaliyyətinə görə bir çox mükafatlarla təltif olunub, "İlin ən yaxşı məktəb direktoru" adına layiq görülüb.

Azərbaycan Yazıçılarının XI, Azərbaycan müəllimlərinin XII qurultayının nümayəndəsi olub. Yazıçılar Birliyinin üzvü kimi 2018-ci ildə Prezident təqaüdü alıb.

Mənbə: Səməndər Məmmədov – "Faxralılar və tarix yaradanlar" kitabı

Səməndər Məmmədov "Cümhuriyyət" medalı ilə təltif edilmişdir

Azərbaycan yazıçılar birliyinin üzvü, "Qızıl qələm" mukafatı laureatı, qabaqcıl təhsil işçisi və Prezident təqaüdçüsü olan Faxralı kəndinin dəyərli oğlu şair-publisist Səməndər Eyvaz oğlu Məmmədov 27.05.2019-cu il tarixində Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev tərəfindən Vətənimizin inkişafı naminə səmərəli fəaliyyətinə görə "Cümhuriyyət" medalı ilə təltif edilmişdir.

Faxralı saytının idarə heyəti də bütün faxralılar kimi hörmətli Səməndər müəllimi bu mükafat ilə bağlı təbrik edir, ona möhkəm cansağlığı, xoşbəxtlik və yaradıcılıq sahəsində daha böyük nailiyyətlər arzulayırıq!

REDAKTORDAN

Səməndər Məmmədov barədə deyilənlər, yazılanalar…

Şair Əlabbas "ÜÇ QALAN ROMAN"

Dunyamalı Kərəm "ƏVƏZOLUNMAZ HƏDİYYƏ"

Binnət ƏLİOĞLU "YURDA ABİDƏ"

Tanınmış ziyalı, dəyərli qələm sahibi, Azərbaycan Yazıçılar Birliyinin üzvü, "Qızıl qələm", "Abdulla Şaiq" və "Araz" ali ədəbi mükafatları laureatı, Bakı şəhərinin Sabunçu rayonundakı 271 saylı orta məktəbin direktoru, "Qabaqcıl təhsil işçisi", 2017-ci ildə Prezident təqaüdünə layiq görülmüş, "Faxralı", "Bir durna ayrıldı öz qatarından", "Payız çiçəyi", "Ümid qapısı", "Coşqun çay kimi", "Faxralıtək ağır elim var mənim", "Bir gəncin taleyi alt-üst olursa", "Nur çiləyənlər", "Ləkəsiz bir vicdan,böyük bir ürək" (M.Nəbioğlu ilə birlikdə), "Pedaqoji düşüncələr", üççildlik "Ağır elsən, Borçalıda adın var", dördcildlik "El sevəni aləm sevər", "İşıq ömrü yaşadı" və s. kitabların müəllifi Səməndər Eyvaz oğlu Məmmədovun uzunillik zəhmətinin bəhrəsi olan "Faxralılar" kitabının birinci cildi Bakıdakı "Elm və təhsil" nəşriyyaında işıq üzü görmüşdür.

696 səhifəlik bu sanballı kitabda yurdumuzun ağır ellərindən sayılan Faxralı kəndinin yetirməsi olan görkəmli dövlət, elm və sənət adamları, eləcə də, müxtəlif peşə sahibləri haqqında oçerklər, şairlərinin yaradıcılığından nümunələr, tanınmış elm və sənət adamlarının, təhsil işçilərinin Səməndər müəllim haqqında söylədiyi fikirlər öz əksini tapıb.

Səməndər Məmmədov yazır ki, "Faxralı kəndi özünün igid övladları, ziyalıları ilə bütün türk dünyasında məşhur olan bir eldir. Son illərdə apardığım tədqiqatlarda da bu kəndin şöhrətinin təsdiqini tapmışam. Bu el-obanın ləyaqətli adamları, nüfuz sahibləri haqqında dövri mətbuatda təxminən yüz yetmiş məqaləm dərc olunub…

Vaxtilə bütün Zaqafqaziyada məşhur olan, Gürcüstanın təhsil nazirinin türk məktəbləri üzrə müavini işləmiş çox görkəmli ziyalı, maarifləndirmə işində, türk məktəblərinin açılmasında müstəsna xidmətləri olan Mirzə Əlizadədən başlayaraq, hal-hazırda ABŞ-ın Texas ştatında çalışan elmlər doktoru Rəhilə Ramazanovaya, Amerikanın Klivlend ştatında yaşayıb-yaradan böyük alimimiz Tahir Qasımova qədər olduqca nüfuzlu isimləri, çox böyük coğrafiyanı, geniş spektri əhatə edən həmin toplular həm də tarixilik baxımından böyük bir zaman kəsiyinin tədqiqi kimi qəbul edilə bilər. Bu tarixə nəzər yetirib öyrənəndə ki, ötən əsrin üçüncü onilliyində M.K.Atatürk müasir Türkiyəni quranda onun ilk energetika naziri olan Hidayət Turan məhz Faxralıdandır, onda bu kəndin, həqiqətən türk dünyasının məşhur obalarından biri olduğunun növbəti dəfə sübutunu tapırsan, üstəgəl, bu kəndin yetirməsi olduğun üçün qürur hissi keçirir, iftixar duyursan. Tarixdəki "Faxralı" izinə düşüb ta bu günümüzə gəlib çıxanda və aşkar edəndə ki, əslən Faxralıdan olan və özünə "Faxralı" soyadını götürən Əfqan Faxralı hazırda Almaniyada yaşayıb-yaradır, almanca şeirlər yazır, öz şeirlərinə mahnılar bəstələyir, Avropanın dünyaca məşhur "Cənnət qrupu" ansamblının rəhbəridir, təkcə ehtişamlı keçmişinlə deyil, bu gününlə də öyünməyə əsas tapırsan".

Quru və boğazdan yuxarı deyilmiş sözlərdən uzaq, şirin və oxunaqlı bir dillə qələmə alınmış bu kitabdakı yazıları oxuduqca, müəllifin yüksək intellektə və geniş erudisiyaya malik olduğunun, hərtərəfli tədqiqat aparmaqla oxucunu bu ellə dərindən tanış etmək marağını gizlətmədiyinin, eyni zamanda, bu elin xidmətində dayanmağından bir zövq aldığının və bununla şərəf duyduğunun şahidi olursan.

Bu kitabı adıbəlli yurda hörmət və ehtiramdan doğan bir abidə kimi də qiymətləndirmək olar.

Bildiririk ki, kitabın redaktoru və nəşrə hazırlayanı Azərbaycanın Əməkdar mədəniyyət işçisi, dəyərli ziyalı Musa Nəbioğludur.

Müəllifin "Faxralı" kitabının o biri cildlərini də səbirsizliklə gözləyir və ona böyük yaradıcılıq uğurları arzulayırıq.

Binnət ƏLİOĞLU

## Pünhan ŞÜKÜR: "FAXRALILAR" – AĞIR ELİN ŞƏRƏF KİTABI

İstedadlı publisist, folklor araşdırıcısı, şair, tərbiyə mövzusunda bir çox aktual yazıların müəllifi, dəyərli dostum Səməndər Məmmədov haqqında əvvəllər də yazmışam. Lakin ildənilə uğurlarının sayının artması, nəhayətsiz, çoxşaxəli yaradıcılığında müşahidə etdiyim yeni çalarlar, bir ümumi dostumuzun sərrast ifadə etdiyi kimi, "peşəsi alışmaq olan Səməndər müəllim"in saçdığı işığın daha uzaqlara yayılması, qaranlıqların daha dərin qatlarına sirayət etməsi qələmimi yenidən özünə cəzb etdi.

Oxucularımın sırasına yeni qoşulanları, həm də onlara müraciət etdiyim tribunaların zaman-zaman dəyişdiyini nəzərə alaraq Səməndər müəl-lim haqqında ən zəruri olan bu məlumatları bölüşməyi vacib sayıram:

Səməndər Eyvaz oğlu Məmmədov 1954-cü ildə Borçalıda – Bolnisi rayonunun Faxralı kəndində anadan olub. 1973-cü ildə Azərbaycan Dövlət Universitetinin (BDU-nun) filologiya fakültəsinə daxil olub.

1978-ci ildə universiteti bitirən S.Məmmədov təyinatla Lerik rayonunun Vistən kəndində pedaqoji fəaliyyətə başlayıb. Dörd il burada çalış-dıqdan sonra 1982-ci ildə Bakıya gələrək Azərbaycan Respublikası Daxili İşlər Nazirliyinin Tərbiyə müəssisəsindəki orta məktəbdə pedaqoji fəaliyyətini davam etdirib. Pedaqoji ustalığını, yüksək peşəkarlığını və təşkilatçılıq qabiliyyətini görən rəhbərlik 1987-ci ildə ona böyük etimad göstərərək həmin məktəbin direktoru vəzifəsinə irəli çəkib.

Orada çalışdığı 15 il müddətində özünün bacarıqlı maarif təşkilatçısı və yüksək pedaqoji ustalığa malik bir müəllim kimi tanıdan S.Məmmədov bir sıra mükafatlara layiq görülüb, Azərbaycan Respublikası Ədliyyə Nazirliyinin Fəxri Fərmanı ilə təltif olunub.

2002-ci ilin yanvar ayında isə S.Məmmədova daha böyük etimad göstərilərək paytaxtımızın ən böyük məktəblərindən birinə – Sabunçu rayonundakı 271 saylı orta məktəbə direktor vəzifəsinə təyin olunub və hazırda da bu vəzifədə çalışır.

Pedaqoji fəaliyyətlə yanaşı, bədii yaradıcılıqla da məşğul olan Səməndər müəllimin böyük zəhməti hesabına Faxralıda yaşayıb-yaratmış neçə-neçə el şairin yaradıcılığı üzə çıxarılaraq tədqiq olunmuş, toplu və ya ayrıca kitab şəklində nəşr edilmişdir. İlk şeiri hələ orta məktəbdə oxuyarkən Gürcüstanda nəşr olunan “Qələbə bayrağı” və “Sovet Gürcüstanı” (indiki “Gürcüstan”) qəzetlərində işıq üzü görən S.Məmmədov bu gün iyirmi kitabın müəllifidir. İndiyədək “Faxralı”, “Bir durna ayrıldı öz qatarından” , “Payız çiçəyi”, “Ümid qapısı”, “Çoşqun çay kimi”, “Faxralı tək ağır elim var mənim”, “Bir gəncin taleyi alt-üst olursa…” , “Nur çiləyənlər”, “Ləkəsiz bir vicdan, böyük bir ürək” (M.Nəbioğlu ilə birlikdə), “Pedaqoji düşüncələr”, üçcildlik “Ağır elsən, Borçalıda adın var”, “El sevəni aləm sevər” kitabının dörd cildi və “İşıq ömrü yaşadı….” kitabları çap olunub.

Azərbaycan Yazıçılarının XI, Azərbaycan Müəllimlərinin XII qurultayının nümayəndəsi olub. Səmərəli pedaqoji fəaliyyətinə görə bir çox mükafatlarla təltif olunub, “Qabaqcıl təhsil işçisi”, “İlin ən yaxşı müəllimi” adına layiq görülüb.

Azərbaycan Yazıçılar Birliyinin üzvü, “Qızıl Qələm”, “Abdulla Şaiq” və “Araz” ali ədəbi mükafatları laureatıdır. 2017-ci ildə şair-publisist kimi Prezident təqaüdünə layiq görülüb.

Bu il S.Məmmədov daha bir uğura imza atıb: Onun “Faxralılar” kitabı (I cild) “Elm və təhsil” nəşriyyatında işıq üzü görüb. Kitabın redaktoru Əməkdar mədəniyyət işçisi Musa Nəbioğludur.

Ötəri baxışda oxucuya elə gələ bilər ki, S.Məmmədovun tədqiqatları doğma yurdu Faxralıdan, sevdiyi eli Borçalıdan o yana keçmir. Amma bu, əlbəttə ki, yanlış yanaşma olar. Əvvəla ona görə ki, Səməndər müəlli-min “Vətənin qıraqda qalan yeri” Borçalının ədəbiyyatı da Böyük Azərbaycan ədəbiyyatının mühüm tərkib hissəsidir. Borçalının ünlü ədibləri, yaradıcı ziyalıları ölkəmizin beynəlxalq miqyasda layiqli təmsilçiləridirlər. İkincisi, S.Məmmədovun öz ellileri olan ziyalılar haqqında ərsəyə gətirdiyi oçerklərində istər Azərbaycan, istərsə də dünya

ədəbiyyatının dahilərinə, mütəfəkkirlərə etdiyi çoxlu sayda istinadlara rast gəlmək mümkündür ki, bu da olduqca dərin mütaliəyə malik müəllifin dünyagörüşünün zənginliyinə, maraq dairəsinin genişliyinə dəlalət edir. Az qala 700 səhifəlik olan "Faxralılar"da yer alan aforizmləri, kəlamları, atalar sözlərini, məşhurların sitatlarını bir yerə yığsaq, bəlkə də kitab içində bir kitab alınar.

S.Məmmədovun tədqiqatları həm də Gürcüstan-Azərbaycan mədəni, ədəbi əlaqələrinə, xalqlar dostluğunun daha da möhkəmləndirilməsi işinə əvəzsiz töhfə kimi dəyərləndirilməlidir. Çünkü Səməndər müəllimin əsərlərində hər iki millətin ziyalı nümayəndələrinin dostluq nümunələrindən çoxsaylı bariz misallar göstərilmişdir. Onu da qeyd etməyə dəyər ki, "Faxralılar" kitabında haqqında bəhs olunan şəxsiyyətlər təkcə bu ağır elin dərin savad sahibi olan adamları deyil, həm də müdrikliyi, iti ağlı, ləyaqəti, qeyrəti, şücaəti, qoçaqlığı, qorxmazlığı, cəsarəti, yurdsevərliyi, vətənpərvərliyi ilə seçilən insanlarıdır.

Səməndər müəllimin qədirşünaslığının nümunəsi olan "Faxralılar" kitabının necə deyərlər, başı-ayağı yoxdur. Kitabın qəhrəmanlarının palitrası zəngindir – onların arasında alimlər, ixtiraçılar, şairlər, yazıçılar, müəllimlər, həkimlər, hüquqşünaslar, hüquq-mühafizə işçiləri, jurnalistlər, mühəndislərlə yanaşı, Vətən müharibəsi qəhrəmanları da var, sadə əmək veteranları da. Muzey işçisi də var, futbolçu da. Onları tərənnüm edən yazıları oxuyarkən, müəllifin az qala bütün peşə və ixtisasların spesifik xüsusiyyətləri barədə məlumatlı olduğu bəlirlənir. Bir çoxlarının iki və daha artıq ixtisası, peşəsi, maraqlı xobbiləri, ən başlıcası isə, şəxsiyyətlərini dəyərli edən üstün insani keyfiyyətləri, ibrətamiz həyat tarixçələri vardır. Səməndər müəllimin həmin dəyərlərin altını cızması kitabın həm də tərbiyəvi əhəmiyyətini önə çıxarır.

Kitaba daxil edilmiş bəzi oçerklər barəsində söz açılan şəxslərin sağlığında yazılıb, müxtəlif qəzetlərdə nəşr olunub. Səməndər müəllimin "sözardı" (P.S) işarəsi altında belə kədərli məqamları qeyd etdiyi vaxt və yaxud, rəhmətlik atası, cənnətməkan qardaşı barədə qələmə aldığı məqalələri topluya əlavə etdiyi zaman necə məyusluq hissi keçirdiyini təsəvvür etmək olar. Axı həmin postskriptumlu yazılar müəllifin öz qəhrəmanlarına üzün ömür, can sağılığı arzusu ilə sonuclanmışdı….

Doğrudur, S.Məmmədovdan başqa da bu mözuya müraciət edənlər olub, var və olacaq. Lakin ədəbiyyatımıza sanballı töhfə verənlərdən biri olaraq Səməndər müəllim bu məsələyə xüsusi həssaslıq, yanğı göstərib. Özünün iqtibas gətirdiyi böyük filosof Martsinin dediyi kimi, bir ideya uğrunda əzab çəkmək ən yüksək məziyyətdir ki, buna da yalnız insan şəxsiyyəti qabildir. Hazırda çalışdığı sahə olan pedaqogikadan, müəllimlik fəaliyyətindən fərqli olaraq Səməndər müəllimi ədəbiyyatdan ayıracaq yaş senzi, təqaüdə çıxma vaxtı yoxdur. Yaşının üstünə yaş gəlməsinə rəğ-mən, qələmi heç də kəsərini itirməyib, yaratmaq eşqi tükənməyib. Ömründən ötən illər onun məziyyətləri sırasına bir də "Ağsaqqal" satusu əlavə edib.

Yeri gəlmişkən, Səməndər müəllimin həyatda rastlaşdığı, bəzilər ilə yaxından ünsiyyət qurduğu, bu gün isə tarixə çevrilərək yaddaşlara hopan ağsaqqallar çox olub. Bu barədə yazır: "Onlar təkcə mənim yox, eldə-obada hər kəsin yaddaşında müdriklikləri, xeyirxahlıqları və alicənablıqları ilə əbədiləşiblər. Mən də onların xatirəsini həmişə uca tutmuş, imkan olduqca onların bəziləri haqda bədii oçerklər yazmışam. Əslində bunu özümə bir mənəvi borc saymışam. Hesab etmişəm ki, xeyirxah əməlləri ilə yolumuza nur çiləyən, hər zaman bizi düzlüyə, sədaqətə, etibarlı olmağa, yurdu sevməyə, haqqı nahaqqa qurban verməməyə çağıran, daha doğrusu, bu keyfiyyətləri tərbiyə edən, bəzən hətta heç bir təhsili olmasa belə, həyat məktəbinin ən böyük müəllimləri olan bu insanlar üzərimizə həm də böyük məsuliyyət qoyub. Bu məsuliyyətin tərkib hissəsinin biri də məhz onları unutmamaq, qədirlərini bilmək, tarixdən

gələn varislik ənənəsini yaşatmaqdır. Və bu gün haqlı bir qürur hissi duyuram ki, nəşr olunmuş kitablarımın demək olar hamısında el ağsaqqalları haqda yazılarım özünə yer tapıb. Hər dəfə bu kitabları əlimə alıb yenidən nəzərdən keçirəndə də hesab etmişəm ki, onların xeyir-duası bu gün də mənimlədir".

Bununla belə mənə elə gəlir ki, Səməndər müəllimin öz üzərinə götürdüyü əbədi, müqəddəs missiyanın gələcəkdə gənc, istedadlı, enerjili davamçılara ehtiyacı olacaq. O, bu məsələ ilə də qayğılanmalı, pedaqoq olaraq, məktəb rəhbəri olaraq kamal attestatı verdiyi məzunları kimi, ədəbi yaradıcılıq, ədəbi tədqiqat sahəsində də ardıcıllarını seçməli, onlara yol göstərməli, xeyir-dua verib həvəsləndirməlidir.

Kitabda həmçinin Səməndər müəllimin özü haqqında tanınmış elm və sənət adamlarının, təhsil işçilərinin söylədikləri dəyərli fikirlər toplanıb. Özünün təvazökarlığına bələd olduğum üçün yəqin bilirəm ki, bu təşəbbüs kitabın ilk oxucusu və nəşrə hazırlayanı Musa Nəbiğludan gəlib. Mən də Musa müəllim kimi inanıram ki, Səməndər müəllimin yaradıcılığında bu da son deyil, "Faxralılar" kitabının ikinci nəşri də belə məzmunlu və əhatəli olacaq. Respublikanın Əməkdar müəllimi, professor Əli Hüseynovun da fikri ilə şərikəm ki, son illərdə nəşr etdirdiyi kitablarıyla Fax-rlanın tarixinə yeni səhifələr yazan Səməndər Eyvaz oğlu Məmmədovun əməyi, vətənpərvərliyi, xalqına sədaqəti heç zaman unudulmayacaq.

Dünyada "Şərəf kitabları" çoxdur. Görürsən, ayrı-ayrı qurumlar, idarə, müəssisə və təşkilatlar, əmək kollektivləri də belə kitablar açır, etik protokol qaydasında nüfuzlu qonaqlarına həmin kitaba ürək sözlərini yazmağı, imza atmağı təklif edirlər. Məktəblər də qızıl medal alan məzunlarının adlarını özlərinin tərtib etdikləri, qrifli nəşr statusu daşımayan "Şərəf kitabı"na yazırlar. Şərəf məsələsinə çox ciddi yanaşıldığı güc nazirliklərində Əsasnamə ilə təsdiq olunsalar belə, bu adlı kitablar həmişə açıq sayılırlar. O da məlumdur ki, heç bir rəsmi kitabxanada konkret müəllifin yazmış olduğu "Şərəf kitabı"na rast gəlməzsən. Amma vətənini sevən, milli kimliyini tanıyan hər bir insanın şüurunda mənsub olduğu elin "Şərəf kitabı" deyilən məfhum var. Həmin yurdun şərəfini ucaldan insanların adları məhz o mücərrəd kitaba daxil edilir. Bu mənada Səməndər Məmmədovun "Faxralılar" kitabını haqlı olaraq Faxralının rəsmi "Şəfər ktabı" hesab etmək olar.

Pünhan ŞÜKÜR

Rəşid Faxralı (Rəşid Məmməd oğlu Hüseynov)

Rəşid Məmməd oğlu Hüseynov – 1954-cü ildə Faxralı kəndində anadan olmuşdur.

1970-ci ildə Faxralı orta məktəbini, 1975-ci ildə Azərbaycan Pedaqoji İnstitutunun riyaziyyat fakultəsini, 1992-ci ildə isə Bakı Dövlət Universitetinin jurnalistika fakultəsini bitirmişdir.

Əmək fəaliyyətinə Faxralı orta məktəbində müəllim ilə başlamış və Bolnisi rayonunda qəzet redaksiyasında müxbir, redaktor müavini vəzifələrində çalışmışdır.

1990-2002-ci illərdə “İnşaatçı” qəzetində müxbir, “Ədalət” qəzetində məsul katib, “Xalq Ordusu” qəzetində məsul katib, “Hərbi bilik” jurnalının redaktoru işləyib. 1992-ci idən hərbi qulluqçu olmuşdur. Rütbəsi “mayor”dur. Müharibə veteranıdır.

“Qoy ədalət zəfər çalsın” müsabiqəsinin qalibi, “Qızıl qələm” və H.B.Zərdabi adına mükafatların laureatıdır. 14 kitabın, 4 sənədli filmin ssenari müəllifidir.

Mənbə : Rəşid Faxralı – “Oğuz eli Faxralı”, Bakı – 20

Fikrət Ayvaz oğlu Məmmədov

## GÖZƏL DAĞI, QOLLARINI BİRCƏ AÇ…

Hər dəfə onun haqqında dü¬şünəndə insan ömrünün tək¬¬cə yaşadığı illərlə ölçül¬mə¬diyini deyənlərin nə qədər haq¬lı ol¬du¬ğu¬nu görürəm. 80-90 il yaşayıb bu dünyadan iz¬siz köçənlərin az¬mı şahidi ol¬muşuq. Amma elə insanlar da var ki, yaşadıqları qısa ömür¬də bir neçə ömrə belə sığ¬ma¬yacaq qədər böyük işlər görə¬rək xatirələrdə əbədiləş¬miş, ölməzlik qazanmışlar. Sevimli xalq şairimiz Zəlimxan Yaqub demiş, “diri ölülərin” dünyası ola bilməz, “bu dünya əbədi dirilərindi”.

Mənim üçün əbədi diri olanlardan biri də Fikrət Məm¬mə¬dovdur. Təkcə ona görə yox ki, o, mənim qardaşımdır. Həm də ona görə ki, o, ruh adamıydı, söz adamıydı. Cəmisi iyirmi illik ömrünü elə yaşadı ki, vaxtsız ölümü ilə doğmalarına bir ömür¬lük nisgil verməklə yanaşı, həm də özündən sonra yadigar qalan sözü ilə, daim minnətdarlıqla xatırlanacaq izi ilə təsəlli də verdi. Bir qardaş kimi təsəllini həm də onda tapıram ki, bu gün Fikrəti xatırlayan təkcə biz qohum-qardaşları deyilik. Bor¬çalıdan olan qələm əhli – nisbətən yaşlı nəslin nümayəndələri bir şair kimi onu yaxşı xatırlayırlar.

Doğma qardaş haqqında keçmiş zamanda danışıb yazı yaz¬maq asan iş deyil. Elə mən də bu yazını uzun tərəddüddən son¬ra qələmə aldım. Daha doğrusu, mənə təkan verən, köməyimə çatan elə onun özü oldu: 1997-ci ildə işıq üzü görmüş “Bir dur¬na ayrıldı öz qatarından” adlı kitabı ilə. İlk dəfə əlimə alırmış kimi kitabdakı şeirlərini və barəsində deyilənləri yenidən bir¬nə-fəsə oxudum. Və gördüm ki, Fikrəti oxuculara təqdim etmək üçün mənim üzərimə heç bir yük düşmür. Elə haqqında vaxtilə deyilmiş fikirlər onu tanıtmaq üçün kifayətdir. Gürcüstanın Əməkdar jurnalisti, bu ölkənin “Şərəf” ordeninə layiq görülmüş Dünyamalı Kərəm yazır:

“Fikrət Məmmədov Bolnisi rayonunun ən böyük, abad və axar-baxarlı kəndlərindən biri olan Faxralıda anadan olmuşdur. Uşaq vaxtlarından laləli-nərgizli “Gözəl dağı”na, kəndin lap yaxınlığındakı meşəyə, dağların zümrüd sinəsindən süzülüb gələn nəğməli bulaqlara vurulmuşdu. Bəlkə də elə ana təbiətə aludəçilik onu şair qəlbli etmiş, saf və təmiz sinəsini ilhamla coşdurmuşdu.

1978-ci ildə kənddəki orta məktəbi müvəffəqiyyətlə bitirən Fikrət sənədlərini Azərbaycan Xalq Təsərrüfatı İnstitutunun mühasibat-uçot fakültəsinə təqdim edir. Müsabiqədən keçib instituta qəbul olunur, tələbə bileti alır. 1981-ci ildə institutun ikinci kursundan ordu sıralarında xidmət

etməyə gedir… Lakin vaxtsız ölüm Fikrətin neçə-neçə arzusunu yarımçıq qoyur, yazacağı ürək nəğmələrinə həmişəlik xitam verir. O, yaşasaydı Vətəninə, xalqına daha çox fayda verərdi, onları özünəməxsus sənətkarlıqla tərənnüm edərdi!.. Yaşayasıydı!..”

Yaşasydı… Həyatdan vaxtsız köçən əzizlərimizdən söz düşəndə ağlımıza ilk gələn bu olur ki, əgər yaşasaydı… Amma yaşamadı Fikrət. Vurğunu olduğu Gözəl dağının gülünü-çiçəyini doyunca sinəsinə taxa bilmədi, “gəzək binələri, lap əldən düşək, yağışda islanaq, gün altda bişək”, – desə də, nə o binələri gəzə bildi, nə də yağışda islanıb gün altda bişmək ona nəsib olmadı. “Dələver, nə səsdi belə sübh çağı”, – dedi, amma nə dözümdə, iradədə bənzədiyi qızılquşlar oylağı olan Qızıl¬qa¬yanı istədiyi kimi gəzib vəsf edə bildi, nə də “dərdlərə dərman” olan “Möylə bulağı”nın suyundan doyunca içdi.

Hələ neçə illər öncə onun vaxtsız ölümündən təsirlənən şair Əli Səngərli “Ağla, Gözəldağı, a Qızılqaya, yad et zaman-zaman bu ağır dərdi”, – deyərək yazırdı:

Yaşasaydı gözəl şair olardı,

Sinəsi söz dolu, saz oldu getdi.

Gənclik illərinin ilkindi çağı

Ömrü çiçək yüklü yaz oldu getdi.

O, bu dünyadan erkən getdi. Faxralılar elin igid oğlunu, şeirsevərlərsə gözəl bir şairi itirdi. O şairi ki, ilhamını doğma yurdundan, el-obasından alırdı:

Gözəl dağı, qollarını bircə aç,

Öz balantək qucağına atılım.

Nə ki, sağam, qoy asılım boynundan,

Öləndə də torpağına qatılım.

Həyatdan vaxtsız köçəcəyi ürəyinəmi dammışdı, yoxsa bu, bir şair duyumuydumu ki, “öləndə də torpağına qatılım”, – deyirdi Fikrət.

Böyük türk şairi Nəcib Fazil Qısakürək yazırdı: “Cəmiyyət öz daxili dünyasında yatır, amma yuxusunu şairlər görür, yozur”. Poeziyanın çətin yollarında ilk addımlarını atan Fikrət də hələ otuz il bundan əvvəl sanki Borçalının bu günkü narahat anlarını görürmüş kimi yazırdı:

Arzum budur, uca, məğrur başından

Dünya varkən qara yellər ötməsin!

İyirmi yaşındaydı Fikrət. Bu yaş segi yaşıdır, sevib-sevilmək yaşıdır. Qoca Faxralının cavan şairinin də sevgiyə, məhəbbətə özünəməxsus baxışı, özünün sevgi dünyası vardı:

İstəmirəm məhəbbətin

Yollarında duman ola.

Ulduzumuz barışmağa,

İstərəm ki, güman ola.

Məhəbbətin yollarını dumansız görmək istəyir, ulduzlarının barışmasına güman diləyir, “Fikrət Eyvaz gedər bada, sevgisini verməz yada”, – deyirdi. Amma sevgisinə qovuşmağa, ulduz¬la¬rı-nın barışmasına güman çox olsa da, aman olmadı. Taleyin vaxtsız əsən acı yelləri ona bu amanı, imkanı vermədi. Vaxtilə Bolnisi rayonunda çıxan və Fikrətin də əməkdaşlıq etdyi “Qə¬lə¬bə bayrağı” qəzetinin şöbə müdri vəzifəsində çalışmış Xəlil Allahverdiyevin onun vaxtsız itgisindən təsirlənərək yazdığı ki¬mi: “… hayıf ki, yaşıdı olduğu baharların ömrünü ömrünə qatmaq, yaşamaq mümkün olmadı. Hayıf ki, doğma yerlərin yeni baharlarına şirin gənclik heyrəti, hey¬ran¬lığı ilə gözüdolusu baxmaq, gül-çiçəyinə doğru can atmaq, çeşmələri üstə diz qatlamaq, bulaqlarıyla öpüşmək ona müyəssər olmadı. Axı, o, bu təbiəti necə də sevir, necə də məhəbbətlə tərənnüm edirdi. Necə də şirin arzular, ümidlər bəsləyirdi Vətəninə, elinə, obasına, vurğunu olduğu qələm qaşlı Borçalı sonasına”.

Azərbaycan Yazıçılar Birliyinin katibi Arif Əmrahoğlu isə bu nakam şair haqqında belə deyir: “Nağıl ömrünün iyirminci ilini yaşayırdı Fikrət. O, layiq olduqlarını göstərə bilmədi. Özündən başqa heç kəsin yaza bilməyəcəyi neçə şeiri, neçə məqaləni köksünə sığmayan qəlbində apardı Fikrət. Onun gördüyü işlər, yazdığı şeir və məqalələr, görmədiyi işlərin, yaz¬ma¬dığı şeir və məqalələrin təmizliyindən, möhtəşəm¬liyindən, səmimiliyindən xəbər verirdi”.

Bu yazıda Faxralının həyatdan vaxtsız getmiş bir şair oğ¬lun¬dan söhbət açmaq istədim. Daha doğrusu, vaxtilə onun ba¬rə¬sində deyilmiş fikirlərə söykəndim, heç bir şərhsiz-filansız bu fikirləri oxuculara da çatdırmaq qərarına gəldim. Və elə sonda da bu yazını Xəlil Allahverdiyevdən sitatla tamamlayıram:

“Bir durna ayrıldı öz qatarından. Sim kimi tarıma çəkildi, gərildi qanadlar. Son vida nəğməsi harayı qopdu, bir ömrün sarayı qopdu. Arzular, istəklər, şirin gümanlar səhər şehi kimi tər çəmənlərə, bir də çox sevdiyi, vurğun olduğu ana torpağa hopdu. Hopdu ki, hər bahar üzü günəşə boy atan güllər-çiçəklər oxuya bilmədiyi nəğmələri ötsün, yaza bilmədiyi şeir¬ləri yazdırsınlar. Onda ayrılıq əbədiliyi də uzaq dolanar, gəzər.

Bir durna ayrıldı

öz qatarından,

Uçub öz səfinə

çata bilmədi.

Uzatdı əlini

Günəşə, Aya,

Əlləri yoruldu,

tuta bilmədi.

Bir durna ayrıldı

öz qatarından,

Ayrıldı, özü də

vədəsiz, vaxtsız”.

Mənbə : Səməndər Məmmədov – “Ağır elsən, Borçalıda adın var…”, Bakı – “Nurlan” – 2009, I kitab.

Yusif YUSİFLİ

FİKRƏT MƏMMƏDOV (1961-1981)

1960-2008-ci illərdə Gürcüstan azərbaycanlılarının yaşadığı bütün bölgələrdə apardığım araşdırmalara, tədqiqatlara əsasən Azərbaycan ədə¬biy¬yatı tarixinin ayrılmaz tərkib his¬səsi olan Borçalıda yaranan ədə¬biy¬yatın tarixinin XVIII əsrdən baş¬lanmasını dəqiqləşdirdim. Bu araşdır¬malar zamanı Səməndər Məmmə¬dovun “Faxralı tək ağır elim var mə¬nim” kitabı mənim yardımçım oldu. Faxralı kəndi XVIII əsr ədəbiy¬ya¬tı¬mıza Allahverdi İbrahimi, Fatma Alı qızını, XIX əsrdə Güllər Pərini, Səhnə Alməmmədlini, İsmayıl Orucoğlu Gülləri, Kərbəlayi İbrahimi, XX əsr ədəbiyyatımıza iyirmi yeddi nəfərdən çox qüdrətli söz sənətkarlarını bəxş etmişdir.

Şair, maarif xadimi və ədəbiyyatşünas Səməndər Məm¬mədov Faxralı ədəbi məkanı, Azərbaycanın və Borçalının yaradıcı ziyalıları haqqında doqquz kitab yazıbdır. O, on dörd bənddən ibarət olan “Faxralı” rədifli şeirində yazır:

Bu torpaqdı sazın, sözün mahalı,

Hər çəməni, hər talası bir xalı.

Dağları var yapıncılı, çalmalı,

Kitab tutmaz min dastanım, Faxralı!

İstedadlı şair Fikrət Məmmədov 1961-ci ildə belə zəngin ədəbi məkanda, təbii gözəlliyə malik olan şairlərin könül rübabını dilə gətirən Faxralı kimi nurlu bir məkanda anadan olmuşdur. Faxralı orta məktəbini 1978-ci ildə əla qiymətlərlə bitirən Fikrət Məmmədov D.Bünyadzadə adına Azərbaycan Xalq Təssərrüfatı İnstitutunun mühasibat-uçot fakül¬tə¬sinə daxil olur. 1981-ci ildə ikinci kursdan hərbi xidmətə çağrılır. İlha¬mının yeni-yeni coşduğu bir dövrdə yazıb-yaratmağın fərəhli anlarını yaşadığı gənclik çağında eşqli-sevdalı ürəyində ən saf, ən zərif, ən pak arzularının qanad açdığı bir zamanda Bor¬ça¬lıdan çox uzaqlarda Vətən qarşısındakı borcunu yerinə yetirdiyi qayğılı günlərdə amansız ölüm Fikrətin böyük arzularını ürə¬yində qoydu. Bu böyük kədər Fikrətin doğmaları üçün, Faxralı ki¬mi bir böyük el üçün nə qədər ağır idisə, Borçalı ziyalıları üçün də bir o qədər ağır idi. Borçalının söz dünyasının üfqlərində şölə saçan bəxt ulduzunun gənc şairlərimizdən Məmmədəli Zənginin 18 yaşında, İsa Sadiqin 30 yaşında, Fikrət Məmmədovun 20 yaşında sönməsi təkcə bir ailənin, bir kəndin

kədəri deyildi, belə kədər, həm də Borçalı ədəbiyyatının, Borçalı qələm sahiblərinin kədəri idi. Görkəmli şair, tanınmış maarif xadimi, Fikrətin ədəbiyyat müəllimi Əli Səngərli "Fikrət Məmmədovun əziz xatirəsinə" şeirində yazır:

Çita… Borziya… Əsgəri xidmət,

Mayda öz qoynuna aldı Fikrəti.

Dərd amansız oldu, zaman qayğısız,

Ölüm caynağına saldı Fikrəti.

Ağrıya-ağrıya gəzdi neçə gün,

Vaxtında halına yanan olmadı.

Torpaq yad, komandir ögey – amansız…

Dərdlinin dərdini qanan olmadı!

… Beləmi göndərdi ana oğlunu?!

Gələndə laçını qutuda gördü.

Ağla, Gözəl dağı, a Qızılqaya,

Yad et zaman-zaman bu ağır dərdi.

Yaşasaydı gözəl şair olardı,

Sinəsi söz dolu, saz oldu getdi.

Gənclik illərinin ilkindi çağı,

Ömrü çiçək yüklü, yaz dolu getdi.

Əlvida, əlvida, balamız Fikrət,

Doğma torpağındır, öz elində yat.

Nə qədər cavanlar nakam gedibdir,

Neyləyək, belədir vəfasız həyat.

Görkəmli Borçalı şairi Əli Səngərlinin şeirlərində qəddar sovet rejiminə, onun qeyri-humanist qanunlarına, qanlı rep¬ressiya olaylarına qarşı ciddi tənqidi iradlar var. Bu qorxmaz, bu cəsarətli şairin qələmi qılınc kimi həmişə kəsərli olmuşdu, çünki bu qələmin arxasında insan¬pərvər Əli Səngərlinin məğrur şəxsiyyəti, əyilməz vüqarı, qeyrəti durur¬du. Uzun müddət onun çoxşaxəli yaradıcılığını tədqiq edəndə, zəngin yaradıcılığının dərin qatlarına nəzər yetirəndə onun polad iradəsinə, cəsarətinə valeh olurdum.

Gənc şair Fikrət Məmmədovun ömrünün ən coşğun, ən qay¬¬nar bahar çağında, arzularının, eşqinin, ilhamının qönçə¬ləndiyi bir vaxtda, uzaq Çitada hərbi xidmət borcunu yerinə yetirdiyi məqamlarda həlak olması Əli Səngərlinin kövrək şair qəlbini həm yandırıb-yaxır, həm də hərbi his¬sədəki koman¬dirlərin qayğısızlığı, diqqətsizliyi onu qəzəbləndirir! Be¬lə ağır dərdə – "gələcəyin gözəl şairinin" ölümünə dözə bilməyən şair göz¬yaşları içində, Fikrətin Faxralıda doğma torpağa tapşırılan rəsmi dövlət dəfn mərasimində, rayon partiya rəhbərliyinin və hərbiçilərin qar¬şı¬sında bu odlu-alovlu şeirini oxuması o dövr üçün çox nadir hadisə idi. Əli Sən¬gərlini həmişə bu qeyrət, bu cəsarət, bu qorxmamazlıq yaşadacaqdır!…

Unudulmaz Fikrət Məmmədovun 1981-ci ildə 20 yaşında dünyasını dəyişməsi xəbəri Borçalı qələm sahiblərini də sarsıtmışdı. Azərbaycan Yazıçılar Birliyinin katibi Arif Əmrahoğlu "Ölüm sevinməsin qoy…!", Əməkdar mədəniyyət işçisi, şair Dünyamalı Kərəm "O, yaşasaydı!…", "Qələbə bayrağı" qəzetinin şöbə müdiri Xəlil Allahverdiyev "Bir dünya ayrıldı öz qatarından…" məqalələrini yazdılar. Fikrətə ithaf edilmiş şeirlər, məqalələr gənc qələm sahibinə, vətənpərvər Azərbaycan oğluna, onun mənsub olduğu ocağa, bir də Fikrətin nakam, pak ruhuna hörmət və ehtiram idi.

Fikrətin "Qələbə bayrağı" qəzetində yazdığı məqalələri, "şeirlər dəftərini" oxuyan Arif Əmrahoğlu yazır:

"Bir gənc tanıyıram….

Elə bir gənc ki, xidməti borcunu, vətəndaşlıq borcunu yeri¬nə yetirərkən həlak oldu. Nağıl ömrünün 20-ci ilini yaşayırdı Fikrət. O, layiq olduqlarını göstərə bilmədi. Özündən başqa heç kəsin yaza bilməyəcəyi neçə şeiri, neçə məqaləni köksünə sığ¬mayan qəlbində apardı. Onun gördüyü işlər, yazdığı şeir və məqalələr, görmədiyi işlərin, yazmadığı şeir və məqalələrin təmizliyindən, möhtəşəmliyindən, səmimiliyindən xəbər verir¬di." ("Bir durna ayrıldı öz qatarından" kitabından səh. 5-9, Bakı, 1997-ci il.)

Fikrət Faxralı toy-nişan şənliklərində saatlarla aşıqlara qulaq asa-asa, sazın alışıb-yanan pərdələrində Kərəmlərin, Əslilərin dərdinə şərik ola-ola saz havalarını, aşıq mahnılarını ana laylası kimi ürəyinin tac damarına hopdururdu. O, orta məktəb illərindən başlayaraq Azərbaycan dastan¬larını, Vaqifin, Səməd Vurğunun şeirlərini ardıcıl oxumağa başladı, Faxralı kimi ağır bir elin şeir-sənət bağça-bağından şirə çəkə-çəkə özü də bu sənət bağının iştirakçısına çevrildi.

Fikrət, Bolnisinin rayon qəzeti – "Qələbə bayrağı" ilə əməkdaşlıq etməyə, öz canı qədər sevdiyi Faxralıdan, onun zəngin təbii gözəlliklə¬rindən, fədakar əmək adamlarından, uzunömürlü nurani şəxslərdən oçerklər, publisist məqalələr yazmağa başlayır: "Faxralının dünəni və bu günü", "Bahar ömürlü qoca", "Mexanizator Camal" və b.

Ulu Borçalının Faxralı kəndi İlahinin yaratdığı ən şəfalı, ən axar-baxarlı, zirvəsi qartallı dağları, keçilməz meşələri, insana sağlamlıq bəxş edən çağlayan bulaqları, insanın ruhunu oxşayan bir məkanda yerləşir. Belə zəngin təbiət gözəllikləri əhatəsində yaşayan Fikrət „Faxralının dünəni və bu günü" oçer¬kində ilk öncə doğma kəndinin göz-könül oxşayan gözəl¬liklərinin bədii təsvirini verir. Sonra müəllif Faxralıya başu¬ca¬lığı gətirən, kəndi hər yerdə, hər yanda tanıtdıran, məşhur¬laşdıran, bütün respublikada adları dillərdə əzbər olan qazilər, şeyxlər, elm-maarif xadimləri, qəhrəman oğulları, XVIII əsrdən başlanan ədəbi mühitimizin nümayəndələri, çoxsaylı alimlərinin tərənnümü müqayisəli şəkildə Fax¬ralının dünəninin və bu gününün bədii xəritəsini yaradır.

Azərbaycanın aqil və müdrik kişiləri demişlər: sağlam ab-havada, dağlar, meşələr, diş göynədən buz bulaqlar, ətir saçan gül-çiçək əhatə¬sində məskunlaşan el-oba tarixə böyük şəxsiy¬yətlər, qəhrəman oğullar, çoxlu sayda uzunömürlü adamlar bəxş edir. Faxralı kəndinin simasında biz bu deyimin real oldu¬ğunu görürük. Mərhum Fikrətin "Bahar ömürlü qoca" oçerki Faxralının uzunömürlü qocası İsmayıl babanın 115 yaşının ta¬mam olması münasibəti ilə yazılmışdır. Yazıçı İsmayıl babanın ömür yolunun ən fərəhli məqamlarını qələmə alandan sonra, qocanın son il¬lərdə ömür-gün yoldaşını itirməsini, İsmayıl babanın həyatının kədərli anlarını bu bayatı ilə yekunlaşdırır:

Əzizim, qara dağlar,

Kəkilini dara, dağlar.

Vəfalı yar itirmişəm,

Bir onu ara, dağlar!

Unudulmaz Fikrət Məmmədov çox az yaşadı. Bu az ömürlə, coşqun ilham sahibi Gürcüstan azərbaycanlılarının ən yeni dövr ədəbiyyat tarixinə yeddi məqalə və səkkiz lirik şeirlə daxil olubdur. Onun qələ¬mindən, fikir-düşüncə dünyasından süzülüb gələn əsərlərin azlığı bir tədqiqatçı kimi məni qətiyyən narahat etmir. Çünki onun əsərlərindəki yüksək sənətkarlıq, peşəkarlıq, bir bədii əsər kimi dəyəri, sözlərin mis¬ra¬lara mirvari kimi düzülməsi, Azərbaycan dilinin zənginliyindən, incəli¬yin¬¬dən məharətlə istifadə etməsi ilk andan oxucunun qəlbinə, ru-huna qo¬nur, yaddaşlara hopur. Nəğmə kimi, mahnı kimi könül sazının pərdə¬lərində, simlərində gənc aşiqlərə, sevənlərə fərəh bəxş edir:

İstəmirəm məhəbbətin,

Yollarında duman ola.

Ulduzumuz barışmağa,

İstərəm ki, guman ola.

Möhnətini çəkə-çəkə,

Tay olmuşam pərgu-tükə.

Həsrətimə bircə tikə,

Mərhəmətin dərman ola.

Suya gəlsən – bulaq ollam,

Seyrə çıxsan – oylaq ollam.

Yolunda göz-qulaq ollam,

Kaş işimiz səhman ola.

Fikrət Eyvaz gedər bada,

Sevgisini verməz yada.

Küpəgirən qarılarda

İnsaf ola, iman ola.

Tədqiqatlar göstərir ki, sevgi və məhəbbət motivli şeirlər Azər¬baycan şairlərinin əksəriyyətinin yaradıcılığının ilk dövrü¬nü təşkil edir. Yəqin ki, şair Fikrət də səkkiz şeirindən ikisini – "Ola" və "Xoş gəldin" rədifli şeirlərini sevdiyi Azərbaycan gözəlinə ithaf etmişdir. "Ola" rədifli şeirində Fikrət arzu edir ki, onun sevgi və məhəbbət yolu işıqlı, nurlu olsun, bu pak, saf, təmiz yolda bunların istək və arzularına mane olan nə duman, nə çiskin, nə də aravuran, sözgəzdirən, küpəgirən qarılar olmasın. Çünki artıq xeyli vaxtdır ki, sevdiyi qızın möhnətini çəkə-çəkə, "pərgü-tükə" – saçları, hörükləri qu quşunun tükləri kimi yumşaq bir gözələ tay-tuş, sirdaş olmuşam, – deyir. Onun bircə tikə, bircə damcı mərhəməti şair üçün dərman olduğunu bu şeirində sevgilisinə bəyan edir.

Şeirin üçüncü bəndində şair cəsarətlə sevdiyi gözəlin nəzə¬rinə çat¬dı¬rır ki, dağlar ətəyində çağlayan bulaqlardan su apar¬mağa gəlsən, sənin xət¬rinə bulaq olaram, əgər eşqli könlünü açmaq üçün oylaq yerlərini gəz¬mək istəsən, sənin üçün turaclı, qırqovullu, kəklikli, marallı, ceyranlı oy¬laq olaram, Faxralının gözəl oylaq yerlərini gəzəndə sənin keşiyində duraram.

Şeirin dördüncü bəndində şair sevgilisinə özünün səda¬qə¬tini, məta¬nə¬tini bildirərək yazır: "Fikrət Eyvaz gedər bada, sevgisini verməz bada!"

"Ola" rədifli şeirində şair sevgilisini bulağa, Faxralının gəzməli, görməli yerlərinə dəvət edirsə, "Xoş gəldin" şeirində isə sevdiyi gözəlin bulaq başında yolunu gözləyir, bulağa yaxınlaşan gözələ "Ay qız, xoş gəldin", – deyə müraciət edir:

Bulaq üstə gələn gözəl,

Ay qız, xoş gəldin, xoş gəldin.

Gəl oduma bələn, gözəl,

Ay qız, xoş gəldin, xoş gəldin.

Ətirim var, əllərində,

Bihuş olum tellərində,

Məhəbbətin sellərində,

Ay qız, xoş gəldin, xoş gəldin.

Yaraşıqdı xal üzünə,

Can qurbandı bal üzünə,

Gəl Fikrəti sal gözünə,

Ay qız, xoş gəldin, xoş gəldin.

Ulu Tanrının Borçalıya, Faxralı tək ağır bir elə bəxş etdiyi təbiət gözəlliyini, bu gözəlliyin bir çox nişanələrini bu elin qüdrətli qələm sahibləri böyük fərəh hissi ilə poeziyaya gətir¬mişlər. Peyzaj lirikasının, təbiət lirikasının ən gözəl nümunə¬lə¬rini şair Nəbi Borçalı, Qara Qərib, İsmayıl Güllər, Hüseynqulu Məmmədov, Əli Səngərli, Məmmədəli Əlləzov, Səməndər Məm-mədov, unudulmaz Fikrət Məmmədov və b. yaratmışlar. Bu şairlərin şeirlərinə qol-qanad verən, ilhamını coşduran başı qar¬tallı Gözəl dağı, Səngər dağı, Qızılqaya, Haçaqaya, Qara¬qaya, Kəmərqaya, Təhməzin bulağı, Molla Qurbanın bulağı, Qoşa¬bu¬laq, Möylə bulağı, Sarıbulaq, Əli Xəlilin bulağı, Fik¬rətin bulağı, Ördəkli, Divsiz gölləri, Ballı dərə və b. gözəlliklər olmuşdur.

Şair Fikrətin sevdalı könlü qartal kimi qanad açıb Gözəl dağının ətəyində dayanır. O, Gözəl dağına hörmət və ehtiram göstərərək, dağın zirvəsində yox, ayağının altında dayanıb, dağdan rica edir ki, qollarını aç, öz övladın kimi məni ağuşuna al, nə qədər ki, sağam boynundan asılıb sənin xidmətində, qulluğunda olmaq, öləndə də sənin doğma torpağına qovuşmaq, qatılmaq istərdim, – deyir.

Gözəl dağı, qollarını bircə aç,

Öz balantək qucağına atılım.

Nə ki, sağam, qoy asılım boynundan,

Öləndə də torpağına qatılım.

Arzum budur, uca, məğrur başından,

Dünya varkən qara yellər ötməsin!

Ətəyin dolu olsun çiçəklə,

Səngərində bircə mərmi bitməsin!

Gözəl dağım, ulu babam oylağı,

Fikrətəm, adına şeir yazıram.

Harda olsam, tərlan könlüm oyaqdı,

Lazım gəlsə, keşiyində hazıram!

Fikrətin yaradıcılığında vətənpərvərliyin, insanpərvərliyin, sülhse¬vər¬liyin, təbiətsevərliyin, İlahinin bəşəriyyətə bəxş etdi¬yi gözəlliyin tərən¬nümü əsas yer tutur. Azərbaycan ədə¬biyya¬tın-da "qara" sözü böyük, möhtəşəm mənasında işləndiyi kimi, "qara" sözü bədxəbər, qara gün, dağıdıcı qasırğa, tufan gətirən qara yel mənasında da işlənir. "Gözəl dağı" şeirinin ikinci bən-din¬də şair arzu edir ki, Gözəl dağı, nə qədər ki, dünya var, bə¬şə¬riyyət

var, sənin həmişə məğrur dayanan uca başından qara yellər əsməsin, əl-ətəyində ətir saçan güllərin həmişə dolu ol¬sun, el-obanı müdafiə edən səngərlərində heç bir vaxt mərmi bitməsin.

Şeirin sonuncu bəndində şair oxucuların da nəzərinə çatdırır ki, gö¬zəllər gözəli bu məğrur dağ ulu babamın ən çox gəzib dolandığı oylaq məskəni olubdur. Ulu babamın ən çox sevdiyi, ayağı dəymiş, nəfəsi hop¬muş bu dağlar, dərələr, meşələr, bulaqlar mənim ata-baba yurdum oldu¬ğuna görə, bu doğma yerlərin həmişə keşiyində ayıq dayanmışam, vətən¬dən uzaq düşsəm belə, tərlan könlüm həmişə o yerlərdə olacaqdır, – deyir şair.

Fikrətin şeirlərinin dili bədii cəhətdən, fəlsəfi-estetik cəhət¬dən əlvan və axıcıdır. Bu şeirlər oxucunun zövqünü, ruhunu oxşayır. Onun müraciət etdiyi mövzular incədir, zərif sözlərlə tərənnüm etdiyi bədii obrazlar didaktik-tərbiyəvi qüdrətə ma¬lik¬dir, həm də bu deyimlərin gözəlliyi orijinallığındadır. Bunun sirrini şairin az sözlə daha çox sahələri tərənnüm etmək iste-da¬dına malik olmasında axtarmaq, araşdırmaq lazımdır. Onun səkkiz şeirinin altısı üç bənddən, ikisi isə dörd bənddən iba¬rətdir. Üç bənddən, səkkiz hecadan ibarət olan "Ovçu" şeirində möcüzələrlə dolu olan doğma təbiəti Fikrət sevə-sevə tərənnüm edir, digər tərəfdən də şairlərin ilhamını pərvaz¬lan¬dıran, yatmış duyğuları oyadan, qədəhlənmiş dilləri açan, tavar sazı ruha gətirən, insanların əkiz qardaşı hesab etdiyimiz təbiət gözəl¬liklərini, bu gözəlliyə pənah gətirən, aşiq olan, bülbülü, kəkliyi, durnaları, turacı, maralı, ceyranı, cüyürü və b. ovçulardan, təbiətin düşmənlərindən müdafiə etməyə səsləyir bəşəriyyəti.

Mahnılarımızın şairi, bəstəkarı və müğənnisi kimi, şeirlə¬rimizdə tərənnüm etdiyimiz şeyda bülbül, meşələrə, tarlalara, dağların ayna sinəsində çağlayan bulaqlara yaraşıq verən, tək¬rarsız gözəllik nişanəsi kimi şeirimizdə tərənnüm edilən bülbül, kəklik, turac, maral, ceyran və cüyürlərin bədii obrazlarını yara¬dan şair Fikrət, canlı təbiətə qənim kəsilən ovçuların mənfi obrazını yaratmışdır "Ovçu" şeirində.

Yenə qondu körpə bülbül,

Qızılgülün sinəsinə.

Zalım ovçu, gözəlliyi

Nişan alma, sinə-sinə!

Ay insafsız, bir az ləngi,

Dabanından sal tüfəngi!

Ovla belə döyüş cəngi,

Yaraşarmı heç o sinə?!

Cüyür gələr yorğun-yorğun,

Quşlar ötər oğrun-oğrun.

Fikrət ala gözə vurğun,

Daş ürəksən sən əksinə.

Axıtdığı günahsız qanların hesabına özünə ruzi toplayan, şərəfli həyat tərzindən – zəhmətdən, əməkdən, qabarlı əlləri ilə yaşamaqdan imtina edən, sinə-sinə, oğrun-oğrun Allahın yarat¬dığı təbiət gözəllərinin al qanını axıdan, qan içməkdən doy¬mayan mənfi ovçu obrazından sonra, şair "Meşəbəyi" şeirində təbiətin dostu, meşələrin, ətir saçan gül-çiçəyin, durnagözlü bulaqların, quşların, maral və cüyürlərin qoruyucusu, onların keşiyində mərdanə dayanan, qansız ovçuların, meşələrə qənim kəsilən¬lərin barışmaz düşməni, sülh, əmin-amanlıq, kef-damaq eşqilə yaşayan müsbət Meşəbəyi obrazını yaradır. Bu şəxs meşəbəyi İlyas Məm-mədovdur.

"Meşəbəyi" şeirinin birinci bəndində şair meşəbəyini sözünün ağası, əhd-peymanına sədaqətli, mərdanə bir şəxs kimi oxuculara təqdim edir. Borçalı cavanlarına Əzgilli talasında kef məclisi qurmağa söz verən meşəbəyi vədini yerinə yetirir, quzu kəsir, palıd közündə kabab çəkir, telli saz sinəsində gənclərə Koroğlu havalarını oxuyur.

Söz vermişdi, sözü üstə,

Möhkəm durdu meşəbəyi.

Əzgillidə cavanlara,

Məclis qurdu Meşəbəyi.

Quzu əti, soyuq bulaq,

Bu dağ-aran, bu quzqulaq.

İstəyənlər gəlsin qonaq,

Dedi, umdu meşəbəyi.

Gözü sərraf, bığı şeşə,

Yağlı əti çəkdi şişə.

Közdə kabab bişə-bişə,

Yüz-yüz vurdu meşəbəyi.

Təbiətdən ilham aldı,

"Koroğlu"nu sazda çaldı.

Əli sığal, sözü baldı,

Çölə nurdu meşəbəyi.

Ulu Borçalının bütün məclislərində – nişan, toy, milli bayram¬la¬rı¬mız, dostların, kirvənin şərəfinə təşkil olunan məclislər aşıqsız keçməzdi. Aşıqlara Borçalıda həmişə böyük hörmət və ehtiram olmuşdur. Borçalının möhtəşəm aşıq məclisləri keçirilən kəndlərindən biri də ağır məclisli Faxralı kəndi olmuşdur. Faxralı məclislərində çalıb-oxuyan yerli aşıqlıardan aşıq Oruc,

aşıq Həsən, aşıq Bayram, aşıq Müsəllim, aşıq Nəsiblə yanaşı, Çıldırlı aşıq Şenlik, Şəmkirli Pərvanə Həsən, aşıq Hüseyn Saraçlı, aşıq Xındı Məmməd, aşıq Əmrah, aşıq Kamandar və b. Faxralıda ağır məclislər aparmışlar.

Faxralı kəndində deyişmə o qədər dəbdə olmuşdur ki, Fax¬ralı aşıq¬ları və şairlərinin əksəriyyəti aylarla davam edən çox maraqlı deyişmələri ilə saz və sözsevərlər kəndində elə bil ki, deyişmə məktəbi yaratmışlar. “Mehdi bəy” dastanının və aşıq¬ların dastanlaşdırdıqları on beş rəvayətin yaradıcısı, Azər¬baycan aşıq şeirinin bütün janr və növlərində gözəl lirik şeirlər yaratmış şair Nəbi Borçalının müxtəlif bölgələrin aşıq və şairləri ilə deyişmələri təqdim etməklə kifayətlənirik:

Şair Nəbi Borçalının Çıldırlı aşıq Şenliklə, Cənubi Azər¬baycan aşığı Heyli ilə, Göyçəli aşıq Dost Pirməmmədlə, Ağstafa bazarında nar satan şair Abdulla ilə, Başkeçidli şair Balakişi ilə, şair Təhləli Novruzla, şair Kərbəlayi İbrahimlə deyişməsi, eləcə də bütün Borçalı aşıq və şairlərinin deyiş¬mə¬ləri aşıqlarımız tərəfindən dastanlaşdırılıb, məclislərdə oxunur. Çağdaş dövrümüzdə dastanlarımızın bir qolu da bu yolla yaranmaqdadır.

Faxralının belə aşıq və şairlərinin deyişmələrində, dastan gecə¬lə¬rin¬də, toy nişan məclislərində uşaq yaşlarından ardıcıl iştirak edən, bu poetik ənənənin təsiri altında ilhamı, eşqi coşan gənclərdən biri də unu¬dulmaz Fikrət Məmmədov idi. Borçalı aşıqlarının, şairlərinin, Borçalının yaradıcı gənclərinin yaradı¬cılığına təsiri olduğu kimi, Fikrətin şeirlərinə də təsirini araşdırdıq. Bunun parlaq nümunəsini aşıq Kamandara ithaf etdiyi “Kamandar”, “Dillənir” rədifli şeirlərində də gördük.

Ay ustad Kamandar, sazın dinəndə,

Yurdumun hər qarış çölü dillənir.

Nərə çəkib hay salanda dağlara,

Möhtəşəm xalqımın dili dillənir.

Aşıq Qərib yaddan çıxmır bir anda,

Şahsənəmi ana-ana çalanda,

“Kərəmi”ni yana-yana çalanda,

Vətənin yamacı, yalı dillənir.

Ucalır sinəndən Abbasın səsi,

Sadığın, Şenliyin şirin nəfəsi,

Bil, Fikrətdi hər kəlmənin xəstəsi,

Əlində qəlbimin teli dillənir.

Azərbaycan dastanlarına, klassik aşıqlarımızın poeziya¬sı¬na, saz havalarına min bir könüldən bağlı olan Fikrət Kaman¬dara ithaf etdiyi hər iki şeirində Kamandarın məlahətli səsinə, böyük

ustalıqla çaldığı saz havalarına, məclis aparmaq iste¬da¬dı¬na vur¬ğun¬luğunu bildirir. Aşıq Ka¬man-darın vaxtı ilə Azər¬bay¬can tele¬viziyasında "Aşıq Qərib" dastanının nəsr hissəsini danışmasına, qoşmaları çalıb-oxumasına bütün dünya Azər¬¬bay¬canlılarının heyran qalmasını bir daha oxuculara xatırladır Fikrət.

Şair, Kamandarın möcüzə yaratmasının əsas səbəbi kimi, haqlı olaraq Tufarqanlı aşıq Abbasın, Türkiyənin Çıldır maha¬lından olan Çıl¬dırlı aşıq Şenliyin səsindən, saz çalmasından, məclis aparmaq üslu¬bun¬dan öyrəndiyini, eləcə də Borçalı aşıq¬larından aşıq Əmrahın, aşıq Sadığın şagirdi olmasını ön plana çəkir. Şair bu meyarları ona görə şeirində tə¬rənnüm edir ki, Bor¬çalı aşıqları Türk-Azərbaycan ustad aşıqlarının klas¬sik ənənəsindən, təkrarsız sənətindən öyrənmiş, kamilləşmiş və klassiklərimizin bu möhtəşəm sənətini gənclərə öyrətmişlər. Bu müqəd¬dəs ənənə aşıqlıq sənətini öz kökündən, öz soyundan ayrılmağa, uzaq¬laşmağa, yad meyillərə üz çevirməyə imkan ver¬məmişdir. İstedadlı şair üç bənd şeirlə necə də zəruri, həyat əhəmiyyətli mətləbləri gələcək nə¬sil¬lərə, gənc aşıqlara bir daha xatırlatmağı zəruri saymışdır. Aşıq Kamandar sənətinin kamil¬liyinin, təkrarsızlığının sehri, sirri nə ilə bağlı idi?!

Əvvəla, Kamandarın səsindəki şirinlik, məlahət, sazın bütün pər¬dələrində səsinin dağ şəlaləsi kimi aşıb-daşması Allah vergisi idi. İkin¬cisi, aşıqlıq sənətinin klassiklərindən aşıq Qurbaninin, Tufarqanlı Ab¬basın, Xəstə Qasımın, aşıq Alının, aşıq Ələsgərin və b. möhtəşəm sənətini kamil öyrənməsi idi. Üçüncüsü, Borçalı aşıq mühitinin kori¬fey¬ləri – aşıq Sadıq, aşıq Əmrah, aşıq Xındı Məmməd, aşıq Hüseyn Saraçlı, aşıq Musa Qaraçöplü, aşıq Əlixan Qarayazılının yaratdıqları Borçalı aşıq mühitindən yetərincə bəhrələnməsi, bu gənc istedadın yaşadığı ulu torpağın yetirdiyi bu ustadlarla birlikdə ağır məclislər aparması, ustad-şagird ənənəsinə hörmət və ehtiram göstərməsi Kamandarı aşıq sənətinin zirvəsinə ucaltmışdır.

Oxucuların da nəzərinə çatdırmaq istərdim ki, aşıq Kamandar haqqında Fikrətin yazdığı "Dillənir" rədifli üç bənd¬dən ibarət olan bu kiçik şeirə nə üçün belə geniş şərh verdim. Məni bu şeirə möhkəm tellərlə bağlayan nə idi?! 20 yaşlı gənc şairin Türkiyə, Azərbaycan və Borçalı aşıq mühitlərini mü¬kəm¬məl bilməsi, üç bənd şeirdə bu mühitlərin Kamandar sənətinə təsirini düzgün qiymətləndirməsi idi.

Bu gənc istedad sahibi kiçik həcmli "Dillənir" şeirinin ikinci bəndində Kamandarın Azərbaycan dastanlarını kamil bilməsini, "Aşıq Qərib" dastanını Azərbaycan televiziyasında görkəmli, ustad aşıqlarımıza məxsus dadlı-duzlu dastan, nağıl dili ilə məharətlə danışması, dastanın nəzm hissələrini ən çox sevilən Azərbaycan aşıq havaları üstündə tək¬rar¬sız oxuması, bu dastanın ifası ilə bütün sənətsevərlərin, folklorşünasların, ədə¬biy¬yat¬şünasların, bəstəkarların, əlli milyonluq Azərbaycan xal¬qının hörmət və ehtiramını qazanması, 16-17 yaşlı bu gəncin eşqli qəlbinə hopduğuna görə, sonralar Kamandara, Türk-Azər¬baycan aşıqlıq sənətinə olan rəğbətini bildirməsinin tərən¬nü¬münü iki misrada şah beyt kimi təqdim etməsi oxucuların ruhu¬na, sevdalı ürəyinə qonmasına, yaddaş¬larda müdrik kəlam kimi uzun müddət yaşamaq hüququ qazanmasına səbəb olmuşdur:

Ucalır sinəmdən Abbasın səsi,

Sadığın, Şenliyin şirin nəfəsi.

Bu iki misranın qüdrəti, məna dərinliyi, tərənnüm və təsvir dairəsinin geniş areal təşkil etməsi, Türkiyə, Azərbaycan və Borçalı aşıq mühitlərinin klassiklərini – aşıq Tufarqanlı Abbası, aşıq Şenliyi və aşıq Sadıq Sultanovu düzgün, dəqiq seçməsi üç qardaş dövlətin sənətinin də bir

kökdə, bir pərdədə, bir milli mənəvi dəyərlər üstündə köklənməsini oxucuların da nəzərinə çatdırır Fikrət Məmmədov.

Ömrünün bahar çağında, ilhamının coşqun anlarında, arzu¬larının tuğyan etdiyi, aşıb-daşdığı may ayında şair Fikrətin dün¬yasını dəyişməsi doğmalarını yandırıb-yaxdığı kimi, Bor¬çalı qələm sahiblərini də kədər¬ləndirdi. Borçalının yaradıcı ziyalıları Fikrətin şəxsiyyətinə, qələ¬minə, ilhamına öz şeirləri, məqalələri ilə ehtiramlarını bildirdilər.

Fikrətin böyük qardaşı Səməndər müəllim “Gözəl dağı, qollarını bircə aç…” məqaləsində yazır: “Mənim üçün əbədi diri olanlardan biri də Fikrət Məmmədovdur. Təkcə ona görə yox ki, o, mənim qardaşımdır. Həm də ona görə ki, o, ruh adamıydı. Cəmisi iyirmi illik ömrünü elə yaşadı ki, vaxtsız ölümü ilə doğmalarına bir ömürlük nisgil verməklə ya¬naşı, həm də özündən sonra yadigar qalan sözü ilə, daim minnət¬darlıqla xatırlanacaq izi ilə də təsəlli verdi. Bir qardaş kimi təsəllini həm də onda tapıram ki, bu gün Fikrəti xatırlayan təkcə biz qohum-qardaşları deyilik. Borçalıdan olan qələm əhli – nisbətən yaşlı nəslin nümayəndələri bir şair kimi onu yaxşı xatırlayırlar.” (“El sevəni aləm sevər” kitabı. Səh.198.)

“Salamat qal” şair Fikrətin son şeiridir. Uzaq Çitaya hərbi xidmətə gedən Fikrət əvvəlcə doğmalarıyla, dostlarıyla, sevgilisi ilə, eşqini, ilhamını coşduran dağlarla, bulaqlarla, meşələrin ətəyində bitən güllərlə, çiçəklərlə vidalaşmaq üçün Bakıdan Faxralıya gəlir. Şair əvvəlcə vurğunu olduğu Gözəl dağına müraciət edir:

Vurğunu olduğum, a Gözəl dağı,

Gülünü sinəmə tax, salamat qal.

Bağçadı bu yerlər, bağdı bu yerlər,

Bağça salamat qal, bağ salamat qal.

Gəzək binələri, lap əldən düşək,

Yağışda islanaq, gün altda bişək,

Dağların alovu, odu, a şimşək,

Gurulda, nərildə, çax, salamat qal.

Qızılqaya qızılquşlar oylağı,

Dərmandı dərdlərə Möylə bulağı.

Dələver, nə səsdi belə sübh çağı,

Çağla, salamat qal, ax, salamat qal.

Fikrətin səkkiz şeirinin dördü – “Meşəbəyi”, “Ovçu”, “Ola”, “Xoş gəldin” rədifli şeirləri aşıq şeirinin gəraylı növün¬də¬dir. Şair bu şeirlərin misra və misradaxili (4+4=8) heca¬la¬rı¬nın bölgüsünü dəqiq aparması, şeirə gözəllik verən, ahənk ve¬rən, musiqi kimi çağlamasına şərait yaradan gözəl qafiyələr seç¬məsi oxucuların da, aşıqların da sevincinə səbəb olmuşdur. Məs:

Gözü sərraf, bığı şeşə, (4+4=8)

Yağlı əti çəkdi şişə, (4+4=8)

Közdə kabab bişə-bişə, (4+4=8)

Yüz-yüz vurdu meşəbəyi. (4+4=8)

Ədəbiyyatımızda çox geniş yayılmış, aşıqların mahnı¬la¬rın¬da, sazının şah pərdələrində şahanə yer tutan qoşma növündə də şair dörd şeir yazmışdır. Bu qoşmaların üçü on bir hecalı, 6-5 bölgüsündə, "Gözəl dağı" qoşması isə 4+4+3=11 bölgüsündə yazılmışdır.

Sazın hal əhlinə dindi, imandı, (6+5=11)

Xalların, güllərin canlara candı, (6+5=11)

Bizi özümüzdən alma, amandı, (6+5=11)

Laylalı sonadı sazın, Kamandar. (6+5=11)

Amansız ölüm Fikrətə yaşamaq üçün ömür versəydi, indi onun çoxsaylı kitabları işıq üzü görmüşdü. Cəmi iyirmi il yaşamış şair Fikrət Məmmədov Gürcüstan Azərbaycanlılarının ədəbiyyat tarixinin ən yeni dövrünə 7 sanballı məqalə, ruh¬larda, könüllərdə, yaddaşlarda ədəbi məskunlaşan, uzunömürlü səkkiz şeirlə daxil olmuşdur. Faxralı kəndini abadlaşdıran – məktəb binası, mədəniyyət evi, məscid tikdirən, kəndə uzaq məsafədən bulaq çəkdirən xeyirxah şəxslərin, uzunömürlü, aqil kişilərin, nağıllaşan müdrik qocaların ümumiləşmiş parlaq ob¬ra¬zını 115 il ömür sürmüş İsmayıl babanın şəxsində yarat¬mışdır. Onun bu məqalədə Faxralının din və maarif xadimləri, çoxsaylı şairləri, alimləri, tarixi şəxsiyyətləri haqqında apardığı ilk araşdırmaları bu günkü və gələcək nəsillər üçün çox gərəkli və dəyərlidir.

Fikrətin şeirləri Azərbaycan aşıq şeirinin qoşma və gəraylı növündə yazılmışdır. Bu səkkiz şeirin, yeddi məqalənin əsas ideya-məfkurə istiqa¬məti, fəlsəfi-didaktik dəyəri bütün dövrlər üçün aktual və yeni olma¬sındadır. Çünki vətənpərvərlik, insan¬pərvərlik, yurdsevərlik kimi milli-mənəvi dəyərlərə bağlılıq, Borçalının, Faxralının təbiət gözəlliklərinə və gözəllərinə vur-ğun¬luq onun yaradıcılığının əsas ruhunu, canını təşkil edir. Onun şeirlərinin gözəlliyi, cazibə və nüfuzetmə təsiri Azər¬baycan dilinin, Azərbaycan şeirinin incəliyindən, zərifliyindən, əlvan-lığından, estetik-bədii dəyərindən səmərəli istifadə etmə¬sin¬dədir. Bu şeirlər Azərbaycan sazının pərdələrinə, gümüşü tüllərinə tez qonan, aşığın səsinə, ruhlara hakim kəsilən hava¬la¬rına çox uyğun gələn şeirlərdir. Bir də gənc şairin atalar sözlərindən, bədii ifadə və təsvir vasitələrindən, çox oynaq, çox zəngin çalarlara, musiqi ritmlərinə, ladlarına uyğun gələn doğma heca vəznimizin ruhuna, coşqun təbinə, sevdalı, eşqli könlünə hopdurduğuna görə, onun şeirləri necə də saf, necə də səmimidir.

Nə qədər ki Azərbaycan xalqı yaşayır, Azərbaycan şairləri, aşıqları yaşayır, sədəfli saz yaşayır, nə qədər ki, "Ədəbiyyat tarixi" kitabları və gənc şair haqqında yazılan məqalələr, şeirlər yaşayır, elə o qədər də Vətəni uğrunda canını fəda edən xalqımızın vətənpərvər oğlu şair Fikrət Məmmədov da yaşayacaqdır!…

Mənbə : Səməndər Məmmədov – "Faxralılar", Bakı – "Elm və təhsil" – 2017, I kitab.

Dünyamalı Gülməmməd oğlu Əsgərov

Dünyamalı Gülməmməd oğlu Əsgərov – 1924-cü ildə Faxralıda anadan olub.

Təcnislər, bağlamalar və nəsihətami şeirlər müəllifidir.

1986-cı ildə vəfat edib.

İstəməzmi

Ay həzərat, qınamayın siz məni,
Sevgidən ayrılan yar istəməzmi?
Aylar xəstəsiyəm, illər düşgünü,
Düşəndə yadına nar istəməzrni?
Qaysaqlamır bədənimin yarası,
Təbibdəmi, loğmandamı çatası.
Alovlansa sinəmin bir parası,
Söylə, ürək yansa qar istəməzmi?
Dünyamalı köç eyləyər aradan,
Əcəl gəlsə illac yoxdu paradan.
Bir kəsin ki, əli çıxa mayadan,
Yerini çəkəndə var istəməzmi?..

Mənbə: Rəşid Faxralının "Oğuz eli Faxralı" kitabından

Məmmədəli Əlləzov

Məmmədəli ƏLLƏZOV (1939).

M.F.Axundov adına APEİ-nin rus dili və ədəbiyyatı fakültəsini bitirib (1965). Azərbaycanın bir sıra rayonlarında, sonra Faxralının məktəblərində müəllim işləyib. Müxtəlif səpgili şeirləri dövri mətbuatda, almanaxlarda dərc olunub.

Sözə alışalı duyğularımıza ad elədiyimiz şeirlərdən yana ürəyimiz uçunub. Fikrin poetik-bədii ifadəsi oxucuya həmişə könül xoşluğu verib, oxucu qəlbini ehtizaza gətirib. Bu anlamda şeirin şəriki olmayan əbədi-əzəli ünvanı ürəklərdi, ürəyin özünün də möhtac olduğu duyğulardı. M.Əlləzov məkansız söz yolunun yolçusudur…

Şair sözlə hamımıza bütün təfərrüatı ilə bəlli olan obyektin görə bilmədiyimiz tərəflərini, məğzini işıqlandırır, onun poetik təsvirini verir; sevir, tanıdır, sevdirir. Bu anlamda təbiətlə poeziya, obyektlə subyekt qoşalaşır, vəhdət təşkil edir.

Elin-obanın şöhrətinə küsənən, onun məlhəm havasından, buz bulaqlarından doymayan minlərdən biri də M.Əlləzovdur. Onun yaradıcılığını müəyyənləşdirən tərəflərdən biri – kövrəklik Faxralının təbiətindən barınıb. Elə bunun nəticəsidir ki, göz açıban gördüyü uca dağların əzəməti, gen biçənəklərin – çəmənlərin ətri-rayihəsi, ayna bulaqların şirin-şəkər pıçıltısı… öz inikasını Məmmədəlinin şeirlərində tapır. “Ruhani”ni ruhu bilən”,’“Kərəmi yandıran teldən doymayan” M.Əlləzovun bədii “mən”inin eşqi dağla“ ra, meşələrə, bulaqlara təbiətə ad olub. O, eşqini “qayaların şəlaləsi” bildiyi kimi, “canını da bu yerlərin pərvanəsi” hesab eyləyir və bundan qürur duyur:

Ruhumdu “Ruhani” saz havaslnda,

Kərəmi yandıran teldən doymaram.

Səngərin ətri var yaz havasında ,

Çıçəkdən doymaram, güldən doymaram. (“Doymaram”)

Bu bəndin fikir yükü təsdiqləyir ki, M.Əlləzov təbiət etibarilə şairdir, o təbiəti etibarıilə şairdir; o, təbiətin bizə ayrı biçimdə, ayrı nizamda görünən tərəflərinin poetik təqdimata çəkə bilir.

Dərələrin dərinliyində, zirvələrin ucalığında poetik məqamlar aşkarlayan şair, “vələsə bənzər cavanların”, “palıd ömürlü qocaların gözləriylə “zümrüdə bürünmüş yamacları”, “qartal yuvasını xatırladan çoban dəyələrini” seyr edir…

M.Əlləzovun yaradıclığı təbiətlə poetik pıçıltıdır. Bu pıçıltını duymaq uçun duyguların təbiətə köklənməlidir, özün təbiətin bir parçası olmalısan. Hər misrası ürək döyüntülərinə çevrilən şeir səni misraların qanadında həsrətində olduğun yerlərlə qovuşdurur – könül xoşluğuna dönür…

Məmmədəli Əlləzovun şeirlərindən nümunələrə buradan tanış ola bilərsiniz.

Mənbə: Rəşid Faxralının “Oğuz eli Faxralı” kitabından